*Bu kitab "**Əkinçi**. 1875-1877. (Tam mətni)" (Bakı, Azərnəşr, 1979) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Transliterasiya və tərtib edəni: **Turan Həsənzadə**

Ön sözün müəllifi və redaktoru: **Əziz Mirəhmədov**

**079.4754 - dc 21**
**AZE**
**Əkinçi. 1875-1877. Tam mətni.**
Bakı, "Avrasiya Press", 2005, 496 səh.

Azərbaycan dövri mətbuatının bünövrəsi sayılan "Əkinçi" qəzeti Azərbaycan xalqının mənəvi mədəniyyəti tarixinə şərəfli səhifələr yazmışdır. Bu kitabda milli mətbuatımızın ilk qaranquşu, XIX əsr Azərbaycan ictimai-siyasi həyatının aynası olan və cəmi 56 nömrəsi çıxan qəzetin tam mətni təqdim olunur.

"Əkinçi" qəzetinin komplekti çox nadir nüsxə halı aldığına görə kitab jurnalist, ədəbiyyatşünas, tarixçi, dilçi, filosof, iqtisadçı, sənətşünas, pedaqogika alimləri və başqa mütəxəssislər üçün qiymətli mənbə olacaqdır.

**ISBN 9952-421-29-8**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



# BİRİNCİ AZƏRBAYCAN QƏZETİ

Böyüklüyü və kiçikliyindən asılı olmayaraq, dünyanın bütün xalqları gec-tez öz tarixinə iftixarla yazır: filan vaxtda bizdə ilk məktəb açılmışdır... İlk zavod, ilk fabrik, ilk teatr, ilk mətbəə, ilk artel, ilk universitet yaranmışdır... Birinci çap kitabı, birinci qəzet, birinci jurnal nəşr edilmişdir...

Cəmisi üç-dörd sözlə ifadə olunan bu tarixi həqiqətlərdən hər birinin həmin xalqın həyatında necə mühüm yenilik yaratdığını, onun tərəqqi və yüksəlişi üçün necə əhəmiyyətli olduğunu yalnız o xalqı yaxşı tanıyanlar yaxşı başa düşə bilirlər.

Hər hansı bir xalqın öz ana dilində ilk qəzeti oxumasına gəldikdə, şübhəsiz, bu da həmişə və hər yerdə əlamətdar hadisə olur. Öz dövri mətbuatını Avropa XVI əsrdə, Rusiya isə XVIII əsrin ilk illərində yaratdığı halda, Azərbaycan buna ancaq 1875-ci ildə nail olmuşdur; yə'ni, feodal mütləqiyyəti və orta əsr geriliyinin ucbatından "Əkinçi"nin mənsub olduğu xalqın intizarı çox uzun çəkmişdir.

Bir çox başqa xalqlar kimi, azərbaycanlılar da ta XIX əsrin son rübünə qədər dünya işləri haqqında məlumatı və yeni xəbərləri əsasən əlyazma səyahətnamələrdən, uzaq ellərdən gələn qasidlərdən, xarici səfirlərdən, tacirlərdən, şahların, hakimlərin fərmanlarından, şəhər və kəndlərdəki xüsusi carçılardan almışlar.

XIX əsrdə Azərbaycanda bu ibtidai rabitə və kommunikasiya vasitələri aşkar anaxronizmə çevrilsə də, çarizm Azərbaycan maarifçilərinin başqa mütərəqqi təşəbbüsləri kimi, milli mətbuat yaratmaq cəhdini də boğurdu. Bəla onda idi ki, hətta əsrin ikinci yarısında da "Mərkəzi Rusiya quberniyalarına nisbətən ucqarlarda məhsuldar qüvvələrin inkişafı qeyri-bərabər və daha yavaş gedirdi. Ucqarların bir çoxunda, o cümlədən Azərbaycanda hələ feodal münasibətləri və patriarxal qalıqlar güclü olaraq qalmaqda idi. Çarizmin müstəmləkə siyasəti ucqarların iqtisadi-siyasi və mədəni inkişafı yolunda ciddi maneə törədirdi..."[1]

Azərbaycan xalqı bu illərdə böyük Mirzə Fətəli Axundzadənin bir sıra ləyaqətli, mübariz xələfini yetirib ərsəyə gətirdi ki, onların sırasında birinci Azərbaycan qəzetinin banisi və redaktoru Həsənbəy Məlikov Zərdabinin (1842-1907) surəti əzəmətlə ucalır.

---

[1] Azərbaycan tarixi. Üç cilddə. II cild, Bakı, 1964, səh. 167

Qədim Şirvanın Zərdab kəndində ziyalı bəy ailəsində dünyaya gələn H.Zərdabi orta təhsilini Şamaxı və Tiflisdə almışdır. Dünyagörüşü Moskva universitetində oxuduğu zaman bilavasitə qabaqcıl rus ictimai-fəlsəfi fikrinin, inqilabi demokratizmin, K.A.Timiryazev, İ.İ.Meçnikov və D.İ.Pisarevin təsiri altında təşəkkül tapmışdı. Ç.Darvinin cahanşümul təkamül nəzəriyyəsini də o, universitetdə öyrənib mənimsəmiş və sonralar həmin nəzəriyyənin qızğın təbliğatçılarından biri olmuşdur[2].

60-cı illərdə Moskva universiteti əsasən təhsil sistemindəki dözülməz qanunlara, mühafizəkar professor və müəllimlərə qarşı yönəlmiş tələbə hərəkatının mərkəzi idi. Bu hərəkat obyektiv olaraq çarizmə qarşı çevrilmişdi. 1861-ci ildə Çernışevskidən ruhlanan tələbələrin təşkil etdikləri gizli dərnəkdə alman materialistləri Feyerbax və Büxnerin əsərləri, A.Gertsenin "Sovremennik" və "Russkoye slovo"dakı publisistikası öyrənilir, müzakirə olunur və coşğun intiba oyadırdı. Dərnək üzvləri qadağan olunmuş ədəbiyyat nəşrinə də başlamışdılar.

Bu hərəkat çar hökuməti tərəfindən qəddarlıqla yatırılsa da, bir neçə il sonra Moskva, Peterburq və digər şəhərlərin ali məktəblərində döyüşkən tələbələr yenidən baş qaldırdılar. 70-ci illərin əvvəlində Moskvada Petrovski-Razumovski akademiyasında başlanmış inqilabi çıxışlarda başqa milliyyətdən olan tələbələrlə birlikdə vaxtilə Bakıda Zərdabinin şagirdi olmuş azərbaycanlı gənclər də fəallıq göstərirdilər: Nəcəf bəy Vəzirov, Əsgər ağa Adıgözəlov (Gorani), Əbülfət Şahtaxtinski, Məhəmmədtağı Əlizadə və başqaları...

Azərbaycanlı "petrovistlər"in elm və maarifi yaymaq məqsədilə məhz "Əkinçi"nin çıxdığı dövrdə təşkil etdikləri gizli "İmdadiyyə" dərnəyinin[3] H.Zərdabini özünə mə'nəvi rəhbər seçməsi gəncliyin ona böyük ehtiramından irəli gəlmişdi. Bu ehtiram onun xalq işi uğrunda çoxşaxəli, fədakar fəaliyyətinə görə idi.

O dövrün, demək olar, bütün görkəmli xadimlərində ictimai və mədəni tərəqqi naminə müxtəlif vasitələrə, yeni-yeni tədbirlərə müraciət etmək xasiyyəti vardı. M.F.Axundzadə bunu belə izah edirdi ki, mən xalq işi yolunda mübarizəyə girişmiş bir adamam. Bu mübarizədə qarşıya olmazın çətinliklər çıxır; lakin mən məsləkimdən əl çəkən deyiləm. Odur ki, bir təşəbbüs baş tutmayanda, başqa bir işə, başqa bir mübarizə üsuluna müraciət etməli oluram.

---

[2] М.А.Павлов. Воспоминания металлурга, М., 1945, səh.35

[3] З.Геюшев. "Имдадие". "Бакинский рабочий", 1963, №193

H.Zərdabi də belə etmiş, xalqa fayda verə biləcək hər bir işə böyük ümidlə girişmişdi: Azərbaycan peşəkar teatrının bünövrəsini qoyan ilk tamaşa... Xeyriyyə cəmiyyəti açmaq təşəbbüsü... Bakı real məktəbində müəllimlik... Rus mətbuatında əməkdaşlıq... Camaat arasında könüllü vəkillik...

Söz yox, bunların hamısı özünə görə əhəmiyyətli olan işlər idi. Lakin Azərbaycanın o zamankı tarixi inkişaf səviyyəsində ən təsirli, ən münasib vasitələrdən biri mətbu söz idi. Zərdabinin "Rusiyada əvvəlinci Azərbaycan qəzeti" məqaləsində oxuyuruq: "Hər kəsi çağırıram – gəlmir, göstərirəm – görmür, deyirəm – qanmır. Axırda gördüm ki, onları haraylayıb çağırmaqdan, onlara deməkdən başqa bir qeyri-əlac yoxdur. Olmaz ki, mənim sözümü eşidənlərdən heç bir qanan olmasın. Necə ki, bir bulağın suyunun altına nə qədər bərk daş qoysan, bir neçə ildən sonra su tökülməkdən o bərk daş mürur ilə əriyib deşilir, habelə söz də. Ələlxüsus doğru söz [...] Belədə qəzet çıxarmaqdan savayı bir qeyri-əlac yoxdur". Bir az aşağıda: "Heç olmaz ki, doğru söz yerdə qalsın. Hər ildə on qəzet oxuyandan birisi oxuduğunu qansa, onların qədəri ilbəil artar. [...] Sonra düşmənin düşmənliyi, dostun doğruluğu və dost göstərən doğru yolun doğru olması aşkar olar"[4].

Bu sözlərdə bir neçə mühüm mətləb var: maarifçilik məsləki, mübarizə əzmi, xalqa məhəbbət, bir də "doğru söz", "doğruluq" eşqi...

Dünyagörüşünün əsas xüsusiyyətləri ilə Qərb və rus maarifçilərinə yaxın olan Zərdabi də feodalizm və onun iqtisadi, ictimai və mədəni sahələrdəki təzahürləri əleyhinə mübarizə aparır, 70-ci illərdə Azərbaycan mütəfəkkirində eyni zamanda rus inqilabi xalqçılığına, xüsusilə onun çar mütləqiyyəti əleyhinə mübarizəsinə rəğbət və yaxınlıq çox qüvvətlənmişdi.

H.Zərdabinin jurnalistikaya dair görüşləri də bu iki ideya istiqamətində formalaşıb inkişaf etmişdi. O, hər cür mətbuatın yox, məhz əməkçi xalqa, onun tarixi mənafeyinə, tərəqqisinə, mübarizəsinə xidmət edən, ictimai zülmə, haqsızlıq və rəzalətə qarşı çevrilən mətbuatın tərəfdarı və xadimi idi.

H.Zərdabi, S.Ə.Şirvani, N.Vəzirov və "Əkinçi"nin digər aparıcı qüvvələri, bir çox başqa məsələlər kimi, demokratik mətbuatın səciyyəsi, azərbaycanca qəzetin vəzifələri, mövzu dairəsi və s. haqqında görüşləri ilə də Axundzadə ilə tam həmrəy, həmfikir idilər. Qəzetdə "xarici siyasət işləri" haqqında, "ölkənin intizamı, millət və məmləkətin faydaları" haq-

---

[4] "Həyat" qəz., 28 dekabr 1905, №129

qında, “daxili xəbərlər və hadisələr” haqqında, öz xeyrini güdən “ümərə və mənsəb sahibləri” haqqında, eyni zamanda “xətərdən qətiyyən qorxmayıb, igidlik göstərən”, “millət və ölkə qarşısında vəzifəsinə əməl edən” dövlət xadimləri, alimlər, şairlər, filosoflar, ordu sərkərdələri haqqında yazmağı vacib bilən Axundzadənin[5] şagirdləri kimi onlar, məsələn, bu fikirdə idilər ki, qəzet və jurnal oxumaq nəinki “insanı dünyadan xəbərdar edir; öz dilini öyrədir[6], “hər vilayətin qəzeti” nəinki gərək “o vilayətin aynası olsun”[7] qəzet nəinki “dərviş kimi nağıl deyə bilməz”, “onun borcudur işlərin yaxşı və yamanlığını ayna kimi xalqa göstərsin, ta xalq nikü bədindən xəbərdar olub, onun əlacının dalınca olsun”[8].

İdeya-nəzəri cəhətdən əsaslandırılan bu prinsipə təcrübədə ən əvvəl “Əkinçi” özü əməl etmişdi. O, əsl mənada xalqa “işlərin yaxşı və yamanlığını” göstərən, ictimai həyatın aynası olan, daha artıq desək, təkcə cəmiyyətdəki nöqsan və bəlaları təsvir etməklə kifayətlənməyib, eyni zamanda onların əlacı haqqında da düşünən, yazan, məsləhət verən bir qəzet idi. O da tamamilə təbiidir ki, M.F.Axundzadə kimi, Zərdabi də xalq həyatından uzaq olan səhifələri mənasız xəbərlərlə doldurulan “Ruznameyi-İran”ı kəskin tənqid edərək, onu “heç kimsəyə nəfi olmayan” mətbuat orqanı sayır və yazırdı ki, hətta ona “qəzet demək olmaz”[9].

Əlbəttə, “doğru söz”ə düşmən olan ictimai quruluşda belə bir proqramla meydana çıxıb qəzet nəşr eləmək asan iş deyildi. Ona görə heç təəccüblü deyil ki, Zərdabi “Əkinçi” üçün hökumətdən icazəni yalnız üçillik ağır, gərgin işdən sonra ala bilmişdi. Sonralar o, “Əkinçi”nin nəşri ərəfəsindəki qayğılarından söz açaraq yanıqlı-yanıqlı xatırlayırdı: “Bəs qəzeti necə çıxardım? Pul yox, yazıçı yoldaş yox, çapxana yox, hürufat yox, əmələ yox, bir-iki yüzdən artıq oxuyan da olmayacaq. Dövlət tərəfindən izin almaq da ki, bir böyük bəladır”[10].

İş onda idi ki, o zaman bütün Qafqazda ərəb əlifbası ilə hürufat yox dərəcəsində idi. Vaxtilə “Tiflisskiye vedomosti” və “Zakavkazski vestnik” redaksiyalarının, Arzanov qardaşlarının Tiflisdəki mətbəələrində olan ərəb hürufatına bel bağlamaq olmazdı. Azərbaycanca qəzet buraxılması işinə milli mətbəə təşkilindən, hürufat tədarükündən başlamaq lazım idi ki, Zərdabi məhz belə etdi.

---

[5] M.F.A x u n d o v. Əsərləri, Üç cilddə, II cild, Bakı, 1951, səh.178-180

[6] “Əkinçi”, 9 avqust 1876, №15

[7] “Əkinçi”, 20 sentyabr 1875, №5

[8] “Əkinçi”, 14 aprel 1876, №7

[9] “Əkinçi”, 25 iyul 1876, №14

[10] “Həyat”, 28 dekabr 1905, №129

İstər o illərdə, istərsə də bu yaxınlara qədər Türkiyədə, xüsusilə İstanbulun "Babi-ali caddəsi"ndə mətbuat və kitab ticarəti sahəsində çoxlu azərbaycanlı ziyalı işləyirdi. Xatiratında Zərdabi onların "Əkinçi" üçün hürufat tədarükünə böyük kömək göstərdiklərini ayrıca qeyd edir.

Aydın məsələdir ki, cəmisi bir neçə il əvvəl, 1854-cü ildə yaranmış yeni quberniya mərkəzində – Bakıda milli poliqrafiyanın inkişafı yolunda atılan bu ilk addım şəhərin mədəni simasının formalaşması üçün də çox əhəmiyyətli idi.

Yeni və müstəqil mətbəə açmaq mümkün olmadığından Bakı quberniya mətbəəsindən istifadə etmək yəni hürufatı da oraya satmaq lazım gəlmişdi. Zərdabi özü bu işdə ona Qafqaz xalqlarına rəğbət bəsləyən Bakı qubernatoru Staroselskinin mühüm köməyi dəydiyini, hətta onun "Əkinçi"ni senzuradan keçirmək məsuliyyətini öz öhdəsinə götürdüyünü yazır.

Soruşula bilər ki, hələ 1828-1832-ci illərdə A.Bakıxanov "Tiflisskiye vedomosti"nin farsca buraxılışının redaktoru və müəlliflərindən biri olduğu[11], 1838-1845-ci illərdə isə "Zakavkazski vestnik"in azərbaycanca da bir neçə nömrəsi çıxdığı halda, bizdə dövri mətbuatın tarixini "Əkinçi" ilə başlamaq ənənəsi nəyə əsaslanır?

Bu suala cavab verməzdən əvvəl qeyd etməliyik ki, şübhəsiz, məşhur Azərbaycan yazıçısı və alimi A.Bakıxanovun göstərilən qəzetdəki fəaliyyəti haqqında ehtimal elmi-tarixi cəhətdən böyük əhəmiyyətə malik olub, xüsusi tədqiqata möhtacdır, layiqdir. Bu qəzetin hətta, A.Bakıxanov tərəfindən çıxarılmış bir-iki nömrəsi də əldə edilərsə, ondan Azərbaycan milli mətbuatının ilk bünövrə daşı kimi danışmaq mümkün olardı. Hələlik isə bu mətbuat orqanı haqqında yalnız arxiv sənədləri və bəzi başqa məxəzlər məlumdur. O ki qaldı "Zaqavkazski vestnik"in azərbaycanca buraxılışı ("Qafqazın bu tərəfinin əxbarı") o da əsasən rəsmi sənədlərin tərcüməsindən ibarətdir; bu qəzet çox az tirajla çap olunmuş və uzun ömür sürməmişdir. Daha ciddi məsələ budur ki, "Qafqazın bu tərəfinin əxbarı"nın nə məzmunu, nə poliqrafik bazası, nə onun materiallarını tərcümə və çap edən şəxs – heç biri Azərbaycan varlığı ilə bağlı olmadığından onu milli mətbuatımızın sələfi hesab etməyə əsas yoxdur.

Təkcə banisi, redaktoru, müəllifləri deyil, məzmunu, ideya istiqaməti, dili, poliqrafik bazası, oxucuları da nəşr olunduğu torpaqla bağlı olan, onun mənəvi və maddi həyatına əsaslanan, ilk növbədə doğma həmvə-

---

[11] Д.Л.В а т е й ш в и л и. Русская общественная мысль и печать на Кавказе. М.,1973, с. 275-309

tənlərə xidmət edən birinci qəzet "Əkinçi"dir ki, Azərbaycan milli mətbuatının tarixi də, çox təbii, bu qəzetlə başlanır.

"Əkinçi"nin tarixi əhəmiyyətini layiqincə qiymətləndirmək üçün belə bir həqiqəti də nəzərə almaq lazımdır ki, o zaman Azərbaycan dilində kitab çap eləmək "dağ çapmaq kimi" (M.F.Axundzadə) bir iş idi: əsər yazmış müəllif onu kitab halında buraxdırmaq üçün pul tapanda mətbəə tapmırdı, mətbəə tapanda senzuradan icazə ala bilmirdi; icazə alıb çap etdirməyə müvəffəq olanda isə oxucu tapmaqda çətinlik çəkirdi... Axundzadənin dahiyanə "Kəmalüddövlə məktubları" – nə az, nə çox – 60 il dünya işığına həsrət qalmışdı; ədib böyük əziyyətdən sonra çap etdirdiyi məşhur "Təmsilat"ını böyük əziyyətlə də satdırırdı. Seyid Əzim Şirvani bir neçə cildlik əsərlərini kitab halında görmədən vəfat eləmişdi. Kitab həsrəti o dövrün başqa sənətkar və alimlərinə də yaxşı tanış idi...

Belə bir "mətbuat aclığı" dövründə nəşrə başlayan "Əkinçi"nin təkcə Qafqaz, təkcə Rusiya miqyasında deyil, Avropada da böyük mədəni hadisə kimi qiymətləndirilməsi bir də bununla izah olunmalıdır.

* * *

Rus klassiki, məşhur "Kolokol" jurnalının redaktoru A.İ.Gertsen yaxşı deyirdi ki, ictimai həyatı zəif inkişaf etmiş xalqlar üçün dövri mətbuat ən gözəl tribunadır. Düzdür, çar senzurası hələ "Əkinçi"nin proqramını nəzərdən keçirdiyi zaman bildirmişdi ki, gərək bu qəzetin "məqalələri yalnız əhalinin məişətinin iqtisadi və ən yaxın mülki məsələlərinə aid olsun və dəbdə olan siyasi görüşlərlə yaxud bütün müasir həyat quruluşunu müzakirə etmək cəhdləri ilə doldurulmasın"[12]. Lakin qəzet nəşrinə belə bir ağır, məhdudlaşdırıcı şərtlə icazə almasına baxmayaraq, mütərəqqi jurnalistika təcrübəsinə yaxşı bələd olan və jurnalistlik ustadlığına yiyələnmiş bir mətbuat xadimi kimi Zərdabi öz əməli işində senzuranın təsdiq etdiyi proqramdan məharətlə kənara çıxıb, "Əkinçi"ni əsl mənada demokratiyanın tribunasına, Azərbaycan ictimai-siyasi, fəlsəfi, bədii, elmi, iqtisadi, pedaqoji və etik fikrinin aynasına çevirə bilmişdi.

Əhalisinin əksəriyyəti savadsız olan bir ölkədə belə mühüm, mürəkkəb işin öhdəsindən gəlmək çox çətin idi. Zərdabi özü yazırdı ki, "...bir tayfa ziyadə avam olduqcan onun üçün qəzet çıxarmaq ziyadətər çətin olur. Ol səbəbə ki, belədə qəzet oxuyanın çoxu xalqın avamlığından

---

[12] Azərbaycan EA RƏF, H.Zərdabinin arxivi, inv. №3 (103)

nəf' görən"[13] adamlardan ibarət olur. Odur ki, "xalqın qəzet oxumağa adət etməsi"nə[14] nail olmaq, jurnalistika vərdişlərinə az-çox yiyələnən köməkçilər yetişdirmək lap "Əkinçi"nin ilk nömrələrindən əsas qayğılardan biri idi. Bu məqsədlə Zərdabi "işin binasından oxuyanları basma xəttinə öyrətmişdi", "Əkinçi"nin tirajının bir hissəsini Bakının küçə və bazarlarında paylatmaqdan savayı, başqa şəhərlərə də müftə göndərirdi ki, xalq "qəzet oxumağa adət eləsin"; ona redaksiya işində, mətbəədə, qəzetin yayılmasında kömək edən gənclərin "hamısı qəzet oxumaqla yazıb öyrənmişdilər və öz vətən dilində qəzet görəndə çox şad olurdular"[15]. Bütün bunlardan əlavə oxucuları mütaliəyə həvəsləndirmək məqsədilə "Əkinçi" səhifələrində dünyanın məşhur kitabxanaları haqqında yazılar dərc edilir, "qəzet" və "jurnal" terminləri haqqında məlumat verilir. Avropada qəzetə böyük maraq olduğu, bəzi ölkələrdə yüzlərcə qəzet çıxdığı statistik rəqəmlərlə göstərilirdi.

Əsgər Gorani məktublarından birində bu məsələnin aydınlaşdırılmasına kömək edən iki mühüm misal gətirir: "... bizim kənd əhlində taxsır yoxdur. Mən keçən yayda onların çoxu ilə danışmışam, onlar hazırdır əli qabara-qabara, üzü tərləyə-tərləyə 3 manat cəm edib, "Əkinçi" gətirtsin. Amma çifayda kənd əhli poşt adını eşitməyib və qəzet gətirməyin qaydasını bilmir"[16].

Deməli, "əli qabarlı" kənd əhli "Əkinçi"nin faydasını başa düşməyə başladığı halda, çox adi bir şeyi – abunə yazılıb qəzet gətirtməyin qaydasını bilmir, o hətta C.Məmmədquluzadənin məşhur "Poçt qutusu" hekayəsindəki Novruzəli kimi "poştun adını da eşitməmişdir"... Deməli, "Əkinçi" öz böyük ictimai, elmi, mədəni işini sırf əməli, maarifləndirici işlə paralel aparmalı olmuşdu.

Öz yüksək amalını həyata keçirmək yolunda mübarizədə Zərdabi Axundzadədən əlavə, dövrünün görkəmli ziyalıları – şair və yazıçıları Seyid Əzim Şirvani, N.Vəzirov, Əhsənül-Qəvaid, Ə.Gorani, Ələkbər Heydəri və başqalarının qüvvəsinə, köməyinə arxalanırdı. Yalnız belə bir tərəqqipərvər müəlliflər heyətinin sayəsində "Əkinçi" zəmanəsinin mühüm elmi, texniki, kənd təsərrüfatı, mədəni yenilikləri, nailiyyətləri haqqında müntəzəm məlumat verə bilmiş, öz səhifələrində Azərbaycan ictimai fik-

---

[13] "Əkinçi", 3 mart 1877, №5

[14] "Əkinçi", 1 yanvar 1876, №12

[15] "Həyat", 3 yanvar 1906, №2

[16] "Əkinçi", 22 dekabr 1876, №24

rinin inkişafı baxımından faydalı polemika açmış, yeni elmi dünyagörüşünün parlaq nümunələrini vermişdi.

Qəzetdə siyasət və iqtisadiyyat, mədəniyyət və sosiologiya, fəlsəfə və ədəbi tənqid, biologiya və nəbatat haqqında irəli sürülmüş müddəa, fikir və tövsiyələrin böyük bir qismi bu gün də öz təravət və əhəmiyyətini saxlamışdır. "Əkinçi" XIX əsr Azərbaycan ictimai fikri, mətbuatı, ədəbiyyatı və dilinin, habelə təbiətşünaslıq elminin tarixini öyrənmək üçün çox qiymətli məxəzdir.

"Əkinçi" iqtisadiyyatda da, ictimai münasibətlərdə, maarif, mədəniyyət, ədəbiyyatda da, məişət, əxlaq, geyimdə də – hər şeydə, hər işdə yenilik, tərəqqi, gözəlləşmə və təzələnmə tərəfdarı idi. Bu xəttin, bu meylin əleyhinə olan hər şey istehza və nifrətlə, təəssüf və pərişanlıqla yad edilir, pislənirdi. Qəzetin birinci nömrəsində proqram məqaləsində deyilirdi: "Bizim zəmanə dəyişilməyi tələb edir. [...] O kəslər ki, həmişə etibar edib bizim sözlərimizə əməl ediblər, zəmanə dəyişilməyinə görə kökündən tərəqqi edib, irəli gedirlər"[17]. Başqa bir yerdə: "...zəmanə dəyişilib. İndi güc və igidlik əyyamı deyil elm əyyamıdır"[18]. Köhnə həyat tərzini, patriarxal adət-ənənələri pisləyib yeniliyə, mütərəqqi həyat tərzinə, "avropalaşmağa" çağıran belə sözlərə "Əkinçi"nin bütün qabaqcıl publisistlərində rast gəlmək mümkündür. Qəzet yeniliyin xalq şüuru və məişətində özünə necə çətinliklə yol açdığını göstərərək yazırdı: "...bir şəxs bizim namərbut başmaq yerinə çəkmə geyəndə şüəralar onu həcv edir, mollalar ona minbərdən lənət oxuyur, əvamünnas ona salam vermir. Xülasə, hamımız birləşib, onu kafir hesab edib, o qədər incidirik ki, biçarə naəlac qalıb, öz millətini atıb, gedib xaricilərlə üns tutur ki, onun övladı onların içində böyüyüb, onların təriqəsinə daxil olur"[19].

Yoxsul kəndlinin təsərrüfat dərdləri – torpaq, su, becərmə, məhsuldarlıq, istehsal aləti, heyvandarlıq, ipəkçilik kimi məsələlərlə əlaqədar dərdlər "Əkinçi"nin başlıca mövzusu idi. Feodal-patriarxal münasibətlərdən irəli gələn çıxılmaz vəziyyətə çarə eləmək, aztorpaqlılıq əzabı çəkən, üstəlik çarizm və bəylər-mülkədarlar tərəfindən amansız istismara məruz qalan dövlət və sahibkar kəndlilərinin suya olan böyük ehtiyacının, qismən də olsa, ödənilməsi üçün yollar axtarmaq, şum, əkin, becərmə, biçin, döyüm kimi istehsal proseslərinin təkmilləşməsinə kömək etmək,

---

[17] "Əkinçi", 22 iyul 1875, №1

[18] "Əkinçi", 17 fevral 1877, №4

[19] "Əkinçi", 22 iyul 1875, №1

bütün maneələrə baxmayaraq məhsuldarlığın yüksəlməsi üçün zəruri vasitə və üsulları öyrənib təbliğ etmək – qəzetin ilk nömrədən son nömrəyədək ardıcıl izlədiyi xeyirxah məslək belə idi...

Kəndli üçün həmişə və hər yerdə müstəsna əhəmiyyəti olan suvarma işini götürək. Bu, "Əkinçi" dövründə Azərbaycan kəndlisinin ən böyük dərdlərindən biri idi. Ölkənin əksər kənd yerlərində, təxminən əkin sahələrinin altmış faizi yalnız suvarma yolu ilə məhsul verdiyi halda, hökumətin suvarma işlərinə vəsait buraxmaması nəticəsində əhali susuzluqdan çox korluq çəkirdi. Aşağı axarlarda öz məcrasını tez-tez dəyişən Kür və Araz çaylarının daşması fəlakətlər törədirdi: əkin sahələri suyun altında qalır, kəndlər məhv olur, münbit torpaqlar bataqlığa çevrilirdi. Bu mövzuda məqalələrindən birində "Əkinçi" xalqa məsləhət verərək yazırdı: "Avam [...] deyir ki, su azalıb və keçən günü yada salıb ah çəkir. Doğrudur, su azalıb və buna səbəb odur ki, zikr olan çayın başında sakin olan kəslər odun bahalandığına orada olan meşələri qırıb azaldıblar. Amma oturub ah çəkməkdən fayda yoxdur, təzədən meşə salmaq gərək ki, su artsın. Lakin təzə meşə gəlib meşə olunca bir qeyri tövr ilə bunun çarəsinin dalınca olmaq gərək, ya arx qazmaq ilə, ya maşın, ya çarx qurmaq ilə, ya dağların ətəyində bəndlər bağlayıb, oralarda qışda əmələ gələn suyu saxlayıb [...] əkini sulamaq lazımdır"[20].

Azərbaycanın Rusiya və Qərblə iqtisadi əlaqələrindən bəhs edən bəzi məqalələrində "Əkinçi" dövrünə görə çox böyük əhəmiyyəti olan bir məsələ də irəli sürmüşdü: yerli sənayeni inkişaf etdirmək lüzumu. Bu zərurəti qəzet belə bir səciyyəvi faktla əsaslandırırdı ki, bizim camaatımız əldə etdiyi xammalı xaricilərə dəyər-dəyməzinə satıb, onların istehsal etdiyi malı çox baha qiymətə alır. Halbuki, bizim öz fabrik-zavodlarımız olsa, bu hala son qoyular.

"Əkinçi"də o dövrün iqtisadi həyatındakı çox mühüm yenilik – Bakıda neft sənayesinin kapitalizm inkişafı yoluna düşməsi də öz əksini tapmışdır. "Daxiliyyə"lərdən birində oxuyuruq: "... yer alan, yer satan həddən çıxıb. Küçə və bazarlarda məhz neft və cövhər (benzin – *Ə.M.*) sözü danışılır. Nataryusxanalarda neft yeri aldı-satdı kağızlarını yazmağa növbət çatmır. Badkubədə sakin olanlar [...] olan-olmazlarını yığıb, Sabunçu bəylərinin yanına yer almağa və ya Qara şəhərdə [...] zavod tikdirməyə gedir ki, bir ya iki ilə sahibi-milyon olsun"[21].

[20] "Əkinçi", 6 noyabr 1876, №21
[21] "Əkinçi", 7 iyul 1877, №14

Amerika nefti ilə Bakı nefti arasındakı rəqabət, neftin satış qiymətinin qeyri-sabitliyi, neft mədən yerlərinin alınıb satılması, Bakıda neft emal edən zavodların tikilməsi, yerli əhalinin bu sahəyə axışması haqqında yazılarda "Əkinçi" redaktorunun siyasi iqtisad elminə yaxşı bələd olduğu[22] bir daha görünməkdədir.

"Daxiliyyə"lərdən birində 70-ci illərdəki Azərbaycan bəyləri haqqında yürütdüyü tənqidi mühakimədə Zərdabi təkcə bu zümrə üçün deyil, bütün o zamankı hakim istismarçı təbəqələr üçün səciyyəvi olan sifətləri ümumiləşdirmişdi. O yazırdı ki, bütün varlığı etibarilə antidemokratik qüvvə, "basıb-kəsən", "tüfeyli olan bu ağalar heç bir vaxt "xalqın xoşbəxtlik fikrin çəkməzlər", bəyə yalnız "pul gərəkdir ki, kef-damağa məşğul ola və millət əvəzinə heyvan gərəkdir ki, ona hakimlik edə"[23].

İctimai və milli zülmə, istismar və iqtisadi bərabərsizliyə dair yazılarında "Əkinçi" çıxış yolu göstərməyə də çalışırdı. Belə "xatalı" təşəbbüsləri, qəzetin öz dililə desək "dövlətə dəyən sözləri" senzuranın nəzərindən yayındırmaq üçün ya mütərəqqi mətbuatda, Puşkin, Şedrin, Axundzadə və başqa klassiklərin yaradıcılığında təsadüf olunan obyektiv informasiya, üstüörtülü, dolayı ifadə, ya da zaman və məkanı bilərəkdən dəyişmək üsullarına müraciət edilirdi. Məsələn, Zərdabi Moskva, Peterburq, Tiflis və s. şəhərlərin mətbuatından xalq azadlıq hərəkatına aid belə xəbərlər seçib verirdi: Peterburqda doxsan min fəhlə işsiz qalmışdır, orada "xalqa dövlət qadağan edən kitablar paylanır", qızıl bayraq üstə "torpaq və asudəlik" yazmış inqilabçılardan 21 adam (kişi və qadın) Sibirə sürgün olunmuşdur, belə hadisələr Moskva, Tula, Oryol kimi şəhərlərdə də baş verir; Amerika Birləşmiş Ştatlarının zavodları və dəmir yollarında tətillər "gün-gündən artır"; Çində Dunkan vilayətində əhli milli zülmə qarşı çıxışlara başlamışdır və i.a. və h.b...

Demokratik oxucunu siyasi cəhətdən maarifləndirmək məqsədilə "Əkinçi" müəllifləri bir çox hallarda İranı təhlil və mühakimə obyekti edib eyni zamanda aşkar yerli, milli əhəmiyyəti olan mübariz ideyalarını onun timsalında yaymağa nail olurdular. Belə yazıların birindən oxucu öyrənirdi ki, "İran dövlətinin əməlcatı [...] xalqı elə incidib ki, şəhərlərdə xalq bu barədə qapılara kağız yapışdırır"[24]. Təkcə İngiltərə, Fransa, Rusiya kimi böyük dövlətlərdə deyil, Yaponiya, Türkiyə və s. ölkələrdə

---

[22] Ətraflı bax: М.Мустафаев. Развитие азербайджанской экономической мысли в XIX веке. Автореф. докт. дисс., Баку, 1967.

[23] "Əkinçi", 17 mart 1877, №6

[24] "Əkinçi", 18 yanvar 1877, №2

də məşrutəli monarxiya, konstitusiya, respublika, parlamentarizm problemlərinin fikirləri məşğul etdiyi, M.F.Axundzadə, Mirzə Yusif xan, Mirzə Mülküm xan, Əli Süavi əfəndi arasında bu məsələlər ətrafında qızğın mübahisə getdiyi dövrdə "Əkinçi" tədqiqat obyekti olaraq İranı alıb yazırdı: "İranda qanun olmadığına binaən işlər bu tövr başlanıb ki, doğru və yalanı qanmaq olmur. [...] Xalqa deyəndə ki, qanun olmasa asudəlik və tərəqqi olmayacaq, deyir: hansı qanundur ki, şəriətdən artıq ola?

Əzizim, qanuni-şəriət hansı öz qaydası ilə dolanır? [...] vəchi siyasəti öz qərar və qaydasında əməl olmur, mövqufdur hər kəsin rəyinə. Hakimlər qanun üzilə hökm etmir. Qərəz, [...] İran xalqı sərgərdandır. Günbəgün müftəxor çoxalır, kasıb payimal olur"[25].

Bu məzmunda yazıları qərəzkarlıq kimi başa düşüb yanlış yozanlar, müsəlmanları tənqid etdiyinə görə Zərdabini "düşmən" adlandıranlar və nüfuzdan salmağa çalışanlar yox deyildi. Beləlırindən biri "Əkinçi"nin İran və Türkiyədəki ictimai-iqtisadi vəziyyət haqqında tənqidi qeydlərini hiddətlə qarşılamışdı. Bu münasibətlə yazdığı məqalədə Zərdabi dərin bir təəssüf və həyəcanla deyirdi ki, "... müsəlmanların düşməni mən deyiləm, məzkur hacı kimi adamlardır ki, bizi millətlər arasında gülüş yeri edib, elmdən və dünyadan bixəbər qoyub, sərgərdan və payimal ediblər"[26]. Başqa bir yerdə: "Bilirəm bu sözləri oxuyub həzərat bizdən rəncidə-xatir olacaq. Amma, dostlar, insaf deyil ki, qeyrilərin eybindən danışıb öz eybimizi xalqdan gizlədək"[27]. İş o yerə çatıb ki, biz "Əkinçi"yə ədəbsiz həcv yazan bir "nadan"ı tənqid edəndə onun həmyerliləri dərhal təəssübkeşliyə başlayırlar; guya yekə bir vilayətdə bir nadanın olmağı gözlənilməz, qeyri-adi bir iş imiş. Halbuki "vilayət nadansız olmaz, dünya belə gəlib, belə də gedəcək. Təfavüt nadanların çox-azlığındadır və bizim xahişimiz onları azaltmaqdır. [...] Filankəsə dəymə – bizim həmşəhrimizdir, ya filan sözü danışma – bizim filan adətimizə toxunur olanda iş yeriməz"[28].

"İş yeritmək" üçün "Əkinçi" tənqid və məzəmmətlə kifayətlənməyib, ictimai-siyasi problemlərin müzakirə və həllində pozitiv fikirlərini də yazıb bildirirdi. Bu mövqeyin əsası yenə "azadlığı", "Avropa həyat formalarını və ümumiyyətlə Rusiyanın hər cəhətdən avropalaşması"

---

[25] "Əkinçi", 7 iyul 1877, №14

[26] "Əkinçi", 18 dekabr 1875, №11

[27] "Əkinçi", 17 mart 1877, №6

[28] "Əkinçi", 14 aprel 1877, №8

ideyası idi. Bir çox maarifçilər kimi, "Əkinçi"nin qabaqcıl müəlliflərinin Qərbi Şərqdən üstün tutmasının sirri də burada idi. Qəzetin yazdığına görə, həmin üstünlüyün səbəblərindən "ümdəsi onlar bizdən artıqraq elm təhsil etməkdir və ondan masəva bunun bir səbəbi də azadlıqdır. Nə qədər Avropa əhli bizim təki azadlıqdan bixəbər olub, ol vaxtacan bizdən bədtər avam olub. Amma bu halda azadlıq cəhətindən Avropa əhli çox tərəqqi edib və hər bir işdə bizdən irəli düşüb. Əgərçi bizim şəriətimizə görə qul azad etmək çox böyük savabdır, amma biz bu barədə həm işi gec qanmışıq. Satınalma qulu azad etməyi savab hesab edə-edə, biz öz xahişimiz ilə bir-birimizə qul olmuşuq. Rəiyyət padşaha, övrət kişiyə, uşaq ataya, nökər ağaya, şagird ustada və qeyrə məgər qul deyil? Bəli, biz hamımız quluq və buna səbəb ata-baba adətləridir. Xülasə, Məşriq-zəmində azadlıq olmadığına, biz Avropa əhlindən geri qalmışıq və nə qədər belə olsa, biz tərəqqi etməyəcəyik və edə bilmərik"[29].

"Əkinçi" müsəlman Şərqindəki nöqsanları, bəla və fəlakətləri böyük ürək ağrısı ilə göstərsə də, öz təsvir və tənqidində heç bir zaman ifrata varmır, birtərəfliliyə yol vermirdi. Bu cəhətdən Zərdabinin Vamberiyə tənqidi münasibəti çox səciyyəvidir. Məşhur macar şərqşünasının "İslam" adlı kitabındakı "Məşriq-zəmin qoca və xəstədir [...] beş yüz ildən ziyadədir ki, islam zülmətə qərq olub [...] mürur ilə tələf olur" – hökmünü Zərdabi məhz birtərəfli mahiyyətinə görə, şərq xalqlarına avropasentrist münasibətin ifadəsi olduğuna görə "düşmən" sözü adlandırmışdı. Maraqlı cəhət bir də budur ki, təxminən otuz il sonra Vamberi özü vaxtilə Şərq haqqında nahaq ümidsiz olduğunu, müsəlman həyatındakı inkişaf və tərəqqi əlamətlərini görə bilmədiyini etiraf eləmişdi.

Bununla bərabər, yadda saxlamaq lazımdır ki, cəmiyyət məsələlərində idealizm mövqeyində dayanmaq Zərdabi və onun məsləkdaşlarının həqiqi azadlıq haqqında düzgün, elmi təsəvvür almalarına imkan verməдiyi kimi, azadlıq əldə etmək yollarını düzgün müəyyənləşdirmələrinə də mane olmuşdu. Eyni sözü bu müəlliflərin ictimai və mədəni tərəqqiyə nail olmaq üçün "tavana" (dövlətli – *Ə.M.*) və kasıbların arasında [...] ittifaq[30] yaratmaq şəklində ortaya çıxmış liberalizmində də görmək mümkündür.

---

[29] "Əkinçi", 9 iyun 1877, №12

[30] "Əkinçi", 28 iyul 1877, №15

* * *

“Əkinçi” səhifələrinin böyük bir qismi bilavasitə yeni tipli mədəniyyət yaradılması məsələlərinə – bədii ədəbiyyat, incəsənət, dil, pedaqogika, dərslik, tərcümə, kitab nəşri, kitabxana və s. haqqında müxtəlif jurnalistika janrlarında yazılara həsr edilmişdir.

Tarixi inkişafda xalqın ideya tərbiyəsini həlledici amil sayan maarifçi müəlliflər Azərbaycan ədəbiyyatının müqəddəratı, habelə klassik irsə münasibət haqqında xüsusi düşünürdülər. Bu məsələlərin müzakirə və həllində daha artıq fəallıq göstərənlər Axundzadənin davamçıları – Seyid Əzim Şirvani, Nəcəf bəy Vəzirov, bir də Zərdabi özü idi.

Realizmi, humanist və demokratik ideyaları, tənqidi pafosu, ictimai satiranı, xalq dilinin zənginliklərini ədəbiyyatda ardıcıl müdafiə və təbliğ etmək “Əkinçi”nin proqramında mərkəzi vəzifələrdən biri idi. Bədii sözü həyatın, dövrün qabaqcıl meyllərinin xidmətinə vermək, Nizami, Xaqani, Nəsimi, Füzuli, Vaqif ənənələrini inkişaf etdirmək əvəzinə epiqonçuluq, formalizm yolunu tutanlar qəzetdə kəskin tənqid olunurdu.

Şe’rdə “pərpuç”, “batil və bihudə sözlər”, süni, tərif, mədh, həcv, “Əkinçi”yə görə, şeytan işinə bərabər olub, “xalqı gümrah edir”, yəni yoldan azdırır. Belə “şairlər” “yaxşı olurdu bu əşar əvəzinə bez toxuyub, bir növ əhli-elm və kamal [...] oleydilər, ya pinəduzluq öyrənib, bir qardaşın başmağı yırtılanda pinə edəydilər”[31].

Cəmiyyət həyatının bütün sahələrində fəal, realist, mübariz olmağa çağırış, qəzavü qədər, “Allahdan buyruq, ağzıma quyruq” etiqadının pislənməsi, başqa xalqlarla, qarşılıqlı mədəni əlaqələri getdikcə möhkəmləndirmək, dünya klassikasının ən yaxşı nümunələrini azərbaycancaya çevirib nəşr etmək “Əkinçi”nin ədəbi-publisist materiallarının əsas ideya məzmununu təşkil edirdi.

Klassik irsdən ağıllı, yaradıcı, yerli-yerində istifadə olunması qayğısına ayrıca qalmaq lazım gəlmişdi. Balaca məktəb uşaqlarına dərslik əvəzinə “Leyli və Məcnun” dastanının oxudulması, xalqın mütaliə dairəsinin yalnız “Min bir gecə”, “Pişik və siçan” kimi əsərlərlə məhdudlaşdırılması, dini-sxolastik risalələrə rəvac verilməsi “Əkinçi”də məzəmmət və tənqidlə qarşılanırdı.

Müasir görüşlərin, demokratik ideyaların, yeni pedaqoji meyillərin təbliği qəzetin səhifələrində məktəb, maarif, təlim-təhsil məsələləri ətrafında açılmış müzakirə və mübahisədə də əsas xətt idi. Bizə “elmi-

---

[31] “Əkinçi”, 15 mart 1876, №5

əbdan”mı (dünyəvi, təbiət elmləri) ya “elmi-ədyan” (dini-sxolastik elmlər) lazımdır? – sualına cavabında bunlardan ikincisinə üstünlük verən köhnəpərəstlərdən, müsəlman ruhaniləri və üləmasından fərqli olaraq, tərəqqipərvər ziyalılar cəmiyyətin maddi və mənəvi inkişafını XIX əsrdə böyük nailiyyətlər əldə etmiş dünyəvi-texniki elmlərlə, təbiətşünaslıqla, qabaqcıl ictimai biliklərlə bağlayır, yeni üsulda tədris ocaqları, sənət məktəbləri açılmasını zəruri sayırdılar.

Xalqın mədəni səviyyəsini yüksəltmək, onu maarifləndirmək, asudə vaxtlarını məzmunlu etmək məqsədilə “Əkinçi” konkret, real təklif və tövsiyələr verirdi. Qəzet yazırdı ki, məsələn, Bakıda klub açıb qiraət üçün kitab və qəzetlər gətirtmək, maraqlananlar üçün şətrənc və nərd alıb qoymaq lazımdır: “millət qeyrəti çəkən qardaşlar” Azərbaycan dilində elmi kitablar hazırlayıb çap etmək məqsədilə xüsusi bir cəmiyyət düzəltməlidirlər, özü də gərək bu kitabları onlar “xalqa müftə ya bir az qiymətə paylasınlar ki, bizim məktəbxanalarda şair kitablarının əvəzində ol kitablar oxunsun”[32].

Qəzetin müvəffəqiyyətlə tərtib olunan “Elm xəbərləri” şöbəsində Azərbaycan və başqa ölkələrin etnoqrafiyasına böyük fikir verilirdi. Dünyanın müxtəlif yerlərindəki milli adət-ənənələr, ailə və nikah, məişət mədəniyyəti, kənd təsərrüfatı alətləri, xalq meteorologiyası, mərasim və ayinlər, əyləncələr və s. mövzularda dərc olunmuş yazılar “Əkinçi” oxucuları üçün ciddi maarifləndirici əhəmiyyətə malik idi. Bütün fəaliyyətində olduğu kimi, bu məsələdə də qəzet xalqın etnoqrafik cəhətdən daim tərəqqi etməsinə, yeni ailə münasibətlərinin, tarixin sınağından çıxmış nəcib adət-ənənələrin, məişət tərzinin, geyim və əyləncələrin bərqərar olmasına çalışır, kömək edirdi.

Zəngin faktik material əsasında yazılan belə məqalələrdən birində, məsələn, yer üzündəki tayfaların ən qədim zamanlarda XIX əsrə qədər adət-ənənə cəhətindən uzun inkişaf yolu keçib gəldiyi təsvir olunur, müsəlman Şərqində nikah, kəbin, ailə, qadına münasibət və s. məsələlərdən danışılır. Peru xalqının və tunğuz tayfasının dəfn mərasimi, Dağıstan, Çin və Yaponiyada qan intiqamı haqqında məlumat verilir. Ən mühüm cəhət məqalənin çox qiymətli, ibrətamiz bir sonluqla qurtarmasıdır: “Əlbəttə, düşməndən intiqamı almaq ol yerdə olur ki, orada ədalət qanunu bina olmamış ola. Elə ki, bir yerdə belə qanun bina olundu, intiqam almaq gərək bərhəm olsun. Pəs bu halda hər tayfada intiqam almaq adəti var isə, məlum

[32] “Əkinçi”, 1876, №6

ki, o tayfanın belə qanunu yoxdur və əgər var isə də, ona əməl olunmur”[33]. Bu sözlər N.Vəzirovun təxminən iyirmi il sonra yazacağı klassik “Müsibəti-Fəxrəddin” faciəsinin bir növ prelüdü hesab oluna bilər.

Çarizmin, yerli istismarçıların, islam dini xadimlərinin mənafeyinə xidmət edən mərasimlərdən məhərrəmlik, təziyəsinin ifşasına böyük yer verməklə “Əkinçi” dini dünyagörüşünə, faciə ilə nəticələnən eybəcər bir adətə amansız zərbə vurmuş, onu müdafiəyə cəhd edən Həsən Qara Hadi, kapitan Sultanov kimi fitnəkarların iç üzünü açmışdır.

“Əkinçi”nin ideya istiqamətində qiymətli cəhətlərdən biri onun tarixi nikbinliyi idi. “Zəhərdən acı bir həyat keçirdiyi” anlarda belə “pərişan və bədbin olmayın! Öz işinizdə mərd-mərdanə olun!” – deyən Axundzadə kimi, olmazın əzab, məhrumiyyət və maneələrlə qarşılaşan “Əkinçi” fədailəri da tarixi inkişaf haqqında, vətən və xalqın gələcəyi haqqında ümidsizliyə qapılmır, haqq və ədalətin, xeyir və işığın qələbəsinə inandıqlarını bildirirdilər. Zərdabi cəmiyyətdə “doğruluğun”, azadlığın, ağlın, mədəniyyətin zəfər çalacağını yazır, Seyid Əzim tezliklə N.Vəzirov, Ə.Adıgözəlov və başqaları kimi universitet təhsilli tərəqqipərvər gənclərin heç bir çətinliyə baxmadan xalqın imdadına çatacaqlarına, “xoşbəxtlik toxumu” əkəcəklərinə möhkəm etiqad bəsləyirdi. Qəzet üçün ən ağır çağlardan birində – 1877-ci ilin yazında bu ruhda müraciətin çap olunması, əlbəttə, çox əlamətdar bir hadisədir: “Ey zikr olan əşxaslar (əməkçi xalqın qanını soran tüfeylilər – *Ə.M.*), bunu fəhm edin ki, sizin dolanacağınız xalqilədir və diriliyiniz onun diriliyinə mövqufdur. [...] Siz xalqın qanını sorub, [...] özünüz həm puç olacaqsınız”[34].

* * *

H.Zərdabi çox vaxt bir neçə adamın – müəllif, redaktor, mürəttib, çapçı, korrektor və başqa mütəxəssislərin işini də təkbaşına görürdü. O, Avropa mətbuatı, xüsusilə London qəzeti “Tayms”la öz qəzetinin kökündən fərqli olan vəziyyətini müqayisə edərək yazırdı: “Dünyada hər qəzeti beş ya on adam inşa edir. Onu çap edən, hərflərini düzən, qələtlərini düzəldən başqa kəslər olur. Amma bu işlərin hamısını gərək mən özüm görüm... Ey bizə diqqət edənlər, bu qəzetin kəsrini görəndə gülməyin. Gülmək yeri deyil. Siz ağlayın ki, bizim müsəlmanların bircə qəzeti də basdırmağa (yəni: nəşr etməyə – *Ə.M.*) adamı yoxdur”[35].

---

[33] “Əkinçi”, 18 avqust 1877, №17

[34] “Əkinçi”, 31 mart 1877, №7

[35] “Əkinçi”, 21 avqust 1875, №3

Üstəlik hakim dairələrin, mürtəce ziyalıların, mühafizəkar din xadimlərinin təqibləri, çuğulçu məktublar onu cana gətirirdi. Hələ maddi-texniki çətinliklər, qəzetin ildə təxminən min manat (o zaman üçün bu çox böyük bir məbləğ idi) zərər eləməsin!..

Bütün bunlara Zərdabi mətanətlə dözürdü. Vətəninə, xalqına bəslədiyi məhəbbətin alovu onun iradəsini ən çətin anlarda da polad kimi qaynadıb bərkidirdi.

Bu ümumiyyətlə, dünya mətbuatı tarixində fövqəladə hallardan biri idi. O zaman Bakıya gəlmiş bir fransız jurnalisti Zərdabiyə yaxşı demişdi ki, "doğrusu Siz əsl qəhrəmansınız! Bizim Fransada belə bir yoxsul qəzet üçün işləmək istəyən adam tapmaq olmazdı. Sizin qüvvənizə heyrət eləyirəm. Belə məlum olur ki, Siz öz xalqınızı çox istəyirsiniz!".

"Əkinçi"nin üçüncü ilində düşmənlər, qayğılar, maneələr daha da artdı. Rusiya-Türkiyə müharibəsi və "Dağıstanda şuluqluq" başlanandan sonra "Əkinçi"nin günü dəxi artıq qara oldu"[36]. Qəzeti çap eləməkdə, xüsusilə müharibə xəbərlərinin verilməsində, "Əkinçi"ni senzuradan keçirməkdə, abunəçilərə çatdırmaqda və bir sıra başqa məsələlərdə yenə çətinliklər ortaya çıxdı. Zərdabi o "qara günlər"i xatırlayaraq yazırdı: "Müsəlmanların düşmənləri ki, Staroselskinin vaxtında bir iş görə bilmirdilər, hər tərəfdən "Əkinçi"nin üstə tökülüb onun bağlanmağına səy etdilər. Jandarma polkovnikinə hər gün məndən adsız danoslar göndərirdilər. Jandarma tərəfindən mənim üstümə qarovulçular qoyuldu. Onların birisi mənim rus qulluqçumun qardaşı adına gecələr mənzilimin içində yatırdı. Birisi də küçə qapısında durub mən hər tərəfə gedəndə məni aparıb gətirirdi".[37] Başqa bir yerdə Zərdabi ona həcv yazan nadanlardan acı-acı şikayətlənirdi: "Fikrim budur ki, bizim Zərdab kəndində Qarabağın sərhəddində bir daş qoydurub onun üstündə zikr olan həcvi tamam qazdırım ki, gələcəkdə bizim övladlar o yadigara baxıb bilsinlər ki, mən bu zəhmət ilə milləti-islamı qəflətdən ayıltmaq istəyən vaxtda necə nadanlara rast gəlmişəm!"[38]

H.Zərdabinin yazdığı kimi, vaxtilə ona kömək etmiş qubernator Staroselskinin[39] Bakıdan köçüb getməsi, onun yerinə gələnin "Əkinçi" və redaktoruna aşkar qərəzli münasibət bəsləyib, fitnəkar adamların təhriki

---

[36] "Həyat", 3 yanvar, 1906, №2

[37] "Həyat", 3 yanvar 1906, №2

[38] H.Zərdabi. Seçilmiş əsərləri, Bakı, 1960, səh.19

[39] "Əkinçi", 15 iyun 1876, №12

ilə hökumət təqibini şiddətləndirməsi vəziyyəti daha da ağırlaşdırdı. Hələ 1876-cı ilin avqustunda qəzetdə deyilirdi ki, "ol cənab qəzetimiz çap olmağa razı olmağını bilmirik. [...] Onu təzə qubernator gələndə az qalmışdı ki, bağlasınlar, amma bir tövr təzə iləcən saxlayıblar. Sonra nə olacaq məlum deyil"[40]. "Əkinçi" bu qeyddən sonra bir il daha çap olundu. Amma hökumətin ona münasibəti getdikcə pisləşdi. M.F.Axundzadənin, çox güman ki, kəskin, siyasi-ifşaçı məzmunda olan bir məqaləsinin, "qonşu getdi, biz qaldıq, haray ellər, ay ellər!" – misraları ilə başlanan anonim şerin və başqa bu kimi "zərərli" yazıların nəşri məhz bu zaman qadağan olunmuşdu.

İş o yerə çatdı ki, qubernator mürəttib Minasovun fitnəsinə uyaraq "Əkinçi"nin çap olunmuş bir nömrəsini ləğv edib, redaktorsuz öz istədiyi məzmunda yeni bir nömrə buraxdırdı. Dramın növbəti pərdəsi Zərdabinin real məktəbdən çıxarılması və Bakıdan uzaqlaşdırılması oldu.

"Əkinçi" qəzeti çox tez bağladılsa da, mədəniyyət salnaməsində böyük bir ad qoydu. Onun milli mətbuat tarixində açdığı yol, yaratdığı ənənələr çox uğurlu, uzunömürlü oldu. Azərbaycan ədəbiyyatı və mətbuatının bütün qabaqcıl xadimləri hətta "Əkinçi" bağlanandan 20-30 il sonra da onun aktual əhəmiyyətini itirməyən demokratik-maarifçi ideyalarına yiyələnməyi və həmin ideyaları yaşadıb inkişaf etdirməyi özlərinə borc bilirdilər. "Əkinçi" onlar üçün xəlqiliyin, əməkçilərə təmənnasız və sədaqətlə xidmətin, ideyalılığın, ictimai və milli zülmə qarşı mübarizənin, doğma mədəniyyət və ana dilinin tərəqqisi yolunda çalışmağın, dünya elminin nailiyyətlərini yaymağın, prinsipial, doğruçu, demokratik mətbuatı inkişaf etdirməyin ilhamverici, gözəl bir nümunəsi olmuşdu. Bunun ən parlaq sübutu məşhur "Molla Nəsrəddin" jurnalının və onun əsas müəlliflərinin "Əkinçi" və əkinçilərlə möhkəm ideya-varislik əlaqəsidir.

Təkcə ideya-mövzu cəhətindən deyil, satirik üslub, kinayə və istehza ilə yazmaq, xalq gülüş vasitələrindən və bu sahədəki klassik irsdən istifadə cəhətdən də "Əkinçi" mollanəsrəddinçilərin ən yaxın, ən doğma sələfi olmuşdur. Bu hökm çoxlu misallarla əyaniləşdirilə bilər. Amma müqəddimənin məhdud imkanlarını nəzərə alaraq, ancaq "Əkinçi"nin çar hökumət idarələrinə seçkiləri, məhərrəmlik təziyəsini, Azərbaycan mülkədar və bəylərini, məişətdəki geriliyi tənqid edən yazılarını, ictimai şüurun qüvvətlənməsi, təbiətşünaslıq və texnikaya dair yeni biliklərin təbliği ("elmi-əbdan və elmi-

---

[40] "Əkinçi", 23 avqust 1876, №16

ədyan" məsələləri ətrafında mübahisə) sahəsində fəaliyyətini xatırlatmaqla kifayətlənmək lazım gəlir. Konkret sitata gəldikdə, məsələn, şəhər idarəsinə seçkilər haqqında bu sözlər "Molla Nəsrəddin" jurnalında eyni mövzuda yazılanlarla tam həmahəngdir:

"Siz Allah [...] intixab elədiyiniz adamların uzun saqqalına, böyük qurşağına, dəmir sandığının doluluğuna baxmayın"[41]. Yaxud: "... dükan-bazarlarda oturanların çoxu bir cüzi yanına qoyub, gündə 4-5 müştəri gözləməkdən ötrü axşamacan ağzını ayırıb gəlib-gedənə tamaşa edir ki, guya bu zaman bir qeyri iş görmək günah imiş. Küçələrdə cavanlarımız ya papağını əyri qoyub "ay balam, ay balam" çağırır, ya bir-birinə yaman deyir, meydanlarda kimi dərviş nağılına qulaq asır, kimi xoruz, kimi qoç döyüşdürür"[42].

H.Zərdabi "Əkinçi"ni nəşr etdiyi zaman Mirzə Cəlil də daxil olmaqla Azərbaycan yazıçılarının yeni nəslinin nümayəndələri 10, 12, 15 yaşlı uşaqlar və yeniyetmələr idilər. Lakin istər səksən-doxsanıncı illərdə, istərsə də sonra bu yazıçıların çoxu "Əkinçi"nin ölməz ideyalarını müxtəlif yollarla öyrənib faydalanırdılar. Bir də XX əsrin əvvəlində "Əkinçi", Sabir demişkən, "vəfat etmişdisə", Azərbaycan ziyalılarının çoxunu özünə "mənəvi ata"[43] saydığı Zərdabi sağ idi; o yenə yazır, mübarizədən qalmır, "Əkinçi"də gördüyü işi davam etdirirdi. N.Vəzirov yeni komediyaları və "Dərviş" imzalı publisist əsərləri ilə mollanəsrəddinçilərlə həmrəy olduğunu göstərirdi.

"Molla Nəsrəddin"in redaktoru Mirzə Cəlil uzun illər "Əkinçi" ilə maraqlanıb məşğul olan, onun biblioqrafik nadirəyə çevrilmiş komplektini səhifəbəsəhifə, bir məktəbli kimi oxuyub öyrənən və ədəbi-jurnalistik fəaliyyətində nəzərə alan şəxsiyyətlər arasında yaşayıb işləmiş və böyük yazıçının mətbuata dair görüşlərinin formalaşıb inkişaf etməsində bu amillərin ciddi əhəmiyyəti olmuşdur.

Dünyagörüşü "Əkinçi" ilə sıx təmasda təşəkkül tapan, Zərdabi ilə məktublaşan, "Əkinçi"nin başladığı yeni ictimai-ədəbi hərəkatla bağlı olan şəxsiyyətlər sırasına habelə M.Ə.Talıbov, M.Tahir, Z.Mərağeyi, Mirzə Mehdi xan kimi cənublu yazıçı və mütəfəkkirlərimiz də daxildir. Akademik M.Cəfərov çox doğru olaraq, məsələn, Z.Mərağeyinin "Səya-

---

[41] "Əkinçi", 4 avqust 1877, №16

[42] "Əkinçi", 26 may 1877, №11

[43] M.Ə.S a b i r. Hophopnamə, III cild, səh.152

hətnameyi-İbrahim bəy” və M.Ə.Talıbovun “Əhmədin kitabı” əsərlərində təbliğ olunan qabaqcıl fikirlərlə M.F.Axundzadə və “Əkinçi” arasında möhkəm əlaqə görür[44].

“Əkinçi” ənənələrini yaşatmaq və inkişaf etdirmək yolunda F.Köçərli daha ardıcıl çalışmışdır. Əsərlərində Zərdabi və onun qəzetini dönə-dönə yad edən alim 1906-cı ildə belə bir doğru fikir irəli sürürdü ki, “Əkinçi”ni gözəl sözləri və nəfli məlumatı indi də öz əhəmiyyətini itirməmişdir”, onlar “müəyyən bir sistem halına salınıb Azərbaycan dilində nəşr edilən dövri jurnallarda çap olunarsa, çox faydalı olar”[45].

Azərbaycanın ən yaxşı oğullarının nisgil və həsrətinə səbəb olan bu arzu həqiqətə çevrilir.

***Əziz Mirəhmədov***

---

44 M.C ə f ə r o v. Azərbaycan-rus ədəbi əlaqələri tarixindən, Bakı, 1963, səh.103, 105

45 Y.V.Çəmənzəminliyə məktub. RƏF, arx.26, Q-13 (269), səh.140

*Əvvəlinci sənə* *İki həftəlik qəzetdir* *Əvvəlinci nömrə*

*Fi 1 rəcəbülmürəccəb, sənə 1292*

* * *

*Fi 22 iyul Rusiya, sənə 1875*

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

*Poşt xərci qəzet basdıran ilədir*

* * *

*Hər kəs öz işləri barəsində bu qəzetdə e'lamnamələr basdıra bilər. Belə e'lamnamələr basdırdan kəslər lazımdır ki, e'lamnamənin hər kəlməsinə iki qəpik versinlər.*




*Hər kəs bu qəzetdə hər bir qism əhvalat barəsində məktublar basdıra bilər və əgər bir şəxs bu gunə məktubatı həmişə göndərməyə xahiş etsə ol kəs üçün qəzet müftə göndərlənir. Əgər bu məktubların məzmunu qəzetin əvvəlinci nömrəsinin daxiliyyəsində adlanan əhvalatlardan savayı əhvalat ola ya bu məktublarda dövləti-əliyyə və ya qeyri dövlətlərə ya məzhəbə ya bir ismən adlanan şəxsə dəyən sözlər ola ol vaxtda qəzetin münşisində ixtiyar var o məktubu çap etməsin, ya o nalayiq sözləri bərkənar edib sonra çap etsin.*

Qəzet çap olunur Qafqaz vilayətinin Badkubə şəhərində. Hər kəs e'lamnamələr və məktubat göndərmək xahiş etsə qəzeti çap etdirənin adına göndərsin. Bu qəzeti almaq xahiş edən kəslər qəzetin yuxarıda zikr olan qiymətini lazımdır qəzeti basdıranın adına göndərsinlər və öz adlarını və sakin olduğu yerlərini yazıb mə'lum eləsinlər. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.

## DAXİLİYYƏ

Əkinçi qəzetinin bina olmağının səbəblərindən o qəzeti çap etmək barəsində göndərdiyimiz e'lamnamədə danışdıq. Əlbəttə o səbəblərdən savay buna qeyri səbəblər də çoxdur. Amma onları burada ismən adlamaq məqdur deyil. Ona görə o səbəblərdən danışmağı lazım bilməyib xahiş edirik bu "Əkinçi" qəzetinin əvvəlinci nömrəsində o qəzetin məzmunundan güftügu edək. Əkinçi qəzetində bu aşağıda adlanan fəsillər olacaqdır. Əvvəlinci fəsil daxiliyyə olacaqdır, yə'ni qəzetin münşisinin öz tərəfindən yazılan şeylər olacaqdır. İkinci fəsildə əkin və ziraət xəbərləri olacaqdır, yə'ni bizim ya qeyri vilayətlərdə olan əkin-

lərdən, onları əkib becərməkdən, onları əkib becərən vaxtda işlənən əsbablardan, əkin yerin şuxm etməkdən, əkin yerin qüvvətli etməkdən ötrü o yerə qeyri şeylər qarışdırmaqdan, xülasə, əkindən və əkini biçib, götürüb qurudub döyüb saxlamaqdan danışıq olacaqdır. Həmçinin bu ikinci fəsildə maldarlıqdan və mallardan əmələ gələn şeylərdən danışıq olacaqdır, yə'ni bizim və ya qeyri vilayətlərdə nə qism mallar saxlamaqdan və ya nə tövr saxlamaqdan və onlardan əmələ gələn şeyləri nə tövr yaxşıraq əmələ gətirməkdən danışıq olacaqdır. Üçüncü fəsildə elm xəbərləri olacaqdır, yə'ni elm və imtahan yolu ilə aşkar olan, məsələn insanın bədəninə və malına nəf'i olan xəbərlərdən danışıq olacaqdır. Dördüncü fəsildə təzə xəbərlər olacaqdır və bu təzə xəbərlər bir neçə qisim olacaqdır. Əvvəla, ticarət xəbərləri olacaqdır, yə'ni bizim vilayətimizdə və ya qeyri vilayətlərdə bir şey, məsələn, buğda filan şəhərdə və ya filan kənddə nə qiymətə və nə tövr satılmaqdan xəbər verəcəkdir. Sani, bizim Rusiya dövlətinin və qeyri dövlətlərin politika xəbərlərindən danışıq olacaqdır, yə'ni padşahların və onların vüzəralarının aralarında olan danışıqlardan dövlətlər arasında olan cənglərdən xəbər verəcəkdir. Salis, Rusiya dövləti tərəfindən öz tabelərinə sadir olan hökmlərdən xəbər verəcəkdir. Rabe', bizim kənd sudlarında ya miravoy sudda və ya okrujnoy sudda qət olan işlərin ümdəsinin qətnaməsi olacaqdır. Xamis, yuxarıda zikr olan xəbərlərdən savayı hər bir vilayətdə aşkar olan məşhur naxoşluq ya yanqu, ya oğurluq və ya qeyri qisim xəbərlərdən danışıq olacaqdır.

Bu məzmunda qəzeti müsəlmanlar üçün vacib bilib onun zəhmətini və zərərini qəbul edib başlayırıq və müsəlmanların anlıyan və pişrov kəslərindən iltimas edirik ki, xalqa bu qəzeti oxumağa mane olmasınlar, bəlkə sə'y etsinlər ki, onu oxuyan çox olsun. Bu təvəqqei anlıyan kəslərdən elədiyimizə səbəb odur ki, bizə mə'lumdur bizim müsəlmanlar həmişə öz anlıyan kəslərini əziz tutub onların sözlərinə əməl ediblər. Əlbəttə, anlıyan və pişrov kəslərə lazımdır ki, xalqın bu e'tibarına xəyanət etməyib onun gözləri açılmağa sə'y və kuşeş etsinlər. Dünya bir şeydir ki, həmişə dövran edir və insan bu tövr dünyanın gərdişinə görə gərək habelə öz rəftarını da dəyişdirsin, necə ki, məsəldir deyirlər, zəmanə sənə saz olmasa, sən zəmanəyə saz olgilən. Pəs olmaz ki, dünyada həmişə bir qayda ilə rəftar olsun. Bizim zəmanənin dəyişilməyi, əlbəttə, hər anlıyan kəsə mə'lumdur və bu tövr zəmanənin dəyişilməyi bizim ilə deyil, həmçinin biz qadir deyilik ki,

zəmanəni dəyişilməkdən saxlayaq. Ol kəslər ki, həmişə bizə e'tibar edib bizim sözlərimizə əməl ediblər, zəmanə dəyişildiyinə görə gün-gündən tərəqqi edib irəli gedirlər. Onların belə irəli getməyinə mane olmaq, yə'ni onların keçən zəmanənin qaydası üzrə saxlamaq məsləhət deyil, ona görə ki, yolu onlar bizsiz də gedəcəkdirlər. Pəs bizim anlıyan və pişrov kəslərə eyni məsləhətdir bu yolu onlar ilə bir yerdə getsinlər, ta ki onların tez tərəqqi etməyinə səbəb olsunlar və buna görə gələcəkdə həmçinin onlara pişrov olsunlar.

## İKİNCİ DAXİLİYYƏ

Gələn təzə ildən alış-veriş və qeyri dadistədlər xərcinin qərardadı bizim Qafqaz vilayətində qoyulacaqdır. Bu hökmü polisə xalqa məlum edibdi. Bu barədə bizim xalqın arasında hər bir qism xəbərlər vardır. Kimi deyir ki, bu xərci qoymaqdan murad budur ki, bizlər öz vilayətimizi qoyub baş götürüb başqa vilayətlərə gedək. Kimi deyir ki, Badkubəyə gələn dəmiryolu tə'mir etməyə on minə qədər fəhlə lazımdır. Çünki o qədər fəhlə tapmaq çətindir, ona görə bu qərardadı qoyurlar ki, xalq öz dadüstədini qoyub o yolda fəhləlik eləsin. Xülasə, xəbər çoxdur, onun bə'zini heç qələmə salmaq məqdur deyil. Əlbəttə, bu xəbərlərə səbəb oldur ki, bizim adamın bu qərardaddan xəbəri yoxdur. Hər kəs öz təsəvvürünü əqəliyyən danışır və bu danışıq ağızdan-ağıza düşüb Koroğlu nağılı kimi nağıl olubdur ki, bu nağılı öz əslinə heç şəbahəti yoxdur. Bu səbəblərə görə bizim borcumuzdur ki, bu barədə xalq ilə danışıq edək. Əvvəla, bunu oxuyan, sizdən bir sual edim: əgər bir kəsin bir külfəti ola və bu külfət də bir atadan doğulmuş iki oğul ola, o vaxtda heç insafdırmı ki, oğlun birisi zəhmət çəkib pul qazanıb öz ata və anasını, öz qardaşını saxlasın. Əlbəttə, bu qardaş tifl olsa, ya naxoş olsa, onu saxlamaq bizim borcumuzdur. Amma o cavan olub əlini işə vurmayan zaman hər kəs belə qardaşı ya gərək başdan eləsin, ya onu işlətsin. Bir neçə ildir ki, Rusiya dövlətinə tabe olmuşuq və buçağadək bizim ticarətimiz qədim sayaq olan kimi olubdur, amma Rusiya dövlətinin öz əhli zikr olan xərci çox zamandır ki, verir. Məzkur qərardad qoyulan on ildir və bu on ildə biz o xərci verməmişik. Əgər biz özümüzü Rusiya dövlətinə tabe hesab edirik belə olan surətdə Rusiya dövləti öz əhli ilə elədiyi rəftarı bizim ilə də eləsə o vaxtda bizim üçün məqami-şikvaya narazılıq

yoxdur. Sani, heç bir qərardadda məqdur deyil ki, hər bir şeyi ismən adlıyasan. Məsələn, zikr olan qərardadda məqdur deyil ki, adı ilə deyilsin ki, filan işi görən adam ya filan maya ilə ticarət edən adam bu qədər xərc versin. Bu səbəbə zikr olan qərardadı qoyan kəs hər bir dadistədləri bir neçə qism edib hər bir qismə bir xərc qoyub. Məsələn, hər bir malı arşın ilə ya çəki ilə satmağa bir xərc qoyulub. Əgər bir kəs əlli ya altmış min manat ilə və bir qeyri kəs min manat ilə arşın malı satır isə qərardadı qoyan kəsdə təqsir yoxdur ki, bu min manat mayası olan kəs də altmış manat xərc verəcəkdir. Doğrudur bezi arşın ilə satıb altmış manat xərc verməyin nəf'i azdır, amma əlli min manat mayası olan kəsə bu tövr ticarət artıq nəf' edir, onun üçün altmış manat artıq xərc deyil. Pəs, min manat mayası olan kəs, sənin dad etməyin nə lazım. Bezi arşın ilə satmağının xərci çoxdur, bez satma, min manat ilə elə alış-veriş et ki, onun xərci az olsun və ya heç olmasın.

Bu məsəli fikirlə oxuyan kəs görər ki, hər bir tərəfdən gələn xərc artıb, cəbr artıb sədası doğru deyil. Əlbəttə, xərc var. Onun varlığına söz yoxdur. Amma elə artıq deyildir ki, xalqa çox cəbr olsun. Məgər insafdan deyildir ki, bizim Badkubənin on ildə yüz min manat qazanan kəsləri ildə altmış manat xərc versinlər. Bu xərc ki, genə bizim özümüzə məsrəf olacaqdır, o xərclərlə məktəbxanalar açılır və qeyri xalqa lazım olan işlər görünür, pəs bu səbəbə bu xərc qoyulmaqdan fəqir-füqəraya nə ki cəbr yoxdur, bəlkə artıcaq mənfəət var.

Şimdi qərardadın özündən danışaq. Bu qərardadda yüz otuz doqquz fəsil var. Əlbəttə, onu tamam qəzetdə çap etmək məqdur deyil. Məzkur qərardadı biz öz türk dilimizə tərcümə etmişik və əgər məqdur olsa, bu yavıq zamanda onu əlahiddə çap edəcəyik. Ona görə burada onun məzmunundan müfəssəl güftügu edək. Məzkur qərardada görə dadistəd edən kəslər üç yerə təqsim olunur: əvvəlinci qism dadistədləri edənlərdə, yə'ni pervoy gildilərdə ixtiyar var, əvvəla, Rusiya və qeyri dövlətlərin mallarını Rusiyanın hər bir yerində yük ilə, tay ya top ilə satsın və bu malları satmaqdan ötrü lazım olduq qədər də kontorlar və anbarlar bina etsin. Sani o şəhadətnamə verilən uyezdin şəhərində və kəndlərində istədiyin dükanlar və mağazinlər açıb Rusiya və qeyri dövlətlərin tamojnıdan keçmiş malını arşını ilə və çəki ilə satsın. Həmçinin onun ixtiyarı var zikr olan uyezdə hər bir qisim dadüstəd üçün lazım olan yer saxlasın və karxanalar və zavodlar açsın. Amma lazımdır ki, hər dadistəd olan yerə bir əlahiddə bilet alsın. Salis hər podrata

girə bilir və nə qədər mal istəsə özü üçün ya özgə üçün ala bilir və hər icarəyə girə bilir. İkinci qism dadistədləri edən kəs şəhadətnamə aldığı uyezdin şəhərində ya kəndlərində istədikcə dükan və mağazin saxlayıb Rusiya və qeyri dövlətin gömrüklənmiş mallarını arşın ilə ya çəki ilə sata bilər, həmçinin o uyezdə lazım olduqca karxana və zavod və qeyri dadistəd olan yer aça bilər. Mal alıb aparıb gətirə bilir və hər icarəyə girə bilər. Amma bu şərt ilə ki, hər podratı ya icarənin qiyməti on beş min manatdan artıq olmasın. Hər karxana ya zavod saxlayan kəs əgər bu karxanada ya zavodda maşın ya qeyri əsbablar par ilə, yə'ni su buğu ilə ya su ilə işləyir isə, ya o karxanada və zavodda on altı fəhlədən artıq fəhlə işləyir isə lazımdır ikinci qisim ticarət, yə'ni vtoroy gildi şəhadətnaməsi alsın və belə karxanalar və zavodlar saxlayan kəslər öz karxanalarından və zavodlarından əmələ gələn şeyləri yük ilə ya boçka ilə öz karxanası və zavodundan ya birjada sata bilirlər. Amma o şeyləri yük ilə satmaq üçün karxanadan ya zavoddan kənarda kantor ya ambar açsa, o vaxtda əvvəlinci qism ticarət şəhadətnaməsi alsın. Əgər əvvəlinci və ikinci qism ticarət şəhadətnaməsi ya xırda ticarət şəhadətnaməsi alan kəs xahiş edə ki, o şəhadətnamə verilən uyezddən qeyri uyezddə də dükan açsın ya karxana, ya zavod bina eləsin, o vaxtda lazımdır bu qeyri uyezd üçün müəyyən olan qiyməti verib əlahiddə şəhadətnamə alsın. Üçüncü qism ticarət, yə'ni treti gildi bir neçə yerə təqsim olunur: onların əvvəlincisi xırda ticarətdir ki, bu xırda ticarət şəhadətnaməsini alan kəsdə ixtiyar var, əvvəla, o şəhadətnamə verilən uyezddə dörd dükan açsın və bu dükanlarda əlahiddə siyahıda adlanan şeyləri satsın. Bu siyahıları müəyyən etmək vagüzar olunub cənab veliki knyaz sərdari-Qafqaziyaya ya bu dörd dükanın əvəzində dörd karxana ya dörd zavod saxlasın ki, bu karxanalarda ya zavodlarda olan əsbablar par ilə ya su ilə işləməsin və onlarda on altıdan artıq fəhlə olmasın. Hər dadistəd olan yerə bir əlahiddə bilet almaq gərək. Saniyən, podrata və icarəyə girə bilər, amma bu şərt ilə ki, podratın ya icarənin qiyməti min iki yüz manatdan artıq olmasın. İkincisi yük ilə arşın malın və ya qeyri malları şəhərdən kənarda gəzdirib satmaqdır. Üçüncüsü, o malları oralarda əli ilə gəzdirib satmaqdır. Dördüncüsü, meşşanlıq, yə'ni sınıqkarlıqdır. Beşincisi, amillikdir. Hər kəs öz yerindən əmələ gələn şeyləri qeyri dövlətlərə satmağa apara bilər, amma özgələrin yerlərindən əmələ gələn şeyləri alıb ambara yığıb sonra qeyri dövlətlərin yerinə satmağa göndərmək üçün gərək əvvəlinci qism ticarət şəhadətnaməsi olsun.

Hər kəs qeyri dövlətlərin yerində mal ala bilər, amma o malı Rusiyada yük ilə, tay ilə ya top ilə ancaq əvvəlinci qism ticarət edən sata bilər. Belə malı ikinci qism tüccar özü arşın ilə ya çəki ilə satmaq üçün ala bilər. Gələn səfər xərclərdən və xərcsiz olunan dadistədlərdən danışacağıq.

## ƏKİN VƏ ZİRAƏT XƏBƏRLƏRİ

### Mal südündən yağ qayırmaqdan danışacaq

Əgərçi bizim Qafqazda qara mal çox saxlanır, amma onlardan qeyri vilayətlərdəki kimi mənfəət olmur. Ona binaən ki, biz malları saxlamağı, yə'ni onlar üçün töylələr tə'mir etməyi və bu töylələrdə onlara ələf verməyi bilmirik. Bu səbəblərə bizim mallarımız korluq çəkib zəif olurlar. Ona binaən mala naxoşluq düşən zaman yaxşı saxlanmış maldan yüzü tələf olur isə, bizim zəif maldan artıcaq tələf olur və bir də bizim maldan az mənfəətimiz olmaqlığına səbəb oldur ki, bizlər yaxşı mal, yə'ni çox südlü mal saxlamağa sə'y etmirik, az südlü malın zəhmətini çəkib, az da mənfəət tapırıq. Məzkur səbəblərdən savayı bizim maldan az mənfəət olmaqlığına qeyri səbəblər də var. Onların ümdəsinin birisi biz süddən yağ qayırmağı bilməməyimizdir. Çünki mal saxlamaqdan ümdə mətləb o malın yağıdır və yağ çox və yaxşı olduqcan mənfəət də artıq olur, ona binaən qeyri vilayətlərdə süddən yağ qayırmaqdan burada güftügu edəcəyik.

Süddən üç qism ilə yağ qayırmaq olur: bə'zi kəslər südü sərib, ondan qaymaq yığıb, bu qaymaqdan yağ çalxalayırlar. Bə'zi kəslər bişməmiş, yə'ni çiy süddən yağ çalxalayırlar, amma bə'zi kəslər süddən qatıq qayırıb, qatıqdan yağ qayırırlar.

* * *

Əvvəlinci, qaymaqdan yağ qayırmaq. Süddən qaymaq yığmaq üçün gərək südü sərəsən. Belə süd sərilən qablar və süd saxlanan yerlər, hətta o yerin havası gərək çox təmiz olsun. Əgər süd sərilən qablar təmiz də olsa, amma onlar sərilən yer, yə'ni otaq çox isti, soyuq, ya yaman iyli olsa, ol vaxtda ya süddən qaymaq tamam yığılıb hasil olmaz, yainki süd turşuyub tələf olar. Xülasə, süd tez iy çəkən şeydir. Ona binaən süd sərilən qabları və onlar saxlanan yerləri təmiz saxlamaqdan

savayı gərək sə’y edəsən ki. o yerlərin yanında töylə və ya qeyri yaman iy gələn şeylər olmasın, yoxsa süd iy çəkib tələf olar, yə’ni turşuyub bilmərrə xarab olmasa da, ondan əmələ gələn yağın rəngi dəyişilib iyi və dadı yaman olar. Qaymaq yığmaqdan ötrü sərilən süd gərək bilmərrə tərpənməsin, əgər tərpənsə, qaymaq az çıxar. Hər şey tərpənməyi görmək məqdur deyil. Məsələn, təmiz suyu qazan içində qaynadanda, su qaynayanacan onun tərpənməyin görmək olmaz, amma o suyun içinə xırda şeylər, məsələn, lil qarışdıranda görmək olur ki, bu lilli su ocağın üstə qoyulandan sonra su qaynayandan irəli tərpənir, yə’ni bir su qismi şeyin, məsələn, südün bir tərəfi isti və bir tərəfi soyuq olsa, ol vaxtda bu şey tərpənir. Ona binaən gərək süd sərilən yerin havası bir istilikdə olsun, yə’ni bir tərəfi isə və bir tərəfi soyuq olmasın. Məsələn, çöldə soyuq olan zaman gərək süd sərilən otağın qapı-bacası açıq olmasın, yoxsa südün soyuq gələn tərəfi ilə isti tərəfinin arasında süd tərpəndiyinə qaymaq az hasil olar.

İmtahan ilə biliblər ki, ağac isti saxlayan, yə’ni gec qızan və gec soyuyan olur. Ona binaən ağac qabda ağacdan isti, ya soyuq süd səriləndə qabın ağzında süd soyuyur, ya qızır, amma qabın dibində isti ya soyuq qalır. Ona binaən əvvəl zaman süd tərpənir və sakit oluncan qaymaq əmələ gəlmir. Bu səbəbə ağac qabda qaymaq gec əmələ gəlir. Ağac qabın bir yaman xasiyyəti də var: onu təmiz etmək müşküldür. Ağacın kiçik deşikləri olur, belə deşiklərə süd dolub orada turşuyub qalır. Bu səbəbə əgər bir kəs qeyri qab tapmayıb ağac qabında süd sərsə, gərək o qabı hər səfər isti su ilə və kül ilə təmiz etsin.

Süd sərməyə hər qabdan qalaylanmış mis qabı yaxşıdır, amma mis qabı qalaysız olsa, onun paxırına süd dəysə, paxır ilə süddən zəhər əmələ gələr və bu zəhər insanı fövt edər. Mis qabı baha olduğuna, bu qabı saxlamağa hər kəsin tavanası olmaz, ələlxüsus mal-qara çox olan zaman. Ona binaən qeyri qab işlətmək lazım gəlir və bu qeyri qabların hamısından ağ dəmir qabı yaxşıdır. Amma bizim kəndlərdə dəmir qabını tapmaq çətin olduğuna məsləhətdir ki, mis qabı az olsa, saxsı qabı işlətsinlər. Amma gərək saxsı qabın içi şirli ola, ona görə ki, şirsiz saxsı qabını da ağac qabı kimi təmiz etmək çətindir, saxsının da ağacın deşiyi kimi deşikləri olur, o deşikləri şir tutmasa, onlara süd dolub, turşuyub, təzə tökülən südü xarab edir.

Süd sərilən qablar gərək yastı və enni olsunlar. Məsələn, bizim təblə və taxta kimi olsunlar. Nə qədər bu qablar dərin olsa və onların

ağzı dar olsa, ol qədər belə qabda sərilən süddən az qaymaq hasil olar. Xülasə, süd sərilən qab gərək dəyəz və ağzı gen olsun və bu qabları hər dəfə isti su ilə və kül ilə gərək təmiz edəsən, yoxsa onun içində qalan süd turşuyub, təzə sərilən südə dəyib, onu da turşudar.

İmtahan ilə biliblər ki, otaqda on dərəcə, yəni on qradus isti olsa, yə'ni qışda bizlər sakin olduğumuz otaqların istiliyi olsa, ol vaxtda iyirmi, ya iyirmi dörd saat süd zikr olan qablarda saxlansa, o südün tamam qaymağı üzünə yığılır. Əgərçi südü belə otaqda qırx səkkiz saat da saxlamaq olur və südü artıq saxladıqcan qaymağın da qədəri artır, amma süd çox zaman sərilmiş qalsa, çürüyüb bilmərrə tələf ola bilər. Yaxşıdır ki, onu iyirmi dörd saatdan ziyadə saxlamayasan və bir də imtahan ilə biliblər ki, əvvəl zaman südün üzünə çıxan qaymaq çox dadlı və xoş iyli olur, amma axırda yığılan qaymaq elə dadlı olmaz. Bu səbəb böyük şəhərlərin yavıqlığında sərilmiş südün üzünə çıxan qaymağı on iki saatdan sonra yığıb, bu əvvəl yığılmış qaymaqdan çox ə'la yağ çalxayıb, ziyadə qiymətə satırlar, sonra on iki saat keçəndə genə təzədən qaymağı yığıb, bu sonra yığılmış qaymaqdan alçaq yağ qayırırlar. Bə'zi kəslər qaymağı südün üzündə ol qədər saxlayırlar ki, qaymaq turşuyur. Sonra bu turş qaymaqdan yağ çalxalayırlar. Amma belə turş qaymağın yağı elə ləzzətli olmaz və az olar. Belə qaymağı turşuyanacan südün üzündə saxlayan kəs elə bilir ki, qaymağı çox saxladıqca onun qədəri də çox olur, amma heç fikir eləmir ki, bu səbəbə onun yağı az və ləzzətsiz olduğuna ondan mənfəət də az olur. Bu səbəblərə binaən qaymağı südün üzündən bir gün bir gecədən, yə'ni iyirmi dörd saatdan ziyadə saxlamaq məsləhət deyil. Əgərçi bir gün bir gecədən sonra qaymağı yığanda onun bir hissəsi südün içində qalır, amma bu üzsüz süd turşumamış olduğuna ondan pendir qayırmaq olur. Bundan savayı onu danaya, buzova və fəhlələrə vermək olur. Amma qaymaq turşuyuncan südün üzündə qalsa, belə üzsüz süd turş olduğuna ondan şordan savayı qeyri şey qayırmaq olmaz və şor tez xarab olan şeydir ki, onu yavıqlıqda böyük şəhər olmasa gərək çölə atasan. Bu səbəblərdən savayı qaymaq südün üzündə çox qalanda süd sərilən qablar və otağın havası turşuduğuna o qablara təzə süd tökən kimi qaymaq əmələ gəlməmişdən o təzə süd turş yerdə olduğuna çürüyər və onun qaymağı az olar. Xülasə, qaymağı tez yığmaq məsləhətdir.

Əgər süd sərilən otağın istisi on dərəcədən ziyadə ola, ol vaxtda gərək qaymağı çox tez yığasan, yə'ni bir gün bir gecə saxlamayasan.

Amma otağın istisi on dərəcədən az olsa, qaymağı bir gün bir gecədən artıq südün üzündə gərək saxlayasan. Xülasə, süd və qaymaq turşumamış qaymaq gərək yığılsın. Nə qədər qaymağın qədəri az oldu ol qədər onun yağı ə'la olur.

Baqisi gələn nömrədə olacaq.

## ELM XƏBƏRLƏRİ

### Evləri sel basmağının zərəri

Bə'zi vaxtda insan sakin olduğu evləri çay, ya qar, ya yağış suyu basıb qərq edir. Belə sel basmağın iki qism zərəri olur. Onların birisini görmək olur. Məsələn, sel basan evlərin çoxu uçub tələb olmağı, ya o evlərdə olan mayəhtacların çürüyüb zay olmağı. Amma onların bə'zisini görmək müşküldür. Ona binaən bu zərər sel basmaqdan əmələ gəlməyi hər kəsə mə'lum deyil. Əvvəlinci qism zərər insanın canına olur. Çünki çox kəslər üçün mal candan şirindir, bu səbəbə mala olan zərəri tez görür, amma cana olanı heç görmür.

İkinci qism zərərdən burada danışıq olacaq. Əvvələn sel basan evlər nəm olduğuna, bu evlərdə sakin olanlara bə'zi naxoşluqlar ariz olur. Məsələn, yatalaq, titrədib-qızdırmaq, isal və yel naxoşluqları bu səbəbdən əmələ gələ bilirlər. Ona binaən belə sel basan nəm evlərin divarları və yeri bilmərrə quruyuncan bu evlərdə sakin olmaq məsləhət deyil. Saniyən, sel ilə belə gələn lil ki, qapı və bacanı basır, onun içində çox kiçik heyvanat və nəbatat olurlar. Su çəkilib gedəndən sonra bu heyvanat və nəbatat fövt olub, çürüyüb havanı xarab edirlər və belə xarab olmuş havanın içində zindəganlıq edən kəslərə hava xarab olmaq səbəbi ilə məzkur naxoşluqlar ariz olurlar. Pəs su çəkiləndən sonra məsləhətdir ki, sel ilə gələn lili yığıb kənar edəsən. Çünki bu lil əkin yerin çox qüvvətli edən şeydir, ona binaən çox yaxşı olar ki, o lili aparıb, əkin yerinə qarışdırasan, yə'ni həmi evləri bəd havadan xilas edəsən, həmi əkin yerin qüvvətli edəsən.

Salisən, həyət-bacanı su basıb sonra çəkilən zaman kiçik göllər qalır. Bu göllərin suyu bir yerdə dayanıb qalmağına binaən çox tez iyiyib xarab olur. Əlbəttə, belə iyimiş suyu içmək olmaz, çünki bu göllərin içində su iyiyən kimi su quyusunun içində qalan sel suyu həmçi-

nin iyiyir. Ona binaən belə su quyusunun suyunu içən kəsə də məzkur naxoşluqlar ariz olur. Bu səbəbə məsləhətdir sel suyu çəkiləndən sonra suyu içilən quyunun suyunu çəkib onu təmiz edəsən ki, bu quyuda ancaq quyudan pəvvarə verən su qalsın ki, bu suyu içmək olsun.

## TƏZƏ XƏBƏRLƏR

İtaliyadan və Firəngistandan xəbər var ki, bu il dağ və sərin olan yerlərdə barama çox olub, amma onların çoxu xarab olduğuna, onlardan ipək az çıxıb. Bu səbəb bu il ipək keçən ildən az olacaq.

* * *

Bu il Avropada və Amerikada buğda az olmaq səbəbi ilə gərək bizim buğda artıq qiymətə getsin.

* * *

Peterburqda iyul ayının səkkizində şam piyinin boçkası 26 manat, neftin cövhəri 2 manat, ə'la inək yağı 8 manat, alçaq yağ 6 manat. Arpa və buğda bahalanıbdır, buğdanın çetveri 11 manat 70 qəpik, arpanınkı 4 manat 20 qəpik.

* * *

Bu il Misirin xədifi Darfor mülkünü alıb, onun soltanı Həsəbalını əsir edib. Keçən ayda soltan Həsəbalını onun üç yüz üryan həbəşi övrətləri ilə gətirib, İskəndəriyyədə xədifi-Misrə təəllüq olan Darüləhmər imarətində sakin ediblər.

* * *

Xədifi-Misir Darfor mülkünü təsərrüf etdiyinə binaən Osmanlı dövləti Misirdən artıq xərc istəyir. Bu barədə xədifin əvvəlinci vəziri Nubar paşa İstanbula danışığa gedib.

* * *

Qəzetlərdə belə bəyan olunur ki, xədifi-Misir Darfor məmləkətini təsərrüf edib, o məmləkətin sərhəddində vaqe olan Vaday mülkünü də zəbt etmək istəyir.

* * *

Zakona müvafiq natarius təsdiq edən vəkalətnamə iki qism olur. Birisi gerbovoy və birisi sadə, yə'ni ağ kağız üstə yazılır. Əvvəlinci qism vəkalətnaməni natarius gərək öz dəftərinə səbt etsin. Ona binaən bu vəkalətnaməni təsdiq etmək üçün o vəkalətnaməni təsdiq elədən kəs gərək natariusa bir manat pul versin, amma sadə kağız üstə yazılan vəkalətnaməni natarius iki qism təsdiq edə bilir. Əgər vəkalətnaməni təsdiq edən kəs xahiş edə ki, vəkalətnamənin məzmunu dəftərə salınsın, ol vaxtda gərək natariusa genə bir manat versin. Elə ki, ol kəs xahiş elədi ki, natarius ancaq onun dəst-xəttini təsdiq etsin, ol vaxtda belə dəst-xətti təsdiq etməkdən ötrü natariusa iki şahı, yə'ni on qəpik gərək versin.

Keçən may ayının beşində Peterburqun okrujnoy sudunda prokurorun sekretarı Maslyankovun ərizəsinə mülahizə olunub. Bu ərizədə Maslyankov bəyan edib ki, natarius Yankin ağ kağız üstə vəkalətnamənin dəst-xəttini təsdiq etməkdən ötrü ondan bir manat pul alıb və vəkalətnaməni dəftərə səbt edib. Amma Maslyankov təvəqqə eləmiş olub ki, ancaq onun dəst-xətti təsdiq olunsun. Bu səbəbə ərizəçi təvəqqe edib okrujnoy sud Yankindən doxsan qəpiyi alıb ona versin və ondan savayı natarius artıq pul almağa binaən zakona müvafiq ona tənbeh olunsun. Bu ərizənin cavabında Yankin cavab verib ki, zakon natariusa izin verib hər bir kağızı təsdiq elədən kəs ilə şərt bağlasın və bu şərtə görə pul alsın, çünki ərizəçi vəkalətnamə təsdiq olunandan sonra bir manat verib, dəftərə qol çəkib, vəkalətnaməni alıb, bundan belə mə'lum olur ki, Maslyankov o bir manatı verməyə razı olub. Ona binaən təvəqqe edib ki, Maslyankova atkaz olunsun. Okrujnoy sud qət edib: natarius Yankinə hökm olunsun ki, Maslyankovdan artıq alınan doxsan qəpiyi qaytarıb Maslyankova versin.

* * *

Bu iyul ayının əvvəlindən Rusiyada keçən zaman işləyən iyirmi və yetmiş qəpiklik və bir manatlıq gerbovoy kağızlarının əvəzində əlahiddə kağızlar və markalar işləyir. Ona binaən hökm-ali olub ki, hər kəs keçən zamanın gerbovoy kağızını saxlamış isə, kağızları kazonnı palatda təzə kağız və markaya bir illik müddətinəcən dəyişdirə bilər.

* * *

"Moskovski vedomosti" adlı qəzet bəyan edir ki, padşahlıq mülklərinin vəzirinin dəftərxanasında balıq tutmaq barəsində təzə qanun bina olunacaq. Bu qanun Rusiyanın qiblə tərəfində və Qafqazda işləyəcək.

* * *

Səmərqəndin yavıqlığında vaqe olan Əfrasiyab düzündə general Abramovun hökmünə binaən yerin altında qədim şeylər axtarırlar. "Birjavoy vedomost" adlı qəzet bəyan edir ki, buçağadək 10 qızıl, 200 gümüş, 500 mis sikkə tapılıb. Ondan savayı bir neçə qədim möhürlər, üzdiklər və sırğalar tapılıb. Bunlardan masəva Abramov otuz qədim yazma kitab satın alıb.

* * *

Keçən iyun ayının 13-də Firəngistanın qiblə tərəfindən vaqe olan Qurunna adlı çay daşıb, bir neçə depertament, yə'ni quberniya, onların şəhərlərilə belə ki, Tuluz adlı şəhər də o cümlədən olsun, qərq edib. Bu seldən 3000 adam fövt olub və 300000000 franka qədər ki, hər frank otuz qəpik olsun, zərər olub.

* * *

Osmanlı dövlətilə İran dövlətinin sərhəd barəsində mübahisələri bu günə olub: 1840-cı sənədə Ərzrum şəhərində yazılan sülhnaməyə görə məzkur dövlətlərin sərhəddi Şat nəhri, yə'ni Şat çayı olub. Ol sülhə görə Şat nəhrinin içində olan Məxməri cəzirəsi və o cəzirədə vaqe olan Məxməri şəhəri İran dövlətinin əlində qalıbdır. Çünki Şat nəhri cari olan yer qumustandır, ona binaən sülhdən sonra Şat çayı zikr olan Məxməri cəzirəsini yuyub, bilmərrə aparıbdır. Şimdi Şat nəhri cari olduğu yer irəliki yer deyil, o nəhr bir qeyri yerdən cari olur. Bu təzə Şat axaq yer ilə qədim axdığı yerlərin arasında əmələ gələn yer üstə mübahisədir. Bu yerin təxmilə tulu 35 və ərzi 2 ağacdır. Bu mübahisəni qət etməkdən ötrü məzkur dövlətlər tərəfindən müəyyən olan komissiya o mübahisəyə baxıb. Şimdi qəzetlərdə söylənir ki, komissiyanın təsəvvürünə görə mübahisənin qət olmağı Avropa padşahlarının birisinə rücu' olunacaq ki, onun qətnaməsinə hər iki tərəf razı olsun. Xəbər gəlir ki, Osmanlı bu əmrə razı olub, amma İran razı olmağı mə'lum deyil.

* * *

"Novosti" adlı qəzet yazır ki, Rusiyada bir icma bina olacaq. Məzkur icmaın qərardadı dövlət təsdiq etməyə pişnəhad olub. İcmaın ismi müsəlman icmaıdır. Onun calisləri müsəlmanlardan olacaq, 1200 adam calis olmağa razı olublar. Onların 180-ı mədyun olub ki, ildə yüz manatdan tutmuş iki yüz manata qədər versinlər. Məzkur icmaın muradı budur ki, Osmanlıya gedən müsəlmanlar geri qayıdıb, Rusiyaya gəlmək xahiş etsələr, onlara kömək etsin, yə'ni yol kirayəsi versin və onlar Rusiyaya daxil olandan sonra özlərinə iş tapıncan onlara kömək etsin.

* * *

Zəngibar hökumətinin soltanı Berqaş bin Səid bu halda Avropada səfər edib, Firəngistanın paytaxtı Parij şəhərindədir. İstanbuldan xəbər var ki, soltan Berqaş öz vilayətinə qayıdan vaxtda Məkkə və Mədinəni ziyarət edəcəkdir. Soltani-Osmani öz imarəti Dolmabaxçanı hazır edib, soltan Berqaşı özünə, yə'ni İstanbula qonaq çağırıb. Çünki soltan Berqaş Məkkəyə İstanbuldan gedəcək və özü vəhabi olduğuna müsəlmanlar onun ziyarətindən narazı olacaqlar. Bu səbəbə çox intizarlıq ilə gözümlüyürlər görək ki, soltani-Osmanı həmişə Məkkədə əsgər saxlayıb ziyarət edənlərə kömək edir öz qonağı soltan Berqaşı nə tövr ilə Məkkəyə yola salacaq. Qəzetlərdə belə söylənir ki, soltan Berqaş vəhabi də olsa, onu ümid var soltan Əbdüləziz əsgər və top-topxana ilə yola salsın.

* * *

Bu il Bonna şəhərində xaçpərəstlərdən əmələ gələn icma məclis edəcək, o məclisdə xaçpərəstlərin məzhəbini bir etmək barəsində danışıq olacaq. Şimdi hər xaçpərəst dövləti öz vəkilini o məclisə göndərir. Osmanlı təsərrüfündə olan Belqrad şəhərindən xəbər var ki, o şəhərin knyazı məzkur məclisə öz tərəfindən Sadə adlı keşişi göndərəcək.

* * *

Badkubədə neftin xalvarı, yə'ni iyirmi pudu 1 manat 50 qəpikdən tutmuş 2 manat 50 qəpik, neft cövhərinin pudu boçkasız 65 qəpik, boçka ilə 1 manat.

* * *

Buğdanın xalvarı, yə’ni iyirmi beş pudu 15–dən 16 manat 50 qəpik, arpanın 8 manat, düyünün pudu 18 şahı, mal ətinin ə’lasının girvənkəsi 6 qəpik, alçağının 5 qəpik, fındığın girvənkəsi 12 qəpik, qozun 4 qəpik, noxud 3 qəpik, qara kişmiş 6 qəpik, sarı kişmiş 8 qəpik, qaysı 2 şahı, stiarin şamı 5 şahı, qəndin pudu 8 manat 2 abbası, yunun pudu 3 manat, pambığın 5 manat 50 qəpik.

## E’LAN

Badkubə şəhərinin “Qafqaz” adlı müsafirxanasında sakin olan Tatosov adlı şəxs hər bir işə vəkil olur və hər bir iş barəsində müftə məsləhət verir.

* * *

Badkubənin çöl şəhərində Şirvan yolunun kənarında təzə tə’mir olunmuş birmərtəbə ev firuş olur. Xahiş edən kəslərdən iltimas olunur ki, ol evin sahibinin ismini “Əkinçi”nin münşisindən soruşsunlar.

* * *

Krasilnikov öz müştərilərinə mə’lum edir ki, sabah onun maqazini Birun şəhərə sobraniyanın müqabilində olan Lalayevin karvansarasına köçəcək.

* * *

Birun şəhərdə bulağın müqabilində Krasilnikovun karvansarasında İtaliyadan gələn Bastiyan adlı kəs mərmər daşından və qeyri daşlardan tə’mir olunmuş şeylər və həmçinin balıqqulağı və onlardan qayrılmış şeylər firuş edir.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Əvvəlinci sənə* *İki həftəlik qəzetdir* *İkinci nömrə*

*Fi 15 rəcəbülmürəccəb, sənə 1292*

* * *

*Fi 5 avqust Rusiya, sənə 1875*

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

*Poşt xərci qəzet basdıran ilədir*

* * *

*Hər kəs öz işləri barəsində bu qəzetdə e'lamnamələr basdıra bilər. Belə e'lamnamələr basdırdan kəslər lazımdır ki, e'lamnamənin hər kəlməsinə iki qəpik versinlər.*




*Hər kəs bu qəzetdə hər bir qism əhvalat barəsində məktublar basdıra bilər və əgər bir şəxs bu gunə məktubatı həmişə göndərməyə xahiş etsə, ol kəs üçün qəzet müftə göndərlənir. Əgər bu məktubların məzmunu qəzetin əvvəlinci nömrəsinin daxiliyyəsində adlanan əhvalatlardan savayı əhvalat ola ya bu məktublarda dövləti-əliyyə və ya qeyri dövlətlərə ya məzhəbə, ya bir ismən adlanan şəxsə dəyən sözlər ola ol vaxtda qəzetin münşisində ixtiyar var o məktubu çap etməsin ya o nalayiq sözləri bərkənar edib sonra çap etsin.*

Qəzet çap olunur Qafqaz vilayətinin Badkubə şəhərində. Hər kəs e'lamnamələr və məktubat göndərmək xahiş etsə, qəzeti çap etdirənin adına göndərsin. Bu qəzeti almaq xahiş edən kəslər qəzetin yuxarıda zikr olan qiymətini lazımdır qəzeti basdıranın adına göndərsinlər və öz adlarını və sakin olduğu yerlərini yazıb mə'lum eləsinlər. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.

"Əkinçi" qəzetinin əvvəlinci nömrəsi gec göndərilməyə səbəb oldur ki, çapxananın hürufatı kəsirdir, bir təbəqəni birdən düzüb çap etməyə çatmır. Ona binaən naəlac qalıb şol vərəqi bir neçə dəfə çap etdirdik. Bu səbəbə əvvəlinci nömrə gec çıxdı.

## DAXİLİYYƏ

Əvvəlinci nömrədə dadistəd edən kəslərin ixtiyarlarından danışdıq. Şimdi onların xərcindən danışaq. Əvvəlinci qism tacir Rusiyanın hər bir yerində bir qədər şəhadətnamə xərci verir, amma ikinci və üçüncü qism tacir verdiyi xərcin qədəri bir deyil. Rusiya beş yerə hissə

olur və hər bir hissə öz təvanasına görə ikinci və üçüncü qism tacirlik xərcin verir. Bizim Qafqaz vilayətin cənab sərdar xəzanə vəziri ilə məşvərət edib belə hissə edib: Tiflis ikinci hissə, Badkubə və Poti şəhərləri üçün üçüncü hissə, Aleksandropol, yə'ni Gömrü, Axalsix, Qori, Yelezavetpol, yə'ni Gəncə, Kutais, Quba, Naxçıvan, Suxum və İrəvan şəhərləri dördüncü hissə və məzkur olanlardan savayı yerlər beşinci hissə hesab olunsun. Əvvəlinci qism ticarət şəhadətnaməsinin qiyməti 265 manatdır. İkinci qism ticarət şəhadətnaməsinin qiymət Rusiyanın əvvəlinci hissəsində 65, ikincisində 55, üçüncüsündə 45, dördüncüsündə 35, beşincisində 25 manatdır, yə'ni bizim Qafqazın Tiflis şəhərində 55, Badkubə və Poti şəhərlərində 45, Gömrü, Axalsix, Qori, Gəncə, Kutais, Quba, Naxçıvan, Suxum və İrəvan şəhərlərində 45. Məzkur yerlərdən savay yerlərdə 25 manatdır. Xırda alış-veriş şəhadətnaməsinin qiyməti əvvəlinci hissədə 20, ikinci hissədə, yə'ni bizim Tiflisdə 18, üçüncü hissədə, yə'ni bizim Badkubədə və Potidə 15, dördüncü hissədə, yə'ni bizim Gömrüdə, Axalsixdə, Qoridə, Gəncədə, Kutaisidə, Qubada, Naxçıvanda, Suxumda və İrəvanda 10 və beşinci hissədə, yə'ni bizim yuxarıda zikr olmayan yerlərdə 8 manatdır. Şəhərdən kənar malı yük ilə gəzdirib satmağın şəhadətnaməsinin qiyməti 15, o yerlərdə malı çiyində gəzdirib satmağın şəhadətnaməsinin qiyməti 6 manatdır. Sənətkarlıq şəhadətnaməsinin qiyməti 2 manat 50 qəpikdir. Amillik şəhadətnaməsinin qiyməti əvvəlinci qism amil üçün 20, ikinci qism amil üçün 5 manatdır. Məzkur şəhadətnamə xərcindən savayı dadistəd edən kəslər hər bir dasitəd olunan yer üçün əlahiddə bilet xərci versinlər. Bilet xərci həmçinin Rusiyanın hər bir hissəsində başqa olur.

**Biletlərin qiyməti**

| Əvvəlinci qism tacirlik üçün | İkinci qism tacirlik üçün | Xırda alış-veriş üçün |
|---|---|---|
| Rusiyanın əvvəlinci hissəsində . . . . . .30 | 20 | 10 |
| İkinci hissəsində . . . . . . . . . . . . . . . . .25 | 17 | 8 |
| Üçüncü hissəsində . . . . . . . . . . . . . . .20 | 15 | 6 |
| Dördüncü hissəsində . . . . . . . . . . . . .15 | 10 | 4 |
| Beşinci hissəsində . . . . . . . . . . . . . . .10 | 5 | 2 |

Yə’ni bizim Tiflisdə əvvəlinci qism tacir üçün 25, ikinci qism üçün 17, üçüncü qism üçün 8 manatdır. Badkubə və Poti şəhərində əvvəlinci qism tacir üçün 20, ikinci qism üçün 15, üçüncü qism üçün 6 manatdır. Gəncə, Quba və sair məzkur olan şəhərlərdə əvvəlinci qism tacir üçün 15, ikinci qism üçün 10, üçüncü qism üçün 4 manatdır və Qafqazın savayı yerlərində əvvəlinci qism üçün 10, ikinci qism üçün 5, üçüncü qism üçün 2 manatdır. Xərcsiz olunan dadistədlərdən gələn səfər danışıq olacaq.

## ƏKİN VƏ ZİRAƏT XƏBƏRLƏRİ

### Mal südündən yağ qayırmaqdan danışacaq

(ibtidası əvvəlinci nömrədə basılıb)

Qolştinya adlı vilayətdə qaymaq sərmək üçün bir ev tə’mir edirlər ki, onun yayda süd sərilən otağı evin şimal tərəfində olur. Bu otağı tağ edib onun içi̇n bişmiş kərpic ilə döşüyüb divarlarını suvaqlayırlar. Bu otağın havasının istiliyi gərək on ya on iki dərəcədən ziyadə olmasın. Elə ki çox isti oldu otağın akoşkaların açırlar ki, şimal tərəfin soyuq havası otağa daxil olub oranı soyutsun. Akoşkaların ələkdən pərdəsi var ki, akoşka açılanda otağa mirçək ya qeyri cücələr girməsin. Yayda çox isti olsa, otaqda buz saxlayırlar ki, oranın havasın soyuq etsin. Məzkur evin qışda süd sərmək üçün bir otağı var ki, onun akoşkaları qiblə tərəfədir. Akoşkalardan gün düşmək ilə otaq qızır. Əgər çox soyuq olsa, otağın peçlərini qalayıb onu qızdırırlar. Süd sağılandan sonra onu ələkdən süzüb təmizləyib palıd ağacından qayrılmış qablarda sərirlər. Bu qablar bizim təknəyə oxşar, onların ağzının genliyi bir arşın və dərinliyi bir çərək olur. Belə qablara yayda südü bir kərədən az, yə’ni iki barmaq dərinliyində payızda və yazda bir kərə yarım və qışda iki kərə dərinlikdə sərirlər. Qışda payızda qabları otağın içində yan-yana düzürlər, amma yayda onları divarlarda mərtəbə-mərtəbə qayırılmış rəflər üstə düzürlər ki, akoşkalar açılan zaman külək onların hamısına dəysin.

Zikr olan qayda ilə südü sərib 24 saatdan tutmuş 36 saatacan saxlayıb sonra onun qaymağını yığırlar. Çünki süd çox zaman sərilmiş qalanda qaymaq turşuyur, amma tez yığılanda onun qədəri az olur, ona binaən Qolştinyada qaymağı pıçaq ilə qalxızıb südə baxırlar. Əgər süd

çox duru oldu, onun rəngi göy oldu qaymağı tez yığırlar. Çünki yağış yağan və ildırım şaxıyan vaxtda süd tez turşuyur, ona binaən bu vaxtda sərhesab olmaq gərək ki, süd turşuyub xarab olmasın. Qaymağı ağac qaşıq ilə yığırlar, qaşığın ağzı gen və dayaz olur. Yığılmış qaymağı bir az saxlayıb, yetişdirib sonra ondan yağ çalxayırlar. Ona binaən ki, yetişmiş qaymaqdan yağ tez hasil olur. Onu yetişdirən zaman sərhesab olmaq gərək ki, turşumasın, turşusa, yağ az olur. Qaymağın yetişməyin belə bilmək olur: bir kiçik taxtanı onun içinə salıb çıxarırlar, əgər yetişmiş isə taxtadan az damcılayır ona binaən ki, o yetişəndə qəlizləşir və bir də onun yetişməyin dadmaq ilə bilmək olur. O yetişəndə təmi bir az turşlanır.

Belə yetişmiş qaymağı nehrəyə töküb çalxayırlar. Qolştinyada nehrə əvəzinə çəllək iştədirlər. Onun böyüklüyü qaymağın qədərilədir. Qaymaq çox olsa, çəllək gərək böyük olsun. Çəlləyin içinə bir ərrabə oxu kimi ox keçirdirlər. Oxun ortasında ki, çəlləyin içində olsun ərrabə topu kimi top var. Bu topa taxtadan çarxlar möhkəm ediblər. Ox fırrananda çarxlar da fırranır, çəlləyin böyründən ağzını açıb onun içinə qaymağı töküb, genə bərkidirlər. Çəlləyin oxuna dəstə möhkəm edib o dəstəni əl ilə ya at ilə fırrandıran zaman oxun çarxları qaymağın içində dolanıb onu çalxayır. Qaymağı çəlləyə tökəndən irəli onu bir qaba töküb su içinə salırlar ki, onun istisi dəyişilsin. Qışda isti və yayda soyuq suya salırlar. Əgər yayda soyuq su olmasa, qaymağın içinə buz salırlar. Xülasə, bu qayda ilə qaymağı su içində ol qədər saxlamaq gərək ki, qışda onun istiliyi 15 dərəcə və yayda 10 dərəcə olsun, amma çəlləyin içinə isti ya soyuq su tökmək olmaz, ona binaən ki, qaymaq dövrələndikcən gec çalxalanır. Çəlləkdən yağı çıxarıb sıxıb bilmərrə süddən aralayırlar, sonra onu duzlayırlar. Gərək duz narın, quru və təmiz olsun və hər bir girvənkə yağa bir miskal yarım duz səpib zirzəmidə saxlayırlar. Yağ yaxşı sıxıldıqca gec xarab olur. Belə yağı bizim şit kərə kimi iştədirlər. Belə yağ ziyadə ləzzətli olur, amma yuyulmadığına üç-dörd günə xarab olur. Satmaq üçün yağı su ilə yuyub bərk duzlayıb palıd ağacından qayrılmış çanaqlara doldurub qeyri yerlərə satılmağa göndərirlər. Belə saxlanan yağ çox qalır. Qolştinyada süd sərilmək üçün tə'mir olan evin yanında gərək mətbəx olsun su qızdırıb qabları yumağa, zirzəmi olsun yağ, pendir saxlamağa və buzxana olsun buz ilə qaymağı soyutmağa.

Baqisi gələn nömrədə

## ELM XƏBƏRLƏRİ

### Meşə olan yerə ziyadə yağış yağmaqdan danışır

Çünki meşə olan yer həmişə kölgə və sərin olur, ona binaən belə bir yer açıq, yə'ni meşəsiz yerdən nəm olur. Yoxsa çox adam elə fikir edir ki, meşə yerinin nəm olmağına səbəb o yer həmişə kölgə və sərin olmağıdır. Amma imtahan ilə bilmək olur ki, o, yerin artıcaq nəm olmağına bir səbəb də o yerə artıcaq yağış yağmaqdır. Bir yerə yağışın çox ya az yağmağını bir əsbab ilə imtahan edirlər ki, şol əsbabın adına yağış ölçən deyirlər. Yağış ölçən bir ağzı gen və dibi dar qabdır ki, onun ağzının genliyi mə'lumdur. Məsələn: tuli və ərzi bir arşındır. Bu qabı bir yerə möhkəm edib onun ağzını açırlar və hər yağış yağan vaxtda o qabın içinə tökülən suyun qədərin bilib demək olar ki, o qabın ağzı boyda bir yerə nə qədər yağış düşübdür. Bu imtahanı bir il sərasər edib bilmək olur ki, filan şəhərdə, məsələn, bir arşın ərzi və tuli olan yerə nə qədər yağış suyu düşüb. Ol vaxtda deyirlər ki, ol yerə ildə bir arşın ya on arşın yağış düşür, yə'ni şol yerə düşən yağışın suyunu yığıb bir il saxlayıb o yerə birdən tökəndə o suyun dərinliyi bir arşın ya on arşın olur. Belə imtahanı edən kəs gərək o yerin havasının nəm ya quru olmağını və hündürlüyünü bilsin. Havanın nəmliyini bilmək üçün qeyri əsbab iştənir. Keçən 1874 sənənin fevral ayından iyul ayınacan Firəngistanın Qalat adlı meşəsində məzkur imtahanı ediblər. İki yerdə yağış ölçən möhkəm ediblər ki, hər iki yerin hündürlüyü bir olsun. O yerin birisi meşənin içində və biri meşəsiz yerdə olub. Fevralın əvvəlindən iyulacan o yerlərə düşən yağışın qədərini biliblər. Meşədə olan yerə 192 millimetr, yə'ni bir arşının yüzdən iyirmi yeddi hissəsi qədərdə yağış düşüb. Bu imtahandan belə mə'lum olur ki, meşə olan yerin nəm olmağına səbəb o yer kölgə və sərin olmaqlığından savayı o yerə artıcaq yağış yağmağı bais olur.

## TƏZƏ XƏBƏRLƏR

Vəba naxoşluğunun səbəbi şol naxoşluq düşən yerin havası xarab olmaq ilədir və havanın xarab olmağını bir neçə yol ilə bilmək olur, o cümlədən onu o yerlərdə olan quşların uçub getməyi ilə bilmək olur. Quşların bədəni çox zərif olduğuna onlar vəba naxoşluğu bir yerə

düşəndə bir neçə gün irəli o yerdən uçub gedirlər. Peterburqda, Prussiya dövlətinin bir neçə yerlərində və qeyri yerlərdə imtahan olunub ki, vəba aşkar olandan bir neçə gün irəli o yerlərdə olan sərçələr, qarğalar və qeyri quşlar uçub özgə yerə gediblər.

* * *

Ərəbistan ilə Misrin arasında Süveyş kanalını tə’mir edən mühəndis ki, onun adı Lespesdir bu halda fikir edir ki, Səhrayi-Kəbiri dərya etsin. Şol səhranın tuli 4124 və ərzi 1100 verstdir. Bu səhra Afrika qit’əsinin şimal tərəfindədir. Onun şərqi Misir vilayətidir, şimalı Bərbərstandır, qərbi Dəryayi-mühitdir və cənubu Sudandır. Bu səhra çox böyük olduğuna onun ətrafında olan məmləkətlər bir-birilə ticarət etməyi çətindir. Ələlxüsus belə ticarətə susuzluq və sam yeli Mane olurlar. Ona binaən Lespes qəsd edib ki, bir ticarət icmaı bina etsin və şol icmanın xərci ilə Ağ dəryadan ya Dəryayi-mühitdən arx aparıb səhranı qərq etsin, çünki səhra dəryadan alçaqdır, onu su basacaq. Amma arx uzun olduğuna onu qazmağın xərci çoxdur. Şimdi İtaliya mühəndisləri səhrada plan çəkirlər ki, mə’lum etsinlər hansı tərəfdən gələn arxın xərci az olur.

* * *

Osmanlı dövlətinin borcu çox olduğuna görə xərci gəlirindən ziyadədir. Bu artıcaq xərci görməkdən ötəri təsəvvür var. Əvvəla qeyri dövlətlərin yerlərindən gələn malın gömrük xərcin artırsınlar. Bu çağadək belə malın 100 manat qiyməti olanda 7 manat xərc alınırdı. Şimdi istəyirlər 100 manata 20 manat alsınlar. Saniyən Misrin xərcin artırsınlar. Bu çağadək Misir 1500000 manat xərc verir idi. İndi istəyirlər 3000000 manat xərc alsınlar. Salisən qulluq edən kəslərin məvacibini azaltmaq istəyirlər. Bu məvacibi azaltmaq bu qayda ilə olacaq: vəzirlərə və vali, yə’ni qubernatorlara irəliki məvacibin üçdən bir hissəsin vermək xahiş edirlər və savayı qulluq edən əgər ayda 3000 quruşdan ziyadə məvacib alırsa, onlara şol məvacibin nisfin verəcəkdirlər.

Osmanlı dövləti Firəngistanın paytaxtı Parij şəhərində öz xərci ilə çox adama tə’lim verdirir. Qəzetlərdən belə mə’lum olur ki, elmi-təbiiyyədən savayı elmləri təhsil edənləri qaytarıb geri gətirəcəkdirlər və onlara xərc olunan pul ilə İstanbulda bir böyük məktəbxana, yə’ni universitet bina edəcəkdirlər.

* * *

Keçən cəmadiəlaxir ayının 25-də Moskva şəhərindən yazırlar: hər bir qism rəngin qiyməti dəyişilməyib. Mok qəhvəsinin yumrusunun putu və'də ilə 18 manat, Moskva zavodlarının baş qəndinin putu 7 manat 80 qəpikdən 8 manat 50 qəpiyəcən, Malorus zavodlarının qəndinin putu 7 manat 50 qəpikdən 8 manat 15 qəpiyəcən, qənd qumunun putu 6 manat 40 qəpikdən 6 manat 65 qəpiyəcən. Daşkənd pambığı satılıb 6 manat 60 qəpiyə, Xivə pambığı 7 manata, ipəyin qiyməti dəyişilməyib. Yunun qiyməti qalxıb, yuyulmuş merinos ə'la 34-37 manat, yə'ni 34 manatdan 38 manatacan, miyanə 30-32 manat, alçağı 27-29 manat, yuyulmamış alçağı 10-11 manat, Rusiya yunu, yuyulmuş, ağ 8-9 manat, qara 6 manat 50 qəpikdən 7 manatacan, dəvə yunu 5-5 manat 50 qəpiyəcən.

* * *

Osmanlı dövlətinin Qerdseqovinya adlı vilayətində sakin olan xaçpərəstlər təhmilat artıq olduğuna görə şol təhmilatı vermirlər. Ona binaən ol vilayətin valisi dərviş Paşa bu halda təhmilatı əsgər gücü ıilə cəm edir. Qəzetlərdə yazırlar ki, məzkur əsgər ilə təhmilatları verməyən kəslərin arasında bir neçə dəfə cəng olubdur və hər dəfə çox adam fövt olub.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

| *Əvvəlinci sənə* | *İki həftəlik qəzetdir* | *Üçüncü nömrə* |
| --- | --- | --- |

*Fi 1 şaban, sənə 1292*

* * *

*Hər kəs öz işləri barəsində bu qəzetdə e'lamnamələr basdıra bilər. Belə e'lamnamələri basdırdan kəslər lazımdır ki, e'lamnamənin hər kəlməsinə iki qəpik versinlər.*

* * *




*Fi 21 avqust Rusiya, sənə 1875*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*Poşt xərci basdıran ilədir*

Bu qəzet çap olunur Qafqaz vilayətinin Badkubə şəhərində. Hər kəs e'lamnamələr və məktubat göndərmək xahiş etsə qəzeti çap etdirənin adına göndərsin. Bu qəzeti almaq xahiş edən kəslər qəzetin yuxarıda zikr olan qiymətini lazımdır qəzeti basdıranın adına göndərsinlər və öz adlarını və sakin olduğu yerlərini yazıb mə'lum eləsinlər. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.

"Əkinçi" qəzetinin münşisi mə'lum edir ki, qəzetin əvvəlinci nömrəsi satılıb qurtarıbdır. Ona binaən təzədən qəzet istəyənə o nömrə göndərilməyəcəkdir.

## DAXİLİYYƏ

Bir aydır bizim qəzet çap olunur, amma onu oxuyanların bu çağacan biz çəkdiyimiz zəhmətlərdən xəbəri yoxdur. Əlbəttə, bu işə girəndə o zəhmətləri biz qəbul etmişik. Ona binaən indi onları izhar etməyi lazım bilirik. Amma bizə mə'lumdur ki, bə'zi kəslər bizim işə artıq diqqət edirlər. Bu diqqət edən kəslərə o zəhmətlərdən bir az danışmağı vacib bilirik. Dörd ildir ki, qəzeti çap etməyə izn istəmişik və bu zamanda dünyanı gəzib bu hürufatı tapmışıq. Bu zəhmətlərə heç bir qəzeti öz nəf'indən ötrü çap elədən razı olmaz və əgər qəzet basdırmaqdan bizim muradımız ondan mənfəətbərdar olmaqlığımız olseydi, onun qiymətini gərək iyirmi, bəlkə otuz manat qoyaydıq. Keçən zamanın zəhmətini və xərcini kənarda qoyub şimdi olunan zəhmətlərdən və xərclərdən söyləyək. Bizim müştərilərdən cəm olan məbləğ indi qəzetə olunan xərcə çatışmır və bizim zəhmətimizin əvəzində bu

halda nə ki bizə bir həddə, bir quruş qalmır, bəlkə artıcaq zərər də olur.

Bizim zəhmətimiz həddən çıxıb. Bir mətləbi özümüz yazıb ağardıb çapxanaya vermək ilə zəhmətdən xilas olseydik, çox xoşbəxt olurduq. Amma iş belə düşübdür ki, biz gərək çapxanada da işləyək. Dünyada hər qəzeti beş ya on adam inşa edib onu çap elədən, hərflərin düzən, qələtlərin düzəldən başqa kəslər olur. Amma bu işlərin hamısını gərək mən tək özüm görüm, hətta bizim müsəlman şəhərində bir savadı olan müsəlman yoxdur ki, qəzetə baxıb onun qələtini düzəltsin ya hüruflarını düzsün. Hərgah bu zəhmətlərdən artıq zəhmət olmasaydı, genə bir tövr yola gedərdik. Amma dərd budur bizim elə zəhmətimiz var ki, qeyri qəzet basdıranların onlardan heç xəbəri yoxdur. Əvvələn bu hürufat İstanbulda alınıb. Çünki bizim dildə bə’zi hərflər, məsələn, q, k, r və l artıq işlənir, ona binaən ol hüruflar qəzetə çatışmır. Bu səbəbə bir mətləbi yazan vaxtında nə ki ol mətləbin məzmununu və qeyri əhvalatları yoxlayırıq, amma məzkur hüruflar az işlənməkdən ötrü bə’zi sözləri götürüb onun əvəzində başqa sözlər yazırıq ki, bu sözlərdə məzkur hərflər olmasın. Əlbəttə, belə olan surətdə mətləb biz istədiyimiz kimi vazeh olmur və bunu diqqət edənlər bizə təqsir hesab edirlər. Saniyən bizim məxsusi çapxanamız yoxdur. Qəzetimiz qubernski pravleniyanın çapxanasında basılır. Əlbəttə, özgələr bizim işə özümüz kimi can yandırmır və bu barədə olan kəsirlər bizim təqsirimiz deyil. Pəs, bizə diqqət edənlər, bu qəzetin kəsrini görəndə gülməyin. Gülmək yeri deyil, siz ağlayız ki, bizim müsəlmanların bircə qəzeti də basdırmağa adamı yoxdur.

## ƏKİN VƏ ZİRAƏT XƏBƏRLƏRİ

### Mal südündən yağ qayırmaqdan danışacaq

(ibtidası keçən nömrələrdə basılıb)

Məşhur Qolştinya qaydası ilə süd sərmək üçün tə’mir olunan imarətin xərci çox olduğuna Qossandr adlı kəs südü bir otaqda sərir ki, çox quru və təmizdir, içi taxta ilə döşənibdir və akoşkaları şimal tərəfədir. Bu otaqda qışda buxarı qalır və yayda onun akoşkaların açıb sərin edir.

Əgər ki, belə akoşkaları açmaq ilə otağı soyutmaq olmaz, amma otaq təmiz saxlandığına süd qabları dayaz və enni olduğuna və südü az vaxt sərili saxlamağa binaən orada süd turşumur. Oranın havasını təmiz saxlamaqdan ötrü sərilmiş süddən savayı orada bir şey, məsələn, şor və pənir saxlamır. Hətta bir damcı süd yerə düşəndə o yeri isti su ilə təmiz edib. Xülasə, otağın havasını təmiz saxlayır ki, bu təmiz hava sərilmiş südə dəyəndə onu turşutmasın. Süd sərilən qablar ağ dəmirdən qayrılıb. Onların içinə südü bir barmaq dərinlikdə töküb iyirmi ya iyirmi iki saat sərili saxlayandan sonra qabların altından puçlarını açıb südü süzüb qaymağı yığıb yetişdirib ondan zikr olan Qolştinya qaydası ilə yağ çalxayır. Məzkur qaydalardan savayı soyuq tərəflərdə Şvars qaydası işlənir. Böyük çəlləkləri soyuq su ilə doldurub onların içinə arşın yarım dərinlikdə süd qabını süd ilə doldurub salırlar ki, onun ağzı sudan çölə olsun. Çəlləyin suyuna peydərpey buz salmaqla soyuq saxlayıb, on iki ya otuz altı saatdan sonra qaymağı yığıb, yetişdirib ondan zikr olan qayda ilə yağ çalxayırlar. Çünki məzkur qaydalar ilə südü sərib ondan qaymaq yığıb yağ çalxamağın xərci və zəhməti çoxdur və ondan masəva ildırım şaxıyanda ya qablar təmiz yuyulmayanda süd turşuyub bilmərrə xarab olur, ona binaən Avropa əhli bu halda qaymaq yığmaqdan ötrü maşın işlədir. Ol maşının qiyməti altmış manatdır. Bu maşın araba çarxı kimi girdədir və şol çarx kimi öz oxunun çevrəsinə fırranır. Onun içinə südü töküb çarxı bərk fırrandırırlar ki, bir dəqiqədə dörd yüz dəfə fırransın. Bu zaman yarım saat müddətində südün qaymağı tamam yığılır. Gələn səfər çiy süddən və qatıqdan yağ çalxamaqdan danışacaq.

## ELM XƏBƏRLƏRİ

### Meşə salmaqdan danışır

Meşənin xeyrini hər kəs bilir. Meşədən özümüz odun qırırıq. Onun ağaclarından özümüzə evlər və qeyri şeylər tə'mir edirik. Xülasə, meşədən odun və hər bir qism hacət əmələ gəlməyin hər kəs bilir. Onlardan masəva imtahan ilə bilinib ki, meşə olan yerə ziyadə yağış yağır. Ol səbəbə bu yer artıq nəm olur, yə'ni oranın havasında su buğu

çox olur və belə havada su buğu ziyadə olmağa binaən o yerin yayı çox isti və quraqlıq və qışı çox soyuq olmur və bir də meşə soyuq külək gələn tərəfdə olanda o yeri küləkdən mühafizət edir. Çünki qədim zaman meşə çox olduğuna insan onların xeyrini bilməyib dövlətli adamın pul qədri bilməyən vəliəhdi o pulu tələf edən kimi onları tələf edibdir, ona binaən şimdi meşənin xeyrini bilib hər vilayətdə əl ilə meşə salmağa sə'y edirlər. Çünki bizim Qafqazda bıçaq sümüyə dayanıbdır, yə'ni biz də meşələrimizi qırıb tələf etmişik və hər tərəfdən yayda müsəlman sədası və qışda təzək tüstüsü gəlir, ona binaən lazım bilirik ki, burada meşə salmağın qaydasın bəyan edək. Əlbəttə, bir qüvvətli yeri hasarlayanda orada özbaşına meşə əmələ gəlir. Amma belə meşədə əmələ gələn ağaclar əyri və alçaq olduğuna görə onlardan yaxşı hacət olmaz. Bu səbəbə onun xeyri də az olur. Ona binaən meşəni əl ilə belə salırlar.

Hər ağacın ömrü bir olmaz, məsələn, söyüd ağacı 10 ilə yetişir isə, çinar 60 ilə yetişir. Ona binaən bir kəs, məsələn, palıd ağacından meşə salmaq istəyir isə və imtahan ilə bilir isə ki, palıd 30 ilə yetişir, ol vaxtda meşə salınan yeri 30 yerə hissə edib sonra bir qoruğu, yə'ni bağçanı 3 yerə hissə edir, bağçanın bir hissəsin şuxm edib orada palıd toxumu əkir. Gələn il bağçanın ikinci hissəsin də əkir və üçüncü il üçüncü hissəsin də əkir, sonra meşə yeri ki, 30 yerə hissə olunubdur, onun əvvəlinci hissəsin şuxm edib payızda bağçanın əvvəlinci hissəsində əkilən palıd ağacların çıxarıb o üçillik ağacları meşə yerinin məzkur əvvəlinci hissəsində şitil edir, genə yazda bağçanın əvvəlinci hissəsində palıd toxumu əkir. Payızda meşə yerinin ikinci hissəsin şuxm edib bağçanın ikinci hissəsində olan üçillik palıd ağacların orada şitil edir. Bu minval ilə tamam meşə yerində cərgə ilə və bir-birindən beş və ya altı arşın aralı ağaclar əkir. Belə meşənin bir tərəfində təzə əkilmiş və bir tərəfində otuz illik yetişmiş ağaclar olur. Otuz illik ağacları qırıb, onların yerin şuxm edib bir il taxıl əkib gələn il genə üçillik palıd ağacları ilə şitil edir. Gələn il meşənin ikinci hissəsini qırır. Xülasə, hər ildə onun bir yetişmiş hissəsin qırıb, satıb onun yerin bir il taxıl əkib, sonra şitil edir. Ona binaən daim hər ildə yetişmiş palıd ağacı satır. Belə meşəni yaxşıdır ki, dağların başında ya soyuq külək gələn tərəfdə salasan. Onlar dağlar başında salınmağının xeyri odur ki, bizim bulaqlar və çaylar dağlarda yağan yağış və qar suyundan əmələ

gəlirlər. Dağların başı meşə olduğuna, oraya artıq yağış yağdığına, çayların və bulaqların suyu da ziyadə olur. Onu soyuq külək gələn tərəfdə salmağın xeyri odur ki, soyuq küləkdən o yeri mühafizət edir. Belə meşəni yanğından və mallardan saxlamaqdan ötrü yaxşıdır ki, onun çahar ətrafın xəndək edəsən.

## PYATİQORSKİDƏN MƏKTUB

Rostov və Vladiqafqaz dəmiryolu avqust ayının əvvəlindən Vladiqafqaz şəhərindən Rostov və Rusiya tərəfinə bimane müsafir və yük götürür. Bu il dəmir yol açılmaq səbəbinə ki, kirayə ucuz və müsafir tez və rahat yol gedir. Rusiya şəhərlərindən və qeyri məmləkətlərdən Pyatiqorskda olan mə’dən sularından mənfəət götürmək üçün ol qədər müsafir və naxoş gəlib ki, müsafirxanalardan yer olmayıb və şəhər içində boş evlər küllən kirayə verilib. Məsələn, bir ev ki, beş arşın tuli və dörd arşın ərzi var imiş, 3 manatdan 5 manata qədər kirayə götürüb. Məzkur müsafirlər ki, 2000-dən artıq hesab olunur, bilcümlə hər biri təxminən 300 manat şəhərdə xərc eləsə 600000 manatdan artıq şəhərdə dadistəd olub və əhli-mənfəətə yetişiblər. Heç bir il bu qədər müsafir və naxoş müalicə eləmək üçün Pyatiqorska gəlməmişdir. Bu kəsrət və xalqın bu mərtəbədə cəm olmağına [bais] dəmir yol açılmağıdır. Dəmir yol hər vilayətdən ki, keçib o yerin əhlinin xoşbəxt və sahibi-dövlət olmağına bais olubdur. Ümid etmək olur ki, Badkubənin dəmiryolu qayırılandan sonra Badkubə əhlinin baisi-vüs’əti-ticarət olub Pyatiqorsk sakinlərindən artıq mənfəət versin.

*Heydəri*

## TƏZƏ XƏBƏRLƏR

İngilis dövlətinin yeri cəzirədir ki, bu cəzirə Avropa qit’əsinin şimal tərəfində vaqedir. Bu cəzirə ilə Firəngistanın arasında bir Lamanş adlı dərya var ki, onun ərzi 73 verstdir. Firəngistanın və ingilisin dövlətli kəsləri iki icma bina ediblər ki, o dəryanın altından quyunun içi ilə bir dəmir yol saldırıb məzkur məmləkətləri qovuşdursunlar.

Ol dəmiryolunun tuli 75 verstdən ziyadə olacaqdır. Onun xərci 85000000 manatdan artıq olacaq. Məzkur icmalar o yolu bu şərt ilə tə'mir edəcəkdirlər, o yol qurtarandan sonra 30 il onların ixtiyarlarında qalsın, yə'ni 30 illik nəf'i onların olsun və sonra o yol ingilis və firəng dövlətlərinə yetişsin.

* * *

Keçən nömrədə Qerdseqovinədə olan cənglərdən xəbər verdik. Ol vilayət Bosna vilayətinin bir hissəsidir, onun 300000 qədər sakini var. Onların çoxu slavyan millətidir. Çünki o yerin ətrafında vaqe olan Serb və Qaradağ əyalətləri həmçinin slavyandırlar və qədim zaman Osmanlıya tabe olublar, ona binaən məzkur əyalətlərin əhli gizdin sərhəddi keçib Qerdseqovinə sakinlərinə kömək edirlər. Bu səbəblərə məzkur cəng şiddət edib və Osmanlı hər tərəfdən oraya əsgər göndərib.

* * *

İstanbuldan ingilis qəzetlərinə tel var ki, vəzirlərin məclisində sultanın xətti-şərifi oxunub. Ol xətti-şərif hökm edir ki, Osmanlı dövlətinin hər vilayətində karxanalar və zavodlar tə'mir etməyə binagüzarlıq olunsun. Həmçinin hər vilayətdə təzə yollar salınsın. Ondan savayı məzkur xətti-şərif ilə hökm olunub ki, sultanın öz məxsus xərcinə İstanbuldan Bağdada dəmir yol aparılsın.

* * *

### Qışda soyuq torpağa daxil olmaqdan xəbər verir

Bu 1875-ci sənənin yanvar ayında Firəngistanın Parij şəhərinin millət bağında Bekkeril adlı kəs imtahan ilə aşkar edib ki, göy ot, yə'ni çəmən bitən yerə soyuq az daxil olur, amma açıq, yə'ni ot olmayan yerə artıq daxil olur. Məsələn, havada 12 dərəcə soyuq olan zaman açıq və çəmənli yerləri yarım arşın dərinlikdə qazıb onların soyuqluğuna baxanda görmək olur ki, çəmənli yerdə yarım arşın dərinliyində 1dərəcə soyuq var, amma açıq yerin arşın dərinliyində 6 dərəcə soyuq var. Bu səbəblərə binaən məzkur Bekkeril bağbanlara məsləhət edir ki, əgər qumustan yerdə soyuq olduğuna orada əkilən meyvə ağacları soyuqdan xarab olur isə o ağacları bəlimə ya qeyri şeylərə bükməkdən o ağacların dibində çəmən əkmək yaxşıdır. Bu çəmən onların köklərini soyuqdan mühafizət edib, qoruyub, tələf olmaqdan saxlar.

* * *

Parij şəhərində 1867-ci sənənin sentyabr ayından dekabr ayının axırınacan, yə'ni dörd ayın müddətində 535, amma 1869-cu sənənin zikr olunan aylarında 626 və 1872-ci sənənin məzkur aylarında 1144 və keçən 1874-cü sənənin zikr olan aylarında 1000 nəfər at, eşşək və qatır əti yeyib. Bu siyahıdan belə mə'lum olur ki, at, eşşək və qatır əti Parij şəhərində gün-gündən ziyadə yeyilir. Həmçinin Firəngistanın qeyri şəhərlərində şimdi məzkur ət artıcaq yeyilir. Əvvəl zaman şikəst olmuş heyvanları kəsirlər imiş, amma indi qəssablar sağ və işə gedən atın birisinə əlli manata qədər pul verib onu kəsib ətini satırlar.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Əvvəlinci sənə* *İki həftəlik qəzetdir* *Dördüncü nömrə*

*Fi 15 şaban, sənə 1292*

* * *

*Hər kəs öz işləri barəsində bu qəzetdə e'lamnamələr basdıra bilər. Belə e'lamnamələri basdırdan kəslər lazımdır ki, e'lamnamənin hər kəlməsinə iki qəpik versinlər.*

* * *




*Fi 5 sentyabr Rusiya, sənə 1875*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*Poşt xərci qəzet basdıran ilədir*

Bu qəzet çap olunur Qafqaz vilayətinin Badkubə şəhərində. Hər kəs e'lamnamələr və məktubat göndərmək xahiş etsə qəzeti çap etdirənin adına göndərsin. Qəzet almağı xahiş edən kəslər qəzetin yuxarıda zikr olan qiymətini lazımdır qəzeti basdıranın adına göndərsinlər və öz adlarını və sakin olduğu yerlərini yazıb mə'lum eləsinlər. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.

Məktubat göndərənlərdən iltimas edirik ki, onları müxtəsər və aydın yazsınlar.

## DAXİLİYYƏ

Tiflisdən Badkubəyə dəmiryolu tə'mir olunmağı xalqa mə'lumdur. İndi Peterburq qəzetləri bəyan edirlər ki, onun tuli 520 verst olacaqdır. Onu Tiflisdən Poti şəhərinə dəmiryolu tə'mir edən icma tə'mir edəcək. Onun xərci 221 58000 manat, yə'ni hər verstə 42537 manat olacaqdır. Onun stansiyalarının yeri Tiflisdə və Badkubədə mə'lum deyil, amma mə'lumdur ki, Badkubədən dərya kənarı ilə gedəcək Hacıqabula, Hacıqabuldan o yana hansı tərəfdən getməyi genə yəqinən mə'lum deyil. Ya Kür çayının kənarı ilə ya da dağ ətəyi ilə gedəcək. Əgər Kür kənarı ilə get getsə, Cavaddan yuxarı gedib Molla kəndindən, Zərdabdan keçib Pirəzəyə gedəcək oradan Kürü keçib Çinlidən, Gorandan Gəncəyə gedəcək və əgər dağ ətəyi ilə getməli olsa, Hacıqabuldan gedəcək Paşalıya, Qaraqaşlıya, Qarasaqqallıya, Qarabucağa, Məlik kəndinə, Çiyniyə, Mixaya, Qarautana, oradan Kürü keçib, əgər iğləyədən, Təkqayadan, Dəli titlidən Gəncəyə gedəcək.

Bu iki tərəflərdən ümid çoxdur ki, Kür kənarilə getsin. Gəncədə stansiya şəhərin şimal tərəfində olacaq, oradan gedəcək Tovuza, Ağstafaya, Salahlıya, oradan genə Kürü keçib Dəmirçi Həsənlidən, Hacılıdan, Axtalıdan, Tiflisə gedəcək.

dəmiryolunun xalqa nəf'i olmağı mə'lumdur. Hər kəs beş gün poşt ilə gedilən yolu bir günə rahat gedir. Ondan masəva bizim yerlərimizdən və mallarımızdan hasil olan şeyləri bir az kirayə ilə Tiflis və Badkubə şəhərlərinə və qeyri yerlərə aparıb artıq qiymətə satmaq olur. Ona binaən bizim indi az mədaxil götürən yerlərimiz birə-beş artıq mədaxil götürəcək. Əlbəttə, bu xeyirləri hər kəs vaxtında görüb biləcəkdir. İndi onlardan danışmağımıza səbəb oldur ki, bizə mə'lumdur bir neçə dövlətli kəslər xahiş edirlər dəmiryolu gedən yerlərdə bəyzadələrin məxsusi yerlərin alıb onları dövlət tərəfindən olan mərhəmətdən məhrum etsinlər. Ona binaən vacib bilib bəyzadələrimizi sərhesab edirik ki, məzkur yerlərdə ya onların yavıqlığında olan yerlərini satmayıb dəmiryolu tə'mir oluncan saxlasınlar ki, ol vaxtda onlar birə-beş artıq qiymətə gedəcək.

* * *

Keçən nömrədə bizə diqqət edənlərə öz zəhmətlərimizdən danışdıq. İndi aşağıda zikr olan Tabasarandan göndərilən qəzəli basdırmaqlıq ilə onlara göstərmək istəyirik ki, bizim oxuyanlar hamısı bizə diqqət etmirlər. "Əkinçi" qəzetinin şükrnaməsi:

**Q ə z ə l**

Xoşa kim qıldı Bakidə qəzet bünyadını mə'mur
Zəbani-türk ilə nabud ikən bir fazili-məşhur,
Cənabi-xaceyi-darülfünun əllamə Zərdabi
Məlikzadə Həsən bəyin xətri hər dəm ola məsrur.
Həmiyyətkeş olub əhli-vətəndən ötrü bişübhə
Qazandı o bu niknamı olsun daima məzkur.
Səvadır şükr ona cümlə müsəlmanani-Qafqazdan
Ki onlara qəraibdən verir o növbənöv mə'tur.
Xüsusən əhli-Dağıstanə ən'ami-əzimdir bu
Ki qəflətdən oyanmaq oldu hala onlara meysur.
Lihəza bu cəhətdən eylərəm ərzi-təşəkkür mən
O alişanə rəbbim etsin ani xeyr ilə mə'cur.
Görüb Məmnun ki, olmuş ol qəzet tarixi ya qəffar (1292),
Rica etdi qüsuri ol xüsusda həm ola məğfur.

## ƏKİN VƏ ZİRAƏT XƏBƏRLƏRİ

### Süddən yağ qayırmaqdan danışır

(ibtidası keçən nömrələrdə basılıb)

Saniyən çiy, yə'ni bişməmiş süddən yağ qayırmaq. Yağı çiy süddən belə çalxalayırlar: təzə sağılmış südü 10 ya 12 saat saxlayıb soyudub sonra nehrəyə töküb çalxalayırlar. Doğrudur belə çiy südün qədəri ziyadə olduğuna ondan yağ çalxamağın zəhməti də artıqdır. Ona binaən sağmal mal 30-dan ziyadə olsa, ya gərək ol qədər süddən maşın ilə yağ çalxayasan, ya onu sərib onun qaymağından yağ çalxayasan. Amma mal 30-dan az olsa, çiy süddən yağ çalxamaq məsləhətdir, ol səbəbə ki, əvvələn çiy süddən yağ çox olur. Məsələn, bir qat çiy süddən 11 girvənkə yağ çıxsa, o südün qaymağından ancaq 10 girvənkə yarım yağ çıxar. Saniyən süd otağını isti ya soyuq etmək lazım deyil, ona binaən ki, süd orada az saxladığına südün turşumaqdan baki yoxdur. Salisən ildırım şaxımaqdan süd xarab olmaz, amma qaymaq üçün sərilən süd xarab olur. Rabiən pişəzvəqt qaymaq hasil olduğu vaxtı bilmək olmaz, amma süddən neçə saatdan sonra yağ çalxanmağın pişəzvəqt bilmək olur. Xamisən az mal saxlayan kəs üçün qaymağın qədəri az olduğuna hər gündə yağ çalxalamaq müşküldür. Amma süddən hər gündə təzə yağ çalxamaq olur. Sadisən çiy süddən yağ çalxayanda yağı yığılmış süd ayran kimi turş olmadığına ondan pendir və qeyri şeylər qayırmaq olur.

Salisən qatıqdan yağ qayırmaq: bizim Qafqazda hər kəs qatıqdan yağ çalxamağı bilir. Ona binaən onun qaydasını burada bəyan etməyi lazım bilməyib onun zərərini bəyan edirik. Əvvələn bizim nehrələri təmiz etmək müşküldür. Saniyən südü süzmədiyimizə onun qab və qaşığını təmiz saxlamadığımıza onun yağı da natəmiz olur. Bu səbəblərə bizim yağın rəngi və dadı yaman olduğuna o tez xarab olur. Salisən bizim yağ az olur. Məsələn, bir qab süddən Qolştinya qaydası ilə dörd girvənkə yağ çıxsa, bizim qayda ilə ondan ancaq üç girvənkə yağ çıxır, yə'ni bizim yağın dörddən bir hissəsi süd qatığa dönmək səbəbilə tələf olur. Rabiən ayranımız turş olduğuna ondan şordan savayı bir şey qayırmaq olmur və şorun heç bir maliyyəti yoxdur.

Zikr olan yağ qayırmaq qaydalarına baxıb bəyan elədik ki, bizim Qafqazda işlənən qayda nə səbəblər ilə onların hamısından yamandır.

İndi görək o qaydaların hansını Qafqazda işlətmək yaxşıdır. Dağlar başında soyuq bulaqlar kənarında sakin olan kəslərə məsləhətdir ki, sağmal malı çox olsa, Şvars qaydasını işlətsinlər və əgər buz tapılmasa, çəlləyin içinə soyuq bulaq suyu töksünlər. Çünki bulağın suyu çəlləyin içində dayanıb duranda istilənib südü turşudur, ol səbəbə yaxşıdır ki, çəlləyin altında bir deşik qayırasan ki, bulağın suyu yuxarıdan girib aşağıdan çıxmaq ilə çəlləyin içində dayanmayıb axmağa binaən qızmasın. Aran yerlərində mal-qarası çox və tavanası artıq olan kəslərə Qolştinya qaydasın işlətmək məsləhətdir. Bu qaydanın ümdə xərci imarətə olur. Onu gərək ki, iki mərtəbə kərpicdən ya daşdan tə'mir edəsən, onun aşağı mərtəbəsi bizim qazmalar kimi yer altında akoşkaları şimal tərəfə və otaqları tac olur. Üst mərtəbə yerin üzündə və akoşkaları qiblə tərəfə olur. Onun alt mərtəbəsində yayda və üst mərtəbəsində qışda məzkur qayda ilə süd sərilir ya aranda mal-qarası çox olan kəsə məsləhətdir ki, yağı çiy süddən maşın ilə çalxasın. Aranda ya dağda sağmal malı az olan kəslərə məsləhətdir yağı çiy süddən ya Qossandr qaydası ilə çalxasınlar. Qossandr qaydasının ümdə xərci süd sərilən qablara olur. Ol qablar bizim məcməyi kimi yastı və ennidirlər. Xülasə, bizlərə vacibdir zikr olan qaydaların birisilə yağ çalxayaq, yoxsa südümüzü qatığa döndərməyə binaən yağımızın dörddən bir hissəsin tələf edib özümüzə artıq zərər edirik.

## ELM XƏBƏRLƏRİ

Keçən nömrələrdə meşə olan yerə yağış ziyadə yağmaqdan danışdıq. Əlbəttə, yağış artıq yağdıqcan o yerin ab-havası təğyir tapıb insanın bədəninə artıq nəf' edir. Pəs yağışın ziyadə yağmağının həmi əkin və ziraətə, həmi insanın bədəninə nəf'i var imiş, ona binaən hər yerdə meşə salmaq vacib imiş. Çünki məzkur qayda ilə hər yerdə meşə salmaq məqdur deyil, ol səbəb ki, hər yer bir qüvvədə olmaz, bə'zi yer özbaşına meşə bitirsə, bə'zisi bitirməz, ona binaən indi özbaşına meşə bitirməyən yerlərdə meşə salmaqdan danışaq.

Bizim Badkubə uyezdinin qumunu və küləyini görən kəs fikir edir ki, hər yerdə meşə salmaq olsa, burada olmaz. Əlbəttə, bizim xəzri küləyimiz və susuzluq təzə əkilmiş ağacları qurudub tələf edir. Amma insan elm səbəbilə sahibi-dünya olduğuna nə ki xəzriyə və susuzluğa,

bəlkə hər bir şeyə əlac tapar. Badkubə uyezdində adətdir bostanın və bir neçə qeyri əkini xəndək içində əkmək. Belə əkini xəndək içində əkməyin xeyri odur ki, xəzri əkinə artıq zərər etmir. Bu xəndəyi qazmağın zəhməti ziyadə olmaqdan savayı bir az vaxtdan sonra xəndək qum ilə dolmağa binaən genə təzədən xəndək qazmaq lazımdır. Onlardan məsava belə xəndək qazmaq ilə nə ki xəzrinin əsməyinə mane olmuruq, bəlkə onun qabağında olan təpələri qazıb götürmək ilə onun dəxi bərk əsməyinə səbəb oluruq. Pəs nə etmək gərək? Bizim uyezdin qumstanında təkdə bir ələfiyyatlar var. Onlar özbaşına hər il əmələ gəlirlər. Bu otlar bizim xəzriyə və susuzluğa vərdiş ediblər. Ona binaən xəndək qazmaqdan o otlardan əkinə hasar çəkmək yaxşıdır. Onların toxumlarını yığıb əkinin xəzri gələn tərəfində cərgə ilə əkib onların daldasında əkin. Əkəndə onlar əkini xəzridən mühafizət edərlər və əgər bu otlar alçaq olmaqlığa binaən əkini küləkdən mühafizət etməsə, ol vaxtda böyük daşları ya üzüm səbətlərin qum ilə doldurub əkin yerinin külək gələn tərəfində cərgə ilə düzüb, hər cərgənin daldasında bir cərgə məzkur otları əkib sonra əkin əkmək gərək. Bu daşlar və səbətlər külək gətirən qumları saxlamağa binaən orada təpələr əmələ gəlir ki, o təpələr xəndək kimi əkini xəzridən mühafizət edir. Şol təpələrin daldasında məzkur otlar bina tutandan sonra onların yayında bizim qumstanda pərvəriş tapan əncir, nar, tut, söyüd və qeyri ağaclar əkəndə otların yanında ol ağaclar həmçinin bina tutar. Doğrudur belə ağacları bitirtməyin zəhməti çoxdur, onları quyu suyu ilə vaxtında sulamaq lazımdır. Amma bu zəhməti qəbul edib onları bitirdəndən sonra onların kölgəsində təzə ağaclar əkmək ilə tamam Badkubə uyezdini bağat etmək olur. Ol vaxtda xəzrinin qumundan və susuzluğundan xilas oluruq; yerlərimiz abad və bədənimiz sağ olur.

## MƏKTUB

Cənubi Tabasaran mahalının naibi kağız ilə bəyan edir ki, keçən rəcəb ayının 10-da Mustafa bəy Karçakskiyə təəllüq olan Kor kənd adlı qəryədə yanğı olubdu. Xərmən payalinlərin çubuğundan xərmənə atəş düşüb. Oradan tayalara, samanlıqlara və kəndin evlərinə od düşüb. Ona binaən ki, bir-birinə yapışıb və qarışıq olublar. Çünki kəndin evləri köhnə, bir-birinə müttəssil və küçələri dar olub və ol zaman

ruzgar, yə’ni külək bərk olub, ona binaən əgər ki, okruqun naçalniki knyaz Orbelyanov öz çinovnikləri ilə kəndin əhlinə köməyə gəlmiş isə də, ol kənddən altmış bir ev və bir məhəllə məscidi lap yanıb və on doqquz evin bə’zi ətrafı, samanlıqları və taxılı yanıb. Xülasə, o yanğından 24439 manata qədər zərər olub və üç nəfər zükur qisminə ağac dəyib yaralayıb.

* * *

Bizim şəhərlərin birisindən bir şəxs kağız ilə bəyan edir ki, ol yerdə bikar və biməşğələ kəslər hədyanat və cəfəngiyat söyləməyə vərdiş edib zarafatkarlığa və həcvguluğa adət ediblər. Belə həcvguluq, yə’ni hədyan danışmaq nücəba arasında artıb. Ona binaən belə hədyan danışmaqlıq bizim şəriətə namünasib olmağından və bizim zəmanədə zarafatkarlıq və həcvguluq adamı bihörmət edib rütbələrini alçaqlandırmaqdan danışıb iltimas edir ki, ol kağızı bizim qəzetdə basdıraq ki, bəlkə nücəbalar onu oxuyub zarafat etmək və həcvguluq ətrafına dolanmasınlar. Heyf ki, ol kağız uzun olduğuna onu basdırmağa yer olmadı.

* * *

Səmərqənd ilə Qaşğarın arasında vaqe olan Kokan xanlığının xanı bizim Rusiya dövlətinin dostudur. Daşkəndin general-qubernatoru Kaufman tel ilə mə’lum edir ki, qıpçaq və Qaraqırğız tayfaları həmişə məzkur xanın yerinə çapğına gedirlər. Bu il onlar Bulat və Nəzər bəylərin sərkərdəliyi ilə genə çapğına gələndə xan öz əsgərini Əbdürrəhman atabaşının sərkərdəliyi ilə onların qabağına göndərib. Amma Əbdürrəhman əsgəri ilə belə dönüb xanın düşmənlərinə qarışıb. Ona binaən xan rəcəb ayının 3-də Rusiya sərhəddinə qaçıb. Ol vaxt onun düşmənləri onun dalınca Rusiya yerinə daxil olub qəzavət başlayıb, Daşkəndin ətrafını qərq ediblər, sonra məzkur general onları rus sərhəddindən çıxarıb indi əsgər ilə Kokan şəhərinə gedir.

* * *

Qerdseqovinədə olan cəng dəxi şiddət edib tamam Osmanlı ixtiyarında olan slavyanlar onlara kömək göndərməyə binaən onların 15000-dən ziyadə əsgəri olub. Rus, Prus, Avstriya, İngilis, Firəng və İtaliya dövlətlərinin konsulları öz aralarında məşvərət edib Qerdseqovinədə gediblər onların xalqına mə’lum etsinlər ki, məzkur dövlətlər onların bu

rəftarından razı deyillər. Ol səbəbə onlar ümid olmasınlar ki, onlara kömək edəcəklər və öz ərizələrini Osmanlı tərəfindən göndərilən şəxsə etsinlər və Osmanlı dövləti o ərizələrə mülahizə etməkdən ötrü Sərvər paşanı göndərib. Amma bununla belə hər iki tərəf cəng üçün bərk tədarük edir.

* * *

Cəmadiələvvəlin 9-da Kutais quberniyasının Ləmçox uyezdində dağlarda sakin olan svanet tayfası ki onların qədəri 15000-dir, öz naçalniklərinin sərəncamlarından narazı olmaqlığa binaən əsbab-əsləhə götürüb dövlət üzünə ağ olmuşlar imiş və Kutais qubernatoru əsgər ilə oraya göndərilmiş imiş. İndi qəzetlər bəyan edirlər ki, cənab qubernator gedib xalqa dövlət tərəfindən olan hökmləri aşkar edəndən sonra xalq onları qəbul edib yaraqlarını atıb evlərinə dağılıblar və cənab qubernator əsgərlər ilə geri qayıdıb.

* * *

Peterburqda bir neçə dükanlarda belə dadistəd edirlər. Dükançı bir dəftər saxlayıb ki, hər müştəri verdiyi məbləğin qədərin oraya yazır, sonra dükançı hər 20 manata ol müştəriyə 1 manat verir.

* * *

Krımın Qarasubazar şəhərində rəcəbin 27-də qaz yumurtasından böyük dolu yağıb hər dənəsi bir girvənkədən ziyadə olub. Evlərin üstə olan kələnəkləri tamam qırıb, ağacların yarpaqlarını və budaqlarını töküb. Dolu ol qədər olub ki, bir gün bir gecə əriməyib qalıb.

* * *

Peterburqda rəcəbin 29-da piyin boçkası 50 manat, ə’la inək yağı 8 manat, Amerikadan gələn neft cövhəri 2 manat 10 qəpik, Amerika pambığı 8 manat 50 qəpik, buğdanın çetveri 11 manat, ə’la arpanınkı 8 manat. Çuval ilə belə rus dövlətinin latara biletləri 231 manat.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Əvvəlinci sənə* | *İki həftəlik qəzetdir* | *Beşinci nömrə*

*Fi 1 rəməzanülmübarək, sənə 1292*

* * *

*Hər kəs öz işləri barəsində bu qəzetdə e'lamnamələr basdıra bilər. Belə e'lamnamələri basdırdan kəslər lazımdır ki, e'lamnamənin hər kəlməsinə iki qəpik versinlər.*

* * *

*Şənbə günü*




*Fi 20 sentyabr Rusiya, sənə 1875*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*Poşt xərci qəzet basdıran ilədir*

Bu qəzet çap olunur Qafqaz vilayətinin Badkubə şəhərində. Hər kəs e'lamnamələr və məktubat göndərmək xahiş etsə qəzeti çap etdirənin adına göndərsin. Qəzet almağı xahiş edən kəslər qəzetin yuxarıda zikr olan qiymətini lazımdır qəzeti basdıranın adına göndərsinlər və öz adlarını və sakin olduğu yerlərini yazıb mə'lum eləsinlər. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.

## DAXİLİYYƏ

Bizim vilayətimizdə hər kəs dad edir ki, zəmanəmizdə xeyir və bərəkət qalmayıb və keçən zamanı yada salıb bayatı çağırır: Keçən günə gün çatmaz calasan günü-günə... Belə bayatı çağırıb şikayət edən kəs heç fikir etmir ki, nə səbəbə zəmanəmiz xeyir və bərəkətsiz olub və ona heç əlac varmı? Belə zəmanəmiz xeyir və bərəkətsiz olmağının səbəblərindən və onların əlacından indi danışaq. Bir tağar yerdən hasil olan taxıl, məsələn, bir adama çatır isə, ol kəsdən sonra onun iki oğlu qalmış olsa, bu iki şəxsə o bir tağar yerin taxılı çatmaz, ya onlar özləri üçün gərək bir tağar da yer alsınlar, ya o bir tağar yerlərini elə qüvvətli etsinlər ki, o yer birə bir ziyadə taxıl bitirsin, yə'ni bir kəsin yerində iki kəs qalanda onlar ya gərək zəhmət çəkib pul qazanıb özlərinə təzə yer alsınlar, ya zəhmət çəkib, atadan qalan yerlərin qüvvətli etsinlər. Xülasə, dünyada insanın qədəri artdıqca zəhmət artır və zəhmət çəkənlər yaxşı zindəganlıq edib ləzzət edirlər. Amma az zəhmət çəkənin zindəganı yaman və ləzzəti az olur. Və bir də xoş güzəranlıq və ləzzət çölə tökülməyib ki, hər kəs axtarıb tapsın. Onları tapmaq üçün gərək dövlət qazanasan. Dövlət qazanmaq istəyən kəs gərək zəhmət çəkib sə'y və kuşiş etsin ki, dövlət qeyri kəslərin əlindən onun əlinə gəlsin,

çünki belə sə'y və kuşişi bir kəs edir ki, ona zindəganlıq etmək və ləzzət çəkmək müyəssər olsun, ona binaən belə sə'y və kuşiş özü bir cəngdir ki, onun adına zindəganlıq cəngi deyirlər. Hər kəs daima belə cəngə məşğuldur. Onda qalib olanlar ləzzət sahibi və məğlub olanlar ləzzətdən məhrum olurlar. Əlbəttə, belə cəng edənlərin, yə'ni insanın qədəri artdıqca zikr olan cəng ziyadə şiddət edir. Çünki dünyada insanın qədəri həmişə artır, ona binaən zikr olan cəng gələcəkdə dəxi ziyadə şiddət edəcək, yə'ni xoşgüzəranlıq və ləzzət tapmaq gələcəkdə dəxi çətinraq olacaqdır. Bu səbəblərə zəmanəmiz xeyir və bərəkətsizdir. İndi görək ona heç əlac varmı? Zikr olan zindəganlıq cəngində tüfəng və xəncər işləməz, güc və rəşidlik iş görməz. Onun əsbabı ancaq ağıldır və ağıl bir şeydir işləndikcən tərəqqi edər, yə'ni elm təhsil etdikcən ağıl da artar. Doğrudur bizim zəmanədə bə'zi vaxtda elmdən və ağıldan bixəbər kəslər sahibi-dövlət olduqlarına xoş güzəranlıq edirlər. Ona binaən şair deyib; Dövlət bəxəran dadənü ne'mət basəgan. Pəs ma bətəmaşayi-cəhan amədəim?[1] Amma onların sahibi-dövlət olmaqlığına səbəb çoxdur. Məsələn, keçən zamanda onların ata-babasından birisi özündən axmağa rast gəlib, özünə qurtarmaz dövlət qazanıb və əgər bizim zəmanədə də elmdən bixəbər kəsə dövlət qazanmaq məqdur isə, ona səbəb oldur ki, ol kəs ilə zindəganlıq cəngi edənlər ondan da dünyada bixəbərdirlər. Bizim zəmanəmiz dəyişilib, biz elm sahiblərinə rast gəlmişik. Bizim ilə zindəganlıq cəngi edən millətlər elm təhsil edirlər. Ona binaən gərək biz də elm təhsil edək ki, onlara zindəganlıq cəngində qalib olmasaq da, onların bərabərində dayanıb duraq, yoxsa dövlət və xoşgüzəranlıq onların əlinə gedəcəkdir və bizlər mürur ilə zindəganlıq cəngində məğlub olub tələf olacayıq. Pəs bayatı çağırıb zəmanədən şikayət edən, sənin bayatından nə hasil? Sə'y et, zəhmət çək, elm təhsil elə ki, dövlət qazanıb xoşgüzəran olasan. Görürəm bu sözləri oxuyan Gülüstani-Sə'dini əlinə alıb oxuyur: Kəs nətəvanəd girift daməni-dövlət bəzur[2].

Əzizim, o söz bəəslən Şirvan Fitdağı sözüdür. Əgər Sə'di bizim zəmanədə olseydi deyərdi:

Hər kəs təvanəd girift daməni-dövlət bəzur[3].

---

[1] Dövləti eşşəklərə vermisən, ne'məti itlərə. Bəs biz dünyaya tamaşa eləməyə gəlmişik?

[2] Heç kəs var-dövlətə zor ilə sahib ola bilməz.

[3] Hər kəs var-dövlətə zor ilə sahib ola bilər.

# ƏKİN VƏ ZİRAƏT XƏBƏRLƏRİ

## Əkin yerindən danışır

Əkin yeri iki qism şeydən əmələ gəlib, birisi cansız şeydən, yə'ni cəmadatdan və birisi canlı şeydən, yə'ni heyvanat və nəbatatdan məxlutə olan şeylərdən əmələ gəlib. Cəmadatdan əmələ gələn şeylər belə əmələ gəlib: daşlar su və külək döyməyə binaən azalıb xırdalanırlar, bu xarda və narın şeyləri yağış suyu ya qeyri su axan zaman aparıb alçaq və düz yerlərdə onlardan torpaq əmələ gəlir. Pəs biz torpaq dediyimiz şey əkin yerinin cəmadatdan əmələ gələn hissəsidir. Əkin yerinin heyvanat və nəbatatdan əmələ gələn hissəsi otların xəzəlləri və heyvanların təzəyi və bədənləri çürüyüb məxlut olmaqlığı ilə əmələ gəlib. Əkin yerində olan cəmadat bir neçə qismdir. Onların üçü ki birisi qum, birisi kül və birisi əhəngdir, hər bir əkin yerində var. Bu üç şeyə əkin yerinin binası demək olur. Onlardan hansının qədəri ziyadə olsa, onun adı ilə əkin yeri adlanır. Məsələn, qumu ziyadə olan yerə qumlu yer deyilir və bir də əkin yerinin xasiyyəti ol şeylər ilədir. Qumu ziyadə olan yer isti olur, yə'ni belə yerə basdırılan toxum tez göyərir, yağışdan sonra tez quruyur. Belə yerə şeh, yə'ni şəbnəm az düşür. Küllü yer soyuq olur, yə'ni belə yerə basdırılan toxum gec göyərir. Yağışın suyunu belə yer canına çox çəkir və gec qurur. Belə yerə şəbnəm ziyadə düşür. Əhəngli yer qumlu yer kimi isti olur, amma küllü yer kimi su saxlayan olur. Zikr olan şeylərdən savayı hər bir əkin yerində gərək qeyri daşlardan əmələ gələn şeylər olsun. Məsələn, qarğaduzu, xörəkdə işləddiyimiz duz, kükürd, soda, dəmir pası. Bu duzlar otlara xörəkdirlər. O duzlar suda əriyəndən sonra onları sorub zindəganlıq edirlər və əgər onlar əkin yerində olmasa, orada otlar üçün zindəganlıq olmaz.

Əkin yerinin canlı şeylərdən əmələ gələn hissəsi iki qismdir. Birisi hava qismi şey və birisi bərk şeydir. Məsələn, bir otu yandıran zaman onun bir hissəsi kül və bir hissəsi tüstü olur və bu şeylərin hər bir qismi otlara xörəkdirlər. Ondan masəva bu şeylər zikr olan duzların bə'zinə dəyəndə onları əridir, yoxsa onlar özləri su dəyməkdən əriməzlər. Xülasə, cəmadatdan əmələ gələn duzlar və canlı şeylərdən əmələ gələn şeylər gərək hər bir əkin yerində olsunlar ki, otlar orada zindəganlıq edə bilsinlər və əgər duzlar və canlı şeylərdən əmələ

gələn şeylər az ya çox olsa, genə olmaz. Gərək onların hər birisinin qədəri lazım olduqcan olsun.

Bir yerdə bir neçə il dalbadal əkin əkiləndə zikr olan otlara xörək olan şeylərin qədəri azaldığına əkin də ilbəil az bəhrə verir. Ona binaən belə yerə genə məzkur şeyləri qarışdırmaq gərək ki, əkin irəliki kimi bəhrə versin. Və bir də hər heyvan bir qism xörək yeməyən kimi, hər əkinin də öz xörəyi var. Məsələn, bir yerdə küncüd bir neçə il dalbadal əkilsə, o yerin küncündə lazım olan xörəyi azaldığına orada küncüd az bəhrə gətirər. Ona binaən o yerdə ya gərək qeyri əkin əkəsən, ya küncüdə lazım olan şeyləri o yerə qarışdırıb sonra küncüd əkəsən ki, küncüd genə yaxşı bəhrə versin.

## ELM XƏBƏRLƏRİ

Bir heyvan öləndən sonra onun əti iyiyən zaman o ətin suyu ki, heyvanın qanıdır zəhər olur. Əgər o qan sağ heyvanın ya insanın qanına dəysə, ol vaxtda onlar zəhərlənib vəfat edirlər. Onun zəhər olmağın belə imtahan etmək olur. Əgər iyirmi dovşanı bir-birinə bağlayıb on gündən ölmüş atın qanından iki damcı onların birisinin ətini yaralayıb ol yaraya tökəsən və iki dəqiqədən sonra əvvəlinci dövşanın yarasından iki damcı qan götürüb ikinci dovşanın qanına qarışdırasan, bu minval ilə onların hamısını yaralayıb birisinin qanını o birisininkinə qarışdırasan, ol vaxtda onlar hamısı ölür. Əgər hər dovşanın qanını bir girvənkə və hər girvənkə qanı min damcı hesab etsək, ol vaxtda əvvəlinci dovşanın beş yüz damcı qanına bir damcı atın qanını töküb ol dovşanın qanından iki damcı ikinci dovşanın qanına qarışdıranda atın qanından ikinci dovşanın qanına bir damcının mində bir hissəsi, iyirminci dovşanın qanına atın qanının bir damcısının min milyondan bir hissə qarışıb, amma onilə belə iyirminci dovşan da ölüb. Pəs ölən heyvanın qanı çox bərk zəhər imiş. Ona binaən iyimiş cəmdəyi əl ilə tərpədəndə sər-hesab olmaq gərək ki, əldə yara olsa, cəmdəyin suyu yaraya dəyməsin və əgər qəfilcən yaraya o su dəymiş ola, ol vaxtda yara qızarmağa başlayanda mə'lum olur ki, ona zəhər dəyib. Belə olan surətdə məsləhətdir ki, yara olan yeri, məsələn, barmağı kəsib atasan.

* * *

Hər malın südü bir xasiyyətdə olmaz, yə’ni bə’zi süd duru və bə’zi qəliz olur. Duru südün suyu və qəliz südün qaymağı çox olur. Ona binaən sağmal mal alan kəslərə məsləhətdir onu alandan irəli onun südünü imtahan eləsinlər. Belə imtahanı yaxşıdır bir şüşə düdük ilə edəsən ki, o düdük dərəcəyə bölünmüş ola. Onun içinə on dərəcə süd töküb onun qaymağı tamam yığılıncan saxlananda əgər on dərəcə süddən bir dərəcə ya on qaşıq süddən bir qaşıq qaymaq əmələ gəlsə, süd yaxşı süddür. Elə ki, onun qədəri az oldu süd yamandır.

* * *

Yayda isti olduğuna heyvanların tükü az və dərisi nazik olur, amma qışda onların tükü çox və dərisi qalın olur. Həmçinin təzə doğulan heyvan əgər yayda doğulmuş isə onun dərisi nazik və tükü az olur. Amma qışda doğulanların tükü çox və dərisi qalın olur. Bu səbəblərə qış dərisi yay dərisindən artıq qiymətə gedir. Ona binaən ki, qışda dərisinin tükü çox olduğuna isti olur və onlar yumşaq və qalın olduğuna onlardan qayrılan şeylər ə’la olur.

* * *

Meyvələrin çürüməyinə səbəb onlara hava dəymək ilədir. Əgər hava dəyməsə, meyvə çürüməz. Ona binaən meyvələri çox saxlamaqdan ötrü yaxşıdır onları havadan mühafizət edəsən. Onları bir neçə tövr ilə, o cümlədən ərimiş muma batırmaqla havadan mühafizət etmək olur. Bir qabda mumu əridib meyvənin saplağından tutub onun içinə salıb çıxarasan. Gərək mum çox isti olmasın. Onu çıxarandan sonra mum soyuyuncan yerə qoymayasan. Onları muma batıranda onların üzündə mumdan nazik pərdə qalır. O pərdə onları havadan mühafizət edir.

## TƏZƏ XƏBƏRLƏR

Volqa vaporu, yə’ni paraxodu Hacıtərxandan Badkubəyə bu sentyabr ayının 24-də gərək gələydi, amma 17-də gəlib. Belə deyirlər ona səbəb oldur ki, sentyabrın 12-də Petrovski şəhərində axşam saat 10-da vaporun kapitanı Buxt öz fəhlələri ilə qovğa edib. O halda ol fəhlələr kapitanı döyübdürlər. Ona binaən kapitanın sərəncamına görə ol fəhlələri ki cümləsi 10 nəfər olubdur, dustaq ediblər və vapor fəhləsiz olduğuna gecikib.

* * *

Quba boyaqçıları cənab sərdara alizarin barəsində verdiyi ərizəyə xəzanə vəzirindən belə cavab gəlib. Alizarini Rusiyaya gətirmək qadağan etmək olmaz. Ona binaən ki, Rusiya karxanaçıları onu işlətməyə öyrənibdirlər. Ondan masəva əgər onu gətirmək qadağan olunsa, onu Rusiyada qayırallar və Rusiyanın öz xalqına onu qayırıb satmağı qadağan etmək olmaz. Həmçinin alizarinin xərcin də artırmaq olmaz. Ona binaən ki, onu artırmaqdan boyaqçılara xeyir də olsa tamam Rusiya əhlinə zərər olur. Ol səbəbə ki, alizarin boyaqdan ucuz olduğuna onun xərcini artıranda Rusiya karxanalarından qayrılan şeylər bahalanır. Əgərçi cənab sərdara vəzir belə cavab edib, amma deyirlər ki, cənab sərdar boyaqçılara bir neçə il kömək etməkdən ötrü bu halda hökm edib ki, yazıb mə'lum etsinlər görək nə qədər qazılmamış boyaq var. Onun keçən illəri və bu il qiyməti, həmçinin fəhlələrin qiyməti nə qədər olub.

* * *

25 ildir Tiflisdə dövlət tərəfindən əkin və ziraət icması bina olub. Onun calisləri məktəbxanalar açıb qeyri yerlərdə işlənən əsbabları imtahan edib öz şagirdlərinə göstərirlər. Bu sentyabr ayının 25-dən oktyabrın əvvəlinəcən məzkur icma öz bina olmağını yad-bud etməkdən ötrü öz calislərini və hər əkinçini qonaq çağırır ki, onlara zikr olan əsbabları və onların işini göstərəcəkdir.

* * *

İstanbuldan “Birjevoy vedomosti” qəzetinə yazırlar ki, Qerdseqovinə buntu aşkar olan zaman Osmanlı dövləti ona məhəl qoymurdu. Elə ki, xəbər gəldi ki, ətrafda olan xaçpərəstlər kömək edirlər və bu işdə slavyan millətinin birləşməyə qəsdi var və slavyanların başçısı Rus dövləti onların tərəfini saxlayacaqdır, ol vaxtda Asiya və Afrika qit'ələrindən əsgərləri İstanbula gətirib gəmi ilə Qerdseqovinəyə göndərdilər. İndi Sərvər paşa İstanbula tel vurub ki, Avropa dövlətlərinin konsulları Qerdseqovinə əhlinə məsləhət edincən ki dava etməsinlər, Osmanlı əsgəri ol yeri tamam zəbt edib.

* * *

Kokanın əhli öz xanları Xudayar rus sərhəddinə qaçandan sonra özlərinə təzə Xanzadə adlı xan zübdə etmişlər imiş. İndi general Kaufman tel vurub ki, bir neçə dəfə düşmənlərin əsgərlərinə faiq gələndən sonra məzkur Xanzadə onun qabağına çıxıb Kokan şəhərini ona təslim edib və ətrafında olan köçərilər tamam itaətə gəliblər.

* * *

Tehrandan "İndipendans Belği" qəzetinə yazırlar ki, bu il şah Şiraza getmək istəyir idi, amma getmədi. Ona binaən ki, orada aclıq var. Bu sözləri yazan deyir, xülasə, İran dövlətinin xəzanəsi boş və xalqının ovqatı təlx olubdur və əgər şah tezlik ilə dövlət işlərinə binagüzarlıq etməsə, işlər xərab olacaqdır.

* * *

Ural kazaklarının yerlərində təzə əsgər qaydasın qoyandan sonra bə'zi şəxslər ol əmrə razı olmadığına binaən hökm olunub ki, onları öz külfətləri ilə tutub Türküstana göndərsinlər və orada onlardan rus kəndləri bina etsinlər. "Nedelya" qəzeti yazır ki, buçağadək bir neçə yüz adam bu səbəbə Türküstana göndərlənib.

* * *

Krımdan "Birja" qəzetinə oranın müsəlmanları Osmanlıya köçməklik səbəblərindən kağız yazan deyir ki, onun ümdə səbəbi oldur ki, onlara Osmanlıya getməyə pasport vermək qadağan olub. Ona binaən müsəlmanlar gizdin dəstə-dəstə qaçıb gedirlər.

* * *

1873-cü ildə Rusiya dövlətinin beş yüz on iki milyon manat mədaxili və beş yüz otuz doqquz milyon manat xərci olub. İndi mədaxili və xərci bərabərdir. Bu halda Rusiyanın iki min milyon manat borcu var, o borcdan iki yüz milyon manat dəmir yollarına xərc olunub.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Əvvəlinci sənə* | *İki həftəlik qəzetdir* | *Altıncı nömrə*

*Fi 15 rəməzanülmübarək, sənə 1292*

* * *

*Hər kəs öz işləri barəsində bu qəzetdə e'lamnamələr basdıra bilər. Belə e'lamnamələri basdırdan kəslər lazımdır ki, e'lamnamənin hər kəlməsinə iki qəpik versinlər.*

* * *

*Yekşənbə günü*




*Fi 5 oktyabr Rusiya, sənə 1875*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*Poşt xərci qəzet basdıran ilədir*

Bu qəzet çap olunur Qafqaz vilayətinin Badkubə şəhərində. Hər kəs e'lamnamələr və məktubat göndərmək xahiş etsə, qəzeti çap etdirənin adına göndərsin. Qəzet almağı xahiş edən kəslər qəzetin yuxarıda zikr olan qiymətini lazımdır qəzeti basdıranın adına göndərsinlər və öz adlarını və sakin olduğu yerlərini yazıb mə'lum eləsinlər. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.

## DAXİLİYYƏ

İnsanın hər bir hərəkatı və fikir dərəcatı beyin ilədir və beyin başda və beldə olur və oradan bədənin hər tərəfinə damarları gedir. Necə ki bir maşının hər bir puçi və digircəyi ol maşın üçün lazımdır və onsuz maşın işləməz, habelə bədənin hər bir əczası ona lazımdır, onsuz bədən iş görməz, yə'ni tələf olur. Bu səbəblərə beynin tələf olmağından bədə`n vəfat edir.

Dünyada olan zəhərlərin hər birisi bədənə bir qeyri cürə kar edir. Məsələn, ilan zəhəri qana qarışmaqlığı ilə və tüstü ağza dolmaqlığı ilə insanı fövt edirlər. Amma tiryak, şərab, bir neçə qeyri şeylər beyinə dəyməkliyilə onu tələf edib insanı fövt edirlər.

Belə beyinə kar edən şeyləri az yeyən vaxtda onlardan bir nəş'ə, yə'ni kef hasil olur. Məsələn, iki ya üç stəkan çay, bir ya iki fincan qəhvə ya bir kiçik stəkan dilgüşa və süxəngu, yə'ni kefli edir. Ol şeylərin bə'zində məzkur zəhər az olmağa binaən onlar bədənə zərər etmirlər. Məsələn, çay, qəhvə, tənbəki. Lakin lazımdır onların zəhər olmaqlığını yaddan çıxarmayıb onları israf etməyəsən. Amma tiryakda, bəngdə və şərabda zikr olan zəhərin qədəri ziyadə olduğuna onların nəş'əsi də ziyadə olur və onlar bədənə də ziyadə zərər edirlər.

Əlbəttə, bir neçə kərrə ol zəhərləri qədərində yeməkdən bədənə zərər olmaz. Amma ol zəhərlərin bir xasiyyəti budur ki, onlara beyin adət eləyəndən sonra onlar beyinə əsər etməz və nəş'ə gətirməz. Ona binaən tiryak atan, bəng yeyən və şərab içən kəslər özlərinə kef gətirməkdən ötrü gərək gün-gündən onları artıq yesinlər ki, onlardan əvvəlki kimi kef gəlsin və belə mürur ilə beyinə güc etmək onu gücdən salıb zəifləndirir. Bu səbəblərə ol kəsin sifəti saralıb, mə'dəsi gücdən düşüb əli, ayağı və başı titrəyib, xülasə, tamam bədəni mürur ilə zəiflənib tələf olur.

Bu səbəblərə xaçpərəstlərin elm sahibləri xalqa bəyan etməklik ilə sə'y edirlər ki, şərabdan onların rəğbətin kəssinlər. Pəs bizim müsəlmanların tiryak atan, bəng yeyən, şərab içən kəsləri, siz adət elədiyiniz şeylər zəhər imişlər, onlar sizin beyninizi və bədəninizi tələf edib sizi fövtə verir imişlər. Belə olan surətdə nəfyül-xəmr vəl meysər min əməlüş-şeytan[1] yaddan çıxarmayıb, istiğfar etmək vacib imiş.

## ƏKİN VƏ ZİRAƏT XƏBƏRLƏRİ

Hər əkinçiyə vacibdir ki, öz yerinin xasiyyətin bilsin. Onu aşağıda zikr olan imtahan ilə bilmək olur.

Əkin yerinin şuxm olunan yerlərinin bir neçə tərəfindən 5 ya 6 ovuc torpaq götürüb onu qəlbirdən keçirib, təmizləyib ev içində bir az sərib sonra ondan 200 misqal çəkib onun 100 misqalını bir qabda saxlayıb, o biri 100 misqalın bir qaba sərib günə qoyub ol qədər tərpətsin ki, bilmərrə qurusun. Ol vaxtda o qurumuş torpağı çəkib bilmək olur ki, torpaqda nə qədər su var imiş. Tutalım o quruyandan sonra onun 88 misqal ağırlığı var. Pəs onun 100 misqalında 12 misqal su var imiş.

Sonra qurumuş torpağı bir saxsı qaba töküb ocaq üstə ol qədər qovursun ki, onda olan yanar şeylər tamam yanıb tələf olsun. Ol vaxtda tutalım 88 misqaldan 80 misqal qalıb. Pəs torpağın 100 misqalında 8 misqal yanar şeylər, yə'ni çürümüş ot var imiş. Pəs mə'lum olur ki, ol yerin 100-dən 12 hissəsi su və 8 hissəsi çürümüş ot imiş.

İndi o biri qabda saxlanan 100 misqal torpağın üstə su töküb onu qarışdıranda su bulanıq olacaqdır, onu bir-iki dəqiqə tərpətməyib sonra

---

[1] Şərabın və qumarın faydası şeytan əməllərindəndir.

bulanıq suyu süzüb genə təzə su töküb qarışdırıb saxlayıb süzmək gərək. Xülasə, ol qədər onun üstə su töküb qarışdırıb süzmək lazımdır ki, təzə su qarışdırmaqdan bulanıq olmasın. Ol vaxtda torpağın gili lilə dönüb su ilə süzülür və qabda ancaq qum qalır. O qumu qurudub çəkib ağırlığını bilmək olur. Tutalım onun 30 misqal ağırlığı var. Pəs əkin yerinin 100-də 12 su, 8 çürümüş ot, 30 qum və 50 misqal gil var imiş.

İndi qum dediyimiz 30 misqalın üstə tünd sirkə ya kükürd cövhəri töküb qarışdıranda onun içində olan əhəng qaynayıb turşuya qarışır, sonra onu bir neçə dəfə təmiz su ilə yaxalayıb qurudub çəkib əhəngin qədərini bilmək olur. Tutalım indi torpağın ağırlığı 25 misqaldır. Pəs onda 5 misqal əhəngi var imiş ki, turşuya qarışıb, yaxalamaqdan rədd olub.

Bu imtahandan bildik ki, zikr olan yerin 100 misqalında 12 su, 8 çürümüş ot, 50 gil, 5 əhəng və 25 misqal qum var imiş və həmçinin bu minval ilə hər bir əkin yerinin hissələrin bilmək olur və əkin yerinin xasiyyəti onun hissələri ilədir.

## MƏKTUBAT

Hər kühənsal və çox ömr eləmiş adamdan soruşursan ki, əmi, keçən zəmanə ilə bu zəmanənin güzəranı necədir? Deyir, oğlum, keçən zəmanənin bərəkəti var idi və çox ucuzluq idi. Məsələn, ətin batmanı bir köhnə riyal, buğdanın xarvarı on riyal, yumurtanın 100-ü iki şahıya satılır idi. Amma bu zəmanədə hər bir şey ol qədər bahalanıbdır ki, demək olur hər şey öz ağırlığında pula gedər və keçən zaman 100 tümən pulu və bir mahud çuxası olan kəsi şəhər içində barmaq ilə nişan verirdilər. Amma indi 100000 manatı olan adama dövlətli demək olmaz.

Bu avam sözdən qiyas eləmək olur ki, indi zəmanə tərəqqi eləyibdir və intizami-aləm həddi-istehkamə yetişibdir və xalqın fəhmi və səliqəsi artmağa binaən meylləri həm ziynətə və təcəllatə artıbdır. Qədim bir mahud çuxası olan şəxsə indi on çuxa kifayət eləməz. Xonçasında doşab halvası olmayan şəkər halvasın bəyənməz.

Əgər yaxşı fikir eləsən, insan öz xilqətinə münasib ki, mədəniyüttəb yaranmış, əgər müxalitət və ictima’ edib, bir-birilə qarışıb dostluq

eləməsə, məişət əsbabın cəm edib dünyada zindəganlıq eləməyi qayətdə müşkül olacaqdır. Pəs şüuru olan insana lazımdır ki, məzkur əsbabi-məişət cəm olan cəbbəxananın bağlı qapısın açmaqçün əvvəl bir kilid təhsil eləsin ki, zəhmətsiz o bağlı qapını açıb hər əsbabı ki, bu şərifi-hədisə müvafiq əhris liddünyakə kəənnəkə təişu əbədən və əhris liaxirətikə kəənnəkə təmutu ğədən[1] özünə lazım görür, təhsil eləyib ondan sonra dünya və axirət evin abad eləməyə məşğul olsun və belə kilidi ki, məzkur evin qapısın açsın, Allahın ne'mətlərinin qədrin bilib və Qur'ani-mübarəkədə nazil olan bu ayeyi-şərifə misqal etməkliyilə və min ayatihi ixtilafü əlsinətiküm və əlvaniküm[2] və imkan qədəri xarici dillərə vaqif olmağı ilə və lazım olan hərf və sənayei tə'lim tapmaq ilə ələ gətirmək olur.

Aşkar görürük ki, xarici vilayətlərin adamları bizim vilayətimizə gəlib vilayət əhli müttəle' olmayan şeylərin mübaliği-xatir dövlət cəm edib və mənfəət aparırlar. Bir firəngi tacirindən soruşsan ki, Qafqazın filan şəhərində nə şey əmələ gəlir, elm üzəri ilə onu elə bəyan elər ki, sən özün mat və mütəhəyyir qalusan. Amma o şəhərin əhlindən sual edəsən ki, kişi, sənin bağında neçə qism yemiş ağacı və nə qədər üzüm, meyvə var, qət'ən deyəcəkdir hesab eləməmişəm.

Firəngistan əhli zükur və ünasən üç-dörd müxtəlifə dillər ilə danışırlar. Amma müsəlmanlar içində savadı olan adamlardan çox az tapılır ki, öz dilində bir dürüst məktub yazsın.

Əgər bir şəxs desə ki, əmi, keçən zamandan bu zəmanə yaxşıdır və bu zəmanəyə Allah keçən zəmanədən artıq bərəkət veribdir, ağraq danışmayacaqdır. Ondan ötrü ki, hər məmləkətdə müəllimxanalar və mədrəsələr açılıb və əsbabi-mə'rifət ətraf aləmə dağılıb. Badkubə kimi şəhərdə sənin öz milli dilinlə qəzet basılır, uzaq məmləkətlərdə olan əxbari-qəribə və müfid söhbətləri öz evindən çıxmayıb oxuyub bilirsən. Gör ki, Avropa məmləkətləri və Yeni dünya, dəmir yollar, buxar gəmiləri olmaq səbəbilə səninlə yaxın qonşu olub. Məkkeyi-müəzzəm ziyarəti ki, neçə il bundan sabiq çox müşkül idi və bir ilə yaxın səfərin tuli var idi, iki ay ya iki ay yarımda kəmali-istirahət ilə gedib-gəlmək olur.

---

[1] Dünya işlərini elə gör ki, guya sən dünyada əbədi yaşayacaqsan. Axirət işlərinə isə elə fikir ver ki, guya sabah öləcəksən.

[2] Sizin rənglərinizin və dillərinizin müxtəlifliyi Allahın məsləhətidir.

Nuri-mə’rifət dünyanı tutub, heç insaf deyil ki, adam vaxtın keçirib bu ayeyi-şərifin məzmunundan göz örtsün: həl yəstəvi əlləzinə yə’ləmun vəlləzinə la yə’ləmun[1]. Fürsət əldən verib öz qom və əqrabasın hərfət və və sən’ət elmlərinin feyzindən qoyan şəxs onların bədbəxtliyinə bais olub və zülmi-fahiş onların haqqında edəcəkdir.

*Heydəri*

* * *

İrəvandan Məhəmməd Rəhimbəy yazır ki, İran dövlətinin Xoy şəhərinə ticarətə getmişdim. Rəcəbin 25-də bir neçə min Osmanlı əhli İran sərhəddini keçib Daş məku mahalını qarət edib, 5000 qədər at, mal apardılar. Sonra Osmanlı dövlətinin Van şəhərinə gedib orada dadistəd edirdim. Şabanın 15-də İran tərəfindən Ziyaüddövlə Məhəmməd Rəhim Mirzə 500 atlı ilə gəlib Van şəhərinin ətrafını qarət etdi.

* * *

İrəvandan, şabanın 22-də Məhəmmədəli bəy Vəliyev yazır ki, bir neçə həftədir İrəvan uyezdinin Dəvə qəryəsində adamxor heyvan peyda olubdur. Gecələr gəlib evlərdən uşaqları aparıb yeyir. İndiyəcən 13 nəfər uşaq yeyib və həmçinin Çəğin mahalının bir para kəndlərindən bir neçə uşaq dəxi aparıbdır. Ol heyvanı görənlər deyirlər ki, onun rəngi qırmızıya maildir və özü itə oxşayır. Amma bə’ziləri deyir rəngi qaradır və qurda şəbahəti çoxdur. Ol kəndlərin xalqı əlində tüfəng qarovul çəkirlər, amma onu görmək müyəssər olmur. Bu halda cənab uyezdni naçalnik Şağubatov bu barədə silist edir.

Dünyada heç bir heyvan yoxdur ki, insanın şücaətindən və gözlərinin nurundan qorxmasın. Ona binaən olmaz ki, heyvan adamxor olsun. Doğrudur ağ pələng, qurd və kaftar düşəndə bir uşaq aparırlar. Amma onlar aclıqdan bu qələti bir edib, bir də dəxi etməzlər. Xülasə, bu xəbərin həqiqətini bilməkdən ötrü çox intizar varıq və ümidvarıq ki, Məhəmmədəli bəy onun keyfiyyətini yazıb bizə mə’lum eləsin.

* * *

Qubadan bizə yazırlar: boyaq qiymətdən düşməyə binaən qeyri yerlərdən Qubaya gəlib müamiləçilik edənlərin işi xarabdır. Tamam Quba əhli, ələlxüsus yəhudilər öz mülk və mallarını nataryus əlilə oğ-

---

[1] Bilən ilə bilməyən bərabər olurmu?

lanlarına ya övrətlərinə verib sahibtələblərə bir qəpik vermirlər və şəhərimizin belə şuluq olmağına səbəb vəkillik edən kəslərdirlər. Onlar hər iki tərəfdən pul alıb ikisin də bədbəxt edirlər və ümidvarıq ki, bizim şəhərə yaxşı tə'lim almış və insaflı vəkil gəlib bizləri ədalət divanının səmərəsindən məhrum edən kəslərin əlindən xilas etsin.

Bu kağızı yazan elə fikir edir ki, qeyri yerlərdə halva yeyirlər. Əzizim, siz istədiyiniz vəkili Rusiyanın paytaxtında tapmaq olmur.

**Q ə z ə l :**

Həzaran şükr kim, bir şəxsi-aliqədr hümmətdən
Qəzet bünyadına Rusiyyədə izn aldı dövlətdən.
Məlikzadə Həsən bəy arifi-dünya Zərdabi
Götürdü əhli-islamı bu gün xaki-məzəllətdən.
Zəbani-türk ilə agah eylər əhli-Qafqazı
Gəhi tazə xəbərlərdən, gəh asari-hökumətdən.
Olub sövdagəri-xeyr ol mükərrəm əhli-islamı
Xəbərdar eylədi hər nəf'ü hər kəsbü ticarətdən.
Nəsimi-sübhtək feyzi olub bu aləmə sari
Oyatdı lütf əliylə qəflət əhlin xabi-qəflətdən.
Bu iznə razılıq vacibdir əlhəq əhli-islamə
Ki, verdi imperaturi-cəhanpərvər ədalətdən.
Dəxi ol izn alan şəxsin bizə vacibdir ikrami
Ki, oldu xeyrxahi əhli-Qafqazın nəcabətdən.
Görüb ol kari-xeyri bu duanı eylədi Seyyid
Dedi əhli Şəmaxi cümiləsi amin sədaqətdən.
İlahi padşahi-Rusun eylə dövlətin əfzun
Məlikzadə Həsən bəyin ömrünü hifz eylə afətdən.

## TƏZƏ XƏBƏRLƏR

Əgərçi bu halda Qerdseqovinəni Osmanlı əsgəri tamam zəbt edibdir və ol vilayətin dövlətdən narazı olan sakinləri dağlarda və meşələrdə məskən ediblər, amma genə təkdə bir cəng olur. İndi onların baş sərkərdələri Sarko adlı keşişdir. Onun 5000 qədər əsgəri var. Onlar konsullara verdiyi ərizənin mətləbi budur ki, Osmanlı dövləti onların haqqında çox cəbr edir. Ona binaən onlar Osmanlıya tabe olmaq istəmirlər.

* * *

Çin vilayətindən rəcəbin 11-də yazırlar ki, bu il çox yağınlıq olduğuna çay az hasil olub.

* * *

Krımın Feodosi şəhərindən yazırlar ki, bu il ol şəhərə gedən dəmiryolu qutardığına oraya ol qədər üzüm, yemək və dərya suyuna çimmək ilə özünə müalicə edən gəlib ki, evlərdə yer olmadığına şəhərin bağlarında məskən ediblər.

* * *

Misirdən yazırlar ki, pambığın əkini çox yaxşıdır və əgər onun bir zavalı olmasa, keçən ildən birə-bir artıq pambıq olacaqdır.

* * *

Bu il Avropada taxıl az olduğuna bahalanmış idi. Amma indi yazırlar ki, hava xoş olduğuna çox kartofel və qarğıdalı hasil olub. Ona binaən taxıl indi ucuzlaşır.

* * *

Rusiyanın "Qolos" qəzetinin münşisi Qerdseqovinə cəngində vəfat edən slavyanların külfətləri üçün pul yığır. İndiyəcən bir-iki min manata qədər yığıb onlara göndərib.

* * *

1873 sənədə Rusiyanın universitetlərində 8000-əcən, gimnaziyalarda 20000-əcən, üç klas məktəbxanalarda 30000-əcən və bir klas məktəbxanalarda 1000000-acan oxuyan olub.

* * *

Peterburq şəhərinin camaat məclisi sərəncam edib ki, şəhərin küçələrində atlar ilə işlənən dəmir yol tə'mir olunsun. Bu il 50 verst tamam olub və gələn il 35 verst tə'mir olunacaqdır. Həmçinin Moskva şəhərinin camaatı öz şəhərlərində 80 verstə qədər dəmiryolu tikdirmək istəyir.

* * *

İngilisin Vulic şəhərində bir top tə'mir olunub ki, onun 82000 girvənkə ağırlığı, 60000 manat xərci, 12 arşın tuli var. Gülüləsinin ağırlığı 1650 girvənkədir və hər səfər onu doldurmağa 300 girvənkə barıt gedir.

* * *

"Triest" qəzeti yazır ki, Qafqazdan Osmanlıya gedən çərkəslərin böyüyü İbrahim paşa sədri-ə'zəmdən izn istəyib ki, 20000 çərkəs əsgəri cəm edib Qerdseqovinə getsin, amma ona izn verməyiblər.

* * *

Biz eşidirik ki, Badkubə uyezdinin Sabunçu kəndinin camaatı istəyir öz kəndlərində rus məktəbxanası bina etsin. Allah eləsin ol xeyir iş başa gəlsin və bir yaxşı müsəlman müəllimi ol məktəbxana üçün tapılsın.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Əvvəlinci sənə* *İki həftəlik sənə* *Yeddinci nömrə*

*Fi 1 şövvalülmükərrəm, sənə 1292*

* * *

*Hər kəs öz işləri barəsində bu qəzetdə e'lamnamələr basdıra bilər. Belə e'lamnamələri basdırdan kəslər lazımdır ki, e'lamnamənin hər kəlməsinə iki qəpik versinlər.*

* * *

*Düşənbə günü*




*Fi 20 oktyabr Rusiya, sənə 1875*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*Poşt xərci qəzet basdıran ilədir*

Bu qəzet çap olunur Qafqaz vilayətinin Badkubə şəhərində. Hər kəs e'lamnamələr və məktubat göndərmək xahiş etsə qəzeti çap etdirənin adına göndərsin. Qəzet almağı xahiş edən kəslər qəzetin yuxarıda zikr olan qiymətini lazımdır qəzeti basdıranın adına göndərsinlər və öz adlarını və sakin olduğu yerlərini yazıb mə'lum eləsinlər. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.

## E' L A N

Gələn 1293-cü sənədə "Əkinçi" qəzeti genə hər iki həftədə bir dəfə, yə'ni hər ayın 1-də və 15-də çap olunacaqdır. Bir illik qiyməti 3 manatdır. "Əkinçi"ni gələn il almaq istəyənlərdən iltimas edirik ki, bu 1292-ci sənə qurtarmamış qəzetin zikr olan qiymətini bizə göndərsinlər ki, pişəzvəqt onu gələn il basdırtmağın sərəncamına məşğul olaq.

* * *

Rəməzan eydi kim olsun mübarək xasü həm amə.
Gətirdilər ibadətlə əcəb bu ayı itmamə.
Hərə bir noi bu ayda edib bəndəliyin zahir.
Xuda, qismən elə bir də çataq kim beylə bayramə.

## DAXİLİYYƏ

Balıq suya qərq olan kimi insan havaya qərq olub onun içində zindəganlıq edir. Hava insanın nəfəs almağına lazımdır. Əgərçi hava yüngül olduğuna onu görmək məqdur deyil, amma insan bir gün bir gecədə ol qədər nəfəsin alır ki, onun ağzına bir putacan hava daxil

olur. Belə olan surətdə havanın yaxşı və yaman olmağını yoxlamaq hər kəs üçün lazımdır. Necə ki şəfa axtaran xəstə ya salamatlıq istəyən kəs həmişə öz xörəyini yoxlayır, həmçinin gərək havanı da yoxlasın. Ona binaən ki, biz udduğumuz havanın qədəri yediyimiz xörəyin qədərindən ziyadə olduğuna xörək yaxşı da olsa, yaman hava insanı fövtə verir.

Biz havanı görmədiyimizə onun bizə xörək olmağından qafil olub onun yaxşı və yamanlığına məhəl qoymuruq. Amma elmi-təbiiyyə aşkar edib ki, insana düçar olan naxoşluqların çoxu hava yaman olmağındandır. Pəs insan özünü yanğından və qeyri bəlalardan saxlayan kimi havadan da saxlamaq vacibdir.

Hava bir neçə tövr ilə natəmiz və yaman olur. Məsələn, insan və heyvanat nəfəsin almaqdan ya yer üzündə olan şeylər iyiyib, çürüyüb havaya qarışmaqdan xarab olur.

### İndi iyimiş su havanı xarab etməkdən danışaq

Bizim Qafqaz vilayətinin əkin və ziraəti min il bundan əqdəm olan kimi olur. Keçən zəmanədə insan köçəri olduğuna, yə'ni onun yeri çox olmağa binaən o yerləri yaxşılandırmağa sə'y etməyib bir yeri əkmək məqdur olanda onu əkib, əkini biçib, götürüb qeyri yerə gedibdir. Həmçinin indi bizim əkinçilər bir yeri əkmək məqdur olanda əkirlər, amma olmayanda oturub zəmanədən dad edirlər. Məsələn, çaylar daşmayanda onların kənarlarında sakin olanlar susuzluq çəkirlər. Amma onlar daşanda tamam yerlərin suya qərq edib sonra quruyan yerləri əkirlər ya axar suyu olanlar onilə əkini suluyub, yə'ni əkini suya qərq edib suyu əkinin, məsələn, çəltiyin içində ol qədər saxlayırlar ki, özü qurusun. Belə olan surətdə su bir yerdə dayanıb durduğuna iyiyir və onun iyi havaya qarışıb onu xarab edir və bu xarab olmuş hava bizim ağzımıza daxil olub zəhər kimi bədənimizi zəhərləyir.

Bu səbəblərə binaən yayda, yə'ni çox isti olan zaman hər tərəfdən gələn titrədib qızdıranların və yatalaq, ishal, yel və qeyri naxoşluqlardan xəstə olanların ahü naləsi tamam vilayətimizi basır.

Ey məzkur naxoşluqlardan xəstə olan kəs, sənin nalə çəkməyindən nə hasil? Sən öz haqqında cəbr edib özünü naxoş etməkdən masəva tamam vilayətin havasını xarab edib xalqı xəstə etmisən. Nalə

çəkmək əvəzində naxoşluğun səbəblərini fikir elə və əkin yerini ya əkini suluyanda tənbəllik etməyib ol yerin ayağından bir arx qazıb ol suyu genə aparıb çaya tök ki, axar su ol suyu axıdıb, onu iyiməkdən mühafizət edib, həmi səni, həmi xalqı zikr olan naxoşluqlardan xilas etsin.

## ƏKİN VƏ ZİRAƏT XƏBƏRLƏRİ

Bizim vilayətimizdə çox ələfiyyat var ki, onları atlarımıza və eşşəklərimizə yedirtməkdən savayı onların bir qeyri nəf'i olmağın bilmirik. Amma ol ələfiyyatlardan qeyri yerlərdə artıq mənfəətbərdar olurlar. Məsələn, bizim Qafqazın isti tərəflərində özbaşına əmələ gələn kəvər otunun qönçələrin və yemişlərin turşuya qoymaqlıq ilə Firəngistanda və İtaliyada artın dövlət qazanırlar. Onların turşuya qoyulmuş kəvərinin girvənkəsi bizim Badkubə şəhərində altı abbasıya satılır. Əlbəttə, biz də onlar kimi kəvəri turşuya qoymağı bilseydik, nə ki bizim şəhərlərdə qeyri yerlərin kəvəri satılmaz idi, hətta onu aparıb qeyri yerlərdə satıb artıq mənfəətbərdar ola bilərdik.

Kəvəri iki cürə əkmək olur: ya onun toxumlarını bir şuxm olunmuş yerə səpib göyərəndən sonra çıxarıb şitil etməklik ilə ya onun budaqlarını əkməklik ilə. Amma toxumdan əmələ gələn kəvər otu iki ildən sonra gül açdığına Firəngistanda onun budaqlarını əkirlər. Ona binaən ki, budaqlar gələn il gül açır.

Kəvərin budaqları qarpız tağının budaqları kimi yer üzünə yatır. Onu bıçaq ilə yarıb ol yarıq yeri torpaqlayandan sonra oradan təzə köklər əmələ gəlir. Ol vaxtda ol budaqları öz kökləri ilə belə kəsib, bir qabda otaqda saxlanan güllər kimi əkib sonra şitil edirlər.

Budaqlardan ya toxumlardan əmələ gələn kəvər otlarını belə şitil edirlər: bir daşlıq ya quru yeri ki, orada qeyri əkin əmələ gəlmir, şuxm edib cızıqlar çəkirlər ki, onların bir-birindən arası iki arşınacan olsun və hər cızıqda otları elə şitil edirlər ki, onların bir-birindən arası iki arşın olsun. Belə şitil edəndən sonra onların artıq zəhməti yoxdur. Hətta onları sulamaq da lazım deyil. Amma kəvər əkilən yer qışda çox soyuq olan yer isə payızın axırında kəvərin budaqlarının ucunu kəsib bir çərək tulində köklərin üstə saxlayıb onun üstün torpaq ya peyin ilə basdırmaqla onları soyuqdan mühafizət etmək olur. Sonra yazda onla-

rın üstün açıb genə budaqların başını bir az kəsəndə onlar təzədən qol atıb gül açırlar.

Kəvər yayın əvvəlindən payızın axırınacan gül açır. Firəngistanda onun qönçələrini belə dərib turşuya qoyurlar. Hər sabah ya üç-dörd və ya on gündə bir otların arasını gəzib onların qönçələrin ki, noxuddan iri olmasın, dərib bir çəlləyə doldurub üstə sirkə tökürlər və sirkəni artıq tünd etməkdən ötrü və kəvər ləzzətli olmaqdan ötrü onun içinə duz, istiot və qeyri şeylər tökürlər. Çəlləyin ağzına taxta qoyub üstə daş qoyurlar ki, qönçələr sirkənin üzünə çıxıb yanıb tələf olmasın. Onlar yetişəndən sonra onları sirkə ilə belə şüşələrə doldurub ağızlarını lək ilə peçatlayıb satırlar. Həmçinin kəvərin yemişlərini bu qayda ilə turşuya qoyurlar. Belə saxlanan kəvər bir neçə il xarab olmaz.

Bizim Qafqazda əmələ gələn kəvəri zikr olan qayda ilə turşuya qoyanda onun təm'i acı olur. Ona binaən onu turşuya qoyandan irəli onun acılığını almaq gərək. Bizlər onun üstə soyuq su töküb günə qoymaqlıq ilə onun acılığını alırıq və belə-belə suda çox saxlanmaqdan kəvər xarab olur. Ona binaən lazımdır imtahan olunsun ki, onu isti suya salmaqlıq ilə və ya qaynatmaqlıq ilə acılığını almaq olurmu ki, az vaxtda onun acılığını alıb zikr olan qayda ilə turşuya qoymaq olsun və əgər bu tövr ilə onun acılığını almaq məqdur olmasa yaxşıdır ki, Firəngistan kəvərinin toxumlarını gətirib əkəsən.

## ELM XƏBƏRLƏRİ

Firəngistanın Sen Didyö adlı bir yerinin altmış arşınlığında bir su quyusu var ki, ol yerin ətrafında sakin olanlar o quyunun suyunu içirlər. Çünki o suyu həmişə içən kəslər zəif və xəstə olurlar, ona binaən Lefort adlı kəs ol suyu imtahan edib deyir ki, ol suyun belə bədənə zərər etməyinə səbəb oldur ki, ol su quyusu qəbristanlığın yanındadır və onun suyu qəbristanlıqda çürüyən meyidlərin iyini çəkib cismi-bədəniyyata qarışıb xarab olur.

Bu səbəblərə Lefort məsləhət edir ki, hər yerdə qəbristanlığı içilən sudan uzaqda bina etsinlər və əgər qəbristanlıq qədim zəmanədə salındığına binaən onu qeyri yerə aparmaq məqdur olmasa, ol vaxtda qəbristanlığın ətrafında xəndək çəksinlər ki, oranın yağış suyu gedib içilən suya tökülməsin.

* * *

Bir suya cismi-bədəniyyat qarışmış olduğunu belə bilmək olur: ol sudan iki qaşıq bir stəkana töküb içinə bir az narın əzilmiş şəkər salıb bir isti yerdə bir neçə vaxt saxlayanda əgər ol su bulansa, mə'lumdur ki, ona cismi-bədəniyyat qarışıb, belə suyu içmək bədənə zərərdir.

* * *

Almaniya dövlətinin sakini Stal adlı elm sahibi meyvəni tez yetişdirməkdən ötrü belə imtahan edib: armudun yetişməyinə iki ay qalmış bir armud ağacının dibini 3 və ya 4 arşın qazıb ki, ağacın köklərinin üstə yarım kərhə qədər torpaq qalıb. Ol vaxt günün istisi ol köklərə artıq dəydiyinə ol ağacın meyvələri qeyri ağacların meyvəsindən bir ay yarım irəli yetişmişdir. Çünki belə ağacın dibini qazanda onun köklərinə gün artıq dəyməkdən ağac quruyur, bilmərrə tələf olur, ona binaən belə ağacı lazımdır ki, tez-tez sulayasan.

Bu imtahandan sonra məzkur Stal bir kəbalu ağacı ilə belə imtahan edib: onun dibini ancaq şimal tərəfdən zikr olan qayda ilə qazıb. Həmçinin kəbalu ağacının da meyvələri ay yarım irəli yetişibdir. Amma bu ağacın bir şimal tərəfi qazıldığına, onun ancaq şimal tərəfinin budaqlarının meyvəsi tez yetişibdir.

Belə ağacların dibini qazmaqdan onların meyvələri tez yetişdiyinə səbəb oldur ki, hər bir nəbatatın zindəganına gün səbəb olur və onlara gün artıq dəyməkdən onlar tez əmələ gəlir.

* * *

Bizim vilayətimizdə barama qurduna həmişə çəkil yarpağı verirlər. Amma Firəngistanda və qeyri yerlərdə imtahan üçün onlara qeyri yarpaqlar verib görüblər ki, qeyri yarpaqları yeyən qurdların baraması qeyri rəngdə olur. Məsələn, üzüm ağacının, yə'ni tənəyin yarpağını yeyən qurdun baraması qırmızı rəngdə, kahı yarpağını yeyəninki yaşıl rəngdə və gicirtkan yarpağını yeyəninki bənəvüş rəngdə olur.

Məzkur yarpaqlar ilə qurdları çəkil yarpağı ilə saxlayan kimi saxlamaq olur, yə'ni əvvəldən axıracan onlara zikr olan yarpaqları vermək olur. Amma bə'zi kəslər qurdlara əvvəl zaman çəkil yarpağı verib barama sarımağa 20 gün qalmış zikr olan yarpaqları verib görüblər ki, genə onların baramasının rəngi qeyri cürə olubdur.

Bu elm xəbərlərin yazıb *Əsgər Mirzə Adıgözəlzadə Gorani.*

## TƏZƏ XƏBƏRLƏR

General Kaufman Kokan şəhərinə daxil olandan sonra ətraf sakinlərinə bu məzmunda e'lamnamə göndərib: hər kəs Rus dövlətinə tabe olur isə, ona xoşgüzəranlıq müyəssər olur.

Rus dövlətinin müsəlman tabeləri öz şəriətlərini işlətməyə dövlət mane olmur.

Xudayar xan Peterburqa göndərlənib. Onu Rus dövləti Kokana xan etməyəcəkdir.

* * *

Səmərqənddən "Türküstan" qəzetinə yazırlar ki, Kokan ilə Rusiya cəng edən zaman Buxaranın xanı məsləhət ilə kokanlıların tərəfin saxlayıb və bu halda sə'y edir ki, genə onları tutuşdursun. Ona binaən Rusiya tərəfindən Buxaranın sərhəddinə bir neçə yüz kazak qarovulu qoyulubdur.

Türküstandan sentyabrın 22-dən yazırlar ki, Kokan sərkərdəsi odabaşı Əbdürrəhman öz əsgəri məğlub olandan sonra genə təzədən 10000 əsgər cəm edib Rusiya ilə cəng başlamaq istəyib. Amma rus əsgərini görəndə onun əsgəri qaçıb dağıldığına özü beş adam ilə qaçıb Buxara sərhəddinə gedib.

* * *

Qerdseqovinə tamam Osmanlı əsgəri ilə zəbt olunubdur. Əgərçi Qerdseqovinənin əhli genə hərdən bir cəng edib, amma ol cənglərdə həmişə məğlub olur.

Qeyri slavyan yerlərindən onlara köməyə gedənlər geri qayıdırlar.

Sülh barəsində danışıq var. Bu danışıqdan ötrü Rus və Almaniya dövlətləri Avstriya dövlətinin konsulunu vəkil edibdirlər.

Əgərçi Qerdseqovinə əhlinin muradı oldur ki, onlara artıq ixtiyar versinlər, amma dövlət ona razı olmur.

Osmanlı dövləti hökm edibdir ki, 1873-cü sənəyəcən kəsir olan təhmilatı xalqdan almasınlar və dəh yeki yüzdən on iki alınırdı, yüzdən on alsınlar.

* * *

Osmanlı teleqrafxanalarında Qerdseqovinə buntu aşkar olandan sonra gizdin, yə'ni məxfi dildə tel vurmaq qadağan olmuş idi. İndi genə heylə tel vurmağa izn var.

* * *

Hindistanda 300000000 can məğluq var: o cümlədən 60000000 can müsəlman, 150000000 can bütpərəst və 20000000 can atəşpərəstdirlər. 150 sənə bundan əqdəm ingilis vilayətində bir ticarət icmalı əmələ gəlib. Ol icma Hindistanın dərya kənarında öz dadistədləri üçün bir az yer alıb sonra mürur ilə tamam Hindistanı zəbt edib. Bir neçə il bundan əqdəm məzkur icma tamam Hindistanı İngilis dövlətinə veribdir. İndi İngilisin kralının oğlu Hindistana gəzməyə gedir. Qəzetlərdə yazırlar ki, bu oktyabr ayının 11-də İngilisdən çıxıb Misirdən Süveyş kanalı ilə Hindistana gedəcəkdir.

* * *

İrandan yazırlar ki, şah Avropa səyahətindən geri qayıdandan sonra xalqa izn veribdir ki, hər bir cəbr barəsində onun özünə ərz etsinlər. Ondan masəva indi təhmilatı cəm etməkdən ötrü təzə qayda qoyub, onu icarəyə verməyi qadağan edib.

* * *

Həmədanda bir yəhudi müsəlmanların məzhəbinə yaman deməkdən ötrü onu müsəlmanlar oda salıb yandırıblarmış. İndi Tehrandan yazırlar ki, ol yəhudini yandıran kəslərə tənbeh olunubdur və yəhudilərə söz verilib ki, bir də onların haqqında belə zülm olunmayacaqdır.

* * *

Misirdən yazırlar ki, Misir ilə Həbəş hökumətinin arasında danışıq düşdüyünə xədifi-Misir Həbəşin sərhəddinə əsgər göndəribdir.

* * *

Rusiyanın 82000000 xalqı var. O cümlədən 9000000 müsəlman, 649000 erməni, 2785000 yəhudi, 277000 bütpərəstdir.

* * *

Rusiyanın 780000 əsgəri var, əsgərdə qulluq edən 460000 əfsəri var.

* * *

Rusiyanın dəryalarda 29 üzü dəmirli, yə'ni branonos, 198 üzü dəmirsiz cəng gəmisi var. Onlardan 527 top, 24500 əsgər var, o cümlədən 3817 əfəsrdir.

* * *

Peterburq şəhərində 768 təbib var ki, onların hər birisinin yanına hər kəs hər gündə gedib öz naxoşluğu barəsində məsləhət edə bilər.

* * *

Badkubə şəhərinin Malakan bağının yanında cənab Vixman sakin olduğu evin qiblə tərəfi satılır.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Əvvəlinci sənə* | *İki həftəlik qəzetdir* | *Səkkizinci nömrə*

*Fi 15 şövvalülmükərrəm, sənə 1292*

* * *

*Hər kəs öz işləri barəsində bu qəzetdə e'lamnamə basdıra bilər. Belə e'lamnamələri basdırdan kəslər lazımdır ki, e'lamnamənin hər kəlməsinə iki qəpik versinlər.*

* * *

*Səşənbə günü*




*Fi 4 noyabr Rusiya, sənə 1875*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*Poşt xərci qəzet basdıran ilədir*

Bu qəzet çap olunur Qafqaz vilayətinin Badkubə şəhərində. Hər kəs e'lamnamələr və məktubat göndərmək xahiş etsə, qəzeti çap etdirənin adına göndərsin. Qəzet almağı xahiş edən kəslər qəzetin yuxarıda zikr olan qiymətini lazımdır qəzeti basdıranın adına göndərsinlər və öz adlarını və sakin olduğu yerlərini yazıb mə'lum eləsinlər. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.

## E' L A N

Gələn 1293-cü sənədə "Əkinçi" qəzeti genə hər iki həftədə bir dəfə, yə'ni hər ayın 1-də və 15-də çap olunacaqdır. Bir illik qiyməti 3 manatdır.

"Əkinçi"ni gələn il almaq istəyənlərdən iltimas edirik ki, bu 1292-ci sənə qurtarmamış qəzetin zikr olan qiymətini bizə göndərsinlər ki, pişəzvəqt onu gələn il basdırmağın sərəncamına məşğul olaq.

* * *

Məktub göndərən gərək ismini bəyan etsin, amma istəməsə adını qəzetə salmarıq.

## DAXİLİYYƏ

Keçən nömrələrdə Rusiya dövlətinin, xalqının və məktəbxanalarda oxuyan şagirdlərinin hesabından xəbər verdik ki, həştad milyonacan xalqdan bir milyon oxuyan var. Əlbəttə ol qədər oxuyana çox demək olmaz. Ona binaən ki, hər həştad adamdan bir adam oxuyur.

Amma qeyri vilayətlərdə, məsələn, Yeni Dünya, yə'ni Amerika qitə'sində cəmahiri-müttəfiqə yerlərində hər 15 adamdan birisi oxuyur. Pəs Rusiya elm təhsil etməkdə qeyri millətlərdən geri qalıb.

Bu axır zaman on illik müddətində Rusiya oxumaqda çox tərəqqi edib. On il bundan əqdəm zikr olan oxuyanların nisfi qədər oxuyan olmayıb, amma indi Rusiyada ol qədər oxumaq istəyən var ki, tamam məktəbxanalar dolubdurlar və hər il də hər bir məktəbxanaya oxumaqdan ötrü ol qədər ərizə verən olur ki, onlardan yer olmadığına beşdən bir adam götürmək olur. Ona binaən həmişə təzə məktəbxanalar bina olunur.

Çünki ol qədər məktəbxanaları dövlət saxlaya bilməz, ona binaən hər bir şəhərin icmaı sə'y edir ki, öz xərci ilə şəhərlərində məktəbxana açsınlar. Rus qəzetlərini oxuyanlara mə'lumdur ki, onların hər bir nömründə belə məktəbxanalar açılmaqdan xəbər verilir.

Bizim Qafqazda, məsələn Badkubə gimnaziyasında ol qədər oxumaq istəyən var ki, keçən il 100 adamdan yer olmadığına ancaq 50 adam qəbul olub. Pəs nə ki, ruslar, hətta bizim Qafqazda olan millətlər oxumağın xeyrini bilib tamam məktəbxanalarımızı doldurubdurlar.

İndi görək bizim məktəbxanalarda oxuyanlar kimdir?

Badkubə quberniyasının sakinləri təxminən yüz min olsa, o cümlədən on mindən ziyadə erməni olmaz. Rus ki, onlardan da azdır. Bizim quberniyada bircə Badkubə gimnaziyası var ki, onda 500 oxuyan, o cümlədən 250 rus, 150 erməni və 100 müsəlmandır.

33 zikr olan müsəlmanlardan padşahlıq xərci ilə pansionda oxuyur, baqisi öz xərcləri ilə oxuyurlar. O cümlədən 30-can Badkubə əhlidir ki, əvvəlinci klasa giribdirlər, rus dili öyrənib sonra öz dadistədlərinə məşğul olsunlar. Əlbəttə, onları elm təhsil edən hesab etmək olmaz.

Pəs bizim məktəbxanalarımızda oxuyanlar rus, erməni və qeyri millətlərdirlər. Biz müsəlmanlar elmdən vəba naxoşluğundan qaçan kimi qaçırıq, hətta padşahlıq xərci ilə də oxumaq istəmirik. Məsələn, Dağıstan müsəlmanlarından Badkubə gimnaziyasında gərək 15 padşahlıq xərcilə oxuyan olsun, amma müsəlmanlar oxumaq istəmədiyinə onlardan ancaq 13 müsəlman oxuyur, ikisinin əvəzində rus uşaqları oxuyurlar.

Belə olan surətdə biz müsəlmanlar elm təhsil etməkdən, yə'ni zindəganlıq cənginin əsasını ələ gətirməkdən qaçmaqlığa görə ol cəngdə məğlub olub mürur ilə tələf olacayıq.

Necə tələf olmayaq ki, bizim qonşular bizlərdən birə əlli artıq elm təhsil etməyə sə'y edirlər, yə'ni zindəganlıq cəngində onların birisi əlli müsəlmana bərabərdir. Onların birisi qazandığı dövləti əlli müsəlman qazanır. Əlbəttə bu səbəblərə bizim ac qarnımıza ağrı, üryan bədənimizə soyuq dəyib bizləri tələf edəcəkdir.

Ey müsəlmanlar, heç mürüvvətdirmi ki, tamam dünya bizim qonşularımız ilə belə elm təhsil etməyə sə'y etsinlər ki, zindəganlıq cəngində düşmənə faiq gəlsinlər, amma bizlər Allahdan buyuruq, ağzıma quyruq deyib duraq? Ey müsəlmanların millət təəssübü çəkən kəsləri, bir açın gözünüzü, dünyaya tamaşa edin... Xoşa ol kəslərə ki, kim bilir, kim qazana kim yeyə, əbləh odur dünya üçün qəm yeyə – deyib gələcəkdən bixəbər olub onun qəmini çəkmirlər!

## ƏKİN VƏ ZİRAƏT XƏBƏRLƏRİ

Əkin yeri bir neçə qism olur. Qumlu yerin qumu çox və qeyri hissələri az olsa, ona ya nar, ya quru qumstan deyərlər. Belə yer isti tərəfdə olsa, ya onun gili və çürümüş otu çox az olsa, orada əkin olmaz. Amma onun 100 hissəsində 10 hissə qeyri şeylər olsa, ol vaxtda əkin əmələ gəlir.

Qumstanda yumru çay daşları olmağı yaxşıdır. Ona binaən ki, ol daşlar mürur ilə əzildikcən onlardan gil əmələ gəlir və gil ol yeri bərkidib yaxşı edir və bir də ol daşlar qumstanın torpağını yağış suyu və külək aparmaqdan saxlar.

Gilli yerin 100-dən həştad hissəsi gil olsa, ona soyuq yer deyərlər. Orada əkin olmaz, amma gilin qədəri az olduqcan gilli yer yaxşıraq olur. Belə yerin 20 hissəsi gil, 40 hissəsi qum və sair hissələri qeyri şeylər olsa, ol yer çox ə'la yerdir.

Gilli yerdə xırda daşlar olmağı yaxşıdır, ol daşların səbəbi ilə gilli yer çox soyuq olmaz. Əgər ol daşlar əhəng daşı olsa, çox yaxşıdır. Ona binaən ki, onlar mürur ilə əzildikcən onlardan əhəng əmələ gəlir və əhəng artdıqcan ol yer artıq yaxşı olur.

Əkin yerinin qumu və gili bərabər və çox olsa, ol yerə suqlinik deyirlər. Amma ol yerin qırx hissədən artıq gili olsa, soyuq olur.

Ol yerdə beş ya on hissə əhəng ya çürümüş ot olsa yaxşıdır.

Əkin yerini qumu, gili və əhəngi bərabər olsa ona mergel deyirlər, bu çox ə'la yerdir.

Əhəng ol torpağa deyirlər ki, əhəng daşı əzilməkdən əmələ gəlib. Əlbəttə əkin yerində bişmiş əhəng olmaz. Əhəngli yerin əhəngi 50 hissədən ziyadə olmasa, ya bir az artıq da olmasa, amma onun gili də çox olsa, orada əkin etmək olur. Lakin belə yerin qumu çox olduqcan ol yer isti və xarab olur.

Əhəngli yerdə xırda əhəng daşı olmağı zərərdir. Onlar əzilməkdən əhəng əmələ gəldiyinə ol yer mürur ilə xarab olur.

Amma əhəng yerində yumru çay daşları olmağı yaxşıdır. Onlar əzilməkdən gil əmələ gəldiyinə ol yer mürur ilə yaxşılanır.

Əgərçi əkin yerinin qumu, gili və əhəngi əkinə xörək olan şeylər deyillər, amma yerin xasiyyəti ol şeylər ilədir. Gildən əkin yeri soyuq, bərk, yağış suyunu və şəbnəmi çox soran və gec quruyan olur. Əhəngdən isti və yumşaq, yağış suyunu və şəbnəmi çox soran və tez quruyan olur. Qumdan həmçinin isti və yumşaq, amma yağış suyu və şəbnəmi az soran və tez quruyan olur. Bu səbəblərə yaxşıdır ki, onların hamısı əkin yerində ola və əgər onların qədəri bərabər olsa dəxi yaxşıraqdır.

Çürük ot əkinə xörək olmaqdan savayı yerin xasiyyətini dəyişdirir. Qumluğu bərkidib şəbnəm soran və gilli yeri qazdırıb isti edir.

Çürük otun qədəri bə'zi yerlərdən, məsələn, böyük çaylar kənarında və meşə yerində on hissədən ziyadə olduğuna, ol yerlərə çürük otlu, yə'ni qara yer deyirlər ki, çox ə'la olur.

Əkin yeri çox zaman su altında qalsa turşuyub xarab olur. Əgərçi belə turş yerdə bə'zi vaxtda çürük ot çox olur, amma onun turşumağına səbəb oldur ki, orada daşlardan əmələ gələn, əkinə xörək olan şeylər az olubdur və turşu əmələ gəlibdir. Ol yeri əkindən irəli bir neçə dəfə şuxm etmək gərək ki, onun turşusu havaya qarışıb tələf olsun və ondan masəva belə yerə kül qarışdırmaq gərək ki, onu əkmək məqdur olsun.

## MƏKTUBAT

### Peterburqdan Əsgər Adıgözəlzadə Gorani yazır ki:

1) Bu günlərdə vəzirlərin məclisində Badkubə dəmiryolu təsdiq olunub. Ol yol Tiflisdən, Qarayazdan, Gəncədən, Gorandan, Zərdabdan, Hacıqabuldan Badkubəyə gedəcək.

Gömrü dəmiryolu Tiflisdən, Ağstafadan, Bambak dərəsindən İrəvan ilə Eçmiadzin şəhərlərinin arasından Gömrüyə gedəcək.

Hər iki yolu Tiflisdən Poti şəhərinə dəmiryolu tə'mir edən icma tikdirəcək.

Badkubə yolu keçən sentyabr ayının əvvəlində iyirmi səkkiz ayın müddətində, yə'ni 1878-ci sənədə yanvar ayının əvvəlinədək gərək tamam olsun.

2) Əkin və ziraət vəzirinin əsbabxanasına ki, muzey deyirlər, padşahlıqdan ildə 10000 manat xərc olunur. Muzeyi hər kəs müftə gəzib orada saxlanan əsbablara baxa bilir. Ol əsbabları saxlayan kəslərin borcudur əsbablara baxan kəslər xahiş etsə, onlar əsbabları göstərib bəyan etsin ki, onlar necə tə'mir olunub və onları nə tövr işlətmək gərək və onları haradan neçəyə almaq olur.

Muzey iki hissədir: əvvəlinci hissədə əkin və ziraət maşınları və əsbabları saxlanır. Amma ikinci hissədə əkin və ziraətdən hasil olan şeylər saxlanır.

Əvvəlinci hissə 15 yerə bölünübdür: 1. 80 qism təzə Amerika, ingilis, firəng, nemes, yə'ni Almaniya və rus kotanları. 2. Əkin yerinə toxum səpən maşınlar. 3. Əkini at ilə biçməyə maşınlar. 4. Taxılı döyməyə və su buğu ilə işlənən maşınlar. 5. Əkinçiyə lazım olan ərradələr. 6. Qoruğu əkməyə, sulamağa və biçməyə maşınlar. 7. At ilə su buğu ilə işlənən dəyirmanlar və qeyri maşınlar. 8. Arxlardan, çaylardan, göllərdən su çıxardan maşınlar. 9. Əkini biçəndən sonra daşımağa maşınlar. 10. At, mal və qoyun saxlamağa tövlələr. 11. Pənir və yağ qayırmağa maşınlar. 12. Arı saxlamağa səbətlər və qeyri əsbablar. 13. Paltar yumağa əsbablar və ağır şeylər çəkməyə tərəzilər. 14. Maldarlığa və baytarlığa lazım olan əsbablar. 15. Bağbanlığa lazım olan hacətlər saxlanır.

İkinci hissədə heyvanlardan və əkindən əmələ gələn şeylər, əkin yerini qüvvətli etməyə şeylər, hər qism əkin yerinin nümunəsi və onların, həmçinin südün və yağın yaxşı və yamanlığını bilməyə maşınlar və əkin, ziraət barəsində yazılan kitablar saxlanır.

**Tabasaranül-cənubiyyədən Mirzə Həsən Əlqədari yazır ki:**

1) Bu məmləkətlərin əhalisi rus dilini bilmirlər. Ona binaən rus əhalisi ilə söhbət və ticarət eləmək kimi mühəssənatdan məhrum olmaqdan savayı öz şikayətlərini öz dilləri ilə naçalniklərinə ərz və ifadə eləmək fəvailindən bibəhrədirlər.

Bu səbəblərə bu il biz bir neçə kürəli və tabasaranlılar ittifaq olmuşuq ki, hər birimiz öz qüdrətinə görə pul qoyub Qasım kəndində bir mədrəsə bina edək ki, ondan uşaqlarımıza rus dili və xətti və həm özgə hürfət və sənaət tə’lim oluna və həm müsəlmanca da tə’lim oluna və bu xüsusda dövləti-Rusiyadan izn tələb etmişik. Ümidvarıq ki, tezliklə izn gəlsin.

**Ş e’ r:**

Təqlidi valideynə zəmanə izn verməsə
Etmək zəmanəyə təqlid fərzi-eyndir.

2) Aprel ayında bir Cuməli adlı məşhur oğru Qasımkənd dustaqxanasından qaçıb bir Zəhra adlı gəlini qaçırdıb. Onun başının saçlarını gödək etdirib mərdanə çərkəs libası geydirib özünə yoldaş edib hər ikisi tüfəng və yaraq ilə yolda rast gələnləri söyə gəzirdilər. Keçən ayın 22-ci gecəsi okrujnoy naçalnik knyaz Orbelyanov öz nökərləri ilə onları dəstgir edibdir.

**Ş e’ r:**

3) Başlar qələm səhifeyi-əxbarı yazmağa
Əhli-sədaqətin bu da bir özgə dinidir.

1862-ci iləcən bizim məmləkətlər öz xanlarının və bəylərinin ixtiyarında olub, uzaq yerlərə kəsb və ticarətdən ötrü səfər eləməyib ata-baba qaydası üzərində güzəran ediblər. Ona binaən əlqənaətü kənzun layəfna vəlyö’sü ehdərrahəteyin[1] dairəsindən çıxmayıb dünyadan bixəbər dolanıblar.

Zikr olan tarixdən sonra bizim məmləkətlərə rus naçalnikləri tə’yin olunub, təzə imarətlər tə’mir olundu. Buralar əhalisi ruslar ilə ixtilati-təbii edib onların təmiz mənzillərini, təam və libaslarını görüb özləri başladılar yaxşı imarətlər təmir etməyə, təmiz libaslar geyib və təamlar yeyib zövqü səfaya məşğul olmağa, amma mədaxil cəhətindən tərəqqiyi-təhsilə artıq ehtimam etməyib və tə’limi-hürfət və sənaət qeydinə düşməyib hamı o cəhətdən boyağa ümidvar olub borcla boyaq əkdilər və müntəzir oldular ki, boyağın nəf’indən borclarını rədd edib mədaxillərinin açığını dolduralar və onlar ilə məsarifləri arasında müvazinə edələr.

---

[1] Qənaət tükənməz xəzinədir, naümüdlük isə iki rahatlıqdan biridir.

Heyf ki, bu tərəqqi tərəqqiyi-mə'kus qəbilindən olub cəmisi vadiyi-hirmanda sərgərdan qaldılar və bu illərdə ki, boyağ vəfat etdi, bular ərəsat iflasında fəhəl ləna min şüfəai fəyəşfəü ləna[1] münacatı ilə nalan oldular.

**Ş e' r:**

Tapdı runas inkisarından neçə dil inkisar
Qaldı onun əhli aləmdə səfilü qüssədar.
Ya ilahi, eylə sən onları zillətdən xilas
Ta tələbkaran əlində olmasınlar əhli-nar.

Pəs bu qədər vilayət əhli hamısı boyağa məşğul olmayıb bə'zisi özgə hirfət və sənaət ilə məişət eləməyi öyrənmiş olsa idilər, əlbəttə, bu gün bunların bə'zisi müflis olseydi, bə'zisi dövlətmənd olur idi və bunlar bir-birinə kömək edərdilər. Pəs gərək bu macəradan ibrət alıb, qeyri cürə binagüzarlıq edək ki, bir də belə rüsvalıq bizim üçün və övladımız üçün olmuya.

* * *

Gələn il avqustun axırında Peterburq şəhərində müsəlmanların dillərin və elmlərin bilən elm sahibləri cəm olacaqdırlar. Ona binaən vəziri-üləma təvəqqə edir ki, hər kəsin köhnə sikkəsi və qeyri qədimi şeyləri varsa, ol vaxtacan Peterburq şəhərinə cənab general Vasili Vasilyeviç Qriqoryevin adına göndərsin. Sonra ol şeyləri qaytarıb öz sahiblərinə göndərəcəkdirlər və əgər onlardan bir şey tarix səbəbilə lazım ola, onun əvəzində bəlkə çox pul versinlər.

* * *

Qerdseqovinə əhlindən 100000 can övrət və uşaq sərhəddi keçib qeyri yerlərdə məskən ediblər. İndi aclıqdan və soyuqdan onlar tələf olduğuna Avropa əhli onlara pul, paltar və çörək göndərir. Rusiya əhli onlara artıq kömək edir. Məsələn, Moskva camaatı şəhər pulundan onlara 20000 manat verib. İndi Peterburqda olan "Russki bazar" adlı ticarət icmaı bəyan edir ki, oktyabrın 20-dən 27-cən onların maqazinlərində satılan şeylərdən cəm olan məbləğin nisfini onlara bağışlayır.

---

[1] Bir şəfahəti vardırmı ki, bizə də şəfahət etsin?

* * *

Tehrandan yazırlar ki, 2000 süvari əsgəri onlara 4 ay məvacib verilmədiyinə bunt ediblər.

* * *

Daşkənddən tel var ki, Kokan əhli təzədən bunt edib. Onların təzə xanı Nəsrəddin Rusiyaya qaçıb.

* * *

Türküstandan yazırlar ki, rusun kağız pulu çox rəvacdır. 100 manatlıq kağız 110 manata gedir.

* * *

Odesdə bir 13 sinnində yəhudi elə və’z edir ki, onun hər və’zindən ötrü xalq ona 60 manat verir.

* * *

Qerdseqovinədə 100000 Osmanlı əsgəri var. İndi sərəsgər Rza paşa hökm edib ki, artıq əsgər göndərməsinlər.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Əvvəlinci sənə* *İki həftəlik qəzetdir* *Doqquzuncu nömrə*

*Fi 1 ziq'ədə, sənə 1292*

* * *

*Hər kəs öz işləri barəsində bu qəzetdə e'lamnamələr basdıra bilər. Belə e'lamnamələri basdırdan kəslər lazımdır ki, e'lamnamənin hər kəlməsinə iki qəpik versinlər.*

* * *

*Səşənbə günü*




*Fi 18 noyabr Rusiya, sənə 1875*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*Poşt xərci qəzet basdıran ilədir*

Bu qəzet çap olunur Qafqaz vilayətinin Badkubə şəhərində. Hər kəs e'lamnamələr və məktubat göndərmək xahiş etsə, qəzeti çap etdirənin adına göndərsin. Qəzet almağı xahiş edən kəslər qəzetin yuxarıda zikr olan qiymətini lazımdır qəzeti basdıranın adına göndərsinlər və öz adlarını və sakin olduğu yerlərini yazıb mə'lum eləsinlər. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.

## E' L A N

Gələn 1293-cü sənədə "Əkinçi" qəzeti genə hər iki həftədə bir dəfə, yə'ni hər ayın 1-də və 15-də çap olunacaqdır. Bir illik qiyməti 3 manatdır. "Əkinçi"ni gələn il almaq istəyənlərdən iltimas edirik ki, bu 1292-ci sənə qurtarmamış qəzetin zikr olan qiymətini bizə göndərsinlər ki, pişəzvəqt onu gələn il basdırtmağın sərəncamına məşğul olaq.

## DAXİLİYYƏ

Rusiyanın şəhərlərində və kəndlərində aşkar olan yanğıların qədərini və onlardan olan zərərlərin hesabını həmişə qəzetlərdə yazıb bəyan edirlər. Ol xəbərlərdən mə'lumdur ki, hər ildə Rusiya əhlinə yanğından bir neçə milyon manat zərər olur. Yanğından xalqı mühafizət etməkdən ötrü Rusiyada zəmanət icmaları bina olunub ki, onların bizim Qafqazda da adamları var. Hər kəs öz evini qiymət edib ol qiymətə görə zikr olan icmaa ildə bir qədər də pul verir. Bu şərtlə ki, onun evi yansa, məzkur icma onun qiymətini ona versin. Və bir də hər kəndin və şəhərin icmaı yanğı keçirtməkdən ötrü lazım olan əsbablar,

atlar və fəhlələr saxlayırlar ki, yanğı aşkar olan kimi onlar dərhal gedib onu keçirtsinlər.

Böyük şəhərlərin hər bir məhləsində bir hündür minarə tə'mir olunub və ol minarənin başında həmişə qarovulçu durub ki, yanğını görən kimi zəng vurub ol minarədə həmişə sakin olan yanğı keçirdənləri hali etsin. Ol vaxtda yanğı keçirdənlər 5 dəqiqənin müddətində öz ərradələrinə lazım olan əsbabları və suyu götürüb çaparaq gedib yanğını keçirdirlər. Ondan masəva hər məhlənin bir tövr fanusu var, elə ki, bir məhlədə yanğı oldu, qarovulçu öz məhləsinin fanusunu yandırıb minarənin başından asır. Onu görüb qeyri məhlələrin qarovulçuları yanğı olan məhlənin fanusu tərzdə fanus yandırıb tamam xalqa yanğı olan yeri mə'lum edirlər. Ol vaxtda hamı məhlələrin yanğı keçirdənləri yanğı olan yerə cəm olub yanğını keçirdirlər. Onlardan savayı hamı məhlələrin arasında teleqraf var ki, yanğı çox ya az olmağını bir-birlərinə tel vurub mə'lum etsinlər. Və bir də Rusiyada ev tə'mir edənlər qanuni-tə'mirata binaən gərək evlərini bir-birindən aralı tə'mir etsinlər ki, yanğı olanda bir evdən o biri evə keçməsin və küçə gərək 9 arşından ensiz olmasın. Amma bununla belə Rusiyada yanğıdan hər ildə bir neçə milyon zərər olur. Bizim ki xalqı yanğıdan mühafizət etməyə heç bir tədarükümüz yoxdur və evlərimizin çoxu ağacdan ya qarğıdan və qamışdandır, evlərimizin bir-birindən aralı tikməkdən, enli küçələr qayırtmaqdan bixəbərik – hər ildə yanğıdan nə qədər zərərimiz olur! Biz korluq çəkməyə elə adət etmişik ki, bir kəndimiz tamam yananda da yazıb yerinə mə'lum etmirik. Hətta zərər dəyən kəslərimiz də yandım sədası vermir. Əlhəq bizim diriliyimizə tamaşa edən gərək təəccüb etsin ki, bu qədər korluq çəkməkdən nə yovuz buçağacan tələf olmamışıq!

## ƏKİN VƏ ZİRAƏT XƏBƏRLƏRİ

Keçən nömrələrdə əkin yerini necə imtahan etməkdən və onun xasiyyətlərindən danışdıq. Ümidvarıq ki, bu çağacan bizim qəzeti oxuyan əkinçilər öz yerlərini imtahan edib onların xasiyyətlərini biliblər. İndi nə tövr ilə əkin yerinin xasiyyətini dəyişdirməkdən danışaq. Əgər bir kəs istəyə ki, bir yerdə əkin etsin, amma ol yerin xasiyyəti, yə'ni qumu, gili ya əhəngi ziyadə olmağı ona mane ola, ol vaxtda ol yerlərin xasiyyətini dəyişdirmək lazımdır.

Əlbəttə qumu ya əhəngi ziyadə olan yerə gil və gili ziyadə olan yerə qum və əhəng ya gili, qumu və əhəngi ziyadə olan yerə çürümüş ot qarışdırmaqlıq ilə onları yaxşılaşdırmaq olur və belə əkin yerinə torpaq çəkəndə sə'y etmək gərək ki, ol yerdə qumun, gilin və əhəngin qədərini bərabər edəsən. Əgərçi zikr olan qayda ilə əkin yerinə torpaq çəkməyin xərci və zəhməti çoxdur, məsələn, bir yerin qumu az olduğuna əkinçi istəyə ki onun qumunu artırsın, məsələn, onun 100-də 10 girvənkə qumu olsa, istəyə ki 10-də 15 girvənkə qumu olsun, ol vaxtda hər desyatinə (bir desyatinin tuli 180, ərzi 120 rus arşınıdır). 8000 putacan gərək qum çəksin, amma eyni məsləhətdir ki, əkinçi qışda bikar olan zaman mürur ilə öz yerlərinə lazım olduqcan torpaq çəksin ki, ol yerin xasiyyəti yaxşılanmağa binaən artıq mənfəətbərdar olsun.

Bə'zi vaxtda əkin yerinə lazım olan torpaq qarışdırmaq çox asan olur. Məsələn, əkin yerinin binası, yə'ni şuxm olan yerin altı ol yerə lazım olan torpaq olsa, məsələn, qumstanın binası gil ya gilin binası qum olsa, ol vaxtda belə yeri dərin şuxm etməkliklə yaxşılandırmaq olur, ya lazım olan torpaq olsa, ol vaxtda su arxının ağzını bağlayıb ol torpağı suya qarışdırıb sonra suyu ol yerə buraxıb orada 20 ya 30 saat saxlayanda sudan torpaq yerə düşür. Onu şuxm edib yerə qarışdırmaq olur. Bişmiş gil qum xasiyyətində olduğuna gilli yeri yandırmaq və ona qum çəkmək kimidir, amma gərək kotan ilə ya bel ilə ol yerin üzünü bir qat soyuq, onu kərpic kimi kəsib onları ömür yandıran kimi yandırıb, sonra əzib ol yerə çəkəsən. Belə gilli yeri yandıranda orada olan alaq otlarının toxumları və heyvanat yumurtaları yanıb tələf olurlar. Şoran yerin şor olmağına səbəb ol yerdə duz çox olmaqdır. Belə yeri yaxşılandırmaqdan ötrü ol yeri suya basdırmaq gərək ki, su duzu əridib axıdıb aparsın. Əkin yerin yaxşılandıran vaxtda sə'y etmək gərək ki, ol yer düz və bir az eniş olsun ki, onu sulayan zaman ya yağış yağan zaman su bir də dayanmayıb mürur ilə axsın. Amma onun enişi artıq olsa, onu su yuyub xarab edər.

Çünki yerin xasiyyətini imtahan etmək və ol yerə lazım olan torpağın qədərini bilmək çətindir, ona binaən məsləhətdir ki, hər əkinçi zikr olan qaydaların birisi ilə öz yerini yaxşılandırandan irəli ol yerin bir hissəsini imtahan üçün yaxşılandırsın və əgər ol hissə torpaq çəkməkdən yaxşılansa, sonra tamam yerə ol qayda ilə torpaq çəksin.

## ELM XƏBƏRLƏRİ

Almaniya qəzetlərində belə yazırlar ki, bir toyuq ömründə 600 yumurta yumurtdaya bilir. Əvvəlinci ili 20, ikinci ili 120, üçüncü ili 130, dördüncü ili 214 yumurtdayır. Amma dörd yaşından sonra hər il 20 əskik yumurtdayır, ta ki doqquz yaşınacan. Ondan sonra ildə ancaq 10 yumurta yumurtdayır. Belə olan surətdə yumurtadan ötrü toyuq saxlayan gərək 3 ya 4 ya 5 yaşında toyuq saxlasın, ondan cahil ya qoca saxlamasın.

* * *

Qəzetlərdən belə mə'lum olur ki, ingilis məmləkətində inək sağmaqdan ötrü bir quttaperçi düdük bina ediblər ki, o düdüyün 4 ucu var. Hər bir ucunun içinə inəyin bir əmcəyini salanda inəyin sütü özbaşına qurtarınca axır, sonra düdük özü düşür.

* * *

İldırım, yağış çox yağan vilayətlərdə çox vaxtda yerə düşüb, ziyadə zərər edir və imtahan ilə mə'lum olubdur ki, ildırım hündür şeylərin, məsələn, hündür ağacın ya hündür evin üstə artıq düşür. Ondan savayı mə'lumdur ki, bə'zi ağaclar, məsələn, palıd və qoz ağacları ildırımı çəkdiyinə onların üstə çox düşür, amma qovaq və daranqu ağacları onu çəkmədiyinə onların üstə ildırım düşmür. Bu səbəblərə indi Avropa şəhərlərində hər bir evin ətrafında qovaq əkirlər ki, evləri ildırımdan mühafizət etsin.

* * *

Gümüş şeyləri belə təmizləmək olur: bir qazanda kartofeli bişirib çıxardandan sonra onun suyunu iki saat saxlayıb o su ilə gümüş şeyləri yuyanda onlar çox təmiz olurlar. Guya onları torpaq ilə sürtmüsən. (Gümüş şeyi torpaq ilə və ya qeyri şey ilə sürtmək yaxşı deyil, onda gümüşün qədəri azalır). Zik olan kartofel suyu ilə mis və dəmir şeyləri də təmizləmək olur, beşərta ki, məzkur şeyləri yuyandan sonra təmiz əski ilə qurudasan.

* * *

Yolunmamış quşları saxlamaq çox müşküldür. Ona binaən ki, onlar tez iyiyib xarab olurlar. İndi ingilis qəzetlərində yazırlar ki, başı kəsil-

miş quşu saxlamaqdan ötrü onun boğazına bir yumru kömür soxub sap ilə bərk bağlayıb bir quru və külək dəyən yerdə asanda onları bir neçə gün saxlamaq olur.

* * *

Qerman adlı şəxs yazır ki, zəli ilə havanı dəyişməyin belə bilmək olur: bir şüşəni yarısınacan su ilə doldurub onun içinə bir zəli salıb ağzını bez ilə bağlayıb evdə saxlayanda hava dəyişməyin bilmək olur: əgər sübhdən görəsən ki, zəli şüşənin dibində yatıb, yəqin ki, hava yaxşı olacaq. Əgər zəli şüşənin suyunun üzünə çıxırsa, yəqin yağış ya qar yağacaq və ya bərk külək əsəcək.

* * *

Qəzetlərdə yazırlar ki, burundan gələn qanı belə kəsmək olur: əgər qan burnun sağ deşiyindən gəlirsə, ol vaxtda sağ əlin kiçik barmağının ucunu dırnaqdan yuxarı və axrıncı bənddən aşağı sap ilə bərk bağlayanda, ya burnun sol deşiyindən qan gəlirsə sol əlin zikr olan barmağını məzkur qayda ilə bağlayanda qan kəsilir.

* * *

Gürcüstanda ud adlı bir tayfa var ki, onun dilində Misir əhlinin dilinin sözlərindən çox sözlər var. Qədim tarixlərə binaən Misir əhli bir neçə min il bundan əvvəl Gürcüstanı zəbt etmişlər imiş. Belə görünür ki, onların bir güruhu bizim Gürcüstanda qalmış imiş. Çünki zikr olan ud tayfası mürur ilə azalıb tələf olur və yavuq zamanda bilmərrə yox olacaqdır, ona binaən indi elm sahibləri ol tayfanın dilini öyrənib onun Misir əhli olmağını sübut edirlər.

* * *

Bu çağadək yanğını su ilə keçirdirlər idi, amma indi mə'lumdur ki, yanğı çox şiddət edən zaman onun üstə su tökən zaman su özü yanır. Bu səbəblərə indi Amerikada su buğu ilə yanğını keçirdirlər.

Bu elm xəbərlərin yazıb *Əsgər Mirzə Adıgözəlzadə Gorani.*

## İRƏVANDAN MƏKTUBDUR

20 ya 30 il bundan əqdəm İran dövlətinin Qarapapaq tayfasından 1500 xanə Osmanlı dövlətinə tabe olan Şurəgil adlı yerə köçmüş imişlər. İndi İran dövlətinin tərəfindən məzkur tayfanı zor ilə İrana köçürdməyə hökm olunub. Bu əmrdən ötrü cənab Mirzə Haşım xan Şoragilə varid olub, ol tayfadan 500 ev İrana göndərib və qalan 1000 evin iltimasına binaən onlara möhlət verib ki, torpaq məhsulatların götürüb sonra köçsünlər. Bu halda xəbər var ki, onlar da bu günlərdə köçə-cəkdirlər.

Bu qərardadlardan belə mə'lum olur ki, ə'lahəzrət şahi-İran Avropa səyahətindən sonra bu xəyala düşüb ki, hakimlərinin zülmündən xaric məmləkətlərə pərakəndə olan İran rəiyyətlərini cəm edib onların xüsusunda lazımi qanun və nizam qoysun ki, hər bir rəiyyət asudə öz işinə məşğul olsun, heç kəsin haqqında bundan sonra hakimiyyət tərəfindən cəbr və zülm olmasın.

Ümidvarıq ki, şahın bu binagüzarlığından sonra İran dövlətinin rəiyyətləri hakimlərinin zülmündən xilas olub sair dövlətlərin rəiyyətləri kimi öz vətənlərində kəsbkarlığa məşğul olsunlar.

Fi 2 şəvval *Məhəmmədəli bəy Vəliyev*

## TƏZƏ XƏBƏRLƏR

Sentyabrın 25-də "Türküstan" qəzetində general Kaufmanın bu məzmunda hökmü çap olunub: nəhri-Sırdəryanın, yə'ni Seyhun çayının sağ tərəfi ki, Kokan xanının itaətində imiş, imperaturi-Rusdan əlahiddə hökm oluncan Rusiyaya tabe hesab olunsun. Ol yerlərdən ki, 5 bəylik hesab olunur imiş, bir Namancan adlı okruq bina olunub və oraya Sobolev adlı polkovnik naçalnik tə'yin olub.

* * *

Osmanlı dövləti öz qərzdarlarına mə'lum edib ki, onlara borcların sələminin nisfini nə qədər verəcək, amma nisfinin əvəzində onlara təzə kağız verib borclu olacaq. Bu barədə qərzdarların və onlar tabe olan dövlətlərin, yə'ni ingilis və firəng vüzəralarının arasında danışıq

var. Bə'zi məsləhət edir ki, Osmanlı dövləti vəqf olunan mülk və mallara maliklənib onu xalqın xoşgüzəranını artırmağa xərc edib onların təhmilatını artırsın ki, borcların sələmini vermək olsun. Bə'zi deyir ki, Osmanlı dövlətinin tamam təhmilatını qərzdarlara versinlər ki, onlar pullarının sələmini götürüb artıq qalanını dövlət işlərinə məsrəf etsinlər. Amma bəzi deyir ki, yaxşıdır Osmanlı dövlətinin paytaxtı İstanbul şəhərini satıb ondan cəm olan məbləği qərzdarlara versinlər ki, Osmanlı dövləti birdən borcdan xilas olub Asiya qit'əsində özünə təzə paytaxt bina etsin.

* * *

Misirdən yazırlar ki, xədivin əsgəri Həbəş hökumətinin sərhəddini keçib Həbəş yerinə daxil olubdur. Buçağacan həbəş əsgərlərilə cəng düşməyib.

* * *

İngilis padşahının oğlu Hindistana daxil olub. Bombey şəhərindən oktyabrın 26-da yazırlar ki, şahzadənin qabağına Hindistan knyazlarından 70 adam çıxıb. 200000 tamaşaçı küçələrdə olub.

* * *

Peterburq qəzetində yazırlar ki, ə'lahəzrət Nəsrəddin şah Moskva şəhərində olanda onun xidmətində olan xanların birisi ki, onun ismi Mirzə Mahmud Hacı Hüseyn xan imiş, xaçpərəst olub Moskvada qalmış imiş, indi Sergey adlı monastra gedir.

* * *

İngilis vilayətində hər bir sənətkarların və hər bir cürə fəhləlik edənlərin icmaı var ki, hər kəs ol icmaya öz güzəranına görə xərc verir. O pul ilə icma şikəst ya naxoş olan və qulluğu olmayan kəsləri saxlayır və bir neçə dəfə ol icmalar sözü bir edib fəhləliyə artıq pul istəyib alıblar. Bir neçə il bundan əqdəm kənizlər icma bina ediblər. İndi yazırlar ki, nökərlər də icma edib istəyirlər ki, onlara həftədə 3 gün oxumağa rüxsət versinlər.

* * *

Oktyabrın 17-də Peterburqda polisə ərz elədiyinə Mirovoy sudya Kiselyov adlı qəssab iyimiş ət satmaqdan ötrü bağlanan işə mülahizə edib. Əgərçi Kiselyov sübut edib ki, ondan ət alanlar iyimiş olmağını bilib alıblar, amma mirovoy qət edib: çünki iyimiş ətin bədənə zərəri var, ona binaən Kiselyovdan 50 manat cərimə alınsın.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления

*Əvvəlinci sənə* *İki həftəlik qəzetdir* *Onuncu nömrə*

*Fi 15 ziq'ədə, sənə 1292*

* * *

*Hər kəs öz işləri barəsində bu qəzetdə e'lamnamələr basdıra bilər. Belə e'lamnamələri basdırdan kəslər lazımdır ki, e'lamnamənin hər kəlməsinə iki qəpik versinlər.*

* * *

*Şəşənbə günü*




*Fi 2 dekabr Rusiya, sənə 1875*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*Poşt xərci qəzet basdıran ilədir*

Bu qəzet çap olunur Qafqaz vilayətinin Badkubə şəhərində. Hər kəs e'lamnamələr və məktubat göndərmək xahiş etsə, qəzeti çap etdirənin adına göndərsin. Qəzet almağı xahiş edən kəslər qəzetin yuxarıda zikr olan qiymətini lazımdır qəzeti basdıranın adına göndərsinlər və öz adlarını və sakin olduğu yerlərini yazıb mə'lum eləsinlər. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.

## E' L A N

Gələn 1293-cü sənədə "Əkinçi" qəzeti genə hər iki həftədə bir dəfə, yə'ni hər ayın 1-də və 15-də çap olunacaqdır. Bir illik qiymət 3 manatdır. "Əkinçi"ni gələn il almaq istəyənlərdən iltimas edirik ki, bu 1292-ci sənə qurtarmamış qəzetin zikr olan qiymətini bizə göndərsinlər ki, pişəzvəqt onu gələn il basdırtmağın sərəncamına məşğul olaq.

* * *

Bizim qəzetdə çap olunmaq üçün hekayət göndərən kəslərə mə'lum edirik ki, qəzetdə yer olmadığına onları basdıra bilmirik.

## DAXİLİYYƏ

Səkkiz ildir ki, bizim vilayətimizdə təzə mirovoy və okrujnoy sudlar qoyulubdur. Əlbəttə bu çağacan ol qaydada baxan kəslər onun yaxşı və yamanlığını və keçən qaydadan çox ə'latər olmağını biliblər. Amma bunilə belə bə'zi kəslər təzə qaydada şikvə və narazılıq edirlər və onların şikvəsinə səbəb ol qayda özü deyil, amma bə'zi əməlocat,

o cümlədən advokatlar, yə'ni vəkillik edən kəslərdirlər. Bu səbəblərə təzə qaydaya yaman demək olmaz. Keçən zaman muğrovlarımız əlindən dad edirdik, indi zakon onlardan bizləri xilas edib, ixtiyar verib ki, işlərimizi özümüz bəyan edək və əgər xahiş edək, advokat tutaq, hərgah bunilə belə biz öz əlimiz ilə onlara bica yerə pulumuzu veririksə, zakonda təqsir yoxdur, təqsir bizim avamlığımızdadır ki, öz işimizdən baş çıxarmayıb advokata pul veririk ki, bizim yerinə danışsın. Əgərçi bu halda Rusiyada vəkillər barəsində təzə qanun bina etmək istəyirlər və bizim Tiflis şəhərində kamil advokatlar istəyirlər bir icma bina etsinlər ki, hər kəs gedib onlar ilə müftə məsləhət edə bilsin və fəqir-füqəraya müftə vəkil olsunlar. Amma ümidimiz yoxdur ki, xalq ol qaydalardan xoşgüzəran olsunlar.

Dünyada heç vaxtda bilmərrə əminlik olmaz, həmişə oğru və dələduz, yə'ni müftə çörək istəyən olacaqdır. Amma xalq qanacaqlı olduqcan əminlik artıq olacaqdır. Bir hambala əlvan libas geydirib hamballıq elədəndə iki gündə ol libas zay olmağının təqsiri libas xarab olmağı deyil, hamballıq sənətidir. Həmçinin xalq avam olanda hər bir qayda qoyulsa, ondan şikvə edən olacaqdır. Ona binaən ki, xalq avam olduqcan qulluq əmələcatı nadürüst ola bilir və əgər əmələcat kamil və insaflı da olsa, avamı aldadan çox olur.

Pəs bizim əmələcatdan və advokatdan şikvə edənlər bizi əvvəl müğrovlar və indi bə'zi advokatlar soymağına səbəb biz özümüzük. Nə qədər biz avamıq, bizi aldadan olacaqdır. Əmələcatdan və advokatlardan bizləri xilas etməklik ilə biz xoşgüzəran olmayacayıq. Onlar olmayanda bir qeyri müftəxor bizim malımıza şərik olacaqdır. Pəs şikvə etməyin, əvəzində sə'y edin, qanacağınızı artırın, yə'ni elm təhsil edin ki, müftəxorların sizin tər töküb qazandığınız mülk və malınıza şərakətliyi olmasın.

**Ç ə y i r t g ə**

Yek müəmma əztü pürsəm, ey həkimi-pürhünər
Mən dərin səhra bədidəm yek əcaib canəvər.
Ərrəpayəş, mardüm, kərkəssifət, əqrəbşikəm,
Mahəndam, fildəndan, gavsinə, əsbsər.[1]

[1] Ey hünərli həkim, səndən bir tapmaca soruşuram: mən bu səhrada bir əcayib heyvan gördüm; mışarayaqlı, ilanquyruqlu, kərkəssifətli, əqrəbqarınlı, balıqbədənli, fildişli, öküzsinəli, atbaşlı.

Bu sözləri ilə şair keçən zəmanədə çəyirtgəni bəyan edib. Amma çəyirtgə bizim gözümüzün yaşını ol qədər töküb ki, onu uşaqdan böyüyəcən hamı tanıyırıq. Ona binaən onun sifətini bəyan etməyi lazım bilməyib onun ömründən və bizlərə etdiyi zərərdən xilas etməkdən göftgu edəcəyik.

Baharın ortasında ki, payız və yazda əkilən əkin göyərib çəyirtgə yumurtadan çıxıb zühura gəlir, ol zamanda çəyirtgə muçək boyda və qanadsız olur, ona piyadə çəyirtgə deyirlər. Piyada olan zaman çəyirtgə 5 dəfə tülüyür, yə'ni ilan kimi dərisini dəyişdirir və hər tülüyəndən sonra bir az böyüklənir. Üç tülüyənəcən çəyirtgə zəif olduğuna elə zərər etməz. Amma ondan sonra onun kiçik qanadları əmələ gəldiyinə qüvvətlənib ziyadə zərər edir. 5 tülüyəndən sonra qanadları böyüyüb uçduğuna ona uçan çəyirtigə deyirlər.

Çəyirtgə yumurtadan çıxıb qanad açıb uçan vaxtacan quraqlıq olanda 40 və yağınlıq olanda 50 gün keçir.

Çəyirtgə qanad açandan sonra qalxıb şimal tərəfə uçar. Bu uçan zaman onun ömrü 40 gün çəkir. Çəyirtgə səfər edən zaman yolda göyərtiyə rast gələndə düşüb onu yeyir, gecə yatıb sübhdən uçar. Uçan çəyirtgə ömrünün axırında yerə toxum salıb tələf olur. Onun toxumu darı dənəsi boyda, irəngi əvvəldən sarı və sonra qara olur. Onları çəyirtgə çay kənarında və qeyri qüvvətli yerlərdə bir yay iki barmaq yerin altına qoyar. Hər çəyirtgənin 70-əcən yumurtası olur. Çəyirtgə onun hamısını bir yerə ya bir neçə yerə salıb sonra tələf olur. Xüsusən çəyirtgə ömrünün əvvəlində yumurta, sonra piyada və uçan çəyirtgə olur. Onun yumurta vaxtı zərəri olmaz. Piyada çəyirtgə əmələ gəldiyi yerə zərər edər və uçan çəyirtgə öz səfərinin vaxtında bir yerə zərər edib qalxıb gedib qeyri yerə zərər edir. Yə'ni onun zərəri çox da olsa, bir yerə olmaz.

Çəyirtgəni yumurta vaxtında tələf etmək məsləhətdir. Uçan çəyirtgə bir yerə düşüb gedəndən sonra ol yerin bir neçə tərəfindən torpaq alıb baxanda çəyirtgənin toxumu oraya salınmağın bilmək olur. Hərgah ol yerə toxum salınmışsa, oranı şuxm etmək gərək ki, çəyirtgənin toxumları yerin üzünə çıxsın. Ondan sonra əgər o yerin qışı bərk olursa, artıq zəhmət çəkmək lazım deyil, qışda soyuqdan toxumlar özləri tələf olacaqdırlar. Amma ol yerin qışı bərk olmursa, toyuq və qeyri quşları ol yerə çıxarmaq gərək ki, onlar toxumları yeyib tələf etsinlər. Amma toxumun qədəri çox olanda onu zikr olan qayda ilə tələf etmək

müşküldür. Ol vaxtla sərhesab olmaq gərək ki, yazda onlardan çəyirtgə əmələ gələn kimi onları qırıb tələf edəsən.

Piyada çəyirtgəni bir neçə qism ilə qırırlar. Ya onları çalğı ilə, ya quyular və xəndəklər qazıb çəyirtgələri onlara salıb üstün torpaqlamaq ilə və ya quru ələflərə neft vurub onu yerə səpib çəyirtgə onun üstdə çıxanda onu odlamaqla onu tələf edirlər. Xülasə, çəyirtgə piyada olan vaxtda onu qırıb tələf etmək gərək, yoxsa qanad açanda ələ gəlməz. Bə'zi kəslər uçan çəyirtgədən öz əkinini tüfəng atmaqla ya mis qabı çalmaqla və ya dua oxumaqla xilas etməyə sə'y edib çəyirtgə qonşunun taxılını yeyib onunkun yeməyəndə fikir edirlər ki, ona tüfəng atmaq ya mis qabı çalmaq bais oldu. Amma uçan çəyirtgənin tüfəngdən bakı yoxdur. Bir yerə düşüb doyunca yeyib tüfəng atılmasa da, sübhdən qalxıb gedəcəkdir.

Çəyirtgə ilə sığırçınların davasını görən fikir etməsin ki, sığırçınlar bizim üçün ol divanı edirlər. Əlbəttə, bizim sərçələr kəpənəkləri və cücüləri buyuruğumuza binaən tutmurlar. Həmçinin sığırçınlar da onları yeməkdən ötrü qırırlar. Əgər onlar həmişə çəyirtgənin dalınca getməyinə baxırsız, ona səbəb oldur ki, sığırçın köçəri quşdur, bir yerdə qalmaz və əgər onların çəyirtgələri qırıb yerə tökməyinə baxırsız, onlar davanı havada edirlər, onlar fövt elədiyi çəyirtgələrdən ondan biri onların ağzına düşüb qeyriləri yerə düşür. Amma sığırçın düşüb onları yemədiyinə səbəb oldur ki, havada çəyirtgə çoxdur, yerə düşüncən havada bir qeyrisin tutur.

## MƏKTUBAT

Petrovskidən cənab Heydəri yazır:

1) Bir şəxsi-fazil Rusiya əhlindən ki, ərəb dilinə kəmali-vüqufu var, bir neçə gün bundan əqdəm məndən sual elədi ki, sizin peyğəmbər Məhəmmədül Mustafa buyurmuş: Əl elmi-elmani elmül-əbdan və elmül-ədyan əqli-əqlan, əqlül-məaş və əqlül-məal[1] – din və məad elmi mə'lum, bədən elmindən və məaş əqlindən mənə bəyan elə görüm ki, o həzrətin mənzuru bu kəlamdan nə imiş. Mən öz qüvvəm qədər əqli və

[1] Elmlər iki növdür: bədənlərə aid olan elm və dinlərə aid olan elm. Ağıl da iki növdür: məişətə aid olan ağıl və axirətə aid olan ağıl.

nəqli sözlərdən o qədər ki, bilirdim o şəxsin cavabında dedim. O şəxs mö'təbər dəlillər ilə mənim sözlərimi rədd edib dedi ki, müsəlmanlar din və məad elmi behşt və huri qılman ümidi ilə yaxşı bilirlər, amma məaşi-əqli və bədən elmi ki, onlardan ləfzən və mə'nən sibqəti var, bilmərrə əllərindən verib və heç bir şeyi bu iki lazım olan zaddan bilmirlər. Çün mən maleysə ləkə bihi elmün[1] babətindən məəttəl qalıb və mülzəm oldum buna binaən "Əkinçi" qəzetinin inşa edəndən iltimas edirəm ki, öz qəzetində iste'anət üçün bizim milləti qardaşlarımızdan xahişi-cavab eləsin ki, elmi-əbdan və əqli-məaş şərhində bir müəyyən cavab yazsınlar ki, mən o şəxsi sakit edib cavabın verim.

2) Bir neçə ay bundan sabiq Petrovski poştxanasının poştmeysterin ki, öz elmində kamil və artıq diqqəti var idi, Dərbənd poştxanasına tə'yin edib və Şəki poştxanasının poştmeysterin onun yerinə Petrovskə gətirdilər.

Təzə poştmeyester Petrovskə gələndən sonra nə ki xalq onun öz rəftarından incidilər, bəlkə əməlcatından növ-növ xilaf qaydalar görünüb. Məsələn, mə'ruf və böyük adamların kağızların onların mənzillərinin yanında olan çörəkçilərə və araq satanlara verdilər ki, filan adam buradan keçəndə bu kağızları ona verin. Bunun bir səbəbi o idi ki, keçən illərdə poştalyonlar kağız gətirmək üçün pul alırlar idi. Amma indi zakon xalqı ol puldan məaf etməyinə binaən bə'zi poştalyon öz təklifindən ki, kağızı öz əzailə sahibinə yetişdirməkdir, ağaz edib və soruşan vaxtda nahəmvar və çirkin cavab verillər.

Bu səbəblər ilə təzə poştmeyester xalqı özündən rəncidəxatir edib öz əməlesi ilə küdurət binası qoyub, poştxananın işi nəhayətdə qarışıq oldu. Bu əsnada bir tacir min manat Hacıtərxana göndərmək üçün poştxanaya verib qəbz alır. Amma sonra mə'lum olur ki, o pul Hacıtərxan poştxanasına yetişməyib. Bu səbəbə Balbubədən çinovnik gəlib ki, ol işi təhqiq eləsin və belə deyirlər ki, ol pulu bir poştalyonda tapıblar. Əgərçi tacirin zikr olan pulu batmayacaqdır, amma ticarət mənfəətindən qalacaqdır.

* * *

3) 4 ay bundan qabaq Petrovski qospitalının rəisinin köməkçisi yuxudan durandan sonra fəryad elər ki, gecə mənim okoşkamı açıb 600 manat padşahlıq pulun aparıblar. Amma polisə gəlib təhqiq edəndə mə'lum

[1] Sənin ondan xəbərin yoxdur.

olmuş ki, nə okoşka açılıb və nə məbləğ oğurlanıb. Ondan sonra iqrar edir ki, ol məbləği Petrovskidə olan sahibmənsəb və çinovniklər kağız oynayıb aparıblar. Şəhərin hakimi haman saat onu dustaq edib. İndi qospitalın rəisi özü odun podratçısı ilə saxta kağız qayırmaqdan ötrü dustaq olub.

Qars şəhərindən Xaçatur Qorxmazov yazır:

Dünyada xəlq olunan millətlər öz lisanlarına ana lisanı deyib ol lisan ilə xudavəndi-aləmə ibadət edib insanlıq edirlər. Bunun üçün bir lisan bir millətin olanda və lisanın dəxi əsası millət olduğundan (hər) bir kişiyə vacibdir ki, daima onun irəli getməsinə canını fəda etsin və millətin xidmətində bulunmayan kişiyə bir kəs yaxşı deməyəcəkdir.

Əgər xalq içində eşidilə ki, filan kişi öz anasını yaxşı saxlamayıb, ona çörək və libas vermir, ol vaxtda hər kəs ol kişiyə yaman sözlər deyib yoldan keçərkən rastına gəlsə, bu, anasını xoşnud eləməyən kişidir – deyibən Allahın salamını dəxi ona verməkliyi çox görəcəkdir.

Bir millət ki, bu qədər övladlar dünyaya gətirmişdir neçə-neçə cəhətlərcə onlardan borclar istəyəcəkdir və hər kəs münkər olmayıb mədyundur öz xidmətini əda eləməyə.

Qədim tarixlərdən mə'lumdur ki, çox millətlər həmişə irəli getməkdə idilər. Amma şimdi hamıdan geridə qalıblar. Və ol millətlər ki, geridə idilər, şimdi qabaqda gedən və getməkdə olandırlar. Əcəba bunun səbəbi nədir? Özgə bir səbəb yoxdur, ancaq qədim zamanlar əfkar sahibi kişilər həmişə millətin irəli getməyi üçün ağıl tökürdülər. Kəndi əhzanına dəxi öz əfkarından bəxş edirdilər, amma şimdi zikr olunan inkarı yaddan çıxarıb ancaq pul qazanmağa, zəngin olmağa yaxşı geyməyə və yeməyə çalışırlar. Və özləri elm və ədəb kəsb etmədiklərindən başqa övladlarını dəxi bu lütfi-rəbbanidən geri buraxırlar. Və bir kişi ona yaxşılıq olmaq inkarı ilə söyləsə ki, övladınızı nə üçün məktəbxanaya göndərmirsiz, cavab verir ki, oğlum çox oxuyub mollamı olacaqdır? Öz çulunu sudan çıxarmağı bilir, şimdi varsın pul qazansın.

Şimdi bir sual: əgər bir kişi elm, ədəbi, tərbiyə ilə mədəniyyəti birtərəf edib pul qazanmaqlığı ondan yaxşı tutursa, ol kişidən millətpərvərlik mə'lum olurmu? Haşa.

## TƏZƏ XƏBƏRLƏR

Rus əsgəri Kokandan qayıdandan sonra Rusiya zəbt edən Namanqan okruğu ki, onun tuli 200 və ərzi 50 ağacdır, bunt edib, amma ruslar genə təzədən zəbt ediblər. Misrin 35 min əsgəri Həbəş hökumətinin paytaxtına daxil olub.

* * *

Xəta dövlətinə tabe olan Dunqan əhli general Kaufmana ərizə verib təvəqqe edibdir ki, onları Rusiya özünə tabe etsin, yoxsa Xəta onlara zülm edir.

* * *

Hind–Çində olan Malay soltanının vəliəhdi Abdulla ingilislərə artıq ticarət ixtiyarı verdiyinə onun qardaşı İsmayılın adamları ingilis konsulunu öldürüblər. İndi oraya ingilis əsgəri gedib.

* * *

Peterburqda xəstələrə baxan icma Qerdseqovinəyə 200 xəstəyə lazım olan mayəhtac və 5 təbib göndərib.

* * *

Gələn il Qazan şəhərində müsəlmanları oxutmaq üçün müəllimxana açılacaqdır. Yə’ni ol müəllimxanada oxuyanları müsəlman məktəbxanalarına müəllim tə’yin edəcəkdirlər.

* * *

Rusiyada çap olunan kitabların birisi gərək padşahlıq kitabxanasına göndərilsin. Ol kitabxananın siyahısı binaən keçən il Rusiyada 9776 kitab təzədən inşa olunmuş çap olunub.

* * *

Cənubi Rusiyada çəyirtgə bu il 35000 desyatin yerə toxum salıb.

* * *

İngilisdə dəryaya qərq olan gəmilər özlərinə kömək çağırmaqdan ötrü bir maşın bina ediblər ki, onun sədası külək şiddət edən zaman altı ağac yol gedər.

* * *

Moskvadan noyabrın 1-dən yazırlar:

Ə'la merinos yunu 38, miyanəsi 33 və alçağı 28 manat. Rusiya yununun ağı 8-10, qarası 6-8 manat. Dəvə yunu 5-6 manat, at yalının pudu 5-8 manat, Mazandaran pambığı 6 manat 25 qəpik, İtaliya ipəyi 380-460, Şəki ipəyi 120-130, Buxara ipəyi 115-125, Xəta ipəyi 160-170 manat, lil 100-120 manat, qırmız 33-40 manat, Dərbənd boyağı 3 manat 50 qəpik, qürab 6 manat 25 qəpik, ə'la qəhvə 19 manat 50 qəpik, Moskva qəndi 8 manat, günəbaxan yağı 6 manat, inək yağı 8 manat 50 qəpik, qurumuş gönün pudu 12 manat, qurumamışınkı 5 manat, imperial 6 manat 25 qəpik, gümüş manat 1 manat 20 qəpik.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub

---

С дозволения Цензуры печатано в Типографии Бакинского
Губернского Правления

*Əvvəlinci sənə* *İki həftəlik qəzetdir* *On birinci nömrə*

*Fi 1 zilhiccə, sənə 1292*

* * *

*Hər kəs öz işləri barəsində bu qəzetdə e'lamnamələr basdıra bilər. Belə e'lamnamələri basdırdan kəslər lazımdır ki, e'lamnamənin hər kəlməsinə iki qəpik versinlər.*

* * *

*Pəncşənbə günü*



*Fi 18 dekabr Rusiya, sənə 1875*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*Poşt xərci qəzet basdıran ilədir*

Bu qəzet çap olunur Qafqaz vilayətinin Badkubə şəhərində. Hər kəs e'lamnamələr və məktubat göndərmək xahiş etsə, qəzeti çap etdirənin adına göndərsin. Qəzet almağı xahiş edən kəslər qəzetin yuxarıda zikr olan qiymətini lazımdır qəzeti basdıranın adına göndərsinlər və öz adlarını və sakin olduğu yerlərini yazıb mə'lum eləsinlər. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.

## E' L A N

Gələn 1293-cü sənədə "Əkinçi" qəzeti genə iki həftədə bir dəfə, yə'ni hər ayın 1-də və 15-də çap olunacaqdır. Bir illik qiyməti 3 manatdır. "Əkinçi"ni gələn il almaq istəyənlərdən iltimas edirik ki, 1292-ci sənə qurtarmamış qəzetin zikr olan qiymətini bizə göndərsinlər ki, pişəzvəqt onu gələn il basdırtmağın sərəncamına məşğul olaq.

## DAXİLİYYƏ

Hər bir vilayətin qəzeti gərək ol vilayətin aynası olsun, yə'ni ol vilayətin sakinləri elədiyi işlər, onlara lazım olan şeylər, xülasə, onların hər bir dərdi və xahişi ol qəzetdə çap olunsun ki, ol qəzetə baxan xalqı aynada görən kimi görsün. Əlbəttə, qəzetin belə ayna kimi olmağı xalq ilədir, yə'ni hər kəs gərək öz dərdini və xahişini qəzetlərində bəyan etsin ki, onların barəsində işdən xəbərdar olanlar mübahisə etməkliklə onların yaxşı yamanlığını aşkar etsinlər, ta ki, ol işi görən onun yaxşı ya yamanlığından agah olub sonra peşmanlıq çəkməsin.

Pəs hər bir qəzetin ümdə mətləbi mübahisədir və əgər bizim dünyadan və elmdən xəbərdar olanlarımız "Əkinçi" qəzetində yazılan mət-

ləblər barəsində mübahisə başlasalar, çox şad oluruq. Amma çifayda qəbristanlıqdan səs gəlməyən kimi bizim xalqdan bir səda gəlmir. Qəzeti oxuyanlar ol mətləblərə bir cavab yazmırlar.

Belə olan surətdə biz mübahisəyə həsrət olmaqdan savayı, hətta qəzetimizi oxuyanlar ondan narazı olduğunu da bu çağacan bilmirdik. Amma "Əkinçi" qəzetinin 9 nömrəsi xalq arasına bir səs salıb ki, o səsi eşitməyən yoxdur.

Təzə xəbərlər cümləsində Osmanlı dövlətinin borcundan və bir iranlı Moskvada xaçpərəst olmağından danışdıq, bu iki xəbər bizim xalqa xoş gəlməyib. Əvvələn, təzə xəbərləri biz özümüzdən yazmırıq. Onları xaricilərin qəzetlərindən yazırıq. Ona binaən ol xəbərlər dürüst də olmasa, onları eşitmək bizim xeyrimizdir. Ol səbəbə ki, onları oxuyub xaricilər bizlərə necə baxmağından xəbərdar oluruq. Saniyən, təzə xəbərləri yazanda biz sə'y edirik ki, müsəlman vilayətlərindən çox xəbər yazaq. Ona binaən ki, bizim xalqa ol xəbərlər gərək xoş gəlsin. Amma bizim müsəlmanlar elm və ədəbdən qaçmağına xaricilərə gülüş olublar. Ona binaən bizə xoş gələn xəbərlər onların qəzetlərində çox az olur. Bu səbəblərə yaxşı-yaman hər bir xəbəri yazdıq. Salisən, ol xəbərləri yazandan irəli təhqiq etmək müşküldür. Əgər onları təhqiq edib sonra yazsaq, gərək heç təzə xəbər yazmayaq.

Pəs bizim zikr olan xəbərlərdən narazı olanlar bir şirvanlı hacı kimi fikir etməsinlər ki, onları biz qəsdlə düşmənlikdən yazmışıq. Əgər qəzetdə məqdur olsaydı, mən dəlillərlə sübut edərdim ki, Osmanlı və İran əhli bizim ilə bir qanda, bir canda və bir məzhəbdə olmağına binaən mən bizim müsəlmanların çoxundan və bişəkk zikr olan şirvanlı hacıdan artıq onları dost tuturam. Pəs müsəlmanların düşməni mən deyiləm, məzkur hacı kimi adamlardır ki, bizi millətlər arasında gülüş yeri edib elmdən və dünyadan bixəbər qoyub sərgərdan və payimal ediblər.

## ƏKİN VƏ ZİRAƏT XƏBƏRLƏRİ

Bizim Petrovski akademiya bir böyük məktəbxanadır ki, əkin və ziraət, maldarlıq və meşə saxlayıb becərmək elmlərin tə'lim edir. Akademiyanın öz yerində meşələri, əkin yerləri və malları var ki, oxuyanlar elmləri oxumaqdan savayı özləri əkin əkib, meşə saxlayıb, maldarlıq etsinlər.

Bu səfər bizim mallar saxlanmaqdan danışaq: Akademiyanın 200 baş malı var ki, bu halda qış olduğuna onları tövlədə saxlayıblar. Tövlə bir mərtəbə daş evdir, onun ortasında uzunlamasına iki cərgə axurlar qayrılıb və axurların arasında dəmiryolu qayrılıb ki, bir fəhlə əlində ərradə, o yol ilə gedib-gələ bilsin. Tövlənin axur olan yerləri, yə'ni ortası hündür, amma divarların yanı bir az alçaqdır ki, malların nəcisi və sidiyi axıb oraya getsin.

Hər bir malın öz yeri və axuru var, onları zəncir ilə üz-üzə bağlayıb, 8 ay ki bizim qışdır, saxlayırlar. Bir fəhlə əlində ərradə axurların arası ilə gedib hər gündə 5 dəfə mallara yem verir: sübh saəti-rusi həştdə, onda və on birdə, günortadan sonra saat dörddə və altının yarısındə. Əvvəl dəfə quru ot ya saman, ikinci dəfə su buğunda saxlanmış yem.

Bu yemi belə qayırırlar: kələm və zələx yarpaqlarını bir böyük qazana qat-qat yığıb üstə maşın ilə doğranmış zələx, yerkökü töküb onun üstə kəpək töküb qazanı doldurub üstə bir az duz səpib ağzını bərkidirlər. Sonra bir qeyri qazanda su qaynadıb onun buğunu novça ilə əvvəlinci qazana aparıb, o buğun içində yemi bir gecə saxlayıb sübh saat onda mallara verirlər. Üçüncü dəfə genə ot ya saman, dördüncü dəfə genə su buğunda saxlanmış yem, beşinci dəfə genə ot ya saman.

Bə'zi vaxtda saat on ikidə mallara turş yem verirlər. Turş yemi belə qayırırlar: kələm və zələx yarpaqların hər birin bir əlahiddə quyuda turşudurlar, quyunun uzunu iki sajın, eni və dərinliyi bir sajındır. Onun dibini və yanlarını taxta ilə tutublar ki, yağış suyu ona dolmasın və yarpaqların suyu oradan çıxmasın. Hər bir ərradə yarpağa bir girvənkə duz səpib quyunu doldurub üstün torpaqlayırlar. Belə saxlanmış yarpaqları iyirmi gündən sonra mallara vermək olur.

Malları iki dəfə suluyurlar: bir sübh saat səkkizdə və bir də günorta saat üçdə. Hər səfər qaynanmış və kəpəyə qarışmış su verirlər. Malları hər gündə iki dəfə çotka və qaşov ilə təmiz edib, iki dəfə də onların altının otlarını dəyişdirirlər.

| Bir gündəlik yemək qədəri | quru ot | kəpək | saman | zələx və kələm | arpa |
|---|---|---|---|---|---|
| bir inəyə girvənkə | 25 | 4 | 8 | 30 | - |
| bir öküzə girvənkə | 23 | 2,5 | 6 | 10 | - |
| bir danaya girvənkə | 18 | 2 | 2 | - | 4 |

Moskva şəhərində noyabrın 7-də *Nəcəf Vəzirzadə*

## MƏKTUBAT

"Əkinçi" qəzetində cənab Heydəri sual edib ki, həzrət Məhəm-mədül-Mustafa elmi-əbdanı elmi-ədyandan, əqli-məaşı-əqli-məaddan ayırmaqda o həzrətin mənzuru nə idi? Bir möhtərəm şəxs buyurduğuna binaən katib ərz edir: bu mükalimənin iki surəti var, birisi ki, həqiqətül-əmrdə bu mükalimə vüqu olub və cənab Heydəri cavab istəyib və birisi ki, cənab Heydəri müsəlman camaatını mütənəbbeh və huşyar qılmaq-dan ötrü hikmət təriqindən bu lisan ilə yetirir ki, ey yaran, nə yatıbsız, oyanın, kərvan rəftə ma mandə, əcəb bixəbərim[1].

Elmi-əbdan və əqli-məaşın mə'nasında çox kuşeş lazım deyil, elmi-əbdan bədənləri cəmi əqsami-əvarizati-məkruhədən hifz və asudə eləməkdir və əqli-məaş həm əbdan üçündür. Elmi-əbdanı ayırmağın hikməti budur və əqli-məaşın mə'nası farsidə güzəran və türkidə do-lanacaqdır.

Və sailin məramı bu sualdan o həzrətin mənzurunu və bu fərma-yişin hikmətini axtarıb istəməkdir. Lihaza ona başqa cavablar lazım olmaz. Məgər ki, qüsuru öhdəyə tutub demək: çün o həzrət alim idi ki, yövmən-fəyövmən gün tərəqqi tapacaq və zəmanənin təqazasilə işlər dəyişəcək və ənva, əqsam hünərlər və sənətlər və əcibə işlər vəz olu-nacaq və bunların hamısı əbdan və məaş üçündür. Fəlihaza elmi-əbdan və əqli-məaş ki, cəmi ümuri-kəmaliyə bu iki sözün təhtindədir, biz camaata əmr elədik ki, ol vaxtda biz camaat da elmi-əbdan əqli-məaş təhsil eləyək, ta ki sair millətlər miyanında dolanaq, bisaman qalıb payimal olmayaq. Vəli biz camaat bə'zi məvaneə görə qafil olub, bisaman qalmışıq.

Çünki e'tiraf bəqüsurüqəla nəzərində mühəssəndir, şayəd bu cavab o suala mütabiq olsun və amma ikinci surətdə ki, cənab Heydəri hikmət təriqətindən sual eləmiş olsa, katib dəxi ona şərikəm və onun sözünün qüvvətində hikmətamiz sözlərim var. Ehtimal var ki, bundan sonra elmi-əbdan və əqli-məaş hədisinin şərhində kəm və biş zikr oluna.

*Əhsənül-Qəvaid*

---

[1] Karvan getdi, biz qaldıq, əcəb bixəbərik.

* * *

Cənab Heydəri elmül-əbdan və əqlül-məaş hədisinin barəsində fazil rus dilindən elədiyi suala cavabdır: əvvələn, əhli-islama əqli məaş və elmül-əbdanı əllərindən verməklik böhtandır. Əgər belə olsa əhli-islama lazım gəlir ki, təxmi-bəvücudları ədəmə mübəddəl olsun, bəlkə hər tayfa özünə münasib səliqə ilə məaş və hifzi-əbdanların hifz ediblər. Küllü hizbin bima lədeyhim[1].

Saniyən elmül-əbdan ibarətdir o elmdən ki, ondan bəyan ola insanın bədinə nəf' və zərər edən əşya və əqlül-məaş ibarətdir o mə'rifətdən ki, insan güzəranlıq babında lazım olan ümuru riayət və tədarük etsin, müəssir olduqcan.

Salisən, nəf' və zərər edən şeylər və lazım olan əmrlər ya insanın öz təcrübəsilə olur ya həkimi-haziq ki, öz müalicəsində təxəllüf tapılmaz və əqli-küll və sahibrə'yi-kamildir, o bəyan buyura. Əvvəlinci fəqərə lazım tutar ki, bu şəxs gərək min-min insanı tələf etsin, ta ki təcrübəyə çatsın. İkinci fəqərə ne'mətdir üzma, xoşa o şəxsin halına ki, o ne'məti-üzmaya vasil və tabe ola.

Rabiən, ərbabi-mə'rifət külli-millətlər Məhəmmədül-Mustafa peyğəmbərin sahibrə'yi-kamil olmaqlığında bahis deyillər. O cənabimüzar və mənafeyi-dünyəvi və üxrəvi biltaman az olan zamanda Qurani-məciddə xəbər verib və əhkami-xümsə vücub və hörmət və istehbab və kərahət və mübah əqsamilə xəvasi-əşyai bəyan edib və şəriətiəhli-islam mücərrəd ibadəti-behişt təməinə və ya cəhənnəm xofuna müxtəs deyil, bəlkə şəriətdəki Qurani-məcidin şərhində müdəvvəndir əhkami-ticarət və adabi-qəzavət və siyasət və riyasət və ülumi-səmavi və ərzi və keyfiyyəti əklü şürbi müfəssələn mübindir.

Xamisən, dünya və dünyəvi ibarətdir bu aləmdə əmr etməklik zamanında vaqe olan ümurdan və axirət və üxrəvi ibarətdir o aləmdən ki, zamanı çox tulani və ne'məti və xəsəratı daima ola.

Sadisən, çünki dünya və axirət əmreyni mütəfaviteyidirlər[2], pəs hər ikisində mərtəbeyi-kəmali-təhsil etmək bir şəxs üçün əmri-məhal məhsub olur və əhli-islam axirət ümidinə o qədər bu dünyada bəhrəmənd olurlar ki, kəsbi-axirət onlara müyəssər ola və qayət kəmal və mə'rifət tamam bu aləmdə onlara lazım olmur. Amma sair millətlər bu

---

[1] Hər bir xalq öz əlində olanla fəxr edir.

[2] İki müxtəlif işdirlər.

dünyanı nəqd bilib öz ovqatların bu az olan ömrün zindəganlığına sərf edirlər. Guya ki, axirətə və'də edən olur xilaf və'də edə. Haşa ki, xudavəndi-aləm sadiqül-qövl və qadirdir və o əşxasi ki, əhli islam məhsub olallar, lakin nə axirət təhsilində və nə dünya zindəganlığında həzz-bərdar və bəhrəmənd deyillər, dərəceyi-e'tibardan saqitdirlər və bu gunə əşxasın hər millətdə vüfuru vardır və əhli-islam sair millətlər ilə əmr etməkdə və yeyib içməkdə və mərizlərə şəfa verməkdə müsavi güzəran edirlər və əhli-islam pəs hərgah öz mətləblərinə vasil olalar xoşbəxt olacaqlar və illa bu az ömrdə şəxs özün sabunla yuva və ya su ilə yuva və gündə bir dəfə öz libaslarına təzavət verə və ya ayda bir dəfə heç bir təfavüt yoxdur. Göyçək və çirkin – hər ikisi torpaq altında qalacaqdır. Pəs necə olur o vaxtda ki, əhli-islam bu dünyada zəhmətinin müqabilində mütənnə'm daimi ola və bu dünyada ömrün xoşgüzəranlığa sərf edən mə'yus ola zalikə hünəl-xosranül-mübin[1] və əfradi-əhli-islam bu dünyadan az tutmaqda və qədri-zərurətə iktifa etməkdə vəklu vəşrəbu vəla təsrifu[2] ayəsindən elmül-əbdanı istixrac etməyində yalqız deyillər, bəlkə Məhəmmədül-Mustafa peyğəmbər və tabeləri və sair ənbiyai-mürsəllər, hətta İsa bəni haviyi-rəhnüma dünya zindəganlığın bəqədri-zərurət mə'mul ediblər. Xoşa o şəxsə ki, atasının sözünə baxa və əcaba o şəxsə ki, öz bildiyin çağıra, necə ki, uşaqlar küçələrdə oynallar və böyük kişilər onlara guşeyi-çeşm ilə təəccüb edib gülələr, əhli-islamın nəzərində sair millətlər də bu timsal ilə görünüllər.

*Badkubəli molla*

* * *

Bizim müsəlmanlar bədbəxt olub sünni və şiəliyi və bir neçə məzhəb adablarını yoxlamağa binaən həmişə bir-birilə düşmənlik ediblər. Çünki indi elmül-əbdan və əqlül-məaş hədisinin barəsində mübahisə düşüb və hər iki tərəf oxuduğunu qeyri cürə başa düşür, ona binaən bizim üləmalardan iltimas edirik ki, ol hədislərin hikmətini xalqa bəyan etsinlər, ta ki bizim aramıza təzədən ayrılıq və düşmənçilik düşməsin. Münşiyi-"Əkinçi"yi-Qafqaz qəzeti Peterburq qəzetindən rəvayət edir ki, ə'lahəzrət İran padşahının əqvamından əvvəlinci

---

[1] O ən böyük ziyandır.

[2] Yeyin, için, amma israf etməyin.

vəzirin oğlu Hacı Mahmud Hüseyn xan iki il bundan sabiq şah Moskvada olanda xaçpərəst olub və indi monastıra giribdir və soruşublar ki, vətənüvə getmək istəmirsən? Cavab verib ki, getsəm başımı qopararlar. Yəqin bu xəbəri yazan "Russki mir" qəzeti olub. Ona binaən ki, şah hənuz Rusiya məmləkətlərinə daxil olmamış məzkur qəzet ittilaı olmağa şahın rikabi-hümayununda olan ə'yani-dövlətin və mülazimlərin əlqabın təfsilən bəyan eləmişdi, amma sonra mə'lum oldu ki, ol xəbər saxtadır.

Zikr olan qəzet belə xəbər çıxarmağına səbəb oldur ki, onlar xəyal edirlər ki, bu babda hər nə yazılsa, heç kim həqiqətinə yetişməz. Əvvələn, şahın rikabında heç zikr olan adlı adam olmayıbdır. Saniyən, Hacı Mirzə Məhəmməd Hüseyn xan şahın əvvəlinci vəzirinin məxsusi adıdır. Salisən, o ad heç müsəlman adlarının rədifilə müvafiq deyildir. Rabiən, şahın məzkur əvvəlinci ministirinin zükurən və ünasən heç bir övladı yoxdur. Əgərçi müsəlmanlar zikr olan qəzeti oxumurlar və onları həcv elədiklərin eşitmirlər, amma ol xəbəri çıxaranın bu gunə rəftarı insaniyyət rəsminin xilafıdır.

*Heydəri*

## TƏZƏ XƏBƏRLƏR

Osmanlı dövləti öz xaçpərəst tabelərilə cəngləri qurtarmaqdan ötrü Rus, Nemes və Avstriya dövlətlərinin məsləhətinə binaən onlara müsəlman tabelərində olan ixtiyarları veribdir.

* * *

Süveyş kanalını tə'mir edən icmaın bir calisi də Misrin xədivi olub indi xədiv öz məxsusi 1760 hissəsini İngilis dövlətinə 25000000 manata satıbdır. Bu barədə qeyri dövlətlər çox heyifslənirlər ki, onu almayıblar.

* * *

Malay nimcəzirəsində ingilis konsulunu Piran hökumətində öldürüblər. İndi ingilis əsgərləri ol hökuməti zəbt edib deyirlər özünə tabe edəcək.

İngilis tüccarları vəzirlərinə ərz ediblər ki, İranda rus malı ingilis malından ziyadə satılır və təvəqqə ediblər ki, İran dəryalarında ticarət gəmilərin artırsın.

* * *

Gələn yanvarın 1-dən Dərbənd, Petrovski və Şura şəhərlərində miravoy sud qoyulacaq.

* * *

Dörd gün əqdəm dustaqxanamızdan qaçan 9 dustağın hamısını tutublar.

* * *

Dekabrın 2-də bir rus vaporu 15 adam və mal ilə Qara dəryada qərq olub. Moskvada bir şəxs ilxısı üçün bir ayğır at 10000 manata [alıb].

* * *

Gələn il yayda Amerikanın Filadelfi şəhərində hər bir vilayətdə qəribə tə'mir olan şeylər göstərəcəklər. Rusiya şeylərin indi Peterburqa cəm ediblər.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*İki həftəlik qəzetdir Əvvəlinci sənə On ikinci, yə’ni axırıncı nömrə*

*Fi 15 zilhiccə, sənə 1292*

* * *

*Hər kəs öz işləri barəsində bu qəzetdə e’lamnamələr basdıra bilər. Belə e’lamnamələri basdırdan kəslər lazımdır ki, e’lamnamənin hər kəlməsinə iki qəpik versinlər.*

* * *

*Pəncşənbə günü*




*Fi 1 yanvar Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*Poşt xərci qəzet basdıran ilədir*

Bu qəzet çap olunur Qafqaz vilayətinin Badkubə şəhərində. Hər kəs e’lamnamələr və məktubat göndərmək xahiş etsə, qəzeti çap etdirənin adına göndərsin. Qəzet almağı xahiş edən kəslər qəzetin yuxarıda zikr olan qiymətini lazımdır qəzeti basdıranın adına göndərsinlər və öz adlarını və sakin olduğu yerlərini yazıb mə’lum eləsinlər. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.

Elmi-əbdan hədisinin barəsində göndərilən məktubların hamısını basdırmağa yer yoxdur.

## DAXİLİYYƏ

Altı ay yoxdur ki, bizim “Əkinçi” qəzeti çap olunur, amma ingilisin paytaxtı London şəhərində onun çap olunmağı mə’lumdur. Oradan bir kitabın bir fəslinin türk dilində olan tərcüməsini bizə göndəriblər ki, onun qələtini düzəldək. Əlhəq bu çox ziyadə gözüaçıqlın istər. London şəhərində bir neçə yüz qəzet çap olunur. Onunla belə kişilər dünyanın ucunda bizim qəzet kimi bir kiçik qəzet çap olunmağını eşidib istəyirlər ondan da nəf’bərdar olsunlar, amma bizim adamın çoxu nə ki buçağadək bizim qəzeti oxumayıblar, bəlkə bə’zi kəslər onun bina olunmağının xəbərini də eşitməyiblər. Hətta elə adam var ki, qəzet pulu verib onu almaq istəmir.

Bizim xalq dünya işlərini belə soyuq tutmağı bilir ikən biz “Əkinçi” qəzetini çap etdirməyi başlamışıq və bizim təkdə bir yuxudan oyananlarımıza ümid olmuşuq ki, xalq qəzet oxuyub ondan mənfəətbərdar

olmağa və dünya işlərindən xəbərdar olmağa sə'y edəcəklər. Əlbəttə, onlar sə'y elədiklərinə keçən il bizim altı yüzəcən müştərimiz var idi. Amma indi belə mə'lum olur ki, onlar xalq qəzeti oxumağa sə'y etmirlər və yəqin fikir ediblər ki, xalq qəzet oxumağa adət edib və özü onu alıb oxuyacaqdır. Lakin iki aydır bizim qəzet gələn il çap olunmaqdan ötrü qəzetimizdə e'lan basdırırıq, amma buçağadək ancaq qırx adam onu gələn il almağa xahiş edib.

Biz müsəlmanlar dünya işini soyuq tutmağa bizim məzhəbimiz səbəb deyil ki, onu xaricilər bizlərə böhtan deyirlər. Cənab şeyxülislamın bu nömrədə çap olunan məktubunu oxuyana mə'lum olur ki, bizim peyğəmbərimiz öz ümmətini irəli salmaqdan ötrü onlara hökm edibdi ki, hər bir elmi təhsil etsinlər. Pəs biz müsəlmanlar millətlər arasında rüsva və zəlil olub dünya işlərinə məhəl qoymadığımıza səbəb... Ol səbəblərdən sonra danışarıq. İndi bizim alimlərdən iltimas edirik ki, bizim bu suallarımıza cavab versinlər. Çünki bizim peyğəmbərimiz müsəlmanlara elmül-əbdanı təhsil etməyə hökm edib və ona binaən bizlərə vacibdir ki, ol elmləri təhsil edək, onları kimdən öyrənək? Və əgər bir xaricə elmül-əbdandan xəbərdar ola, ondan o elmləri öyrənmək olurmu ya elmül-ədyan oxudan gərək bizlərə elmül əbdanı da oxutsun?

## ƏKİN VƏ ZİRAƏT XƏBƏRLƏRİ

Keçən nömrələrdə əkin yerindən danışdıq. İndi gərək onu şuxm etməkdən və qüvvətləndirməkdən danışaq. Amma şuxm edən əsbabları görməmiş və onların şəklinə baxmamış bir yazı ilə ondan baş çıxarmaq olmaz. Ona binaən onlardan gərək müxtəsər danışaq.

Əkin yerin şuxm etməkdən murad əvvələn ol yeri narın etməkdir ki, hava və günün istisi ol yerə daxil olub yerin altında otlara xörək olan şeylərə dəyib onları otlar üçün amadə etsin ki, toxum səpmək məqdur olsun ki, onların kökləri dərinə getsin, ta ki, onlara quraqlıq kar etməsin və yağınlıq olsa ol narın yerdən su tez buğa dönüb rədd olsun. Saniyən, ol yerin hissələrin bir-birinə və ya yeri qüvvətli edən şeylər ol yerə çəkilmiş isə ol şeyləri yerin hissələrilə yaxşı qarışdırmaqdır. Salisən, yerin nəmişliyini almaq və ya ol yeri quru isə onu şəbnəm çəkməkliyi ilə nəm etməkdir. Rabiən, əkin yerin alaqdan,

yə'ni ələfiyyatdan təmizləməkdir. Xamisən, əkin yerin düzəltməkdir. Sadisən, toxumun üstün örtməkdir.

Əkinçilik əsbabları bir neçə qism olur. Əvvələn, yeri şuxm, yə'ni narın edən əsbablar. Saniyən, toxum səpən əsbablar. Salisən, əkini biçib döymək əsbabları. Rabiən, əkin daşımaq əsbabları.

Əkin yerin şuxm edən əsbablar: əvvələn, kotan. Kotan yaxşı olduqcan yeri yaxşı, narın edər, onu işlətməyin zəhməti az və yerin bəhrəsi çox olur. Yaxşı kotan gərək şuxmu bir qalınlıqda kəsib qalxızıb, çökürüb əzsin.

Kotanın hissələri:

1) **Gəvasin.** Gəvasin bir yastı dəmirdir ki, onun ucu və qıraqları iti olur, onu kotanın künəsinə, yə'ni binasına möhkəm edirlər. Onun ucunun eni dörd kərəhdən altı kərəhəcəndir, amma əkin yeri daşlı olsa, onun ucunu bir az ensiz, 3 kərəh yarım edirlər və elə ki, yer çox daşlıq oldu, onu çox ensiz dil kimi qayırırlar. Gəvasin şuxmu altından kəsir.

2) **Qılınc.** Kotanın qılıncı bıçaq kimi düz dəmirdir. Onun dəstəsi kotanın qırına möhkəmlənib ağzı gəvasinin qabağında onun bir böyründədir ki, şuxmu böyürdən kəssin. Qılınc gərək bir az əyri, yə'ni meyli irəli möhkəm olsun ki, sınmasın. Bə'zi vaxtda gəvasinin bir tərəfin bıçaq kimi iti edirlər ki, qılınc əvəzinə şuxmu böyürdən kəssin. Amma onilə ancaq dolama əkmək olur. Əgər əkin yeri qumlu, yə'ni yumşaq olsa, ol vaxtda kotanın qılıncını çıxardırlar.

Baqisi gələn səfər

## MƏKTUBAT

Alişanlı Həsən bəy! Cənab Heydərinin cavabında icmalən yazarsan ki, bizim peyğəmbərimizin buyurduqları əlelmü elman elmüləbdan, elmül-ədyan qövlündə vaqe olan elmi-əbdan külli-ülumi-dünyəviyyədən ibarətdir. Bu illətə ki, ülumi-dünyəviyyə səbəb olur təksiri-əbdani-insan və heyvana əfradi-insanın və ənvai-heyvanın kəsrəti kimi və təksiri-əcsadi-nəbatat və cəmadata məzare' və bağ və bostanın kəsrəti kimi və dari-büyut və dükan və rübatın kəsrəti kimi, vəsi' olur onların əbdan və əcsadının hifz və tərbiyətinə. Bu səbəbə görə elmi-dünyəviyyə elmi-əbdan ismilə təsmiyə olunubdur və elmi-

ədyan külli-ülumi-üxrəviyyədir, ibarətdir ki, elmi-din təsmiyə olunubdur və elmin iki qism olmasının vəchi budur ki, bəni-noibəşərin hali-həyatında iki qism ehtiyacı vardır. Əvvəlinci ehtiyac cismani və ikinci ehtiyac ruhanidir. Pəs hər elmi ki, rəf'i-ehtiyaci-cismani edər, ona elmi-əbdan deyilir və hər elmi ki, rəf'i-ehtiyaci-ruhani edər, ona elmi-ədyan deyilir.

Amma bəni-noibəşərin ehtiyaci-cismanisi mə'lum və aşkardır ki, insan hali-həyatında möhtaci-təhsili-məaşa və təksibi-mə'kulat və məlbusata və tədbiri-mənzil və məskən və təhzibi-əxlaqa və təməddüni-ictimaa və cəlbi-nəf' və dəf'i-zərərə və möhtac-ileyhlərin hər biri mövqufdur ülumi-mütənəvviə və kəsirəyə. Məsələn, təhsili-məaş və mə'gulat mövqufdur elmi-fəlahətü ziraətə və elmi-ğərsvə peyvəndə, elmi-məcariyil-iyun vəl-ənharə və həfri-qənaətü ubarə və elmi-hifzai-heyvanatü tüyurə və elmi-istiyadü huşü səmukə və təhsili-məlbusat mövqufdur elmi-nəscü hekayətə və elmi-səbağətü xəyatətə və elmi-kəsbü ticarətə və tədbiri-mənzil mövqufdur elmi-tə'mirü ticarətə və elmi-həddadivü cərri-əqsalə və bu elmlərin hər birinin təhsili-əsbab və alatı mövqufdur fününi-kəsirəyə misli-elmi-məadin və elmi-şimya və elmi-fizikə və elmi-ximya və elmi-matematika və elmi-məsahət və elmi-xəvassi-əşya və elmi-həndəsə və elmi-hesab və elmi-e'dada və bunların təhsili mövqufdur elmi-kitabət və qiraətə. Bir löqmə çörəyin təhsilində fününi-mütənəvviəni cəm görərsən. Və amma bəni-noi-bəşərin ehtiyacı-ruhanisi o da genə vazeh və aşkardır.

İnsan kətmi-ədəmdən ərseyi-vücuda gəlib, bu aləmə baxıb təsəvvür edər ki, aya bu mövcudatı ki, anən-fəanən təcəddüdi-təğyirdədir, kim mövcud edibdir ki, bizim bu vücudumuz mövt olandan sonra ədəmi-məhz olacaq ya bir əlahiddə aləmdə genə mövcud olacaqdır? Pəs insan bu təsəvvüratda cövr edər və bu gunə təsəvvürat onu işgəncəyə çəkər ki, aya bizi bu aləmə kim gətiribdir və aya onilə bizim aramızda bir vasitə var ya yox və biz mövt olandan sonra aləmi-digərdə nə tövr olacaqdır. Pəs insan möhtac olur bu günə ruhani təsəvvüratı fəhm-dərk etməyə və bu ehtiyacın rəf'i mövqufdur təhsili-elmi-fəqahətə və elmi-kəlama və elmi-təfsirə və elmi-hədisə və bu elmləri təhsili mövqufdur elmi-nəhv və elmi-sərf və elmi-məan və bəyana və bunların təhsili mövqufdur elmi-kitabətə və inşaya və sair ülumi-müxtəlifəyə. Hər tərəfə baxsan özünü bu elmlərə möhtac görərsən. Buna binaən bizim peyğəmbərimiz ümmətini təhsili-üluma təhris etmək

babında buyurublar: ey mənim ümmətim, bilin və agah olun ki, əlelmü elman elmül-əbdan və elmül-ədyan və məqami-təhrisdə elmi-əbdanı elmi-ədyandan müqəddəm zikr buyurublar və ülumi-dünyəviyyə və axiriyyəni bu qövlündə cəm ediblər və çün bu iki elmin təhsili ağıl ilə mümkün olur, ona binanən buyurublar ki, ələqlü əqlan əqlül-məaş və əqlül-məad. Yə'ni xudavəndi-aləm bu iki əqli bəni-noi-bəşərə kər-maət edibdir ki, əqli-məaş ilə elmi-əbdanı təhsil edə və əqli-məad ilə elmi-ədyanı. Bu mətləbin təfsilatı var, lakin bu təhrirata küncayişi yoxdur, icmalən zikr olundu. Hər kəs bu icmalı mülahizə etsə, təfsili-ni fəhm edər, vəssəlam.

*Şeyxülislami-Zaqafqaz axund Əhməd Hüseynzadə.*

* * *

Elmi-əbdan və əqli-məaş hədisini sual edənin cavabında 2-ci fə-sildir. Qəzetin 11-ci nömrəsində ərz oldu ki, elmi-əbdan ibarətdir ümurati-hifzi-bədəniyyə, əvarizati-məkruhədən və əqli-məaşı-əbdanın dolanacaq əsbab və mayəhtacların fərahəm gətirməkdən. İndi görək onun lüzumatı nədir?

Əlbəttə, təqazayi-zəmanəyə görə ki, əl-ümur və mərhunət-əhu biövqatiha[1] cəmii-ülumi-mütədavilə və fünuni-müxtəriələrdən hər qədər əkməl və ətəmm ola yaxşıdır, əgər olmaya təəyyüş eləmək və məmləkət və millət saxlamaq müşkül olur. İ'məl lidünyakə kiənnək təişü əbədən[2] hədisinin mə'nası əmələ gəlməz. Ona binaən ki, qonşu-lar, leysə lil insani illa masə'a[3] ayəsinin tərcüməsinə görə sə'y və kuşişi-təfəkkür və tədəbbür ilə ülumi-rəyasət və sənaət və ticarət və ziraət və məadin və sair fünuni-müxtəriələr ilə məmləkətlərin mə'mur və xəzanələrin məmlüvv ediblər.

Pəs fünuni-elmiyyə ki, dünyanı məmlüvv və mə'mur edib və yov-mən-fəyövmən tərəqqidədir, elmi-əbdan məhsub olur, əqli-məaşı iş-tədməkdən hasil olur və o həzrətin elmi-əbdan və əqli-məaş hədisini buyurmaqdan mənzuru və onun hikməti budur. Belə ki, əvvəlinci fəsildə ərz oldu ki, cəmi ümuri-kəmaliyyeyi-dünyəviyyə bu iki fər-mayişin təhtindədir. Aqil və həkim əxşaslar bu rümuzati-lətifələrin mə'nasından öz dünya işlərinə rövnəq verib, möhkəm və müntəzəm

---

[1] Sərf olunan əmək girov kimidir.

[2] Dünya üçün çalış, elə bil ki, orada həmişəlik yaşayacaqsan.

[3] İnsan üçün öz əməyindən başqa heç nə yoxdur.

edirlər. Bu səbəbə biz qüsuru öhdəmizə alıb əvvəlinci fəsildə dedik ki, bə'zi məvaneə görə biidrak olmuşuq. Amma bu ki sail deyib müsəlmanlar behişt və huri və qılman ümidilə din və məad elmin yaxşı bilirlər, əgər o şəxs də bizim kimi insaf ortalığa qoya və inadı özündən kənar edə, bilər ki, bu aləmin vücudu və belə müntəzəm olmağı və icrami-kəvakibin gərdişi bisane olmaz. Saat ki. bir kiçik sənətdir məxluq işlərindən aqil və cahil onun çarxlarının müntəzəm olub işləməyinə baxsa yəqin edər ki, onun bir sanei var. İnsaf deyil insan elmi-əbdan və əqli-məaddan bixəbər və bu aləmin saneindən qafil olub ya sinfi-bəşərdən bir şəxsi bu aləmə sane bilib, qiyamət mövqufunda desin ya leytəni küntü türabən[1]. Hükəma deyiblər: vücud naqisi-ədəm tərəfdən yaxşıdır. Əgər bir kəs elmi-əbdan, əqli-məaşda vücudi-naqis ola, ondan yaxşıdır ki, elmi-ədyan və əqli-məadda ədəm sərf olsun. İnşallah gələn fəsildə əqlin mə'nasında göz açan və əql artıran sözlər ərz olunacaq.

*Əhsənül-Qəvaid*

## TƏZƏ XƏBƏRLƏR

Cənab sərdar hökm edib ki, təzə ticarət qanunu bu yanvarın birindən iki ayın müddətində Qafqazın hər bir tərəfində bina olunsun və ol müddətdə hər kəs şəhadətnamə və bilet alsın.

* * *

İrəli Misir Osmanlıya tabe idi, ancaq ona xərc verir və İngilisə çox yavuqlaşıb Süveyş kanalının hissələrin alandan sonra Misrə bir neçə İngilis gəlib ki, Misrin xəzanə işlərin ələ alıb dövlətin gəlirini artırsınlar. İndi deyirlər ki, İngilisin vasitəliyinə binaən Misir Həbəş ilə ki, xaçpərəstdirlər, cəngi mövquf edəcək.

* * *

Kokan xanlığında abtavəbaşı və poladbəyin genə təzədən qəzavət başlayıb. Kokan və Adjid şəhərlərini zəbt edib ruslar ilə cəng başlayıblar. Amma ruslar genə onları pərakəndə edib Adjid və Məhərrəm qalaların alıblar.

---

[1] Nə olaydı ki, mən torpaq olaydım.

* * *

Noyabrın 28-də Parij şəhərində bir neçə elm sahibi aerostat, yə'ni şar ilə havaya qalxıblar ki, elm imtahanı etsinlər, amma aerostat cırıldığına 230 metr, yə'ni arşın hündürlükdən yerə yıxılıblar və 8 adamdan 5-i bərk yaralanıb.

* * *

London şəhərində bir icma var ki, hər kəs öz qiymətli şeylərin ol icma tə'mir elədiyi imarətdə əlahiddə sandıqda saxlaya bilir. İmarətin içindən gecələr havanı maşın ilə çəkirlər ki, oraya oğru girsə, fövt olsun və yanğı olmasın və ətrafda yanğı olan zamanı imarəti suya basdırırlar. Amma imarət möhkəm olduğuna onun içənə su girmir.

* * *

Rusiyada övrətlərə izn var idi ki, teleqrafxanalarda və dəmiryollarda qulluq etsinlər. İndi onlara ixtiyar verilib ki, vəkillik, yə'ni advokatlıq etsinlər.

* * *

Amerikadan yazırlar ki, Cəmahiri-Müttəfiqə dövlətin sakinlərinin qədəri qırx milyondur. Amma orada 7643 qəzet çap olunur, lakin tamam Avropa, Asiya və Afrika qit'ələrində ki, bir neçə yüz milyon sakin var, ol qədr qəzet çap olunmur. Buna səbəb oldur ki, zikr olan dövlətin xalqı tamam oxuyubdurlar və hər kəs gündə qəzet alıb oxuyur.

* * *

Noyabrın 11-də Moskva şəhərində elə bərk soyuq olub ki, sərçələr və qarğalar soyuqdan donub ölüblər. Həmçinin küçələrdə bir neçə adam soyuqdan fövt olub.

* * *

Rusiyadan Amerikanın Filadelfi şəhərinə gedən şeylər fevral ayında göndəriləcəkdi. Deyirlər ol qədr şey göndərən var ki, onların aparmağının 100000 manat kirayəsidir.

* * *

Rusiya, Almaniya və Avstriya dövlətlərinin vəzirlərinin arasında Osmanlı və xaçpərəst tabelərilə cəng etmək barəsində danışıq var. Avstriya vəziri Andraşi sülh şərtlərini yazıb zikr olan vəzirlərə göstərib. İndi İngilis, Firəng və İtaliya vəzirlərinə göndərib. Ol şərtlərin məzmunu mə'lum deyil.

* * *

Badkubə şəhərinin Mixaylovski azarlıxanasında bu yanvarın ibtidasında müalicəgah bina olunub. Hər gündə saat on birdən on ikiyəcən hər kəs öz naxoşluğu barəsində gedib orada müftə həkimlər ilə məsləhət edə bilər. Hər şənbə günü zikr olan vaxtda orada 3 həkim olacaq ki, bərk naxoşlara məsləhət etsinlər. Məzkur həkimlərdən savayı orada bir müsəlman dili bilən mama olacaq. Övrətlər üçün hər kəs bitəvana olduğuna həkimlərin məsləhətinə binaən özünə dərman ala bilməsə, ona zikr olan müalicəgahdan müftə dərman verəcəkdirlər.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления

*İkinci sənə* *İki həftəlik qəzet*

*Fi 1 məhərrəm,*
*sənə 1293*

* * *

*Poşt xərci*
*qəzet basdıran ilədir.*

* * *

*Cümə günü*




*Fi 16 yanvar Rusiya,*
*sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı –*
*1 manat 50 qəpik*

* * *

*Əvvəlinci nömrə*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin.*
*Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## DAXİLİYYƏ

Cənab sərdarın hökmünə binaən mart ayının əvvəlinəcən Qafqazda dadistəd edənlər gərək özlərinə şəhadətnamə və bilet alsınlar. Ona binaən bu halda bizim dadistəd edənlərimiz tamam fikrə gedibələr ki, aya hansı qism tüccarlar silkinə özlərini yazdırsınlar və ol silkdə onların nə ixtiyarları olacaq. Bu səbəblərə biz özümüzə vacib bilirik bəqədriməqdur onların ixtiyarlarını mə'lum edək.

Dadistəd edənlər üç qismdir: əvvəlinci və ikinci qism gildi hesab olunur, amma üçüncü qism gildi deyil və özü də beş firqədir: birisi xırda alış-veriş etmək, birisi malları yük ilə gəzdirmək, birisi malları əldə gəzdirmək, birisi sənətkarlıq və birisi amillik.

Bu səfər xırda alış-veriş edənlərin ixtiyarından danışacayıq.

Hər xırda alış-veriş şəhadətnaməsi alan kəs iki qism dükan aça bilər: ya örtülü yerdə, məsələn, karvansarada, ya açıq yerdə. Örtülü yerdə açılan dükanda sata bilər: 1) Hər bir qism taxıl və un. 2) Ət, balıq, quş, süd və süddən əmələ gələn şeylər. 3) Səbziyat, hübubat və meyvə. 4) Hər bir qism ot kökləri və toxumları, amma dərman üçün işlənən şey olsa, gərək onu satmağa həkimbaşından əlahiddə izn olsun. 5) Aşa qoyulmuş ya qoyulmamış gönlər. Ondan qayrılmış təkbəndlər, qoyun, keçi və dovşan dəriləri. 6) Duz, şadır, zəy, zağ, kükürd, çaxmaq daşı, kül və lak. 7) Qətran, yapışqan, piy və piy şamı, ələfiyyatdan hasil olan yağlar və sabun. 8) Kəndir, çuval, həsir. 9) Əldə toxunan pambıq və

kətan şeylər. 10) Əldə toxunan mahut və keçələr. 11) Mıtqal, lənkə, pambıq, ipək, kətan və onlardan toxunan dəsmallar və qurşaqlar. Hər bir qism qaytan, sap, eşmə. 12) Rus papaqları, əlcək, corab. 13) Fəqir-füqəra əyninə və ayağına geyən şeylər. 14) Qızıldan savayı hər bir mə'dəndən qayrılmış kiçik şeylər: kibrit, papiros və pul qabları: çətirlər ki, ipək parçadan olmaya: ayna ki, onun uzunu səkkiz və eni altı kərəhdən ziyadə olmaya. 15) Hər bir Rusiyada qayrılmış ağac, saxsı və şüşə qablar, akoşka və lampa şüşələri. 16) Hər ziraət əsbabları və ərradə hacətləri: iynə, sancaq və dəmirçilər əl ilə qayırdığı şeylər. 17) At qayışı, plan və hər ərradəyə və kirşəyə lazım olan şeylər. 18) Kağız, qələm, mürəkkəb, qələm-divar. 19) İşlənmiş stullar, paltar və qab-qazan. 20) Köhnə kitab. 21) Hər bir şey ki, onu xərcsiz satmaq olur.

Açıq yerdə açılan dükanda sata bilər: 1) Çay, qənd və bal. 2) Un, düyü, nişasta, çörək, suxari. 3) Səbziyat, meyvə, mürəbbə. 4) Yağları işlənən toxumlar. 5) Hər bir qism yağ. 6) Xörəyə dad verməkdən ötrü işlənən şeylər, məsələn, istiot, duz və dərman otları ki, onu satmağa izn ola. 7) Sirkə və qeyri su qismi şeylər ki, xörəyə tökələr. 8) Hər bir qism ət, balıq və onlardan qayrılmış şey. 9) Yumurta, süd və ondan əmələ gələn şeylər. 10) Kükürd, zəy, zağ, nişadır, çaxmaq daşı. 11) Qətran, yapışqan. 12) Hər bir qism şam və sabun. 13) Kağız, qələm və qeyri yazı üçün lazım olan şeylər. 14) Tikiş üçün lazım olan şeylər. 15) Rusiyada qayrılmış qablar. Onlardan savayı ucuz mə'dənlərdən qayrılmış kiçik şeylər: hər bir qism süpürgə, çuval, ələk, qəlbir və siçan tələləri. Hər bir qism pamad ki, başa sürtürlər və vaks ki, çəkməyə sürtürlər. Uşaqlar üçün oyun şeyləri ki, onlara iqruşka deyirlər və kibritlər.

Əvvəlinci siyahının şeylərin ancaq örtülü yerdə olan dükanda, ikinci siyahının şeylərin açıq yerdə olan dükanda satmaq olar, amma ol şeylər ki, hər iki siyahıda adlanıb, hər iki zikr olan dükanlarda satıla bilər.

Şəhər camaatının iltimasına binaən cənab sərdar zikr olan siyahılarda adlanan şeyləri dəyişdirə bilər.

Əvvəlinci siyahıda zikr olan şeyləri şəhadətnamə almamış bir bilet almaqlıqla satmaq olar, bəşərta ki, ol şeylər satılan yer tərpənən yer olsun, yə'ni taxta, ya stul üstə, ya taxtadan bina olunmuş kiçik ev içində ki, ol evi də çadır kimi tərpətmək olsun. Həmçinin dükan çox kiçik olsa ki, onu bir otaq hesab etmək olmaya, belə dükanda əvvəlinci siyahıda adlanan şeyləri ancaq bir bilet almaqla satmaq olar, bəşərta ki, bir şəxsin bir şəhərdə bir ədəd belə dükanı ola.

3) Kotanın taxtası. Taxta gəvasin və qılınc kəsdiyi şuxmu qalxızıb, çökürüb əzməkdən ötrüdür. Taxtanı kotanın binasının böyrünə – gəvasin başlanan yerə bərkidirlər. Taxta düz olsa, şuxmu yaxşı çökülməz, gərək onun ortası çökək ola və belə taxtanı ağacdan ayırmaq çətin olduğuna onu dəmirdən qayırmaq yaxşıdır. Taxta gödək və ortası çökək olduqcan şuxmu yaxşı çökürüb əzir, amma uzun olduqcan onun çökəyi az olur və şuxmu yaxşı əzmir, lakin gödək və çökək taxtalı kotan çox, uzun taxtalı kotan az güc istər. Dəmirdən qayrılmış yaxşı gödək taxtanın uzunu bir arşın bir kərəhdən, bir arşın bir çərəyəcən olur, amma uzun taxtanın uzunu bir arşın üç çərəkdən iki arşın iki kərəhədək olur. Taxtanı kotanın sağ tərəfinə möhkəm edirlər, amma belə bir tərəfə bərkinmiş taxtanı kotanla ancaq dolama şuxm etmək olur, yə'ni onu elə sürmək olmaz ki, iki cızıq yana-yana düşsün. Ona binaən dağ yerlərində ki, dolama əkmək məqdur deyil, taxtanı elə möhkəm edirlər ki, bir tərəfə gedəndə sağ tərəfə isə, geri qayıdanda onu sol tərəfə bərkidirlər və cızıqları yana-yana çəkirlər. Amma belə taxtası dəyişlənən kotan şuxmu yaxşı əzməz.

4) Kənə, yə'ni kotanın binası. Kənə kotanı düz saxlamaqdan və onun hissələrini bir-birinə bərkitməkdən ötrüdür. Kotan düz duranda cızıqları da düz çəkər, kənə uzun və enni, yə'ni ağır olduqcan kotanı düz saxlamaq asandır, amma yüngül olduqcan heylə saxlamaq çətindir. Ona binaən kənəni dəmirdən qayırmaq yaxşıdır ki, o kiçik və ağır və möhkəm olsun. Kənənin uzunu üç çərəkdən bir arşınacan və eni iki kərəhdən iki kərəh yarımacan olur.

5) Qır. Kotanın qırı ona mal qoşmaqdan ötrüdür. Onu ağacdan ya tamam dəmir olan kotan üçün dəmirdən tə'mir edirlər. Əgərçi qırı düzdə qayırırlar, amma onun qılınc taxılan yeri bir az qalxaq olsa yaxşıdır. Ona binaən ki, bə'zi vaxtda gəvasin şuxmu altından kəsir, taxta onu qalxızır, amma qılınc onu böyürdən kəsib qurtarmayıbdır. Ol vaxtda şuxm qırın qalxaq yerinə dirənib kotanı ləngidəndə, qılınc şuxmu kəsib tamam edir.

Diyircəksiz kotanın qırının uzunluğu bir arşın üç kərəhdən bir arşın dörd kərəh yarımacan və ucu ya qalxaq, ya aşağı olur, amma diyircəklininkinin ucu həmişə qalxaq olur, onun ucu qalxaq olmağına binaən qırı bir az qısa etmək və yeri dərin ya dayaz etmək olur.

6) Dəstə. Dəstə kotanı düz saxlamaqdan ötrüdür. Dəstə iki olur, onlar əyri və uzun olduqcan yaxşıdır. Doğrudur, diyircəkli kotana bə'zi vaxtda bir dəstə qayırırlar, amma onu bir dəstə ilə düz saxlamaq müşküldür.

## MƏKTUB

Keçən fəslə binaən gərək əqlin vəsfində ərz edək. Əvvələn, əql nədir və necədir? Qəzetdə küncayiş olmaz, amma əql, mə'rifət, beynülnas ki, deyirlər filankəs aqildir, görək bu əql maddidir ya kəsbi? Bəli, bu əql həm maddidir, həm kəsbi. Məsələn, yerin kəmunində olan su kimi. Necə ki, onun üstündən torpağı götürüb işdətmək və qüvvətləndirmək və nəhr edib quru yerlərə aparmaq səbəbilə o yer zində olur və minəl-ma'küllü şeyin həyyi[1] əvarazi-əmvatda bağ və bəsatin, gül və riyahin, əşcari-əsmar əmələ gəlir ki, xalq bəhrəmənd və ləzzətbərdar olurlar, həmçinin əql də işlədib cəhalət torpağın üstündən götürüb təhsili-kəmal səbəbilə bağati-hirfət və əşcari-sənaət əmələ gətirir ki, xalq bəhrəmənd və məşğuli-nəf'bərdarlıq olurlar, mütəfərriq və pərişan olmazlar. Pəs lazımdır əqli-məaşı işlədib ülumi-əbdan əxz etmək. Əvvələn, əkl və şürb möhtacdır ülumi-ziraətə. Hifzi-səhhət, dəf'i-mərəz möhtacdır ülumi-təbabətə. Məlbusat və sair mayəhtaclar möhtacdır ülumi-sənaət və ticarətə və qis əla haza[2] hər əməl üçün onun elmi lazımdır əl elm sümməl-əməl[3]. Əl əməl və bilaelm və vəbalün[4]. İnsan ömrünün ibtidasından intəhasına qədər möhtacdır təhsili-üluma. Ütlübül-elmə min əl məhdi-iləlləhdi[5]. Amma nəinki gərək bir adam cəmi ülumi öyrənib bilsin, bu məhaldır və heç birin itmama yetirmək olmaz. Lazımdır hər kəs bir elmə ki şüru' elədi, onu müntəhaya yetirsin, yə'ni onun cəmi üsul və fiqhin bilib məqami-ictihada yetişsin ki, sonra özü o elmdən bir elmi-digər ixtira edib ya o elmə rövnəqi-təmam versin ki, cəmi ülum bir-birindən iqtibas olub artar və bunların hamısı möhtacdır əmniyyətə.

---

[1] Sudan hər şey dirilir.

[2] Sən bunu qalanlarına uyğunlaşdır.

[3] Əvvəl elm, sonra əməl.

[4] Əməl elmsiz vəbaldır.

[5] Elmi tələb elə beşikdən qəbrə kimi.

Pəs təhsili-ülum insana vacibdir necə ki, bizim peyğəmbərin bu fərmayişindən mə'lumdur: Ənnasü alimün əf mütəəllimün vəl-baqi hüməcün, yə'ni eşşək arısı ki, nişi olur, amma balı olmaz. Pəs gərək qəlbin aynasın pak etmək ta nuri-əql ona tabidə olub zülməti-cəhli götürsün. Necə ki, günün işığı kor gözə kar etməz, həmçinin əql də bədən aləminin günüdür. Gərək qəlb gözü açıq olsun, ta nuri-əql ona tabidə olub, işıqlanıb ülumu dərk etsin.

Gələn fəsil cəhl məzəmmətində və tərbiyətin vəsfində əl-əql ma əbdəhu bihir-rəhman[1] hədisinin şərhində zikr olunacaq.

*Əhsənül-Qəvaid*

* * *

"Əkinçi" qəzetinin 11-ci nömrəsində 2 fəsil elmi-əbdan bəhsində yazılmış idi. Fəsli-əvvəl Əhsənüd-Qəvaid ki, öz xəyalın tərzi-münasibətilə ki, əsbabi-bədəniyyətə münkər olmayıb bir daş ilə min bir budağı vurubdur. Fəsli-sani Badkubəli molla ki, bişi-mətləbi ilə rədd cavaba iktifa etməyib ərəb övrəti üzün örtmək istəyib, övrət eynin açan kimi özgə millətlərə sataşıbdır. Mollayi-məzkur cənabından iltimas edirəm ki, mətləbi-xəmsənin bəhslərin bir növ ilə ki, mücəddədən bəhsi-varid kəlməsin əda buyursunlar.

Əvvəlinci mətləb ki, molla buyurmuş müsəlmanların əqli-məaş əllərindən verməyi böhtandır. Əgər belə olsa onların töxmi-vücudları mə'lum olurdu. Əvvələn, əgər desə ki, məaşdan əhli-islamın muradı, məhz xəlq və dəlqü cəlqdir, bunlar bilcümlə bəhaimdə də tapılır. Bəlkə heyvanatın məqamı bu ehtiyacı özündən rəf' eləməkdə insandan artıqdır. Ona binaən ki, heyvanat dünyaya gələndən heç bir köməkçiyə və onu mühafizət edənə möhtac olmayıbdır. Hətta bir naxoşluq onlara üz versə, bə'zi ələfiyyatı yeməklə özlərinə müalicə və müdava edirlər. Amma bexilafi-insan ki, hər halətdə özündən qeyrisinə möhtacdır, pəs insanın şərafəti heyvandan nə ilə olacaqdır?

Saniyən, müddəi ki, əhli-islamın nə Quranına, nə peyğəmbərinə və nə hədisinə qail deyildir və bu sualı müsəlmanların payeyi-fəzl və kəmalın bilməkdən ötrü edibdir, əgər desə ki, mən elmi-əbdan və əqli-məaş məqsudun soruşdum ki, bilim həzrətin muradı ol kəlamından nə

[1] Ağıl o şeydir ki, ona Allahın özü də itaət edir.

imiş, zahiri mə'nasın məktəb uşaqları həm bilirlər. Təəssüb və cədəl yolu ilə meydana gəlib bu ayeyi-şərifənin ki, küllü hizbin bima lədeyhim fərihun[1] yazıblar, mə'nasının mənim sualıma nə münasibəti var?

Salisən, əgər desə ki, müsəlmanların töxmi-vücudları ədəmə mübəddəl olmamaq elmi-əbdan və əqli-məaş müsəlmanların arasında olduğun sübut edir, üləmayi-islam və qayeyi-məmaliki-xariciyyə mütəvəcceh olsalar, əlbəttə şəkk eləməzlər ki, müsəlmanların anən-fəanən töxmi-vücudları ədəmə mübəddəl olur. Ol vaxtda, əlbəttə, onun əlacının dalınca olurdular.

Rabiən, tutaq ki, hər tayfa özünə münasib səliqə ilə məaş və hifzi-əbdanların hifz ediblər. Məsələn, əkinçilik elmlərin təkmil etməyə maşın gətirib, əqəllən 50 fəhlənin işin bir adam etməklə məhsulatı artırıb, xərci az eləməklə buxar gəmiləri və dəmiryollar qayırmaqla və genə yüz belə sənətlərə tətəbbö' edib, əsbabi-istirahət və asayişi xəlqə dürüst gətirməklə və əqsami-ülumda tərəqqi eləməklə və bunlara münasib əməlləri ilə nə ki özləri bənəfseyi-hifzi-əbdan və məaş edirlər, bəlkə müsəlmanların da ehtiyacların rəf' edib bu tərzlə dövlətlərinə və millətlərinə qüvvət verirlər və bu məratibin heç birisinin nəhyində nə bir ayeyi-Quran və nə bir nəssi-nəqli və əqli varımızdır.

Bizim xalqın cümlə libasları və bilküll əsbabi-istirahətimiz aynadan tutub suzənə kimi ki, libaslarımızı tikirik, xaricə sənətkarlarının əməlidir. İslam əhlinin, cənab ağa, hansı sənətin bunlara müqabil tutaq? Rusiya vilayətindən gələn undan bayramlarımızda həlviyyat qayırırıq, gərçək danəsi ki, müsəlman vilayətlərinin cümləsində əkilib əmələ gəlir və bə'zi vilayətlərdə onun yağını neft əvəzinə yandırırlar, amma bizlər naxoşa verməyə labüd qalıb onun yağını xaricə dərmanxanalarından alırıq.

Xamisən, həzrəti-rəsulillah cəmi ülumu-elmi-əbdan və elmi-ədyana münhəsir buyurdular. Elmi-əbdana və əqli-məaşa hükəma-hikmət-əməli ad qoydular ki, təksiri-əbdani-insan və heyvan və nəbatat və hifzi-əcsad, cəmadiyyeyi-bina və tə'mir və hifzi-imarət və əxzi-filizzat və onlara təsərrüf eləməkdən ibarətdir. Ayə: ələm tərə ənnəl-lahə səxxərə ləküm mafil-ərzi vəl fələk ilə axirə[2].

---

[1] Hər bir insan yığnağı özünün əldə etdiyi şey ilə fərəhlənir.

[2] Görmürsünüzmü Allah yer və göydə olan şeyləri sizin ixtiyarınıza verib?

Badkubədə yüz il bundan əqdəm üləma və füzəlayi-islamın vücudi-mübarəklərilə Badkubə neftindən üç yüz tümən İran pulu yüz min zəhmət ilə vüsul olurdu. Amma keçən ildə 16959 put İran məmləkətinə, 1319766 put Rusiya məmləkətlərinə neft cövhəri aparıbdılar. Putu 50 qəpikdən hesab eləsək 667362 manat 50 qəpik qət'i-nəzər neftin qalan xıltından cövhər qiyməti olur. Bu tərəqqi aya hansı müsəlmanın tədbirilə zahir olubdur ki, elmi-əbdanı əllərindən vermək onlara böhtan ola?

Baqisi yazılacaq.

*Heydəri*

## TƏZƏ XƏBƏRLƏR

Peterburqda bir padşahlıq kitabxanası var ki, onun hər ildə 800000 manat xərci olur. Ol kitabxanada 900000 basma, 30000 yazma kitab və 75000 kitab surəti var. Qiymətli kitabları şüşə altında saxlayırlar ki, onlara dəyməsinlər. O cümlədən bir qızıl cildli Quran var ki, qiyməti 33000 manat.

Kitabxana hər gündə sübh saat ondan axşam saat doqquzacan açıqdır və hər kəs ol zaman gedib orada müftə kitablar və qəzetlər oxuya bilir. Hər bir dildə çap olunan kitabları və qəzetləri orada tapmaq olur və əgər bir kəs bilsə ki, filan kitab yoxdur, ol vaxtda deyə bilər ki, onu tapıb iki həftənin müddətində ona oxumağa versinlər. Hər yek şənbə günü kitabxananı hər bir kəs gedib tamaşa edə bilir. Orada bir dəftər var ki, hər kitabxananı gəzən mütəşəxxis adam ona öz dəsti-xəttilə qol çəkir, o cümlədən həzrəti Nəsrəddin şah ona qol çəkib.

*Əsgər Gorani*

* * *

Avstriya vəziri Andraşi yazdığı şərtnaməni Osmanlı dövlətinə mə'lum ediblər. Cənab sədri-ə'zəm cavab verib ki, dövlət özü xaçpərəst tabelərinə lazım olan ixtiyarları verəcək, amma İngilisdən savayı tamam Avropa dövlətlərinin vəzirləri tə'kid edirlər ki, Osmanlı ol şərtləri qəbul etsin.

* * *

Firəng Mişo bir maşın qayırıb ki, günün istisi ilə işləyir. Qazanın üstə büllurdan bir ayna qayırıb ki, günün istisini yığıb qazandakı suyu qaynadıb buğa döndərir və o buğ maşını işlədir.

* * *

15 gündür ki, Rusiyadan gələn yollar qar şiddət elədiyinə bağlanıb və poşt gəlməyib.

* * *

Qəzetlərdə yazırlar ki, bizim Rusiya dövləti kağız pulun saxta qayıran çox olduğuna çox olduğuna təzə kağız pulu kəsdirəcək.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления

*İkinci sənə* *İki həftəlik qəzet*

*Fi 15 məhərrəm,*
*sənə 1293*

* * *

*Poşt xərci*
*qəzet basdıran ilədir*

* * *

*Cümə günü*




*Fi 30 yanvar Rusiya,*
*sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı –*
*1 manat 50 qəpik*

* * *

*İkinci nömrə*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Təzə dadistəd qərardadını istəyirik türk dilində əlahiddə elədək.

## DAXİLİYYƏ

Su bir yerdə dayanıb qalanda, məsələn, yağışdan sonra əmələ gələn göllərdə onun rəngi sarı ya göy olur. Onun səbəbi ol suda kiçik heyvanat və ələfiyyat məskən edib zindəganlıq etməyidir. Onları kiçik olduğuna baxmaq ilə görmək olmaz, amma ol suyun bir damcısına altı yüz böyüdən ayna ilə baxanda o bir damcıda bir neçə min heyvanat və ələfiyyat görmək olur. Belə su quruyanda zikr olan heyvanatın və ələfiyyatın toxumları toz kimi havaya qalxıb gedirlər. Sonra iyimiş və natəmiz yerə düşəndə təzədən zindəganlıq edirlər. Bu toxumlar havada ol qədərdir ki, insan hər nəfəsin alanda onların bir neçəsi onun ağzına gedir.

Çünki zikr olan heyvanatın bə'zinin rəngi qırmızıdır, ona binaən bə'zi yerlərdə yağış yağanda havada olan toxumlar ona qarışıb onu qan kimi qırmızı elədiyinə belə qırmızı yağışa avam adam qan deyib qəzəbi ilahi hesab edir.

Zikr olan ələfiyyatın bə'zinin toxumları insanın bədəninə daxil olanda onlardan titrədib-qızdırma, çiçək, vəba, yatalaq və bir neçə qeyri naxoşluqlar əmələ gəlirlər. Çünki bədən təmiz olanda ol toxum-

lar bədənə daxil də olsalar, orada pərvəriş tapıb zindəganlıq edə bilməzlər, ona binaən hər kəs zikr olan naxoşluqlardan özünü mühafizət etməkdən ötrü gərək bədənini və paltarını təmiz və qarnını iyimiş, çürümüş və artıq xörəkdən saxlasın.

Bu halda bizim Badkubə şəhərində çiçək naxoşluğu olduğuna indi ancaq çiçəkdən danışacağıq.

Çiçək iki qism naxoşluğa deyirlər ki, birisi əsl çiçəkdir və birisi səpgidir ki, çiçəyə oxşadığına ona da çiçək deyirlər. Amma onların təfavütü çoxdur. Məsələn, əsl çiçək yovuxmadır, yə’ni bir xəstənin yanına sağ adam gəlsə o da naxoşluyar. Amma səpgi yovuxma deyil. Əsl çiçəkdən çox adam tələf olur, amma səpgidən yüzdə biri vəfat edər. İndi Badkubədə hər iki naxoşluq var. Həkimbaşı mə’lum edib ki, əsl çiçəkdən 5 adam xəstə imiş. Onların birisi ki, südəmən uşaq imiş, vəfat edib və qeyriləri şəfa tapıllar. Amma səpgidən xəstə çoxdur.

Keçən zaman ki, çiçək döymək mə’lum deyilmiş, çiçək qara yara kimi hər bir vilayətə düşsə, onu tamam edir imiş. Amma indi onun səbəbi və əlacı mə’lum olduğuna ol qədər şiddət etmir.

Çiçəyi döyülən kəs çiçəkdən xəstə olmaz və əgər olsa da az olur. Bə’zi vaxtda çiçəyi döyülən kəs genə sonra çiçəkdən naxoşlayır. Ona binaən təbiblər məsləhət edirlər ki, hər kəs on ildə bir dəfə çiçəyini döydürsün və belə deyirlər ki, ol vaxtda ona heç çiçək dəyməz.

Əgər çiçək düşən yerdə təbib olsa, onu xəstənin üstə gətirdib onun məsləhətinə görə əməl etmək gərək, amma təbib olmasa lazımdır xəstəni soyuqdan və istidən mühafizət edib ona isti və təmiz xörəyi az-az verib, paltarını və bədənini pak saxlamaq və əgər iştədmə lazım olsa, gərçək yağı vermək. Belə saxlanan xəstənin çoxu təbibsiz də şəfa tapır.

Çiçək azarı bir yerə düşəndə sə’y etmək gərək ki, o naxoşluq sağ olan adamlara da dəyməsin. Ona binaən xəstəni elə saxlamaq gərək ki, onun yanına lazım olmayan sağ adam, ələlxüsus, çiçəyi döyülməmiş kəs gəlməsin və əgər məqdur olsa, xəstəyə bir əlahiddə otaq vermək ki, orada qeyri kəs sakin olmuya. Xəstəni elə saxlamaq gərək ki, onun yaralarının üstə milçək düşməsin, yoxsa onun ayaqlarına və qanadlarına ol yarada olan ələfiyyatın toxumları yapışar və sonra ol milçək sağ adamın üstünə oturanda ona da çiçək salar.

## ƏKİN VƏ ZİRAƏT XƏBƏRLƏRİ

Kotan üç qism olur: diyircəkli, dayaqlı və diyircəkli. Diyircəksiz kotan yüngül olduğuna ona daş ya kəsək rast gələndə onu düzəltmək asandır. Ona binaən onilə daşlı yeri şuxm etmək yaxşıdır və bir də onu əkin yerin dərin şuxm etməkdən ötrü işlədirlər ki, yüngül olduğuna az mal ilə də işlədmək olur. Ona bir ya iki cüt öküz qoşurlar. Onun cızıqları düz olmadığına şuxmu təmiz olmaz.

Dayaqlı kotanın qırının altında bir ucu yastıq dayaq ya bir diyircək olur. Ona binaən onu düz saxlamaq çətin deyil, onun cızıqları düz və şuxmu təmiz olur və əgər lazım olsa, onun dayağını çıxarıb diyircəksiz kotan yerinə işlədmək olur. Ona 2 ya 3 cift öküz bəsdir.

Diyircəkli kotanın iki diyircəyi olur ki, onların üstə qırın başı dayanıb onların üstün basıb kotanı ağır edir. Ona 3 ya 4 cift öküz qoşurlar, amma o ağır olduğuna onu düz saxlamaq asandır, hətta əkinçi əldən qoyanda da çökürülməz. Ona binaən onun cızıqları düz və şuxmu təmiz olur. Çünki dərin şuxm etmək ötrü gərək qırın başını aşağı salasan və onu aşağı çəkdikcən diyircəklərin üstün bərk basıb kotanı ağır edir, ona binaən diyircəkli kotanla dərin şuxm etmək çətindir. Bu kotanın şuxm tərəfdə olan diyircəyi şuxmun içilə getdiyinə gərək o biri diyircəkdən böyük olsun, amma bə’zi vaxtda onların hər birinə qeyri ox qayırıblar ki, onların hərəsini əlahiddə qalxızmaq və aşağı salmaq olsun.

Bə’zi yerlərdə onun kiçik diyircəyinin yerinə bir ucu yastı dayaq ya yarım diyircək qayırırlar. Bizim kotanın qırının ucu qalxaq olduğuna onu diyircəklərin üstə irəli və geri çəkmək ilə dərin ya dayaz şuxm edirlər. Amma qeyri yerlərdə qırın ucuna bir dik dəmir möhkəm ediblər ki, onun üstəki halqasına malları qoşanda dərin və aşağıdakı halqasına qoşanda dayaz şuxm edir. Məzkur kotanları hər vilayətdə bir qeyri cürə qayırırlar. Xülasə, dünyada kotan çoxdur, amma bizimkindən yamanı heç olmaz. Onun hər bir hissəsi yaman olduğuna 8 cift öküz ilə işlədirik və onilə belə yeri narın edib çökürə bilmirik. Ona binaən bizim tavanası olan əkinçilər yaxşı elərdilər ki, Moskva karxanalarından ə’la kotanlardan gətirdib işlədəydilər. Onların qiyməti 30–100 manat olur. Ol vaxtda bəlkə onları görüb özgələr də onlardan alsınlar.

İndi elm sahibləri sə'y edirlər ki, kotanı su buğu ilə işləyən maşın ilə işlədsinlər və belə maşınlar qayırıblar ki, bir tağar yeri bir saatda şuxm edir. Amma onların qiyməti çoxdur və onları ancaq düzlənmiş yerdə işlədmək olur.

## MƏKTUBAT

Çün əql müdəbbiri-əf'al və mürəbbiyi-kəmaldır, genə əqlə gələk. Çün tü darəm həmə darəm, əgərəm hiç nə başəd[1]. Əgər əql olsa hamı zad olar, əql olmasa heç bir zad olmaz. Əsli-əf'al xeyrin amilidir, vəli asand deyil, çox zəhmət və riyazətlər çəkib işləri bu məqama yetiriblər və genə zəhmət çəkib artırmaqdadırlar.

İki qism şəxsə aqil deyərlər: biri ki, riyazət çəkib bir elm ixtira edə və biri ki, onu görəndən sonra təhsil edib öyrənə. Bunlara alim və mütəəllim deyirlər və illa həməc məhsub olunur, amma əqlin cəvahiratı zülmati-cəhalətdə itib və hər kəsin bir rizə daş əlinə gəlib ki, onu cəvahir xəyal edər. Belə ki, şair deyib:

Gər əz bəsiti-zəmin əql mün'ədəm gərdəd
Kəsi bexud nəbərəd in güman ki, nadanəst[2].

Bu xəyal ilə o kəslər ki, əllərində cəvahir var, onlarla bie'tinalıq edib, sözlərini guşi-istimaə almazlar, təfavüt odur ki, aqil-cahili tanıyıb aqilanə sözləri ona deyir və cahil qüruri-cəhalət səbəbilə eşitməyəndə aqilin ona ürəyi yanar, amma aqilanə sözlər cahilin iste'dadı o məraitibə olmamaq səbəbilə onun təbiətinə çətin və idrakına uzaq gəlir və o sözlərdən onun təbiəti incidib ürəyi büğz bağlayıb qət'i-nəzər bie'tinalıqdan savayı biehtiramlıq və bəlkə qəsdi-həlak edər. Pəs lazımdır təfəkkür, təəqqül çırağını ələ alıb insaf gözü ilə baxmaq ki, aya ülumi-mütəkəssirənin cəvahirləri ki, əqlin nişanələrindəndirlər, əldə bir zad var ki, əql hesab etmək olsun, ya cəhalətin susuzluğu həvayi-nəfsin şurəzarını saf su göstərir? Necə ki, əql bir şəcəreyi-teyyibədir ki, yaxşı əməllər onun nişanəsidir, həmçinin cəhl də bir şəcəri-xəbisədir ki, yaman əməllər onun

---

[1] Mənim heç nəyim olmasa da, sən varmısansa, hər şeyim var.
[2] Əgər yer üzündən ağıl yox olarsa,
Heç kəs özünün ağılsız olmasını güman etməz.

nişanəsidir. Gərək təhsili-elm ilə nuri-əqli tapıb yaxşı-yamana təfavüt qoymaq. Və illa yaxşı yaman yerinə və yaman yaxşı yerinə iste'mal olur. Cəhalət bir atəşi-suzandır ki, şəxs öz cəhalətinin oduna yanar və onu da anlamaz ya əyyuhəl-ləzinə amənu-qu ənfusəkum və əhlikum narən[1]. Necə ki, insana lazımdır özün və əhlin elmi-din və məad ilə atəşi-duzəxdən saxlasın, həmçinin gərək tərbiyəti-ülum ilə özün və əhlin cəhalət odundan hifz etsin. Tərbiyət mövqufdur zəhmət və riyazətə və xidməti-ərbabi-üluma və afaqi-ənfəsə baxıb nik və bəd əf'alda təfəkkür və təəqqül eləməyə. Əz hər çe tələb küni şəbü ruz piş əzhəmə nikbuyi beyamuz[2]. Çün yaxşı olmağın əvvəldə zəhməti və çətinliyi var, amma yamanlıq hər bir vaxtda mövcuddur. Hamı kəs yaxşı olmaq istəyir, amma onun çətinliyi səbəbindən qaçıb yamanlıq çölündə sərgərdan qalır və hər şey üçün bir vaxt var, gərək o vaxta onu əmələ gətirmək, ta fayda versin, insanı da tüfuliyyətdə gərək atası və böyüyü hirfətə və tərbiyətə qoysun ki, dəmir soyuyandan sonra çəkic ona kar edib əsbab qayrılmaz. Vəsfi-tərbiyətin baqisi və əl-əql ma əbədəhu bihürrəhman[3] gələn fəslə qaldı.

*Əhsənül-Qəvaid*

* * *

Quba şəhərinin əhllərinin boyağının tənəzzülü cəhətindən işi mə'lumdur ki, nə qədər evlər xarab olub. Hansı ki, bu zərərin Şamaxının zəlzələsinə və ya İranın keçmiş qəhətliyinə nisbəti var. Quba əhlləri hər kəs öz qüvvəsinə görə 100000 ya 50000 manat xərc edib boyaq əkmişdi, indi nə haman külli məbləğdən əl çəkib buraxmağa taqətləri olmuyub və nə mülahizə edib saxlamağa istitaələri qalmayıb, mütəhəyyir və sərgərdan qaldıqları halda cənab bari-təalanın mərhəmətindən onlara cənab Kazlyakovski kimi adil hakim Quba şəhərinə uyezdni naçalnik tə'yin olunub. Ol cənabın ədalətindən bir-iki fəqərə ərz edim. 1) Quba əhlinin vəz'i-övzaını mülahizə edib və çox şəxslərin yövmiyyə xərcinə məəttəl qalmağın mənzur tutub öz məvacibindən və qeyri mütəməvvil şəxslərdən bir qədər məbləğ cəm edib

[1] Ey mö'minlər, özünüzü və ailənizi oddan qoruyun.

[2] Gecə-gündüz hər nəyə nail olmaq istəsən, hər şeydən əvvəl yaxşı ad qazanmağı öyrən

[3] Allah hər şeyi ağılla görür.

bisaman olan füqəralara təqsim buyurub. 2) Zikr olan məbləğdən baş pulunu verməyə qadir olmayanların yerinə padşahlıq xərcini verib. 3) Qurban bayramının günü məhbusların haləti-təzəllümdə olmağın mənzur tutub onlara bir neçə kəllə qənd ən'am edib.

*Sultanov*

* * *

Bizim Quba şəhərində erməni camaatı güzəranlıq babında lazım olan ümuru müyəssər olduqcan tədarük edib öz ovqatlarını bu az olan ömrünün zindəganlığına sərf edib öz füqəra və məsakinlərinə kömək edib, elm və ədəb təhsil etməyə sə'y edirlər ki, sair millətlərə gülüş olmasınlar. Quba uyezdinin Gilvar qəryəsində bir uşqola, yə'ni məktəbxana bina edib bir nəfər müəllim məvacib ilə tutublar ki, öz əhlinin uşaqlarına erməni və rus dillərilə tərbiyət verilsin ki, onlar müsəlmanlar içində olduqlarına öz dilini dəxi yaxşı bilmirlər. Bu qeyrət onlara üz verib qaytanlı dəftər hazır edib məbləğ cəm edirlər, əvvələn, zikr olan məktəbxana üçün güzəran olsun, saniyən, həmin qəryədə kəlisa tə'mir olunsun və əlavə bərin artıq pul fərahəm etmək üçün dekabr ayının 26-cı gecəsində və yanvar ayının əvvəlində erməni teatrı bina edib məbaliğ pulu cəm etdilər. Amma bizim müsəlmanlar nə ki, elm və ədəb dalınca olmurlar, hətta onların miyanında məhəbbət, qardaşlıq rəsmi olmadığına öz fəqir-füqəralarına da kömək etmirlər ki, cənab uyezdni naçalnik Kazlyakovski yövmiyə xərcinə məəttəl olan müsəlmanları acından həlak olmaqdan mühafizət etməkdən ötrü pul cəm edib onlara təqsim edir.

## TƏZƏ XƏBƏRLƏR

İran dövlətinin Tiflis general-konsulunun dəftərxanasından yazırlar: keçən ziq'ədə ayının onuncu yövmündə Culfa sərhəddində İran dövlətinin tərəfindən nəviştəcat, pul və əmanət göndərmək üçün poştxana bina olunub. Bundan sonra ümumi-nas bacara bilirlər ki, öz nəviştəcat, pul və əmanətlərini haman poştxananın təvəssütilə lazım olan yerlərə göndərsinlər və göndərən surətdə gərək paketin üstündə vazeh yazılsın ki, bu kağız ya pul, ya əmanət Culfa sərhəddində İran

poştxanasına yetişib onun təvəssütilə filan şəhərdə, filankəs filan oğluna çatsın. Hər şəxsin zakaznoy kağızı və ya əmanəti müəyyən olan məhlədə özünə çatmıya, o vaxt o kağız və o əmanəti iki ay saxlayıb ondan sonra sahibinə geri qaytaracaqdır. Məzbur poştxana mütəəhhid olur ki, əgər bir şəxsin pulu, kağız və ya əmanəti yolda tələf olub lazım olan yerinə yetişməyə cəmi xəsarətinin öhdəsindən gəlsin.

* * *

İngilis padşahının oğlu bu çağacan Hindistanda səyahət edir. İndi Hindistanın şimal tərəfindən pələng və fil şikarına məşğuldur.

* * *

Bir ildir ki, Badkubənin sudebni pristavı erməni Sukyasov min səkkiz yüz manat padşahlıq pulun özünə məsrəf eləməkdən ötrü məhbus olmuş idi. Bu yanvarın 13-də onun işi qət olan zaman Badkubə erməniləri siyahı üzilə ol məbləği cəm edib suda veriblər. Ona binaən sud onu qulluqdan əzl edib əldən qoyubdur. Bizim müsəlmanlardan belə işə 5 qəpik də verən olmaz.

* * *

Peterburqda təzədən Rusiyada ixtira olunmuş tüfəng ilə əsgərlər məşq edirlər. Onu hava ilə doldururlar, gülləsi 70 arşın gedir və tüstüsü olmur.

* * *

Andraşinin sülhnaməsini hələ Osmanlı qəbul etməyib. Deyirlər İngilis də təkid edəcək ki, qəbul etsin.

* * *

Daşkənddən yazırlar ki, abtavaçıbaşı təzədən Acid şəhərində qəzavət üçün 10000 əsgər cəm etmiş imiş, amma Namanğanda olan rus əsgərləri onları pərakəndə ediblər.

* * *

Peterburqda Ştiğlis adlı bir kəs bir milyon manat verib ki, ol məbləğ ilə bir şəkil çəkmək məktəbxanası açılsın.

* * *

Tiflisdə dövlət tərəfindən bir məclis bina olunub ki, Qafqazda olan əkin sulamaq adətlərin cəm edib bir qərardad qoysun ki, su xalq arasında doğruluq ilə paylansın.

* * *

Tiflisdə ermənilər və gürcülər öz dillərində həmişə teatr çıxardıllar, amma bu çağacan onların həmişəlik imarəti yox idi. İndi istəyirlər dəftər ilə pul yığıb teatr üçün imarət təmir etsinlər.

* * *

Dünyada 1034434000 insan var, o cümlədən 17300000 müsəlman, 300000000 xaçpərəst, 47000 yəhudi, 740000000 bütpərəst və artığı qeyri məzhəblərdir. Dünyada min məzhəb var.

* * *

İmtahan ilə məlum olub ki, dərya suyunun 62 putunda bir qran qızıl olur.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления

*İkinci sənə* | *İki həftəlik qəzet*

*Fi 1 səfər,*
*sənə 1293*

* * *

*Poşt xərci*
*qəzet basdıran ilədir*

* * *

*Yekşənbə günü*



*Fi 15 fevral Rusiya,*
*sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı –*
*1 manat 50 qəpik*

* * *

*Üçüncü nömrə*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Cənab sərdarın dəftərxanasının rəisi knyaz Muxranski fevralın birində Badkubə qubernatoruna yazıb ki, təzə dadistəd qərardadı gərək yanvarın əvvəlində Qafqazın hər bir tərəfində qoyulaydı. Amma işin əvvəli olduğuna cənab sərdar dadistəd edənlərə iki ay möhlət verib ki, martın əvvəlinəcən hər kəs fikir edib zikr olan qərardada müvafiq özünü dadistəd edənlərin silkinə yazdırıb şəhadətnamə və bilet alsın. Lakin belə məlum olur ki, Qafazın dadistəd edənlərinin çoxu bu çağacan özlərinə şəhadətnamə və bilet almayıblar. Ona binaən cənab sərdar buyurur ki, onlara mə'lum olunsun zikr olan qərardad martın əvvəlində bişəkk qoyulacaq və əgər ol vaxtacan hər kəs özünə şəhadətnamə və bilet almamış ola, onun dükanı ya qeyri dadistəd olunan mənzili bağlanmaqdan savayı onlardan zakona müvafiq cərimə alınacaq.

## DAXİLİYYƏ

Elmi-əbdan hədisinin barəsində olan külu vəşrəbu və la tisrifu[1] bizim mollalar verən mənanın birisini görüb istəyirəm ol ayənin hikməti mə'nasından danışam. Hər bir millətin məzhəbində insan özünə və ya bir qeyri kəsi öldürmək qadağan olunub. Ona binaən ki, insan bir-birini həlak etsə, camaat olmaz və camaatsız insan dolanmaz. Çünki

[1] Ye, iç, amma israfçılıq eləmə.

insan özünü bir neçə tövr ilə, o cümlədən az ya çox yemək və içmək ilə həlak edə bilir, ol səbəbə zikr olan ayə müsəlmanlara nazil olub ki, onları belə ölümdən mühafizə etsin.

Necə ki, şamın piyi çox olanda piltəni boğduğuna və az olanda piltəyə çatmadığına onun işığı kəm olur, habelə insanın da yemək-içməyi ziyadə və ya kəm olanda onun bədəni zəiflədiyinə ona naxoşluq ariz olub onu həlak edir. Az yemək və içmək insanın bədənini zəif eləməyi mə'lum və aşkar olduğuna, indi ancaq çox yemək və içmək bədənə zərər eləməyindən danışacağıq.

Biz yediyimiz xörəklər gərək mə'dədə əriyib qana qatışıb bədəni saxlasınlar və əgər mə'dədə bir girvənkə xörəyi bişirib əritməyə qüvvət varsa, ona iki girvənkə xörəyi bişirtdirəndən mə'də gücdən düşüb zəiflədiyinə tamam bədəni də zəif edir. Habelə biz içdiyimiz su lazımdır ki, mə'dədə bişən xörəyi əridib qan kimi etsin ki, damarların içində axsın. Elə ki, qan bədənin əczalarına daxil oldu, gərək su özü tər və ya qeyri surətdə bədəndən rədd olsun. Çünki suyu rədd edən əczalar su çox olanda onu rədd eləməkdən ötrü ziyadə kuşeş edib, gücdən düşüb tamam bədəni zəif edirlər, ona binaən çox içmək, çox yemək kimi bədəni fövtə verir.

Pəs üləmayi-islam yaxşı elərdilər ki, zikr olan ayeyi-şərifəyə verilən mə'naların cümləsindən zikr olan hikmət mə'nasını da verəydilər və bir müsəlman israf edəndə, məsələn, qovunu batman ilə yeyəndə, ya lilli suyu bir neçə kasa içəndə ona deyəydilər: külu vəşrəbu və la tüsrifu.

## ELM XƏBƏRLƏRİ

İmtahan ilə bəyan olub ki, bə'zi naxoşluq insandan heyvana və ya heyvandan insana düşür. Məsələn, sinə naxoşluğu ki, ona sill deyirlər, heyvanda da olur və onların südünü işlədən insana da düşür. Ona binaən sağlam malın sill naxoşluğu olsa onun südünü yemək məsləhət deyil. Ondan masəva onu sürüdə də saxlamaq yaxşı deyil. Ona binaən ki, sürüdə olan dana və buzovlar onu əmib sill naxoşluğuna düşər. Həmçinin onun ətini də yemək yaxşı deyil. Ol səbəbə yəhudilərin adəti ki, malı kəsəndən sonra onun ciyərinə baxıb və gər yara olsa onun ətini yemirlər, yaxşı adətdir. Pəs sill naxoşluğu olan heyvanı məsləhətdir tələf edəsən ki, onun ətini ya südünü insan və heyvanlar yeməsinlər.

* * *

İmtahan ilə mə’lum olub ki, insanın xasiyyəti və bə’zi naxoşluqları, məsələn, sill və babasil naxoşluqları onun övladında tapılır və habelə zikr olan naxoşluqlar ananın südü ilə övlada yetişir. Ona binaən dayə saxlayanlara məsləhətdir ki, sağ dayə tutsunlar ki, onun sill, ya babasil və ya kəffət naxoşluğu olmasın. Həmçinin zikr olan naxoşluqları olan övrətlərə məsləhətdir ki, öz uşaqların əmizdirməyib onun üçün dayə tutsunlar ki, uşaq əgər anasına oxşamış isə naxoş ananın südündən azara düşməsin.

* * *

Çünki bizlərdə oğrunu bə’zi vaxtda ləpir ilə cüstücu edirlər və kəndlərdə olunan oğurluğun çoxunu atlı adam edir, ona binaən atının yeriməyindən və onun ləpirindən danışacayıq.

At yorğalıyanda hər tərəfinin iki ayağını birdən qalxızıb, birdən yerə qoyar. Addım ilə gedəndə hər bir ayağını tək yerə qoyar. Məsələn, sağ tərəfin qabaq ayağından sonra, sol tərəfin dal ayağını, sonra sağ tərəfin dal ayağını və axırda sol tərəfin qabaq ayağını. Yeriş ilə gedəndə iki ayağını birdən, yə’ni sağ tərəfin qabaq ayağı ilə sol tərəfin dal ayağını birdən və sol tərəfin qabaq ayağı ilə sağ tərəfin dal ayağını birdən yerə qoyar. Ona binaən at yorğalıyanda gah sağ tərəfə, gah sol tərəfə basıb yırğalanar, amma yeriş ilə gedəndə hər iki tərəfə birdən [ayaq] basdığına yırğalanmaz.

At yeriş ilə və addım ilə gedəndə onu hər tərəfinin iki ayağından bir ləpir düşür, yə’ni qabaq ayağının ləpirinin üstə dal ayağının ləpiri düşür. Lakin bir tərəfin ayaqları elədi ki, ləpirlərin bir-birindən irəli olmağına baxıb bilmək olur ki, o ləpirlər yeriş ilə və ya addım ilə gedən atdan düşüb. Addım ilə gedən atın ləpirlərinin arası az, amma yeriş ilə gedəninki çox olur. Amma at yeriş və addım ilə yoxuşa çıxanda onun dal ayağı qabaq ayağının ləpirinin üstə düşməz, bir az dala düşər və enişdən düşəndə dal ayağının ləpiri qabaq ayağından irəli düşər. Həmçinin yorğa at düz yerdə gedəndə dal ayağının ləpiri qabaq ayağının ləpirindən irəli düşür.

* * *

Hörümçək öz torunun içində bir deşik qayırıb oturub gözləyir ki, bir heyvan ona düşəndə onu şikar etsin. Çünki hava yaman olanda hey-

vanat gəzmədiyinə onun toruna da düşməz, ona binaən ol zaman hörümçək özü də tordan çıxıb bir yavıq yerdə, məsələn, ağacın budağının altında gizlənir. Belə hörümçək yerini dəyişməyə binaən hava dəyişilməyin bir neçə gün qabaq bilmək olur. Əgər hava yaxşı olan zaman hörümçək tordan çıxıb gedir isə ya getmiş isə, mə'lum ki, hava dəyişilib yaman olacaq və əgər hava yaman olan zaman hörümçək öz toruna gəlmiş isə ya gəlmək istəyir isə, yəqin yaxşı hava olacaq.

## MƏKTUBAT

5-ci f ə s i l. Keçən fəsildə yazıldı ki, hər ataya lazımdır, övladına tərbiyət etsin ki, elm və ədəb sahibi olsunlar. Həməc olub xəyanət və şərarət nişlərilə xalqa niş vurmasınlar. Çün ənə və Əli əbu hazihil-ümmət[1] fərmayişinin mə'nasına binaən mə'lumdur ki, padşah rəiyyətə atadır. Əlbəttə, övladın tərbiyəsində sə'y və onları təhris edər və övlad gərək ülül-əmr atanın itaətin özünə vacib bilib tərbiyətli və qabil olmağa sə'y etsin, ta cəhalət və füqəralıq odu onu yandırmasın. Fəqisəsül-qissə lə əlləhum yətəfəkkərun[2] ayəsinə binaən bir misal deyək. Xalq içində məşhurdur ki, it və qurd ildə on doğar, əti yeyilməz, onilə belə artmaz. Amma qoyun ildə bir ya iki doğar və əti yeyilmək ilə genə azalmaz. Bu Allahın bərəkətidir. Bəli. Amma onun bir səbəbi-hikməti həm var ki, it-qurda mütəvvəcceh və mürəbbi olan olmadığına tələf olur, amma qoyunun müstəhfiz və mürəbbi və sahibi olduğuna məsrəf olursa da, genə artar, habelə vəqta ki, xalq hirfət və sənət elmlərilə tərbiyət oldular, hüquqi-soltan vermək ilə nöqsan etməzlər, genə artarlar. Qərəz, elm və tərbiyət insanın səbəbi-tərəqqi və nəf'idir, amma bə'zi adamlar nadanlıqdan deyir:

Be ciddi cəhd çu kari nəmirəvəd əz piş.
Bekirdigar rəha kərdə beh məsalehi-xiş.[3]

Əlbəttə, nadanlıq ilə ciddi-cəhd edən məqsudə çatmaz, gərək yol ilə getmək ta mənzilə çatmaq. Pəs insana vacibdir ki, elm ilə işlərə

[1] Mən və Əli bu ümmətin atasıyıq.

[2] Qissədən hissə ola bilsin ki, onları bir fikrə gətirsin.

[3] İşin ki, sə'y və çalışmaqla irəli getmədi, onun düzəlməsini Allaha tapşırsan yaxşıdır.

iqdam və ciddi-cəhd etsin, ta əməl fayda versin və hər bir tayfada olan yaxşı elmləri öyrənsin. Bə'd əz on ki, mə'lum oldu ki, təqazayi-zəmanəyə binaən ülumi-əbdandarlıq vacibdir. Pəs ülum və əf'ali-mütəkəssirə qanuni-səltənət və sənaət və ticarət və ziraət və məadin və qeyri və bunlardan ötrü fabrika və maşınlar bina etməkdən tutub ta kəfşduz, bəlkə ədna mərtəbeyi-pinəduzluğa qədər. Elə ki, hər biri öz qayda və qanununda tərəqeyi-həqq və niyyəti-xalis və rəhmani ilə məhz millətin ümuri-əbdan və məaşları rövnəqlənib, özgələrə möhtac olmadığından ötrü oldu və əqrazi-şeytani daxil olmadı. Çün əsl ibadət Allahın bəndələrinə yaxşılıq etmək və onların hacəti-xeyirlərinə əncam vermək olduğuna binaən ülum sahiblərinin alim və mütəəlliminin əf'alı ibadət olur, dünyavü axirət ne'məti və cinanın kəsb edirlər. Əgər nəzərdə əhli-dünya da olalar əl məcaz qəntərətül-həqiqəti[1] qapısından daxil olur əl əqlü ma übidə bihirrəhman[2] hədisinin cinanına. Bu neçə fəsil mücməli əqli-elm və tərbiyətin qəvaidində danışıldı, çün qəzet münşisi 2-ci nömrədə müsəlmanlarda qardaşlıq rəsmi və məhəbbəti olmadığın yazdığına binaən gələn fəsil qardaşlıq qəvaidində ərz olacaq.

*Əhsənül-Qəvaid*

* * *

İ r ə v a n d a n. Əxbari-cədideyi-İrandan birisi də onu söyləyirlər ki, bu ənqərib zamanda Təbriz vilayətində sud divanxanası qoyublar ki, İran istilahi ilə məclis adlanır və o məclisdə əcza' tə'yin olublar Mirzə Yusifxan Müstəşarüddövlə, Hacı Şeyx hacı Məhəmməd İbrahim Qəzvini oğlu hacı Məhəmməd Hüseyn Nizamüttücar və onlara rəis tə'yin olunub Ağa Mirzə Rəfi xan Nizamülüləmaülhəqq. Bu xəbəri eşitməkdən dilşad olduq ki, əlhəmdülillah İranda nizam başlandı və şahın Avropa səfəri binəticə olmadı.

*Ələkbər Elçizadə*

* * *

Q u b a d a n. Quba uyezdinin Xaltan isti suyunun üstə tə'mirat olmadığına bu çağadək isti suya gələnlər açıq yerə düşüb ziyadə korluq

---

[1] Məcaz həqiqətə keçmək üçün körpüdür.
[2] Ağıl ona deyilir ki, Allaha ibadət eləsin.

çəkirdilər və oradan kəndlər uzaq olmağına binaən tamam mayəhtac-ları gərək özlərilə gətirəydilər. Ondan masəva istisuda bircə hovuz var idi, amma keçən il cənab uyezdni naçalnikin sərəncamına binaən dəftər üzü ilə pul cəm olunub, o cümlədən cənab Hacı Xəlil bəy 300 manat verib. Zikr olan məbləğ ilə istisuda bir ev tə'mir olunub ki, olsun səkkiz bab otaq və təzədən iki hovuz tə'mir olub. Bu il genə bir neçə otaq və hovuz tə'mir olunacaqdır. Ondan savayı orada dükanlar açılacaqdır ki, hər bir mayəhtacı oraya gələnlərə satsınlar. İstisuya gələnlər zikr olan evə kirayə verməyəcəklər.

## TƏZƏ XƏBƏRLƏR

Bu fevralın 9-da bizim padşahın həmşirəsi Mariya Nikolayevna mərhum olub.

* * *

Badkubə müsəlmanlarının arasında danışıq var ki, şəbnişindən ötrü bir mənzil kirayə edib oraya axşamlar söhbət etməyə və vaxtı xoş keçirmək üçün cəm olsunlar və bu camaat mənzilinin adını beistilahi-rus müsəlman klubu qoysunlar ki, haman mənzildə olan məşğulat cümləsi müsəlmanlar adət etdiyi məşğələlərdən olsun. Məsələn, şətrənc, nərd-taxta oynamaq və hər cürə özləri xahiş etdiyi müsəlman kitabları oxumaq. Bu mənzilin kirayəsin verməkdən ötrü, lazım olan müxəlləfatı və kitabları almaq üçün camaat məbləğ cəm edəcəkdir ol kəslərdən hansıları ki, ol mənzilə həmişə gəlməyə xahişmənd olacaqlar.

* * *

Aşura axşamı Səlyan qəsəbəsində yanğından 30-dan ziyadə dükan tamam malları ilə ki, 40 min manata qədər qiyməti olsun, yanıb tələf olub. Yanğının şiddət etməyinə səbəb 2 neft dükanı olub ki, zikr olan 30 dükan 2 saatın müddətində yanıb qurtarıb.

* * *

Osmanlı dövləti öz xaçpərəst tabelərilə cəng elədiyinə binaən tamam Avropa dövlətləri əsgər cəm edib ol cəngin aqibətini gözləyir idilər və Osmanlı çox əsgər yığıb, o cümlədən Qafqazdan gedən çər-

kəzlərdən əlahiddə polk düzəldib cəng gəmilərini və top-tüfəngi arastə etmiş idi. Keçən həftə ki, Avropa dövlətlərinin konsulları Andraşi yazdığı sülhnaməni sədri-ə’zəmə verəndə onu qəbul etməmişdi, hamı fikir elədilər ki, cəng başlanacaq. Amma indi teleqraf ilə xəbər gəlib ki, Osmanlı dövləti ol sülhnaməni qəbul edib.

* * *

Andraşi yazdığı sülhnamənin məzmunu: 1) Bosnidə və Qerdseqovinədə sakin olan xaçpərəstlərə izn olsun ki, asudəlik ilə, yə’ni bimane öz məzhəblərinin adablarını, məsələn, kəlisə tikmək və zəng vurmağı əmələ gətirsinlər. 2) Çünki zikr olan vilayətlərdə torpaq padşahlıqdır və ya müsəlman bəyzadələrinindir, ona binaən xaçpərəst rəiyyətlərə izn olsun ki, ol yerləri ki, onlar əkib-biçirlər, onları özləri üçün satın ala bilsinlər. Dövlət hökm eləsin ki, yer sahibləri ol yerləri onlara satsınlar. 3) Məzkur vilayətlərdən vüsul olan təhmilatın bir hissəsi ol vilayətlərin özlərinə məsrəf olsun. 4) Hər bir icarə ki, ol vilayətlərin sakinlərinə zərər edir, məsələn, təhmilatı icarəyə vermək bərhəm olsun.

* * *

Hindistanda olan məmləkətləri ingilis bir-bir zəbt edib. İndi Hindistanın şimal tərəfində bir neçə məmləkət qalıb ki, alsınlar: Kabul, Herat, Gilat və Bilucistan. Onlardan Gilat və Bilucistan dərya tərəfində olduğuna, indi onları da zəbt etməyə sə’y edir.

* * *

1874-cü sənədə Qafqaz vilayətindən 7 milyon 3 yüz min manat təhmilat vüsul olub. O məbləğdən 6 milyon 5 yüz min manat əskəriyyədən savayı divanxanalara məsrəf olub.

* * *

Qazan şəhərindən Sibir vilayətinə gedən dəmiryol təsdiq olub. Onun Tulu 1600 verst olacaq.

* * *

Bu halda dövlət tərəfindən müəyyən olan adamlar Türküstanın Daşkənd şəhərinə gedən yolların planını çəkirlər. Danışıq var ki, oraya da dəmiryolu aparsınlar.

* * *

Rusiyanın elm sahibləri bir kitab çap ediblər ki, ismi "Qardaş köməyi"dir. Onu satmaqdan cəm olan məbləği Qerdseqovinə əhlinə göndərəcəklər.

* * *

Kokan xanlığının əhli Rusiya ilə cəng etməkdən yorulub Nəsrəddin xanı Rusiyadan gətirib genə özlərinə xan ediblər.

* * *

Keçən yanvarın 19-da Şuşa şəhərində, yə'ni Qarabağın Şuşa qalasında teleqrafxana açılıb.

* * *

Peretburqdan yanvarın 27-də yazırlar: gərçək yağı 7 manat 25, neft cövhəri Amerikadan gələn 2 manat 30 qəpik, Badkubədən gələn 2 manat 2 şahı, Misir pambığı 8 manat 50 qəpik, inək yağı 8 mant 25 qəpik, buğdanın çetverti 11 manat 30 qəpik.

* * *

Avropa dövlətlərinin hər bir vilayətində icmalar bina olunub ki, heyvanatları onları incidənlərdən mühafizət etsin. Hər kəs ol icmaya calis ola bilər və hər bir calisdə ixtiyar var ki, bir kəs öz heyvanını, məsələn, atını ağır yük yükləmək ilə ya döymək ilə incidəndə onu suda apardıb cərimə etdirsin.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского
Губернского Правления.

*İkinci sənə* *İki həftəlik qəzet*

*Fi 15 səfər?*
*sənə 1293*

* * *

*Poşt xərci*
*qəzet basdıran ilədir*

* * *

*Yekşənbə günü*




*Fi 29 fevral Rusiya,*
*sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı –*
*1 manat 50 qəpik*

* * *

*Dördüncü nömrə*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Elmi-əbdan barəsində göndərilən məktubların hamısını əvvəl zaman çap etməyə yer olmadı, indi ol hədis aşkar olduğuna onları çap etmək lazım gəlmir.

## DAXİLİYYƏ

Bu çağacan təzə dadistəd qərardadından bir neçə dəfə danışmışıq, amma onilə belə ki, sabah mart ayının əvvəli olduğuna tamam Qafqaz vilayətində təzə qayda işlənəcək, bizim xalqın çoxu ol qaydanın adablarından bixəbərdir və onların belə bixəbər olmağına ümdə səbəb ehtimallıqdır ki, ata və babadan qalan adətlərə öyrənib onu dəyişdirməyi özlərinə böyük tənbeh hesab edirlər. Çörəkçi fəğan edir ki, belə zülm olmaz, 28 manat 80 qəpik gərək xərc versin, kəlləpəz ona yoldaş olub deyir canım, 10-ca manat mayam var, amma mən də zikr olan xərci verəcəyəm. Bu sözləri dülgər eşidib ah çəkib deyir dülgərlik əsbablarından savayı heç bir zadım yoxdu, məndən də o xərci istəyirlər. Xülasə, çörəkçi, kəlləpəz, dülgər, baqqal, əttar, bəzzaz və qeyriləri bir-birinə dəyib elə dad edirlər ki, onların sədası ərşə çıxıb. Əgər kənardan bir kəs ol sədaya qulaq asa, elə fikir edər ki, onlara həddən ziyadə cəbr edirlər. Amma həqiqətdə onlara bir heylə cəbr yoxdu, taxsır ancaq ata və baba adətidir ki, ondan əl çəkə bilmirlər.

Çörəkçi, kəlləpəz, kababçı və qeyri yeməli şeyləri satan kəslər əgər ol şeyləri evdə bişirib çıxarıb əldə satalar onlara heç xərc yoxdu, amma bizim adam ol şeyləri həmişə dükanda satıblar, ona binaən indi dükandan çıxmağı istəməyib və dükan xərcini çox görüb dad edirlər.

Hər bir sənətkar, o cümlədən dülgər ki, dükanı olmaya və qeyri kəslərə fəhlə olub işləyə xərc verməyəcək, amma bizim dülgər bir dükanı özünə mənzil edib oradan gedib fəhləlik edir və ondan dükan xərci istəyəndə ah çəkib fələkdən şikayət edir.

Baqqal, əttar və qeyri xırda alış-veriş edənlərdə ixtiyar var ki, 4 dükan saxlasınlar, yə’ni 4 dükana 28 manat 80 qəpik xərc var, amma bizim baqqalın və əttarın ki, bir neçə tabaq alma ya fındıq və ya bir neçə torba dərman almağa tavanası var, bir dükan açıb və ondan 4 dükanın xərcini istəyəndə fəğan edir ki, ona cəbr olur.

Bizim bəzzazların çoxunun mayası min manatdan ziyadə deyil, amma hər bir malı arşın ilə ya çəki ilə satan gərək 80 manat 90 qəpik xərc versin və 10 ədəd belə dükan aça bilər. Çünki min manat ilə bircə də yaxşı dükan açmaq olmaz, ona binaən bizim adlarını bəzzaz qoyan kəslər əgər qaz yerişi yeriməyib öz tavanalarına görə dadistəd etsəydilər, heç fəryad etməz idilər.

Xülasə, bizim dadistəd edənlərimiz təzə qaydaya mütəvəcceh olub onilə rəftar etsələr, belə fəğan olmaz. Çünki zikr olan qayda bizim ata və baba qaydası deyil, ona binaən bizim adətlərimiz ilə düz gəlmir. Məsələn, malı gəzdirib satmaq bizlərdə heç olmuyub. Ol səbəbə ki, bizim vilayətlər heç əminlik olmuyub. Amma indi vilayətimiz əminlik olduğuna malı gəzdirib də sata bilirik. Pəs ata və baba adətləri dəyişmək bizə lazımdır. Əlbəttə, adət dəyişmək çətindir, amma dövlət bir qayda qoyanda hər bir kəsin adətini mülahizə edə bilməz və əgər onlar mülahizə olunsa idi, bizim əyri və mütəəffin küçələrimiz gərək baqqi qalaydılar. Amma indi düz plan ilə qayrılmış küçələrə elə adət etmişik ki, hərgah qədim şəhərlərimiz geri qayıda, bir gün də onda davam edib qala bilmərik.

## ƏKİN VƏ ZİRAƏT XƏBƏRLƏRİ

Necə ki, bir heyvan, məsələn, sərçə yumurtadan çıxıb zindəganlıq edib bir neçə dəfə yumurtduyub sonra tələf olur, habelə hər bir ələfiyyat toxumdan əmələ gəlib zindəganlıq edib, toxumluyub sonra tələf olur. Ondan masəva, heyvanatın bə’zi çox, bə’zi az ömür edən kimi

ələfiyyatın da hər birinin ömrü başqa olur və hər bir qism heyvana bir qeyri cürə xörək lazım olan kimi hər bir ələfiyyata da başqa xörək lazımdır. Xülasə, elmi-ələfiyyatdan mə'lumdur ki, hər bir ələfiyyat heyvan kimi canlı şeydir və onun kimi zindəganlıq edir.

İndi görək ələfiyyat zindəganlıq etməyə, yə'ni onların nəşfü nümasına nə lazımdır?

Hər bir ələfiyyata lazımdır: əvvələn, hava ki, onsuz heç bir cism dolana bilməz. Havanın ələfiyyata lazım olmağın belə bəyan etmək olur: bir göyərən otu stəkanı çökürüb onun altında saxlayanda ot quruyub tələf olur.

Saniyən, isti. Əgər bir otu göyərən vaxtda soyuğa versək, tələf olur, ona binaən qışda tamam ələfiyyat ya tələf olur, ya yuxuya gedir.

Salisən, günün işığı. Əgər bir göyərən otu qaranlıq yerdə saxlıyasan onun rəngi saralıb tələf olur.

Xamisən, xörək, yə'ni bə'zi duzlar ki, onlar suda əriyəndən sonra otların kökü onları sorub nəşvü nüma edirlər.

Su ələfiyyata lazım olmağı mə'lumdur və duzların həm lazım olmağını belə bəyan etmək olur: əgər bir əlcə pambığın içinə toxumları qoyub onları soyuq olmayan yerdə suluyasan, onlar əvvəl zaman göyərir, yə'ni xırda otlar çolpa yumurtanın sarısını və ağını yeməkdən böyüyüb dünyaya gələn kimi toxumların içində olan xörəkləri yeməkdən əvvəl zaman göyərib dünyaya gəlirlər. Amma sonra xörək olmadığına tələf olurlar. Lakin onlara lazım olan duzları pambığın üstə səpəndə onları sorub nəşvü nüma edirlər.

Pəs ələfiyyat heyvan kimi yemək-içməyə möhtacdır. Necə ki, bir heyvanı saxlıyan onun ələfini yığıb ona yedirtməyəndə ondan nəf' tapmaz, həmçinin əkinçiyə də lazımdır ki, öz əkininin xörəyə möhtac olmağını bilib əkin yeri qüvvətdən düşəndə, yə'ni onun əkinə xörək olan şeyləri azalanda ol şeyləri yerə qarışdırmaqla onu qüvvətə gətirsin ki, mənfəəti ziyadə olsun. İmtahan olunub ki, qüvvətlənmiş yerin birə on ya iyirmi məhsulatı artıq olur.

## MƏKTUBAT

2-ci fəsil. Elmi-əbdan bəhsdə Badkubəli molla 2-ci mətləbi belə yazıb. Elmi-əbdan ibarətdir o mə'rifətdən ki, insan güzəranlıq babında lazım olan ümuru riayət və tədarük etsin müyəssər olduqcan.

Əvvələn, bəhsi ki, ortaya düşüb, həmin bu mə'rifətin şərhindədir ki, əhli-islam içində onun məratibinin riayəti nə həddədir?

Saniyən, güzəranlıq babında lazım olan ümur müyəssər oluqca riayət etmək vazehdir, necə ki, qeyri tayfalar həm məişətlərin bu qərar ilə keçirirlər və ayeyi-leysə lilinsani illa masəa[1] məzmununa binaən görürük ki, müsəlman başmaqçısı əgər yaxşı olsa, gündə 1 manat qazanır, amma xarici başmaqçısı 10 manata razı olmur. Əgər müsəlman başmaqçısı həm sə'y edib öz əməlində mahir olsa, onun məzhəbi-islama nə zərəri?

Salisən, heç bir millətin kitabında yoxdur ki, şəxs öz qüvvəsindən ziyadə iş görə bilsin. Amma əfradi-bəşərə sə'y ilə məratibi-elmə tərəqqi eləmək müyəssər olur. Müsəlman losmanları ki, dəryada gəzirlər, elmləri olmadığına ildə iki ya üç (2-3) yüz manat məvacib alırlar, amma xarici losmanları ki, elmləri var, neçə bu qədər məvacib alırlar. Amma, zahirən payeyi-zəhmətləri birdir. Əgər belə mənfəətə müsəlman losmanı yetişsə və öz milləti qardaşlarına kömək edib ə'mali-xeyir əmələ gətirsə, onun eybi nədir və nə yol ilə onu məzəmmət eləmək olur?

Rabiən, tüccari-islam öz məmləkətlərinin ipək, pambıq və yunun aparıb Moskva və Firəng karxana sahiblərinə ucuz qiymətə satıb haman şeyləri ki, bir il ondan sabiq onlara vermişdilər və onlar bu il müxtəlifə surətlər ilə parça qayırıblar, artıq qiymətə alıb dala gətirirlər və əgər güzəranlıq babında riayəti-ümur etsələr, heç vaxt belə bihünərliyi qəbul etməyib onun çarəsinin xəyalına düşərlər ki, öz məmləkətlərində fabrika açıb öz məhsulatlarından müxtəlifə parça qayırıb, qeyri-millətlərə satsınlar. Əgər biz müsəlmanlar bu qəbil zadları idrak və mülahizə eləsək, sə'y edərik ki, "Əkinçi" qəzeti gündə bir vərəq çıxıb bizləri öz bədbəxtliyimizdən müttəle etsin.

Xamisən, kitabi-islamda şiddəti-fəqri mövtün əkbərün[2] yazdıqlarına heç alimin və cahilin məhəlli-iradı deyil vücudi-insan dünyəvi və üxrəvi ə'mali-xeyri zühura gətirməyə qabil və müstəiddir. O zaman özün qabil və kamil hesab edə bilir ki, özündən ədna payədə olan mövcudatdan elm və əməl həsəbilə artıq ola. Mən la məaşə ləhu la məadə ləhu[3] hədisi bu sözün qüvvətinə bir dəlil və izahdır. Ə'mali-dini

---

[1] İnsan üçün öz əməyindən başqa heç nə yoxdur.
[2] İnsan üçün şiddətli yoxsulluq böyük ölümdür.
[3] Bir adamın bu dünyadakı məişəti yaxşı deyilsə, onun axirəti də yoxdur.

əmələ gətirmək əğniya üçün hər halda əshəli-vəch ilə füqəradan ziyadə mümkündür. Füqəra rəddi-məzalim xümsü zəkat və ənva' həsənat və ə'mali xeyir[4] feyzindən binəsibdir. Güzəranlıq babında lazım olan ümuru riəyət etsək, müayinə görmək olur ki, elm və sənət sahibi olan kəs nikbəti-fəqrdən məhfuz qalır.

Baqisi yazılacaq

*Heydəri*

2-c i  f ə s i l. Neçə qism qardaşlıq var. Onun iki qismindən danışaq. Əvvəl bəni-adəm və noi-bəşərlik qardaşlıqdır ki, hamı kəs bir-birilə qardaşdırlar. Amma ixtilafi-əqaidə binaən firqə-firqə olub hər biri bir millət adlanıb, onların böyük icmaına dövlət deyilir və kiçik icmalar bir dövlətə tabe olmaq səbəbilə asudə olublar məgər Dəşti-Qıpcaq əhalisi və əgər onlar həm öz məsləhətlərinə binaən təfəkkür, təəqqül etsələr, onlara mə'lum olur ki, bir dövlətə tabe olalar, həm özləri asudə olurdular, həm başqa xalq onların azarından xilas olurdu və özləri özgəyə baxıb elmi-ədəb öyrənib tərəqqi tapardılar. Amma dövlətlər üçün iki məqam var: biri məqami-cəng ki, onun təklifi özgədir və biri məqami-sülh ki, ol vaxtda gərək hamı bir-birilə məhəbbət və doğruluq ilə rəftar etsinlər, ona binaən ki, insan məişət üçün bir-birinə möhtacdır, adamın işi adam ilə keçər və əgər doğruluq olmasa bir-birindən nəf'bərdar ola bilməz. İkinci, milləti qardaşlıqdır. Bunlar gərək ziyadə qardaşlıq mərasimin müraat edib məhəbbət, insaf və doğruluq ilə bir-birilə rəftar etsinlər, hansı ki, aciz və miskindir gərək əl-ələ vermək ilə dolandırmaq. Amma bizim camaatda pul qazanmaq elmləri az olduğuna varlımız az və bibəzaətimiz çoxdur və hamısının varlıdan bir növ çeşm-daşdı var. Lihaza az qardaşlar çox qardaşları dolandıra bilməz, ona binaən gərək varlılar insafı və varsızlar doğruluğu və insafı ortalığa qoyub, bir-birilə əl-ələ verib köməkləşib, dövlət qazanmaq təriqəsin tapmağa sə'y etsinlər, ta millət dövlətləri tərəqqi tapsın. Amma çifayda bizim varlı, varsız, hər kəs öz haqqına razı olmamağına binaən bir-birinə inanmır. Belədə işlər yerdə qalır.

Bunun illəti odur ki, bizim müəllimlər tüfuliyyətdə elmi-ədəb, elmi-süluk, elmi-xəvas, əşyayi-pəndiyyat və hikməti-qəvaid ilə tərbiyət etməyib, kitabi-Hafiz, Sə'di, Leyli-Məcnun, Yusif-Züleyxa və

---

[1] Növbənöv yaxşılıqlar və xeyirli işlər.

hətta Qaani oxudub elmi-kəmal əvəzinə eşqbazlıq, cür’əkeşlik, həzliyyat elmləri örgədirlər. İnsafən bizim xalq ziyadə bahuşdur ki, elmi-tərbiyət görməmək ilə genə belə dolanır. Yaxşı olurdu ki, ol kitablar ki, həqiqətdə kütübi-zəlaldır, mövquf olub özgə qism kitab, elmi-ədəblər bina edib, ətfala tə’lim edə idilər. Bu məratibdə ziyadə danışıq var, bu məktubda küncayiş olmaz. Amma, milləti qardaşlar, bilin ki, körpü sudan uzaq qalıb. Necə ki, sabiq ərz oldu, əql itib hər kəs bir təriq ilə özünə çıxıb: həmçinin kəmal da itib hər kəs özünə çıxır. Filhəza gələn fəsil kəmal və əhli-kəmalın vəsfində ərz olacaq.

*Əhsənül-Qəvaid*

* * *

P e t r o v s k i d ə n. Petrovskidə və tamam Dağıstanda bu il qarın və soyuğun şiddəti bir qayətə yetişdi ki, çox yaşamış və müəmmər adamlar onun mislin görməkdən haşa elədilər. Petrovski şəhərinin kənarında 2 saat külək olduğu səbəbilə 12 adam tələf oldu. Neçə gün meşə yolu bağlandı. Bə’zi əşxas ki, odun tədarük eləməmişdilər, evlərinin taxtaların pozub yandırdılar. Unun pudu bir həftə içində 75 qəpikdən 1 manat 20 qəpiyə tərəqqi elədi. Bu soyuqda bir gecə Petrovski bazarında yəhudilərin balaqanları və dükanları ki, taxtadan qayırmışdılar ki, od tutub bir neçə dükan yandı. Bə’zi adamlar odun közü baqi olduğu qədər öz evlərinə qayıtmazdılar.

*Heydəri*

## TƏZƏ XƏBƏRLƏR

Cənab sərdarın övrəti bina elədiyi latara bu fevral ayının 13-də Tiflis şəhərində oynayıb və udan biletlərin nömrələri qubernatorların dəftərxanalarına göndərilib. Hər kəsin bileti var isə, gedib oradan xəbər bilsin ki, onun bileti udubdurmu?

* * *

Fevralın 8-dən Daşkənddən tel var ki, rus əsgərləri Kokan şəhərinə daxil olub, Nəsrəddin xanı və Abtavabaşıçını tutub Rusiyaya göndərib və qeyri sərkərdələri dustaq ediblər. General-qubernator özü Kokana gedir ki, oranın işlərinə sərəncam versin.

Daşkənd şəhərində türk dilində çap olunan “Türküstan vilayətinin qəzeti”ndə elmi-əbdan hədisinin barəsində mübahisə başlanıb.

* * *

Kənd əhli üçün qərz pul tapmaq çətin olduğuna Avropa vilayətlərində hər kənd ya bir neçə kənd birləşib hər bir xahiş edən evdən qərarlanmış məbləğ cəm edib kənd bankı bina edirlər. Bankı intixab olan kəslər dolandırıb onun calislərinə qərz verib, hər ildə məbləğin sələmini calislərə paylayırlar.

* * *

Rusiyada torpaq kənd əhlinin camaatına təəllüq olduğuna bə’zi kəndlərdə camaat əkin-biçini bir yerdə edib, sonra məhsulatı bölürlər. Camaatın belə birləşməyinin bir xeyri də odur ki, elm yolu ilə tə’mir olunmuş əsbabları gətirib işlətmək asan olur.

* * *

“Moskovskiye vedomosti” qəzeti yazır ki, boyağ vəfat etdiyinə Dərbənd əhli bitavana olub. Ona binaən danışıq var ki, Samur çayından Dərbəndin ətrafına arx aparsınlar ki, onlar əkin və ziraət edə bilsin.

* * *

“Tiflisski vestnik” qəzeti yazır ki, Zəkərtəla şəhərində 50 min manat qədər məbləğ cəm olunub ki, ətraf kəndlər üçün bank açılsın.

* * *

Berlin şəhərində qulluqçular üçün məktəbxana açılıb ki, onlar paltar tikməyi, yumağı, biçməyi və xörək bişirməyi öyrənirlər.

* * *

Qədim zamandan bəri Bağdad tərəfində göyərçinləri poşt yerinə işlədirlər. İndi Avropa əhli hər bir qalada göyərçin poştu bina ediblər, ona binaən ki, cəng vaxtında belə poşt işlətməyə mane yoxdur.

* * *

2-ci nömrədə yazılmışdı dünyada 1034434000 insan var, o cümlədən 17300000 müsəlman, amma gərək yazılaydı 10344340000 insan var, o cümlədən 173000000 [müsəlman].

* * *

1875-ci sənədə Rusiyada 25 min 9 yüz həştad yanğı olub. Onun 9 yüzü ildırım düşməkdən, 3 min 6 yüzü qəsd ilə odlamaqda n, 6 min 8 yüzü qəsd olmaya odlamaqdan və artıq qalanının səbəbi mə'lum olmayıb. Ol yanğılardan 3 min 5 yüzdən olan zərər mə'lum deyil; amma başqalarından 64 milyon 96 min manat zərər olub.

* * *

Fevralın 22-dən İstanbuldan tel var ki, həzrət Soltan Bosni və Qerdseqovinə əhlini iki il təhmilatdan azad edib.

* * *

Qəzetlərdə yazırlar ki, Andraşinin sülhnaməsinin məzmunu Vyana şəhərinin qəzetlərində basılan günü cənab xədivi-Misir təvəqqə elədiyinə o sülhnaməni tel ilə ona mə'lum ediblər. O tel olub 3 min 8 yüz söz və qiyməti 2 min 2 yüz manat.

* * *

Firəngistanın İvrar şəhərində bir naxoş olub ki, 128 gün yuxuda qalıb. Çünki insan o qədər xörəksiz qala bilməz, ona binaən onun ağzına düdük salıb, düdüyə xörəyi töküb onun mə'dəsinə aparırlar imiş.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*İkinci sənə* *İki həftəlik qəzet*

*Fi 1 rəbiüləvvəl,*
*sənə 1293*

* * *

*Poşt xərci*
*qəzet basdıran elədir*

* * *

*Düşənbə*



*Fi 15 mart Rusiya,*
*sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı –*
*1 manat 50 qəpik*

* * *

*Beşinci nömrə*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

3-cü nömrə ilə belə təzə dadistəd qərardadının müxtəsər məzmununu göndərdik. Amma hər tərəfdən bizə yazırlar ki, onlar ilə ol məzmuna müvafiq rəftar olunmur. Məsələn, deyirlər ki, amildən şəhər pulu istəyirlər.

Çünki hər bir qanunda ismən demək olmaz ki, filan şey belə olsun, ona binaən qanuna əməl edən kəslər hər biri öz qüvvəsinə müvafiq onu anlayıb iş görürlər. Bizim Badkubə quberniyasında ol qanunu nə tövr anlayıblar, yazıb bəyan etmişik və əgər qeyr yerlərdə onu qeyr tövr anlayır isələr, bizdə taxsır yoxdur.

## DAXİLİYYƏ

İstanbul şəhərində Məhəmməd Tahir İrani fars dilində "Əxtər" adlı bir qəzet çıxardır ki, onun e'lamnaməsini aşağıda çap elədirik:

"Əxtər" dər İstanbul dər xanvalidə dər mətbəeyi-məxsuseyi-xud təb' və müntəşir mişəvəd. Bəcüz əz-ruzhayi-cüm'ə və yekşənbə hər ruz birun miayəd. Əzəxbari-yövmiyyeyi-İslambul və sair məmaliki-Osmaniyə xəbərhayi-Firəngistan və Hindistan və məmaliki-məhruseyi-İran və digər məmaliki-Şərqiyyə minəvisəd. Və niz əxbari-dövləti və politiki və ülum və fünun və ədəbiyyat və bə'z ümuri-ticarəti və sərrafiyə və həvadisi-nafiə və ümumiyyəra came mibaşəd. Kəsani ki talibi-in qazet başənd, mitəvanənd bəvəkil və ajentin in karialişan iftixarül Hacağa

(Hacı Rəhim) taciri-irani sakini-darüssüruri-Tiflis dər-sarayi Xələtov xəbər bedəhəd. Və qiyməti salyaneyi-onra bəqərari-tə’rifeyi-zeyl rəsanidə və qəbahayi-məxsusi-onra ki, bəmöhr və imzayi-idarə dər-nəzdi-xeyrül-hac müşarileyh əmanətəst dəryaft darənd. Və müstəqimən həftə behəftə nüsxəhayi-”Əxtər”ra əzpostxaneyi-rus ki, baidarəhayi-ma müqavilə və qərardad darəd təhvil bəgirəd bəonki puli-post və qeyrə bədəhəd. Və qeyrə əzin həm əgər kəsi bəxahəd, yeksər bətəvəssüti-post bəmüdiri-”Əxtər” benəvised və qazet bəxahəd baz həftə behəftə bərayi-u fürustadə mişəvəd. Dər-bə’z məmaliki-Qafqaziyyə həm bə’d əzin vəkilha müəyyən xahəd şüd ki, əsamiyi-onhara həm dər sani ittila xahim dad.

T ə’ r i f ə. Qiyməti-salyaneyi-“Əxtər” dər-məmaliki-Rusiyyə əsl qiyməti salyaneyi-on yazdəh manat və nimpuli-əskinas. İcrəti-posti-yeksalə həşt manat və nim gəzlək. Cəm’ən bəinzimami-icrəti-post mişəvəd. Dər-ərzi-sali bərayi 252 nüsxə bist ədəd manat kağəzi.

Sahibi-imtiyazi-”Əxtər” *Məhəmməd Tahir*

Əgərçi İstanbul şəhərində müsəlmanlar üçün çox qəzet çap olunur, amma onlar Osmanlı dilində olduğuna bizim üçün elə ləzzət eləməz, lakin “Əxtər” qəzeti fars dilində çap olunduğuna və fars dili bizim vilayətlərdə çox işləndiyinə ümidvarıq ki, onu bizim tərəflərə gətirdən çox ola. Əgər qeyr məmləkətlərin sakinləri “Əxtər” qəzetin gətirtmək istəyələr, onlara məsləhət edirik ki, onu bir baş İstanbuldan gətirtsinlər.

## ƏKİN VƏ ZİRAƏT XƏBƏRLƏRİ

Siçan insana zərər edən heyvandır. Onun 4 qabaq dişləri çox tez uzandığına siçan gərək onları sürtüb gödəltsin ki, onlar uzanıb onun ağzını tutmasınlar. Ona binaən onun zikr olan dişləri uzanan zaman hər bir şey ona rast gəlsə onu çeynəmək ilə dişlərini gödəldib itiləyirlər. Bu səbəblərə xalq ona kəsəyən deyir. Siçan ildə 4-5 dəfə və hər səfər 8-dən 13-cən doğur və onun balaları bir neçə aydan sonra özləri də doğurlar. Belə olan surətdə onun düşməni çox isə də, ziyadə artıban indi tamam dünyanı tutub.

Siçan yerin hər bir tərəfində ola bilir. Onun üçün dağ ya düz, soyuq ya isti tərəf birdir. Hər yerdə siçan insana mehmandır. Bizim evlərimiz

və ambarlarımız onun üzünə açıqdır. Xülasə, siçan insanın dalınca öz kölgəsi gedən kimi gedib. İndi hətta cəzirələrdə həm ona mehman olubdur. Siçanın zərəri bizim ambarlarımızda nə qədər ziyadə olsa, elə mə'lum etməz. Ona binaən ki, ambarı olan kəs tavanalı olduğuna onun zərərini görməz. Amma vay kənd əhlinin halına ki, onların əkininə siçan düşə! Həzar müsibət ilə əkinçi taxılı yetirib, onun bəhrəsini gözləyən zaman siçan onun əməyini zay edib, taxıl tələf edib onu gözüyaşlı qoyur. Və əgər bir il belə taxılı tələf olmaq ilə ondan xilas olseydi, xoşbəxt olur idi. Amma siçan taxılı yeyən zaman ondan özünə qış üçün azuqə saxlayıb ilbəil artıb dəxi ziyadə zərər edər. Bu səbəblərə binaən bir yerə siçan düşəndə onu qırıb tələf etmək gərək. Siçanı belə tələf etmək olur:

Əvvələn, siçan düşən yerə qoyun, mal sürülərini çıxardıb ol yeri taptadmaq ilə. Çünki günorta vaxtı siçan öz dəməyində olur, ona binaən ol zaman mallar yeri tapdalamaqdan dəməklərin deşikləri tutulduğuna siçanın nəfəsi darıxıb boğulub tələf olur. Amma lazımdır ki, mal çox olsun, onlar gəzəndə sıx, yə'ni bir-birinə yavıq gəzsinlər ki, dəməklərin tamam deşiklərini tutsunlar. Zikr olan qayda ilə 4-5 gün ol yeri tapdadanda siçan tələf olur.

Saniyən, siçan bərk yerdə məskən edir ki, onun dəməyinin qıraqları uçub onu incitməsin. Ona binaən payızın axırında belə yeri dərin şuxm edəndə ol yer narınladığına siçan çıxıb qeyri yerə gedir. Və əgər getməsə də, belə narın yerə yağış və qar suyu ziyadə daxil olduğuna siçan nəmişlikdən tələf olur.

Salisən, əkin yerində quyu qazmaq ilə ki, onların dərini bir arşın və qıraqları dik ola, belə quyunu hər 30-40 arşında birisini qazıb, onun qıraqlarını daş ilə döyüb bərkidmək gərək. Ya quyuların əvəzində zikr olan qayda ilə ol yerə iki şirli qalğalar, yə'ni bəstilər basdırmaq ilə ki, onların da dərini bir arşınacan və ağzı yerin üzü ilə bərabər ola. Zikr olan qalğalara və quyulara bir az piy ya qeyr iy siçana xoş gələn şey qoyulsa, dəxi yaxşıdır. Onlara düşən siçanlar bir-birilə dava edib, bir-birini yediklərinə həftədə bir gedib onlardan sümükləri çıxarıb təmizləmək gərək.

Rabiən, siçan dəməyinin deşiklərini bərk torpaqlayıb bir deşikdən dəməyi tüstü ilə doldurub onları tələf etmək olur. Bir kasa kimi dəmir ya mis qabın bir böyrünə bir kiçik körük və o biri tərəfinə bir düdük möhkəm edib düdüyü deşiyə salıb kasanın içində əsgi ya qeyr şeylər və bir az kükürd yandırıb körüyü basanda yanan şeylərin tüstüsü də-

məyə daxil olur, sonra ol deşiyi də tutanda siçanlar boğulub tələf olurlar və əgər sabahısı günü bir neçə deşik açılmış isə, mə'lum olur ki, bə'zi siçan sağ qalıb. Ona binaən onları da zikr olan qayda ilə boğmaq gərək. Habelə siçanları suya basdırıb tələf etmək olur.

Xamisən, bə'zi heyvanat, məsələn, quşlardan yapalaq, bayquş, süd əmən heyvanatdan pişik, tülkü və kirpi siçanı yeyib tələf elədiyinə, Avropa kəndlərində onları siçan düşən yerdə saxlayırlar. Məsələn, yapalaq üçün ağac başında yuva qururlar. Deyirlər ki, hər yapalaq bir oturuma 40 siçan yeyir.

Zikr olan qaydalardan savayı siçanları mərgəmuş və ya qeyr zəhərlər ilə zəhərləyib tələf etmək olur. Amma sərhesab olmaq gərək ki, qeyr heyvanat zəhərlənməsin və bir də qarğaduzunu bişirib, un kimi əzib ərimiş piyə qarışdırıb, siçan deşiklərinə salıb, bir qabda su qoyanda siçanlar onu yeyib, su içəndə qarğaduzu onların mə'dəsində daşa dönüb onları həlak edir.

## MƏKTUBAT

Badkubəli molla cənabları elmi-əbdan sualında mətləbi-salisi belə bəyan buyurublar: nəf' və zərər edən şeylər və lazım olan əmrlər ya insanın öz təcrübəsi ilə olur və ya həkimi-haziq ila-axir.

Əvvələn, bu məqbuledən belə mə'lumdur ki, cənab ağa məhz tibb elmin mənzur buyurublar ki, təcrübə ilə müalicəni xilaf və həkimi-haziq rə'yinin mütabeətin cavab və xoşbəxtlik hesab ediblər. Haşa ki, məhz murad bu elm olmuş ola ki, belə surətdə laməhalə üləmanın tibb elmindən filcümlə vaqif olmaları lazım olurdu.

Saniyən, ayati-Quran və əhadisi-qüdsi əlfazın kəlli-münnasa əla qədəri üqulihim1 babətindən məqamına görə mə'na olmasa və bir müddəi irad tutsa ki, sizin ayat və əhadisin ləfzi mə'naları bir-birinin ziddi və xilafıdır, nə cavab vermək olur. Pəs lazım gəlir ki, əlfazın mə'na və muradın anlayıb bəyan eləmək.

Salisən, təcrübə və nəf' və zərər edən şeylər biduni-əql payeyi-nöqsandadır və əql biduni-elm və cəvahir kimidir ki, pak və təraş olmamış heç bir qədrü qiymət onunçün müəyyən deyil, ona binaən adabi-elmə baliğ olmayan əqldən bir səmər, bir vəzə gəlməz. Pəs nəf'

---

[1] Hərəni öz ağlına görə danışdırın.

və zərər edən şeyləri elmi-əbdan hikmətin anlamamış bilmək qeyr mümkündür.

Rabiən, biz müsəlman tayfasının bədbəxtliyinə bundan ziyadə nə dəlil ki, qədim zamanda hikmətdən xəbərdar olan padşahlar öz dövlətlərinə tərəqqi verməkdən ötrü bə'zi təvaif qeyr mətbuəyə karxana və maşın və bunalara münasib əməlləri dürüst eləməyə mən' eləyir idilər ki, onlar öz məhsulatın götürüb, ol padşahın öz dövlətində olan karxanalara satıb və haman malın təmiz olmuşun iki başa kirayə verib dala qaytarsınlar. Amma bizlər öz ixtiyarımız ilə o əmrləri bina eləməkdən uzaq qaçırıq.

Kücast əhli-dili ta künə dəlaləti-xeyir –
Ki ma bədust nəbordim rəh, behiç təriq[1].

Baqisi yazılacaq

*Heydəri*

* * *

7-c i f ə s i l. Əvvələn cəmi məratibi-kəmalata yetişməyin dəlili əql yolu, elm körpüsü, doğruluqdur. Əz hər çe talib küni şəb və ruz əvvəl rəhi-elm və sidq amuz[2].

Salisən, kəmal ibarətdir o elmi-əməldən ki, onun millət, dövlət üçün bir faydası ola. Hər elmin faydasına qədər mərtəbeyi-kəmali mülahizə olunur, xah qovlü, xah fe'li və söz kəmalın kilididir. Kəlmeyi-daniş və hikmət daneyi-cəvahirdən mərğub və qiymətlidir.

**R ü b a i:**

Hikmətin kəlməsinin qiymətini gər bilələr.
Min ilin gövhəridir, hər birinin qiyməti var.
Sözlərin canına lütf ilə əgər fikr edələr,
Hər sözün bir canı yox, bəlkə onun min canı var.

Çün nəzmdə bir növ məlahət olduğuna əhli-daniş deyiblər əşşe'r fil-kəlam kəlmilhi fit təam[3] nəinki batil və bihudə sözlərdən kitablar

---

[1] Biz dostluğa heç cürə yol tapa bilmədiyimiz halda, hanı elə bir qayğıkeş adam ki, xeyir işlərə yol göstərə.

[2] Gecə-gündüz nə istəyirsənsə əvvəl elm və düzlük yolunu öyrən.

[3] Kəlamda şeir, xörəkdə duz kimidir.

yazıla və çap olub ətfal və cühhal əlinə düşə, hər laübalı adam pər-puç sözləri bir-birinə toxuyub birin mədh, birin həcv, şərab və əmrədləri vəsf etmək ilə adın sahib-kəmal və həkim qoyub minaət xərcə versin, haşa və kəlla belə adam sahib-kəmal olmaz, bəlkə müin və ləşkəri-şeytan olub xalqı gümrah edər. Yaxşı olurdu bu əş'ar əvəzinə bez toxuyub bir növ əhli-elm və kəmal hesab oleydilər, ya pinəduzluq öyrənib bir qardaşın başmağı yırtılanda pinə edəydilər. Bu mətləbdə söz çoxdur. Bu fəsil əşşüəra yəttəbiü hüm elğavun[1] ayəsinə iktifa edək.

Qərəz, ümdeyi-kəmalat ülumi-səltənət və əmri-nəhydir ki, millət, dövlətin ümuratının ümdə pişrəft və rövnəqi bu iki növ ülum illədir. Habelə ümdə əhli-kəmal bu iki qism ülumun alim və amilləridirlər ki, xalqı dolandırmaq zimamı bunlar ilədir. Gərək bunlar hər biri öz elminə müqərrər olan ümuratı qanun və qəvaidi-ədalət ilə möhkəm və müntəzim edə və o birinin əməlinə ixtilal etməyə ki, bədən zəif olduqca ruh qüvvətdən düşər. Lazımdır ruh və bədən məən ola, ta vücud salim və qəvi ola. Hərçənd ruh və bədən əlahiddə deyilir, amma həqiqətdə birdirlər. Pəs həzrətin bu kəlami-mö'cüznizamında iki növ əql və iki növ elm buyurmağından belə məfhum olur ki, millət üçün iki növ hakim lazımdır: biri məaşi-əbdana lazım olan ümurata rövnəq və sərəncam versin, biri dini-məada lazım olan üluma rövnəq versin və illa əql bir şeydir, həmçinin elm bir şeydir. Belə ki, sabiqən əql üçün neçə məsəl ərz oldu, biri su idi, necə ki, hər qism nəbatata sərf edələr, onu öz xasiyyətində həddi-kəmala yetirir. Habelə əqli hər bir elmə sərf edələr onu həddi-kəmala yetirir, necə ki su bir şeydir məhəlli-sərfinə binaən adlanır, məsələn, bağın ya bostanın suyu, ya dəyirmanın suyu qis əla haza[2], pəs əqli-məaş və əqli-məad həm bu qəbildir və elm genə bir şeydir. Elmin mə'nası bilməkdir. Hər əməli öyrənməkdə təhsil olmuş ola onilə adlanır. Məsələn, elmi-rəyasət və ticarət və sənaət və ziraət və qis əla haza. Elmi-əbdan və ədyan, amma əqli-məaş müqəddəm buyurmağın dəlili vazöhdir ki, əvvəl məaş gərək fərahəm ola ki, məaş yol və körpü və məzrəədir məad üçün, həmçinin əbdani-alət və mərkəbdir ədyan üçün. Dinin səbatı bədən ilədir. Din biduni-bədəni-məad, biduni-məaş surətpəzir olmaz.

Gələn fəsil mə'niyi-dövlətdə ərz olacaq

*Əhsənül-Qəvaid*

---

[1] Ancaq yolunu azmış adamlar şairlərin ardınca gedərlər.
[2] Buna binaən müqayisə et.

## TƏZƏ XƏBƏR

Əlahəzrət Fərhad Mirzə Mö'təmədüddövlə Məkkə ziyarətindən qayıdıb sabah İrana gedəcək.

* * *

Cənab Sərdarın dəftərxanasından qubernatorlara yazırlar ki, Məkkəyə gedən müsəlmanlara mə'lum eləsinlər öz pasportlarını Osmanlı konsuluna pişnəhad etməmiş sərhəddən keçsinlər ki, onlara Osmanlı dövləti təzə qaydaya binaən mane olur. Bu ayın 2-də "Pravitelsvenni vestnik" qəzetində yazılıb ki, padşahi-imperator hökm edib Kokan xanlığını Rusiyaya tabe hesab edib, onu Fərğan oblastı adlasınlar və general Skoblev oraya hakim tə'yin olub.

İndi Rusiyanın sərhəddi Qaşqar dövlətinə yetişib.

* * *

Qəzetlərdə yazırlar ki, ingilis Əfqanıstanı ki, Hindistan ilə İranın sərhəddində vaqedir, əldə saxlamaqdan ötrü oranın hakimi Şirəliyə məvacib verir imiş. Amma cənab Şirəli bir inigilis kitabından bilib ki, ingilisin muradı onun Herat şəhərini zəbt etməkdir. Ona binaən indi ingilisə düşmən olubdur.

* * *

Misir ilə Həbəş dövlətinin cəngi hələ qurtarmayıb. Yazırlar ki, bu yavıq zamanda Misir əsgərləri həbəşlərə qalib olublar.

* * *

Təzə çap olunan Rusiyanın pambıqdan qayrılan mallarını satmaqdan danışan kitab deyir: Rusiyanın pambıq malı ilbəil az satılır. Ona səbəb oldur ki, dəmiryolları artdığına Avropa dövlətlərinin malı bizim mal satmağa mane olur. Bu səbəbə bir neçə ildir ki, fabrika sahibləri öz mallarını Çin və Japon dövlətlərinə göndərirlər. Amma indi Avropa malı orada həm onlara mane olur.

Bu halda zikr olan rus malları yaxşı satılır Türküstanda, Kokanda, Buxarada, Qaşqarda, Dəşti-Qırğızda. Ona binaən ki, oralara atəş gəmiləri və dəmiryol işləmədiyinə qeyr tayfaların malı ona mane ola bilmir.

* * *

"Moskovski vedomosti" qəzeti yazır ki, dövlət məsləhətxanasında məşvərət var taxsırkarları Sibirə göndərməsinlər.

Deyirlər hər vilayətdə bir dustaqxana bina olunacaq ki, taxsırkarları orada saxlasınlar.

* * *

Rus qəzetlərində yazırlar ki, martın axırında vəliəhdi-İran Peterburqa gəlib, sonra Avropa səyahətinə gedəcək.

* * *

"Uralski vedomosti" qəzeti yazır ki, Ural kazaklarından 87 adam dövlət qərar edən əsgər tutmaq qanununa əməl etmədiklərinə onları tutub Türküstanda dövlət tərəfindən müəyyən olan yerlərə sakin olmağa göndəriblər.

* * *

Peterburqdan tel var ki, Rusiyanın Hacıtərxan, Samar və Tambov quberniyalarından çox adam xahiş edir ki, dövlət Türküstanda verdiyi yerlərdə gedib sakin olsunlar.

* * *

1876-cı sənədə Rusiya dəmiryollarının tuli 17000 verst olub. Ol yolların hər versti bir ilin müddətində 8000 manat mədaxil gətirib.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*İkinci sənə* | *İki həftəlik qəzet*

*Fi 15 rəbiüləvvəl, sənə 1293*

* * *

*Poşt xərci qəzet basdıran ilədir*

* * *

*Düşənbə günü*




*Fi 29 mart Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*Altıncı nömrə*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## DAXİLİYYƏ

Bir dəfə yazmışdıq ki, hər bir qəzetin ümdə muradı mübahisədir ki, aqil kəslər bir-birilə mübahisə edib işləri xalqa bəyan etsinlər. Bu əsnada cənab Heydəri elmi-əbdan hədisinin mübahisəsi başlanmağa bais oldu. Çünki elmi-əbdan hədisinin əsli mə'nası mə'lum və aşkardır, ona binaən zikr olan mübahisənin ümdə muradı bizim elmi-əbdandan bixəbər qalmağımızın səbəblərini bəyan edib onun əlacını xalqa aşkar etmək idi. Bu səbəbə 12-ci nömrədə aqil kəslərdən sual elədik ki, o elmləri kimdən öyrənək ki, biz də tərəqqi edib payimal olmayaq? Amma indiyəcən ol suala heç bir cavab yazan yoxdur ki, guya bizim sual ol mübahisəyə daxil deyil imiş.

Necə ki bir imarət tə'mir etmək istəyən onun üçün yer alıb orada olan tə'miratları dağıdıb daş və kəsək gətirib oraya tökdürüb, sonra imarəti tikdirmək istəməyəndə ol yer ondan dəxi artıcaq xarab olur, habelə bizim elmi-əbdan bəhsi. Biz o elmlərdən bixəbər olmağımızı xalqa bəyan edib və əgər indi onun əlacının dalısıycan olmayaq işlər dəxi artıcaq xarab olacaqdır.

Pəs biz lazım bilirik bu barədə öz təsəvvürümüzü yazıb bizim aqil kəslərdən iltimas edək ki, hər bir kəs onun yaxşı və yamanlığını qəzetdə bəyan etsin. Bir neçə ildir ki, Osmanlı dövləti məktəbxanalar açıb hər bir elmi öz dillərində xalqa öyrədir. Çünki onların kitablarını bizim adam oxumaq çətindir, ona binaən yaxşı olurdu ki, bizim millət

qeyrəti çəkən qardaşlar bir icma bina edib, ol kitablardan gətirib, bir az dəyişdirib, çapxana açıb öz dilimizdə çap elədib, xalqa müftə, ya bir az qiymətə paylasın ki, bizim məktəbxanalarda şair kitablarının əvəzində ol kitablar oxunsun.

Əlbəttə, bizim şair kitabları oxudan müəllimləri birdən elm kitabları oxudan etmək olmaz. Amma ümidvarıq ki, işin binası qoyulsa, mürur ilə yerisin. Elm kitablarımız olsa, onları oxurlar və necə ki, su damcı-damcı düşmək ilə daşı deşər, habelə ol kitabları oxumaqdan elm və ədəb mürur ilə xalqın könlündə nəqş bağlayıb möhkəmlənər.

Bu halda elmi-əbdandan bixəbər olduğumuza bir qeyr çarə bilməyib, bu təsəvvürü yazıb anlayan müsəlmanlarımıza mə'lum edirik ki, millət təəssübünə görə əlacpəzir olsunlar.

## ƏKİN VƏ ZİRAƏT XƏBƏRLƏRİ

Hər bir heyvanatın xasiyyəti və bədəninin naqis, ya tamamlığı onun övladında olur. Ona binaən ingilis və qeyr Avropa maldarları sə'y edib, öz mallarını yaxşılandırıblar. Məsələn, mə'lumdur ki, heyvanın ayaqları qısa olduqcan yavaş yeriyir və belə ağır tərpənən mal tez kökəlir. Ona binaən kök mal istəyən kəslər o malların ayaqları qısalarını seçib onların balalarından ayaqları çox qısa olanını saxlayıb, qeyrlərini tələf edib, bu minval ilə bir qərinədən sonra ayaqları çox qısa və özü tez kökələn mal əmələ gətiriblər. Məsələn, ingilis donquzu ki, kökələndə heç tərpənə bilməz. Həmçinin mə'lumdur ki, qara malın qabaq tərəfi, yə'ni başı, boynu və döşü iri olduqcan gücü, dal tərəfi, yə'ni budları və əmcəkləri yekə olduqcan südü və tamam bədəni bərabər canlı olduqcan əti ziyadə olur. Ona binaən bir neçə qism mal əmələ gətiriblər ki, məsələn, süd malının südü, ya ət malının əti birə beş qeyr qism malların südündən və ətindən ziyadə olur. Əlbəttə, belə malları ə'lalandırmaq çətin deyil, ancaq zəhmət istər. Məsələn, süd üçün mal saxlayan aşağıda zikr olan nişanlar ilə süd mallarını cəm edib, onların balalarından ziyadə südlü olanını saxlayıb, qeyrlərini tələf etsə, bir qərinədən sonra çox ə'la mal əmələ gələr. Həmçinin malları bir qeyr tövr ilə yaxşılandırmaq mümkündür. Necə ki, yaxşı ayqırı ilxıya qoşanda ilxı mürur ilə yaxşılanır, habelə qeyr məmləkətlərdə ə'lalanmış malın kəllərini sürüyə qoşanda ondan sürü yaxşılanır. Belə ə'lalanmış malı Avropa vilayətlərində və hətta bizim Tiflis şəhərində də satırlar.

Südlü malın nişanı budur: başı kiçik, boynu və buynuzları nazik, döşü ensiz, qarnı yekə və girdə, sağrısı canlı, quyruğu nazik və uzun, əmcəyi yekə, amma onun başları miyanə, ayaqlarının hündürlüyü miyanə və onların aşağı bəndi nazik, tükləri nazik və yumşaq olur. Onlardan savayı süd aynası ki, malın dal ayaqlarının gerisində tüklər tərsinə, yə'ni meyli yuxarı bitən yerə deyirlər, böyük və onun tükləri yumşaq və yağlı kimi olur. Əmcəklərin üstündə qan damarları çox olur.

Zikr olan nişanlardan savayı maldar gərək onun südlü olmağın imtahan etsin. Mal üç doğanacan onun südü mə'lum olmaz. Südü bir qabda saxlayıb onun qaymağının qədərini bilmək gərək. Ona binaən ki, bə'zi malın südü duru olduğuna çox görünür, amma yağı az olur.

## MƏKTUBAT

8-c i f ə s i l. Keçən fəsildə və'də elədiyimiz mətləb tul əncam idi və mənzur bu idi ki, ondan sonra mə'niyi-şəriətdə və xəzanədə danışıb, ta əvvəlinci fəsildə zikr olan məvanei bəyan edək. Vəli bu mətləb özü də məvane peyda edib, qaldı. Behər təqdir əz-cümleyi ülumikəmaliyyə ülumi-ziraətdir və ziraət həmin arpa, buğda deyil. Hər bir şey ki, yerdən əmələ gəlir ziraətə daxildir. Məsələn, ipək baraması.

12 ildir ki, Qafqaz, Gilan və Mazandaran yerlərində barama olmur. Ona binaən xalq pərişan olub. Ələlxüsus Gilan əhli ki, onların naləsi aləmi tutub. Zarelər və tüccarlar əldən düşüb. Hərgah bizim əhldə ülumi-ziraət olseydi, bu ərzi-müddətdə elm üzündən ya onun çarəsin tapmışdılar, ya imtahanat və təcrübat ilə bir qeyr ziraət əmələ gətirərdilər. Məsələn, qənd xalq üçün xörək olub xah qəni, xah fəqir və bu qədər qənd ki, məmaliki-İrana gəlib əvəzinə pul gedir, hamısı Firəngistanın bir quberniyasında əmələ gəlir ki, Marsel olsun, beibarətimüsəlmani bir valinişin yerdir və çuğundur, yə'ni zılx suyundan qayırırlar. Bebin təfavüti rəh əz kücast ta bekuca[1]. Onlar çuğundur suyun belə əmələ gətirirlər, amma Mazandaran mahalında neyi-şəkərdən bir zad qayırırlar ki, adam onun rəng-buyindən birəğbət olur. Gər gəda kahil bəvəd təqsiri-sahibxanə çist?[1] Pəs bə'd əz on ki, elm olmadı əməlin təqsiri nədir? Əməl mövqufdur əməl edənin elminə. Əgər on-

[1] Bax gör, yolun fərqi haradan haraya qədərdir.

ların elmi olaydı onun çarəsin edərdilər ki, qənd öz məmləkətlərində əmələ gəlsin. Həm xalqa güzəran yolu açardı, həm bu qədər pul məmləkəti-xariciyə getməz idi. İldə nə qədər hər adamın xərcinə təfavüt edərdi və ticarət əmri də rövnəq tapardı. Məsələn, bu halda firəng qəndi Badkubədə 5 manat və rus qəndi 8 manatdır. Firəng qəndinin hər puduna 3 manat 20 qəpik gömrük məsarifi olduğuna Qafqaz vilayətində firəng qəndi sərf etmir, amma İrana aparmağa rus qəndi sərf etmədiyinə, firəng qəndi aparıllar. Əlbəttə, Firəngistanda 2 manat yarımadır ki, Badkubəyə gətirib 5 manata satırlar. Pəs Firəngistanda hər bir mə'kulatın bahalığı ilə və əməlinin icrətinin ziyadəliyi ilə, məsələn, 2 manat yarım olanda, əlbəttə, fabrika sahibləri genə nəf' edirlər. Pəs bizim yerlərdə mə'kulat və əmələ ucuz olduğuna gərək dəxi qənd ucuzraq əmələ gələ. Bunlar təfəkkür istər.

C a v a b. Filankəs, guya sənin xəbərin yoxdur ki, Mazandaranın Barfərş şəhərində qənd fabrikası bina elədilər, amma zərərinə binaən mövquf oldu. Bəli, yaxşı xəbərim var ki, onun mübaşiri əvvəl Hacı Mirzə Məhəmməd Bərrar taciri-Təbrizi və sonra Hacı Yə'qub taciri-Kaşani idi. Onun mövquf olmağına necə səbəb oldu ki, onların birisi aləmi xərab edər, əz on cümlə təkəbbür və nəxvət, bihesablıq və xəyanət, israf və təbzir. Hər kəs o əməli özü üçün mədaxil yolu bilib öz tərəfinə əxzü cərr etməyə məşğul oldu, belədə əlbəttə, iş əncam tapmaz.

Tovfiri-əməl budur ki, elm əhli əməli əncama yetirib ondan nəf'bərdar olur, amma əhli-eli olmayan əmələ qarışmamış əxzü cərr fikrində olub, əməli puç edir və özü də nəf'dən qalıb biabru və sərgərdan olur.

Ey qardaşlar, cəm olun elmə və sədaqətə, ta abad olasız, qaçın nəxvət və israfdan, xəyanət və bihesablıqdan, ta xərab olmayasız.

Gələn fəsil sənaətdən ərz olacaq.

*Əhsənül-Qəvaid*

* * *

Badkubəli molla elmi-əbdan bəhsində mətləbi-rabe'i belə bəyan edib: ərbabi-mə'rifət külli millətlər Məhəmmədül-mustafa peyğəmbərin sahibrə'yi-kamil olduğuna bahis deyillər ilaxirə.

---

[1] Əgər dilənçi tənbəldirsə, ev sahibinin təqsiri nədir?

Əvvələn, o şəxsi-sail həzrətin rə'yi-kamil olduğuna heç bir növ şəkk eləməz, bəlkə bu sualına binaən məqami-təsdiqdə olduğun ibraz edər. Əgər soruşsa ki, mən nə vaxt cənab peyğəmbər haqqında izhari-süstrə'ylik elədim ki, siz onun kamalın isbat etmək istəyirsiniz – cavabı nədir?

Saniyən, şəxsi-əvam əgər filməsəl, alim sözün anlamaya, ya xeyr, alim öz elminə əməl etməyə, əvvəlinci halda alimin və ikinci surətdə elmin nəqsi nədir?

Kütübi-şəriət ki, Qurani-məcidin şərhində müdəvvindir ehkami-ticarət və adabi-qəzavət və qeyr həm ki, bəyan olunubdur. Pəs cəmi nüqati-aləmdə islam ticarətinin səbəbi-tənəzzülü gərək nə olmuş ola. Qazilərin dürüst kirdarlığı öz insaflarına mühəvvəl olub. Ol xüsusda danışmaq bizlərə təklif deyil.

Rabiən əgər əhli-islamın şəriəti mücərrəd adət təməi-behişt və xofi-cəhənnəmə müxtəs olseydi, belə irad gətirmək məhz xilaf olardı və ona cavab bundan artıq ki, bizim ehkami-şəriətimiz belədir və şare'i-müqəddəs bizlərə belə hökm edibdir, bir şey lazım gəlməzdi və heç bundan mö'təbər cavab yox idi. Pəs sailin mənzuru oldur ki, bu vüs'əti-şəriətlə müsəlmanların qeyr tayfalardan geri qalmağına səbəb gərək nə olsun?

Baqisi yazılacaq.

* * *

Petrovski və Teymurxan-Şura Dağıstan mahalında təzə bina olunmuş şəhərlərdən hesab olunurlar və hər iki şəhərin dadistədi mövqufdur əsgər əhlinə.

Petrovskinin xoşməkanlığı ki, şərqi və şimali dərya, qərbi və cənubi səmti dağdır, bir havayi-məxsus vüs'əti-nəfəs üçün onda istişmam olur ki, bədənin və ruhun yüngül olmağına səbəb olur.

Ətrafın ə'yanı və əşrafı dərya suyuna çimməyə, qımıs, yə'ni at südü içməyə, Rusiya tərəfindən üzüm yeməyə buraya cəm olurlar.

Hər gün günortadan sonra ə'yan-əşraf şəhərin milli bağında nücəba üçün bina olan evdə rəqsə və təfrihi-damağa məşğul olurlar və dövləti muzıkaçılar hər gün camaatın xoşvaxtlığına məşğul olurlar.

Keçən yay Dağıstan nücəbasından Avar xanının bikəsi Şamxalın qızı öz mütəəlliqələri ilə ki, neçə nəfər Dağıstan uyezdlərinin xatunlarından idilər, hər gün bağa səyahətə çıxıb, camaatın nəzərində həddən artıq cilvələri var idi.

Petrovskinin iki verstliyində bir palçıq vardır ki, bə'zi naxoş üçün onun içində yatmağı həkimlər caiz bilirlər, amma Dağıstan əhli adət üzərilə xah naxoş, ya qeyri-naxoş ola, 10-15 köç və külfət ünas və zükur hər gün qız və gəlin faxir libaslar geyinib, Petrovskinin baş küçəsindən düşüb, saz və nağara çala-çala rəqs və toy ilə dəstə-dəstə zikr olan palçıq tərəfə gedirlər.

Petrovskinin 14 verstliyində isti su var ki, Dağıstan əhli o suda yatmağa çox gedib və mənfəətin iğraqi-tə'rif edər.

Şəhər əhlinin çoxu qulluq və əsgər əhlidir, tacir və sövdagər şəhər əhlindən çox azdır. Bilcümlə dadistəd edənləri Qafqaz və İran xalqıdırlar. Onların bə'zisi Dağıstan qızları alıb və xatunların öz adətləri ilə çadırşəbə büründürürlər.

Baqisi yazılacaq.

*Heydəri*

* * *

D ə r b ə n d d ə n. Bizim şəhərin xalqı ya tüccarlıq, ya sənətkarlıq və ya fəhləlik ilə güzəran edir. Ticarət əhlinin əvvəldən də tanqahi cüzvi olub. Onlar Rusiyadan mal gətirib onun bir hissəsini nəqdə və birisini nisyə satıb, nəqdini boyağa xərcləyib, mizanda ki, iyul ayı olsun, öz boyağını və nisyədən hasil olan boyağı cəm edib, Rusiyaya aparıb füruş edib edib mal gətirirdi. 3 ildir ki, nisyə xalqın üstə qalıb və nəqdi ki, boyaq idi qiymətdən düşüb. Ona binaən alış-veriş bilmərrə yatıb. Onların çoxu dükanların bağlayıb və bə'zi bir çotgə və özü qalıb, bilmir nə eləsin. İndi hər bir adam gərək təzədən dadistəd binasın qoysun, amma tanqahsız heç bir iş etmək mümkün deyil. Belədə camaat birləşib bang bina etsəydi, fəqir-füqəranın əlindən tutub onlara kömək edərdi. Amma çifayda bizim adam hər kəs öz başının fikrində olub, camaat üçün nəf' verən işlərdən bir tədbir və məsləhət eləmək əsla xəyallarına gəlmir. Pəs yaxşı olurdu ki, böyük olan hakimlər bizim şəhərdə bang tə'yin etmək sə'yində olaydılar ki, bizim tüccarlar bang köməyi ilə təzə dadistəd başlaya bilsinlər.

* * *

Dərbənddə təzə ildən miravoy sud bina olunub. Əgərçi boyaq dadistədinin ərizəçiliyi bilmərrə orada yoxdur, amma onunla belə ərizəçinin çoxluğundan cənab sudya təngə gəlib.

Şəhərimizin buçağacan nataryusu yoxdur, ona binaən çox məəttəllik çəkirik.

*Əlimədəd Abdullazadə*

## TƏZƏ XƏBƏRLƏR

Həzrət sərdarın dəftərxanasından Badkubə qubernatoruna yazıblar ki, Məkkəyə gedən müsəlmanlara mə'lum olsun İskəndəriyyə şəhərində olan Rusiya konsulu yazır ki, müsəlmanlar Məkkədən qayıdan zaman Cəddadən gəmiyə oturub İskəndəriyyəyə gəlirlər, amma oradan İstanbula gəmi olmadığına ləng olurlar. Ona binaən yaxşı olar ki, onlar Rus ya Avstriya və ya Xədifiyyə camaatının gəmisinə otursunlar ki, onlar birbaş İstanbula gedər.

Rusiya Kokanı zəbt edəndən sonra İngilis dövləti çox təşvişə düşüb istəyirlər, öz padşahlarına imperator desinlər ki, Asiya qit'əsinin sakinləri onları güclü hesab etsin. Onlar qorxur ki, Rus Türküstanı, Bilucistanı, Əfqanıstanı zəbt edib Hindistanı alsın. Amma Rus qəzetləri yazır ki, bizim qonşular qanun üzünə öz işlərinə məşğul olsa, onlar ilə işimiz yoxdur. Çünki Hindistanda İngilis qanunu işləyir, ona binaən oraya getmək bizim heç xəyalımıza gəlmir.

* * *

Peterburq qəzetlərində martın 2-də yazırlar ki, 2 aydan sonra ə'lahəzrət Şahənşahi-İran əsgər cəm' edib, Məşhədə türkmanlar ilə cəng etməyə gedəcək.

* * *

"Türküstan qəzeti"ndə yazırlar ki, Kokan xanlığı zəbt olandan sonra Abtavabaşçını və qeyr sərkərdələri tutub Rusiya göndəriblər. Və'dəsi tamam olan əsgər adamına izin olmayıb ki, evlərinə qayıtsınlar.

* * *

Misir əsgərləri Həbəş əsgərini pərakəndə edib, amma İngilisin məsləhətinə binaən Zəngibar yerinə getməyiblər. Ona binaən Zəngibarın soltanı İngilisə xoş gəlmədən ötrü öz vilayətində olan qulları tamam azad edib.

* * *

Martın 10-da İngilis padşahının oğlu Hindistandan geri qayıdıb.

* * *

Misir dövləti martın 11-də Parij şəhərində təzədən 6 milyon manat borc edib.

* * *

Sibirdə məxsusi mə'dən zavodlarında 1875-ci ildə 1390 pud qızıl əmələ gəlib.

* * *

Şved dövlətində bir libas ixtira ediblər ki, yanğı olanda onu geyib oda girmək olur.

* * *

Dünyada dərya içində, yə'ni su altında olan teleqraf məftillərinin 75000 verst tuli var. Əgər Dəryayi-Mühitin bir hissəsi ki, Çin və Amerikanın arasındadır, oradan tel aparılsa, yerin ətrafında birbaşa tel olacaq ki, tuli 8900 verst olsun.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*2-ci sənə* *7-ci nömrə*

*Fi 1 rəbiülsani,*
*sənə 1293*

* * *

*Poşt xərci*
*qəzet basdıran ilədir*

* * *

*Çaharşənbə günü*




*Fi 14 aprel Rusiya,*
*sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı –*
*1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktubat göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## DAXİLİYYƏ

Mənim dostum... mənə yazır ki, haçan elmi-əbdan bəhsindən əl çəkəcəksiniz və o bəhsin qəzetdə işi nədir? Ondan əlavə yazır ki, ol qədər qəzetdə elmi təhsil etmək xüsusunda yazırsınız ki, qorxuram bu ənqərib zamanda xalqın qəzet oxumaqdan rəğbəti kəsilsin.

Əvvələn, elmi-əbdan bəhsindən çoxdan əl çəkmişik və indi çap olunan cənaban Heydəri və Əhsənül-Qəvaidin məktublarının mətləbləri başqa mətləblərdir.

Saniyən, elmi-əbdan hədisi 1293-cü ildir ki, xalqın ipini əllərində saxlayan şəxslərə mə'lumdur. Amma onlar bə'zi səbəblərə binaən buçağacan nə ki ol hədisi xalqa bəyan etməyiblər, amma özləri də onun dalınca olmayıb müsəlman millətini sərgərdan qoyublar.

Çünki qəzetin muradı xalqın gözünü açmaqdır, ona binaən peyğəmbər əleyhüssəlamın 1293 il əməl olunmayan qövlünü xalqa bəyan eləmək qəzetə vacibdir.

Salisən, qəzet dərviş kimi nağıl deyə bilməz, onun borcudur işlərin yaxşı və yamanlığını ayna kimi xalqa göstərsin, ta xalq öz nikbədindən xəbərdar olub onun əlacının dalıncan olsun.

Amma bizim xalqın işlərinə baxanda bir əməli-kamil görmək olmur ki, millət təəssübü çəkən qardaşlar ona fəxr etsin. Libasdan tutmuş bə'zi yeməli şeylərəcən xaricə dövlətlərindən gətirdirik. Pəs heç olur

ki, bu yoxsulluğumuzdan danışanda onun səbəbi elmsiz qalmağımız olduğun bəyan etməyək?

Ey qardaşlar, rəva deyil ki, sizin qəzetiniz də, bircə qəzetiniz ki "Əkinçi" olsun, sizə Əlif-Leyla nağılı desin.

Bu halda müsəlman milləti tufana düşmüş gəmi təkidir ki, hər ləpə onların bir hissəsini aparıb qərq edir. Belədə çox həmiyyətsizlik istər ki, qardaşlarımızın qərq olmağına baxa-baxa inək irəlidən yediyi çörəyi gövşəyən kimi Rüstəm Zalın nağılını oxuyub keçmişdə olanların qüvvətinə fəxr edək və öz qərq olmağımıza əlac etməyək.

Pəs, dostum, doğru deyiblər ki, əlhəqq mürrün (doğru söz acı olur). Amma bizə hökm olub ki: qülil-həqq və löv kanə mürrün (deyin sözün doğrusunu acı da olsa)!

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Maldarlıq edən şəxslərə mə'lumdur ki, qoyun-quzuda bir gicəltmə naxoşluğu olur ki, onlar bir yerdə fırranıb yıxılıb fövt olurlar. Bu naxoşluğun səbəbi bir qurutdur ki, itin bağırsaqlarının içində zindəganlıq edər. Onun tuli bir neçə arşın və bədəni barama qurdunun bədəni kimi bənd-bənddir. Hər bir bənd yetişəndə onun bədənindən ayrılıb itin nəticisi ilə çıxır ki, o bənd qabat toxumuna bənzər. O bir bəndin içində bir neçə min toxum var: bənd hava dəyməkdən çatdayanda toxumları külək aparıb dağıdır. Onların bə'zi otlar üstünə düşür və otlar ilə belə onları qoyunlar yeyirlər. Qoyunun mə'dəsində toxumdan bir kiçik qurd çıxır ki, bağırsağı deşib qan damarına girib qan ilə belə gedib qoyunun beyninə yetişib, orada barama qurdu kimi özünə ətdən barama qayırır. Barama mürur ilə yekələnib genə qoyunun beyninə azad edib, özünü fırlandırıb tələf edir.

Bu naxoş qoyun beynini it yesə onun mə'dəsində barma çatdayıb ondan uzun qurd əmələ gəlir ki, bağırsağın içinə yapışıb zikr olan qayda ilə 5-10 il toxumlayır və onun toxumları bəndlərin içində nəcis ilə çıxır.

Pəs zikr olan qurd itin və qoyunun bədənində zindəganlıq edir. İtdən qoyuna və qoyundan itə düşməsə, əmələ gəlməz. Ona binaən ol naxoşluq olan yerdə gərək itlərin nəcisinə baxmaq və hansının nəcisində qabağ toxumu kimi qurdun toxumu olsa, onu sürüdən uzaq

etmək və ol naxoşluqdan ölən qoyunun başını yandırıb tələf etmək ki, itlər onu yeyib naxoşlamasın.

Gicəltmə naxoşluğu nəmişlik yerdə çox olur.

Naxoşlayan qoyunu sağaltmağa əlac yoxdur. Çünki it qoyunu naxoş edir və özü onun başını yeməkdən naxoşlayır və bu naxoşluq Avropa vilayətlərində elə şiddət edir ki, fövt olan quzu və qoyunun 100-dən 70-i ol naxoşluqdan tələf olur, ona binaən danışıq var ki, itə qoyunun başını vermək bilmərrə qadağan olacaq və gicəltmədən ölən qoyunun başını itə verənə əlahiddə cərimə qoyulacaq.

*Əsgər Gorani*

## MƏKTUBAT

9-c u  f ə s i l. Ülumi-sənaət böyük dəstgah və vəs'i büsatdır ki, cəmi ümurati-səltənət, ticarət, ziraət və qeyr ona möhtacdır və bu əməl 2 qismdir: əl ilə qayrılan və maşın ilə əmələ gələn.

Əl ilə qayrılan şeylərdən çəndan karsazlıq olmaz, ümdə maşındır. Məsələn, gümüş pullar maşından çıxanda bir qism, bir tövr, bir qayda olur, amma əl ilə sikkə olanda biri böyük, biri kiçik, biri uzun, müxtəlif tərkiblər ilə çıxır, necə ki, görürük. Pəs lazımdır maşınlar bina edib işləri maşına salmaq. Maşınsız bizim Yəzd, Həmədan, Brucerd çitləri olur, hər biri 4-5 arşın, biri qumaş, biri bədqumaş, biri enli, biri ensiz. Əcəb budur ki, 5 arşın deyilən 4 nim, 4 deyilən 3 nim ya 3 gəlir. O ustadi-kamil onun başın yarım arşın qumaş və baqisin bədqumaş edib deyir ki, gərək başı və rukari yaxşı olsun ki, müştəri yaxşı görüb alsın və başında yazır:

Məkün peşeyi-xud bəcüz rasti,
Əgər rasti karət arasti[1].

Mərcan usta, toy belə olanda yas necə olacaq? Sözüvə baxım ya buzova baxım? Nə yaxşı olurdu ki, insan öz əməlinin eybinə bərxurd olub onun çarəsin edəydi!

---

[1] Özünə düzlükdən qeyri başqa peşə tutma. Əgər düzsənsə, işlərin sahmanda olacaq.

Xub, ustacan, sənin qayırdığın bir top çitdir, qiyməti 1 qran ya 20 qəpik. Onun qəddində və qumaşında xalqı aldatmasan, guya işin keçməz. Nə üçün baxmırsan ki, Avropa məmləkətlərində mahud, hərir parça qayırırlar. Arşını 3-10 manata qədər, başı-dibi bir və qəddi yarıdan ziyadə gəlir ki, kəm gəlməz. Aya, onun bu məharəti yoxdur ya tədəyyünü artıqdır? Heç biri deyil. Onlar elm yüzilə işlərini mülahizə edirlər ki, tərəqqi və pişrəft tapsın, onlar da sən kimi olseydilər, sən kimi biqabiliyyət qalardılar. Əcəba ki, bizim camaat heç bir əməllərinə tərəqqi vermək fikrində deyil, bəlkə tənəzzül verməkdə sə'y edir. Lakin xalq öz məaşi-əbdanlarına tərəqqi verməyə anənfəanən millət, dövlətləri zəif olur.

Heyhat ki, sərgərdan qalmışıq, nə üçün ki, tüfuliyyətdə pirəzənlər bizlərə bir para nağıl deyiblər və hər dəm deyiblər: bala, insanın alnında yaxşı-yaman, izzət-zillətdən hər nə yazılıb o olacaqdır. Bu söz bizim başımıza girib. Ondan bizi mollaya qoyublar, bizə Hafiz kitabını,

Mey dü salə və məhbub çəhardəh salə[1]

– dərsini oxudubdur. Şüəra bizlərə belə dəlalət edib. Üləmalarımız daim dünyanı məzəmmət ediblər. Münəccimlərimiz deyib sitarəniz hər nə göstərə onu görəcəksiniz. Dərviş deyib gərək əhli-kəsvət olasan, ta ülumi-kimya və qeyrisinə biduni-təhsil kəşf olsun. Lihaza elmdən bixəbər olub öz təkalifimizi anlamayıb mütəhəyyir qalmışıq.

Pəs millət, dövlət qeyrəti çəkən qardaşlar gərək xəyalat və qəvaidi-mövhuməni kənara qoyub başarıq və qüvvə sahibləri əsbab, alati-tərəqqiyyat və məktəbxanalar bina edib maşın və ustadlar gətirib və ətraflı qaideyi-ülum ilə tərbiyət etsinlər, ta kəm-kəm baxəbər olub öz məaşi-əbdanına lazım olan işləri əmələ gətirsinlər. Axır, insaf, təfəkkür yaxşıdır: Laməhalə bunu mülahizə etmək ki, haçanacan sair millətlərə möhtac olaq, bizim Quran və kitablarımız xarici kağızlarında yazılsın və bizim ətfal və cavanlar bikar, bielm, bitərbiyət olub əksəri əcamirü ovbaşlar ilə papağın kəc qoyub küçələrdə yar-yar oxuyub gəzsinlər?

Aman bu qism əcamirü ovbaşdan ki, xalqın yamanı onlardılar! Özləri cəhənnəm, bir müsəlmanın övladın qoymazlar ki, adam olsun.

Baqisi gələn fəsil.

*Əhsənül-Qəvaid*

---

[1] İkillik şərab və on dörd yaşında sevgili

* * *

D ə r b ə n d d ə n. Dünyada hər bir şəhərin özünə münasib sənətkarlığı var, savayı Dərbənd. Bizim əhl həmişə boyaq dalınca olduğuna ancaq buyuruq verməyə adət edib. Boyaq dadistədini həmişəlik hesab edib, elm və sənət təhsil eləməyiblər.

Bizim şəhərdə nə qədər dülgər və xarrat varsa, tamam İran əhli, ermənidirlər ki, yaxşı pul qazanırlar.

Xəyyat bizim əhldən 1–2 nəfərdir ki, çuxa şalvarlardan alahı libas tikmirlər, amma palto, kürk və qeyri libasları tikənlər erməni, rusdurlar ki, yaxşı pul alıllar.

Qərəz, çəkməçi, saatsaz, zərgər, ahəngər və əqləbənd tamam qeyri vilayət əhlidirlər. Bu sənətlərdən əlavə 30–40 nəfər həmşərilər rəngsazlıq edirlər.

Müxtəsər kəlam, bizim şəhərin kəmbəxt xəlaiqi bu qədər sənətləri əldən verib özləri məəttəl və sərgərdan qalıblar və əgər indi ol sənətlər bu darlıq vaxtda əlimizdə olseydi, az iş deyil idi.

Amma çifayda, sənətkarlıq nəfindən və elmindən bixəbər olmaqlarına binaən, genə məhəl qoymurlar və camaatdan həm heç kimin xatirinə gəlmir ki, bu gündən sonra insan hər bir sənət üçün elmə möhtacdır.

Bari gələcək vaxt üçün məktəbxanalar sə'yində olub, elm səbəbilə uşaqların sənətkarlığa və işlərə həris eləsinlər ki, özləri çəkən zillətləri uşaqları çəkməsin.

Belədə bir sənət məktəbxanası bizim şəhərdə olsa yaxşı olmazmı?

*Əlimədəd Abdulla oğlu*

## ELM XƏBƏRLƏRİ

Kənd və kiçik şəhər əhlinin ömrü böyük şəhərlərdə sakin olanların ömründən uzun olur. Ona binaən ki, kənd əhli təmiz havada və günün işığında, amam böyük şəhərlərdə izdiham kəsrət olduğuna onların əhli natəmiz havada və çırağ, şam ya qeyri yandırılan şeylərin işığında güzəran edillər.

Germaniyanın Leypsiq şəhərində sakin olanların və ol şəhərlərin evlərinin hesabına gedib belə mə'lum ediblər ki, ol şəhərdə olan otaqları 3 yerə hissə etsək ki, 1-ci hissədə hər bir otaqda 1–2 və 2-ci hissədə 2–3 və 3-cü hissədə 3 ya dəxi ziyadə adam sakin olur, ol vaxt

1871-ci il sənədə 1-ci hissədə hər 1000 adamdan 23 və 2-ci hissədə 1000-dən 33 adam və 3-cü hissədə 1000-dən 40 adam vəfat edib. 1872-ci sənədə 1-cidə 1000-dən 18 və 2-cidə 1000-dən 23 və 3-cü hissədə 1000-dən 30 adam vəfat edib.

* * *

Firəngistanda 10 illik müddətində vəfat edən kəslərin hesabına gedib biliblər: 25-30 can yaşı olan kişilərdən hər ildə vəfat edib: evli kişilərdən 1000-dən 6, evsiz, yə'ni subaylardan 1000-dən 10 və dul kişilərdən 1000-dən 22 adam. 30-dən 35-cən yaşı olan kişilərdən: evli 1000-dən 7, evsiz 1000-dən 11, dul 1000-dən 19 şəxs vəfat edib.

Xülasə, 20 yaşdan ziyadə olan kişilərdən kəbinli övrəti olan az vəfat edir, amma ol yaşda olan subay kişilər artıq və dul kişilər dəxi artıq vəfat edir, yə'ni ol yaşda kişilərin ömrünü kəbin uzun edir. Amma 20 yaşından az olan kişilərin kəbinli övrəti olanda onlardan hər il 1000-dən 50 şəxs vəfat edir, yə'ni 20 yaşınacan olan kəbin kişinin ömrünü qısa edir, amma 20 yaşından ziyadə olan kişilərinkin uzun edir. Həmçinin övrətlərin də ömrü kəbində uzun olur, əgər kəbin 20 yaşından sonra olmuş ola. Amma 20-dən az olsa onların da ömrünü qısa edir.

* * *

Firəngistanda təcrübə olunub ki, vəba naxoşluğu misgər və qələyçi və qeyri mis işlədən kəslərə dəymir. Məsələn, Parij şəhərində 1819-cu sənədə misgər silki bina olub. Ol zamandan bəri zikr olan şəhərə bir neçə dəfə vəba naxoşluğu düşüb, amma məzkur silkdən heç bir adam ol naxoşluqdan vəfat etməyib.

Miyatinto şəhərinin ətrafında ki, mis mə'dənləri vaqedir, heç vəba naxoşluğu görünmür.

## TƏZƏ XƏBƏRLƏR

Qəzetlərdə yazırlar ki, Bağdad tərəfə taun naxoşluğu düşüb. Ona binaən Bakı quberniyasına kağız gəlib ki, sərhesab olsun. Bu xəbərin doğru olmağı yəqin deyil və əgər yəqin də olsa, ümidvarıq ki, Avropa əhli ol naxoşluğa əlac olmadığını bilir ikən onu əmələ gələn yerindən çıxmağa qoymaya.

* * *

Osmanlı dövləti Andraşi yazan sülhnaməni qəbul edəndən sonra Bosni və Qerdseqovinə xaçpərəstləri ona razı olmadığına Avropa dövlətləri ol xaçpərəstlərə məsləhət edirdilər ki, razı olsunlar. İndiyəcən ol danışıq var idi. Lakin təzə gələn tellərdən belə bəyan olur ki, onlar zikr olan sülhə razı olmayıb istəyirlər ki, Osmanlıdan bilmərrə ayrılıb, əlahiddə hökumət bina etsinlər. Ona binaən təzədən 15 minəcən əsgər cəm edib Osmanlı ilə cəng başlayıblar.

* * *

Fərqan xanlığına ki, Rus onu zəbt edəndən sonra adını Fərqan oblastı qoyub, poşt aparırlar.

* * *

"Russki invalid" qəzeti yazır ki, Osmanlı dövləti Rus dövlətinin dost olmağını yəqin edib, sərhəddə olan əsgərini Bosniyə xaçpərəstlərilə cəng etməyə göndərib. İndi tamam sərhəddə 6 batalyon qalıb.

* * *

3 il bundan əqdəm İngilisdə bir icma bina olub ki, hər bir şəhərdə qızlardan ötrü məktəbxana açsın. İndiyəcən 9 məktəbxana bina edib. Ol camaatın hər ildə öz calislərindən 90 min manat cəm olur.

* * *

İngilis dövlətinin adamı ki, Misrin xəzanə işinə mülahizə etməyə getmiş idi, xədivin izni ilə bəyan edib ki, Misrin hər ildə xərci mədaxilindən 15 milyon manat ziyadədir. Ona səbəb oldur ki, təhmilat xalqın üstə qalır və əgər təhmilat tamam cəm ola, xərc və mədaxil bərabər olur.

* * *

Moskva gimnaziyalarının birisindən 3 şagird ki, hər biri 15 yaşındadır, qaçıb Bosniyə gediblər ki, Osmanlı ilə cəng etsinlər.

* * *

Rus dövləti Qafqazda və Türküstanda ə'la pambıq əkdirməkdən ötrü o pambığı becərməyi öyrənməyə Amerikaya bir neçə adam göndərmiş imiş ki, indi onlar qayıdıb Moskvaya gəliblər.

* * *

Tehrandan “Peterburqski vedomosti” qəzetinə yazırlar ki, bu il “Lepatri” ismində bir qəzet firəng dilində 2 həftədə bir çap olunur idi, amma indi deyirlər ki, onu çap etmək qadağan olub.

* * *

İrkutski gimnaziyasının şagirdləri 2 gün çay içməyiblər ki, onun pulunu Bosni və Qerdseqovinə əhlinə göndərsinlər.

* * *

Avropada bir dövlətli yəhudi var imiş, adı Rodşild. İndi onun övladı hər bir məmləkətdə sakindir. Keçən ay Parij Rodşildinin qızı Vyana Rodşildinin oğluna gedib. Qızın atası qızına 4 milyon manat verib.

* * *

İstanbuldan yazırlar ki, həzrət soltanın hərəmində bir xacə vəfat edib, 102 sinndə. 88 il sabiq ol xacə soltan Süleymanın hərəmində olub.

* * *

Keçən il Rusiyanın tamojnalarından 64 milyon manat yığılıb.

* * *

İngilisin xəzanə vəzirinin danışığından mə’lumdur ki, bu il dövlətin 450 milyon manat mədaxili, 455 milyon manat xərci olacaq. Kəsri doldurmaqdan ötrü gərək təhmilat artsın.

* * *

Peterburqda vaqe olan “Slavyan milləti” adlı icma indiyəcən Qerdseqovinə və Bosni əhli üçün 243 min manat xalqdan cəm edib onlara göndərib.

* * *

Türküstan qəzetində rusların Kokan şəhərinə daxil olmağın belə bəyan edirlər: cəng bilmərrə olmayıb. Şəhərin əhli küçələrə çıxıb rus əsgərinə tamaşa edib “Allahdan bu imiş” deyibən, ə’lahəzrət padşahi-imperaturi-Rusun ömrünə dua ediblər.

* * *

Osmanlı sərəsgəri Muxtar paşa bu aprelin 10-da İstanbula tel vurub ki, Qaradağ knyazı Qerdseqovinə əhlinə aşkar kömək edir. Bu halda 7000-cən Qaradağ əhli onlar ilə belə Osmanlı ilə cəng edir.

* * *

Hindistan qəzetləri yazır ki, Əfğanıstanın hakimi Şirəli xan ilə İngilisin arası dəyməyə səbəb oldur ki, cənab Şirəli öz ixtiyarında olan vilayətlərin hakimləri ilə dava elədiyinə onların tabeləri İngilis sərhəddini keçib, çapğınçılıq edirlər. Ona binaən İngilis əsgər cəm edib ki, sərhəddi saxlasın. İngilisin Kelat şəhərinə getməyə qəsdi yoxdur.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Fi 1 rəbiülsani,
sənə 1293*

* * *

*Poşt xərci
qəzet basdıran ilədir*

* * *

*Çaharşənbə günü*



*Fi 28 aprel Rusiya,
sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat
Altı aylığı –
1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktubat göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## E' L A N

Badkubədə olan məxsusi bank bəyan edir ki, gələn may ayının 24-də, yə'ni cəmadiələvvəl ayının 14-də ki, çaharşənbə günü ola, sübh saat 10-da zikr olan bankın hüzurunda Məhəmmədkazım Hacı Axundovun zaloqu ki, 9 tay və 5 boçka saxsı qabdır, onun bankdan borc elədiyi 900 manat əvəzində füruş olacaq. Zikr olan mal 1800 manata qiymət olunub, Qafqaz Merkuri kampaniyasının anbarında saxlanır.

## DAXİLİYYƏ

İnsanın bağırsağının içində bə'zi qurdlar zindəganlıq edir ki, onların ayağı, gözü və hətta ağzı da yoxdur. Onların bədəni belə naqis olmağa səbəb oldur ki, onların bədəni nazik olduğuna, mə'dədə ərimiş xörəyə qərq olub onu mürur ilə sormaq ilə pərvəriş tapırlar və dəxi xörək axtarmaq və yemək onlara lazım deyil. Çünki ol qurdlar zindəganlıq edən zaman onları görmək müşküldür, ona binaən bu yavuq zamanacan onların doğub törəməyi mə'lum deyil idi. 35 il bundan sabiq Avropa hükəmaları ziyadə zəhmət çəkib onu da bəyan ediblər. Hükəmalar ol imtahanlar ilə dünyanın sirrini aşkar edib xudavəndi-aləmin qüdrətini xalqa bəyan ediblər. Məsələn, indi mə'lumdur ki, ol qurdların bə'zi gərək bir neçə surətə düşüb, bə'zi heyvanın bədəninə girib,

onun ətilə insanın bədəninə daxil ola ta ki, əmələ gəlsin. Habelə mə'lumdur ki, onların bə'zindən yaman naxoşluqlar əmələ gəlir. Məsələn, onların birisi öz toxumunun insanın bağırsağının axırında, dərinin altına qoyur və onlardan çıxan qurdlar dərini gicişdirib ibnə naxoşluğu əmələ gətirir.

Zikr olan qurdların birisi ki, ona solitir deyirlər, insanın bədənində olanda onun 3-4 və bə'zi vaxtda 10 arşın uzunu olur. Onun bədəni bənd-bənd, yastı qeytan kimidir. Onun zindəganı və doğub-törəməyi keçən nömrədə yazılan qoyuna gicəltmə salan qurdunku kimidir ki, ona it solitiri deyirlər. Amma it solitiri itdən qoyuna və qoyundan itə düşür, lakin insan solitiri insandan donquza və donquzdan insana düşür. İnsan solitiri donquzun ətində olur və onu gicəltməyə salmaz, amma insanın bağırsağının içində olanda çox azar edər. Solitir insandan donquza və donquzdan insana düşməyini imtahan ilə biliblər. İnsan donquz əti yeməkdən və solitirdən naxoş olan insanın nəcisini donquz yeməkdən onlarda ol qurd əmələ gəlir. Ondan masəva ol yerlərdə ki, müsəlmanlar ilə xaçpərəstlər sakindirlər, zikr olan naxoşluq müsəlmanda heç görükməyibdir.

Pəs 1293 il bundan əqdəm nazil olan hərrimət əleykümül-meytətə vəddəmə və ləhməl-xinziri[1] ayeyi-şərifəsinin hikməti budur.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Hollandiyada pənir 2 qism olur. Ə'la pənirin girvənkəsi 15 qəpik, alçaq pənirinki 10 qəpik və yağın qiyməti 30 qəpik. Onilə belə 1867-ci ildə Hollandiya qeyri vilayətlərə füruş edib 10 milyon 900 min manatlıq yağ və 11 milyon manatlıq pənir və öz əhli 23 milyon 100 min manatlıq yağ və pənir işlədib.

Çünki zikr olan ildə Hollandiyada 1 milyon sağmal inək olub və onlardan 55 milyon manatlıq nəf' gəlib, pəs hər inəkdən ildə 55 manat mənfəət olub.

Hollandiya maldarlığının belə nəf'i olmğına səbəb oldur ki, onlar çox ə'la mal saxlayırlar ki, hər inəkdən ildə 15 min istəkanacan süd hasil olur.

[1] Sizin üçün meyidlər, qan və donuz əti haram qılınıbdır.

Pənirdən ötrü mayanı belə qayırırlar: 2–3 günlük buzovun qarnını kəsib bağırsaq tərəfini düyünləyib o biri tərəfindən pəncərədə ya qeyri-hava dəyən yerdə asırlar ki, qurusun. Sonra onu zolax-zolax kəsib 22 dərəcə qızmış turş südün içində 24 saat saxlayıb, bir qeyri qaba töküb, üstə bir az turş süd və duz səpirlər.

Bu minval ilə onu bir həftə saxlayanda maya yetişir. Amma bə'zi vaxt onu 2 ay da saxlayırlar. Bu mayanın bir istəkanı 24 vedrə, yə'ni 950 istəkan südə bəsdir. Mayanı südə vurandan sonra süd çürüyən zaman onu dəmir ağaclar ilə qarışdırıb, suyunu süzüb şorunu sıxmaq gərək.

Ol şoru ağacdan qayrılmış qutunun içinə qoyurlar ki, onun dibi qəlbir kimi deşiklidir, əl ilə şorun üstün basıb genə şor töküb ol vaxtacan basırlar ki, onun suyu deşiklərdən axsın.

Belə bərkimiş şoru maşın altda qoyub genə sıxırlar. Sonra onu duzlanmış turş süddə bir az saxlayıb bir qeyri qabda turş südü 35 dərəcə qızdırıb onun içində pəniri 2–3 dəqiqə saxlayıllar ki, üzü qabıq tutsun.

Belə qabıqlanmış pəniri 2 həftə rəf üstə saxlayıllar və ol zaman onu çökürürlər ki, formunu, yə'ni tövrünü dəyişdirməsin. Sonra pəniri isti su ilə və çotka, yə'ni mahutsilən ilə yuyullar və üzünə yağ sürtüb altı ay kimi saxlayıb füruş edillər.

## MƏKTUBAT

C ə v a b i-Ə h s ə n ü l-Q ə v a i d. Ey Əhsənül-Qəvaid ilə müləqqəb olub, şüəranın əş'ari-abdarında olan mühəssənat və lətaifi dərk etməyib, tə'nə və tovbix zəbanın açan kimsə, mə'lum olur ki, dərki-məzamini-əş'arda zövqi-səlim və təb'i-müstəqiminiz yoxmuş ki, mədh və qədhi-şüəra pəsəndi-xatiriniz olmayıbdır. Görünür ki, şüəranın şərab mədhi və şahidü səfa damağınıza dəyibdir.

Əziza, mə'zur söz ki, ol məzaq hələ sirlərdə büruzə gəlməyibdir, mən ləmyəzuq və ləm yə'rif[1]. Cənab şeyx Bəhayi ki, müctəhidini ə'zəm cümləsindəndir, şahid vəsfində və eşqbazlıq mədhində buyururlar:

---

[1] Dadmayan bilməz

**M ə s n ə v i**

Küllü mən ləm yə’şuqü vəchül-həsən
Qərribül-cüll ileyhi vərrəsən.
Hər kira dər sər nəbaşəd eşqi-yar
Bəhri-u palanü əfsar biyar.[1]

Və Əbu Əli Sina ki, rəisül-üləma ləqəbilə məşhurdur, şərab vəsfində buyururlar:

**N ə z m**

Ğizayi-ruh bəvəd badeyi-rəhiqül-həqq,
Ki rəngü buş künəd rəngi-buyi gülra dəq.
Betə’mi-təlx, çu pəndi-pədər və leyk müfid
Bənəzdi-batil mübtil, bənəzdi-dana həqq[2].

Və cənab Şeyx Sə’di ki, e’rafül-ürəfadır, şahid vəsfində buyururlar:

**F ə r d**

On nə zülfəstü binaguş ki ruzəstü şəbəst
Von nə balayi-sənubər ki, dirəxti-rütəb əst[3].

Və cənab Mövlana Xacə Hafiz ki, Lisanül-ğeyb namilə hər bir lisanda məzkurdur, buyururlar:

**F ə r d**

Şeyxəm bətə’nə güft həraməst mey məxor,
Güftəm ki, huşü guş behər xər nəmikünəm[4].

Və cənab Əmirəlmö’minin əleyhüssəlam bir nəfərin həcvində buyururlar:

---

[1] Gözəl üzə aşiq olmayanların hamısına bir çul və bir yügən lazımdır.
Hər kimin başında yar eşqi olmasa, onun üçün noxta, palan gətir.

[2] Ruhun qidası həqq badəsi olar.
O öz ətri və rəngi ilə gülə oxşayar.
Dadı ata nəsi həti kimi acı olsa da, özü faydalıdır.
O batil edən yanında yalan, ağıllı adam yanında həqdir.

[3] O qulağının dibindəki zülf deyildir, gecə və gündüzdür.
Və o şam ağacı kimi hündür deyil, xurma ağacıdır.

[4] Şeyx mənə tə’nə ilə dedi: şərab içmə, haramdır,
Dedim ki, mən hər eşşəyin söz-söhbətinə qulaq asmıram.

**Ş e' r**

Ləqəd rəbbeytu cirvən tulə dəhrin
Fələmma sarə kəlbən əzzə ricli[1].

Pəs sizin fərmayişatınızdan mə'lum olur ki, bu büzürgüvarlar ki, biri şərabı və biri şahidi vəsf edibdilər, nəuzübillah bunlar cümlə bimərifət və bikamal kimsənələrdir ki, nə üçün biri şərab və biri şahid vəsfini edibdirlər və xəlyaqi gumrah edib zəlalətə salırlar.

Əzizim, pəs gərək siz bu diqqəti və bu nüktəgirliyi xudavəndi-aləmə edəydiz ki, o da şərab vəsfin və şahid vəsfin Quranda bəyan edibdir. Şərab vəsfində buyurublar: Ənharün min xəmrin ləzzətün lişşaribin[2].

Və əmaridi-vildan xüsusunda buyururlar: vildani-müxəllədun[3].

Arifa, müşahidə olunur ki, siz xəlaiqə xudavəndi-aləmin hər əmr və nəhyin icra etmişsiz, ancaq şüəraya nəsib etmək fəqərəsi qalıbdırmış ki, onu da iblağ etdüz. Çox sağ olasuz, Allah taala bu təbliğ əvəzində siz cənaba şərabi-təhur və hur, qüsur kəramət eləsin, amin, ya müin.

Və xatimeyi-kəlamda əşşüəra yəttəbi'ühümül-ğavun[4] ayəsinə iktifa etmişdüz, amma illəl-ləzinə amənu[5] istitasın bilmərrə xatirənizdən məhv və fəramuş etmişdiniz. Bu əmr ona bənzər ki, laila ki kəlmeyi-nəfydir, zikr edəsən və kəlmeyi-illəllah isbatdır zikr etməyib xamuş olasan.

Ümidvaram ki, minbə'd belə cəsarətləri edib şüəranın həcv lisanların üzünüzə açmıyasınız, zira ki:

Çü şair berəncəd beguyəd həca,
Həca ta qiyamət bemanəd bəca[6].

Vəssəlam, əla mən ittəbəəl-hüda[7].

*Şüərayi-ərbəeyi-Şirvan*

---

[1] Uzun illər bir it balasını saxlayıb böyütdüm,
Elə ki, böyüyüb it oldu, birinci dəfə mənim ayağımdan qapdı.

[2] İçənlərin ləzzət alması üçün çaxır çayları yaratdım.

[3] Tüksüz oğlan uşağı.

[4] Şairlər azğındırlar.

[5] İman gətirənlərdən başqa.

[6] Şair inciyəndə həcv deyər və həmin həcv qiyamətə kimi yaşayar.

[7] Doğru yol ilə gedənlərə səlamətlik olsun.

10-c u f ə s i l. Əcamir-ovbaşlıq şəcəreyi-xəbiseyi-cəhalətin əsmarındandır ki, tərbiyət və elm görməyib bişüğl, bikar olub mütabiət həvayi-nəfsilə ətfalın dalınca düşüb onları özlərinə cur etmək istərlər. Onların ənva', əqsam şaxkarları var. Əz-cümlə mürəbbiləri müttəhim və onlara bədguluq edirlər və həm övladın ustad və mürəbbi xidmətinə qoyan adamlara və xudi-ətfala töhmət və bədguluq binası qoyub, onları töhmət və qeyr şərarətdən qorxuzmaq ilə ətfalı bikar edib, özlərinə cur etsinlər və bə'zi avam adam onlara şərik olub, bir kamil şəxsin yanında sadə adam görəndə sui-zənn edib əmr bemə'ruf nəhy əzmünkər[1] təriqin bilməyə-bilməyə əmri-mə'rufluq binası qoyub töhmət və qiybətə mürtəkib olullar. Ey qardaş, özgə üçün zənni-mə'siyət etmək ilə özünü nə üçün mə'siyətə salırsan, bir vahimə ilə min fəsada razı olursan? Məsələn, mənim bir oğlum var və lazımdır tərbiyət və tə'lim tapsın. Tifil həm tərbiyət olmaq vaxtında sadə olur və mən özüm tərbiyət edə bilmirəm. Labüd gərək ustad və mürəbbiyə süpordə edəm. Əlbəttə, namə'qul kəsə süpordə etmək olmaz və mə'qul və kamil əşxas xalqın töhmət və bədguluğuna binaən qəbul etməz. Lihaza o tifli-biçarə bikar və sərgərdan qalıb əcamir-ovbaşlar ilə ülfət edib onlar kimi olur. Ondan binayi-bədguluq qoyub deyirlər ki, filankəsin oğlu əcamir oldu. Ey qardaş, tifil nə etsin, siz işi ol məqama yetirdiniz. Pəs bərfərz, mürəbbidə bir zənni-xəyanət olsa, bikarlıqda min fəsad var. Laməhalə mürəbbidə axir bəxeyir və bikarlıqda axir bəşər olur ki, heç bir şəriətdə ətfal və mürəbbiləri müttəhim etmək olmaz. Belə ki, ayeyi-şərifdə buyururlar: innə bə'zəz-zənni əsəmün[2] və genə buyururlar: La təcəssüs və la yəğtəb[3]. Cəmi miləl qanuni-şəriətlərinə əməl edirlər. Mürəbbi və ətfalı müttəhim etməyib ütlübül-elmə min əl-məhdi iləl-ləhdi[4] fərmayişinə əməl edib 5 yaşından 100 yaşınacan təhsili-elm və tərəqqi tapmağa sə'y edirlər. Bizdə qanuni-şəriət işlənmədiyinə binaən xalq daim bir-birin biabır etmək, həvayi-nəfs ilə rəftar etmək ilə təhsili-kəmaldan ol qədr uzaq olmuşuq ki, şüəranın batil sözləri qafiyə və nəzm ilə deməyin kəmal bilirik. Qərəz, bizim sərgərdanlığımız elmsizlikdən və qanuni-şəriətin möhkəm və müntəzəm olmağındandır. Pəs şəriət bilatəşbih maşın

---

[1] Qadağan edilmiş şeyləri rədd etməli.
[2] Adamlar çox şey fikirləşirlər.
[3] Axtarma və gözdən qaçırma.
[4] Elmi öyrəniniz beşikdən qəbrə kimi.

kimidir ki, işlər cəmiən gərək o maşından çıxsın ki, xalq bir qayda ilə rəftar etsin. Necə ki maşın işləri qaydaya və ənzadəyə gətirir, şəriət xalqı dolandırmaq və onları əndazə və qaydada salmaq maşınıdır ki, xalq əmniyyət ilə ülumi-məaşi-əbdanlarına tərəqqi verib cəhalət və fəqr oduna yanmasınlar. Necə ki namaz dinin sütunudur, habelə qanun, qəvaid şəriətin intizamı, millət dövlətin payidarlığının sütunudur. Elə ki nəzmi-şəriət möhkəm oldu, xalq yamanlıq edə bilməz və yaxşılıq dalıyca gedər. Pəs gərək xalq bədgulara e'tina etməyib övladların tərbiyətə qoysunlar və elm, miknət sahibi olan kəslər din qardaşlarının övladın öz övladı tək tə'lim və tərbiyət edib atəşi-cəhalətə yanmağa qoymasınlar. Bundan yaxşı nə olur ki, insan birin ehya edə? Bir din qardaşının övladın tərbiyət edib, əcamir ovbaşlıqdan saxlamaq, məgər onu ehya etmək deyil?

Gələn fəsil ticarətdən yazılacaq.

*Əhsənül-Qəvaid*

## ELM XƏBƏRLƏRİ

Kurtenber adlı şəxs keçmişdə və indi Firəngistanda olan hükəmaların anadan doğulduğu yerləri mülahizə edib deyir ki, hər vilayət öz ab-havasına görə hükəma əmələ gətirir. Məsələn, filan vilayətdə təbib çox doğulub. İndi sə'y edir ki, ab-hava necə olanda nə qabliyyətdə adam doğulmağın bəyan etsin.

* * *

Soğan qabığı yaxşı rəngdir. Onu qaynadıb suyuna şey salanda sarımtıl boyanar və əgər onu söyüd ya qeyri ağacın qabığı ilə qaynadasan, ləvinbələvin ə'latər rənglər əmələ gələr.

* * *

Firəngistanda Forster adlı şəxs keçən il imtahan ilə bilib ki, otağın divarından çölə olan yaman hava nə qədər divardan keçib otağa daxil olur. O deyir ki, otaqda ocaq qalananda otağın havasının 100-dən 50-si və ocaq qalanmayanda 100-dən dördü yaman hava olur.

* * *

Əhəng adamın gözünə düşəndə onu su ilə yumaq yaxşı deyil, ona binaən ki, sudan əhəng bərkiyib ziyadə azar edər. Yaxşıdır ki, onu qənd suyu ilə yuyasan.

* * *

Çox ə'la neft cövhəri ilə ki, ona benzin deyirlər, hər bir qism parçadan ləkə çıxarıllar. Parij və qeyri şəhərlərdən belə ləkə çıxardan sənətkarların mənzilində özbaşına yanğı əmələ gəldiyinə hükəmalar imtahan edib deyirlər: neft ilə sürtülmüş parça quruyandan sonra onu sürtəndə ondan çaxmaq daşından şərarə çıxan kimi od çıxır və bu şərarə neftə dəyəndə özbaşına yanğı əmələ gəlir.

## TƏZƏ XƏBƏRLƏR

450 il bundan sabiq Osmanlı türkləri Avropaya daxil olub Rum dövlətinin Qəstəntiniyyə şəhərini zəbt edib ona İslambul, yə'ni islam şəhəri ad qoyub, ətrafda vaqe olan xaçpərəst vilayətlərini həm zəbt ediblər. Bir neçə il bundan sabiq zikr olan vilayətlərin bə'zi ki, olsunlar Serb və Qaradağ, yə'ni Əşqudrə və Əflan və Bağdan əyalətləri Osmanlı dövləti ilə cəng edib onun zirdəstindən çıxıb, indi ancaq dövləti-Osmaniyyəyə müəyyən olan xərc verirlər, amma ümurati-daxiliyyələri özləri ilədir.

Bu halda ki, Bosnə və Qerdseqovinə əhli Osmanlı dövləti ilə cəng edirlər, onların həm müradı oldur ki, zikr olan əyalətlər kimi olsunlar. Zikr olan əyalətlərdən Serb və Qaradağ əhli Bosnəyə kömək etməkdən muradları oldur ki, osmanlıya heç xərc verməsinlər.

Çünki Serb və Qaradağ əhli Bosnəyə kömək etməyi mə'lumdur və keçən həftə tel gəlmişdi ki, Osmanlı dövləti Serb və Qaradağı zəbt etmək istəyir, ona binaən danışıq var idi ki, Avropa dövlətləri o cəngə qarışacaqlar. Amma indi tel gəlib ki, Osmanlı əsgəri ol əyalətlərin sərhəddini keçməyib və keçmək istəmir.

* * *

"Russki invalid" qəzeti yazır ki, Kokan xanlığının ki, indi ona Fərğan oblastı deyirlər, sərhəddi budur: şimal və məşriq tərəfi Sildər-

ya çayı, məğribi Semireçni oblastı, cənubu Qaşqar hökuməti və Zərəf-şan okruğudur. Onun uzunu 800 və eni 150 ağacdır. 960 min nüfusu, yə'ni xalqı var. Keçmişdə xan onlardan 2 milyon 500 min manat təh-milat yığırmış.

* * *

Misirin Qarna şəhərindən aprelin 4-dən tel gəlib ki, Həbəş ilə cəng qurtarıb, sülh danışığı olur. Ona binaən sərəsgəri-Misir gəmi ilə İskəndəriyyə şəhərinə getdi.

* * *

Aprelin 3-də Odessa şəhərinin 8-ci mirovoy sudyası polisə bir kənd əhli öz öküzünü döymək barəsində verdiyi ərizəyə mülahizə edib ol kənd əhlinə 10 manat cərimə kəsib.

* * *

Peterburqda əsgərlər üçün buğdanı suya salıb sonra maşın ilə əzib, xəmir edib ondan çörək bişirirlər. Bu imtahanı indi edillər və deyirlər ki, belə bişmiş çörək tez qurumur.

* * *

Rusiya zakonuna binaən küçələrdə dilənçilik etmək qadağandır. İndiyəcən Peterburqda 24 icma bina olub ki, dilənçilərdən ötrü əlahiddə mənzillər bina edib onlara kömək etsinlər. Ol icmaların calislərində hər ildə 118 min manat cəm olur.

* * *

"Qolos" qəzetinin idarəsi indiyəcən Bosnə əhli üçün 37 min manat cəm edib.

* * *

Amerikanın Nyu-York şəhərində bir Stüart adlı şəxs vəfat edib. Yazırlar ki, ol şəxs İngilisdə 25 yaşınacan elm oxuyub, sonra Ameri-kada 50 il çox doğruluq ilə ticarət edib, 80 milyon manat qazanmış imiş.

* * *

“Tiflisski vestnik” qəzeti yazır ki, Tiflisdə bir erməni 15-əcən sazandar cəm edib onları Amerikanın Filadelfi şəhərinə ki, orada bu il yayda əcaibati-dünya cəm olacaq aparır.

* * *

Bizim rus dövləti bir komis[siya] tə’yin edib ki, Türküstana gedən yolları mülahizə edib dəmiryolunun yerini bəyan eləsin. Ol komissiyaya 100 min manat verilib.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Fi 1 cəmadiələvvəl, sənə 1293*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Pəncşənbə günü*




*Fi 13 may Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## E' L A N

İstanbulda fars dilində çıxan "Əxtər" qəzeti indi həftədə 2 dəfə, yə'ni şənbə və çaharşənbə günləri təb' və nəşr olunur. Bir illik qiyməti poşt xərcilə:

Rus məmləkətində 10 manat, Tehran və biladi-farsda 4 tümən, Təbrizdə 3 tümən yarımdır.

* * *

Badkubədə olan məxsusi bank bəyan edir ki, gələn may ayının 24-də, yə'ni cəmadiələvvəl ayının 14-də ki, çaharşənbə günü ola, sübh saat 10-da zikr olan bankın hüzurunda Məhəmmədkazım Hacı Axundovun zaloqu ki 9 tay və 5 boçka saxsı qabdır, onun bankdan borc elədiyi 900 manat əvəzində füruş olacaq. Zikr olan mal 1800 manata qiymət olunub Qafqaz Merkuri kompaniyasının anbarında saxlanır.

## DAXİLİYYƏ

Vamberi ismdə bir nemes ki, müsəlman vilayətlərində çox səyahət edib, indi "İslam" adlı bir kitab inşa edib, ol vilayətlərin yerlərini, əhlini, onların adətlərini və qeyrə yazıb elm təhsil etmək barəsində deyir:

Məğrib, yə'ni xaçpərəst vilayətləri və Məşriq, yə'ni islam vilayətləri elm təhsil etməyə qeyr tövr baxıllar. Məğrib sə'y edir ki, elm xalqa bəyan olsun və hər kəs elm yolu ilə iş tutsun ki, ziyadə mənfəət tapsın. Amma Məşriq elm yollarını xalqdan gizdin saxlayır. Lakin İslam bina olan vaxtda Məğrib ilə Məşriqin belə təfavütü olmayıb. Ol vaxtla həzrət xəlifələr və hər tavana kəslər öz ehsanına məscid və məktəbxanalar bina edəllər idi ki, xalq elm öyrənsin. Ona binaən ol vaxt islamda olan hükəmalar heç bir məmləkətdə yox idi.

Elə ki xəlifələrin yerində soltanlar, şahlar, xanlar əyləşdi və xalqın ipi ruhanilərin əlinə düşdü, hökumət əhli öz nəf'indən ötrü xalqı gözübağlı saxlamaq üçün məktəbxanalarda ancaq şəriət adablarının, boş sözləri bir-birinə yapışdırıb ibarət ilə danışmağın dalıncan düşüb, xalqı yoxsul və sərgərdan edib özləri kef və ləzzəti-dünyaya məşğul oldular və nəinki özləri təzədən xalq üçün məktəbxanalar açmadılar, hətta olan məktəbxanalarda mollalıq məsailini araya salıb xalqı elm yolundan uzağa saldılar.

İndi Məşriq-zəmin qoca və xəstədir və ol şəxsə aqil deyərlər ki, o ibarət ilə danışdığı sözləri başa düşmək olmasın və bu aqil kəslər deyirlər elm cəvahiratı hər şeydir. Necə ki, cəvahiri çölə atanda hər kəsin əlinə asanlıq ilə düşdü genə qiymətdən düşər, habelə kamallı sözləri vazeh danışanda onu hər kəs başa düşər, ona binaən söz biməqdur olur.

Bu tövr ilə 500 ildən ziyadədir ki, islam zülmətə qərq olub, elmdən və dünyadan bixəbər olduğuna yoxsulluqdan mürur ilə tələf olur.

Əgərçi Vamberinin zikr olan kəlamı düşmən sözüdür, amma yaxşı olurdu ki, onu oxuyanlar fikir ilə oxuyaydılar.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Əkin yerinə, əvvələn cəmadat, saniyən ələfiyyat, salisən heyvanatdan əmələ gələn şeyləri, rabiən zikr olan şeylərdən məxlut olan şeyləri qarışdırmaqlıq ilə onu qüvvətli etmək olur.

Əzcümlə cəmadat işlənir:

1) Əhəng daşı ki, onu yandırıb üstə su töküb un təki edəndən sonra.

2) Qarğa duzu ki, onu da yandırıb un kimi edəndən sonra.

3) Xörəkdə işlənən duz və bir neçə qeyri duzlar ki, onları da əzib xırdalayandan sonra əkin yerinə çəkib onu şuxm etmək gərək.

Ələfiyyat 3 qism olur. Əvvələn:

1) Bəlim, yə'ni ol otlarını budaqları ki, onların toxumu insana gərəkdir, məsələn, arpa, buğda bəlimi.

2) Yarpaqları lazım olan, məsələn, tənbəki otunun budaqları.

3) Kökü lazım olan, məsələn, yerkökü, zılx kartofelin budaqları və yarpaqları.

4) Ağacların xəzəli, qarğı qamışı, şirin ya dərya suyunda əmələ gələn otlar və qeyrə.

Zikr olan ələfiyyatları ya mal nəcisinə qarışdırıb ya aşağıda zikr olan kimi işlədillər. Ol ələfiyyatları bir duzlanmış və bərkinmiş yerə 3-4 arşın hündürlükdə yığıb taya vurub onun eniş tərəfində bir quyu qazıb, ol quyunu su ilə doldurub ona əhəng, kül, qarğaduzu, heyvanat sidiyi və bə'zi ələfiyyat töküb onlar çürüyən vaxtda ol suyu haman tayanın üstə səpib üstün ot ilə örtüb kürək ilə döyüb bərkitmək gərək. Bu tövr ilə hər gündə ol tayanı isladıb bərkidəndən 8-9 gün sonra ol ələfiyyatlar çürüyür. Ol vaxt tayanı açıb soyudub onu əkin yerinə çəkib şuxm etmək gərək.

Saniyən, əkin biçiləndən sonra köklərin üstə qalan budaqlardır ki, ol yeri şuxm edib onları yerə qarışdırmaq gərək.

Salisən, əkin yerində qəsd ilə bə'zi ələfiyyatı toxm edib sonra onlar gül açan vaxta ol yeri şuxm edib onları yerə qarışdırmaq gərək. Belə kök otlar ilə yeri qüvvətli edəndə gərək elə otlar ilə edəsən ki, onların kökü dərinə gedib, oradan duzları sorub əmələ gələ ki, onları yerə qarışdıranda yerin üzü ol duzlar qarışmaqdan qüvvətlənsin. Həmçinin gərək ol otların kükürdü çox ola ki, yeri nəmiş saxlaya və özləri tez çürüyən ola.

## MƏKTUBAT

F ə s i l  II. Ticarət sözü 12-yə qaldı.

Cənab Ağa, cəddin fədası olum, məktubunuz mülahizə oldu.

1) Mənim şüəra ilə ədavətim ya sair nas ilə xüsumətim yoxdur. Mətləbimiz əsasi-mə'muriyyətə bais olan səbəbləri və ona eyib yeti-

rən illətləri bəyan etməkdir ki, aya cəhət nə olmuş ola ki, miləli-digər bu qədər tərəqqi tapıb, millət, məmləkətləri mə'mur olub və illət nə olub ki, bizim millət, məmləkət tənəzzül etməkdədir. Lihaza elmdən başqa mə'muriyyət üçün bir səbəb və cəhldən savayı xarabalığa bir illət olmadığına binaən qəvaidi-mə'mulə və əlfazi-mərsumə və əf'ali-adiyə və əsnafi-mütədavilləni mizani-rüchan ilə müvazinə edib onun mə'muriyyətə olan nəf' və zərərin beqədri-məqdur din qardaşları üçün bəyan edirik. Hərgah bir faydası ola fəbihəl-mətlub[1]. Olmuya, zərəri həm yoxdur. Əz-cümlə sinfi-şüəranın əsasi-mə'muriyyətə olan nəf' və zərərin mizani-rüchanə qoyub, küffeyi-xüsranin çox səngin görüb və əşşüəraü yəttəbiü-hümül-ğavun[2] ayəsinin hikmətinə müntəqim olub, iləlləzinə amənu istisnasının zimnində olan və ülumül-səlahət şərtini onlarda görməyib ağıl və şər'hökmü ilə anladığımızı bəyan etmişik.

2) Şər'i-mübin ki, əqli-külli-müəbbirnas üçü qərar verib ta xalq o müəbbirdən keçsin, silabi-cəhalət onları qərq etməsin, onun batininə ağ olanın cəzası ruzi-cəzaya qalır. Amma zahirinə ağ olan üçün fəmən yə'məl misqalə zərrətin xeyrən yərəh və mən yə'məl misqalə zərrətin şərrən yərəh[3] ayəsinin hökmünə binaən divanxanəhayi-dövlətidə hər kəsin əməlinin şərrinə tənbeh olmaya, büsati-şəriət ki, əvvəlin əsasi-mə'muriyyətdir, bərhəm olur. Bu surətdə necə olur ki, zahiri-şəriətə zidd olan mətalibi-kütübi elm qərar verib ibtidada tə'limi-ətfal etsinlər?

3) Bu ki deyirlər mənzuri-şüəra bu badə və sadə deyil, bu mətləb xilaf və təlbis büsatıdır. Ona binaən ki, lisan qəlbin xahişini hekayət edir, əz kuzə birun haman təravət ki, dərust[4]. Hər aşiq öz yarın çağırır. Söz ağızdan hər nə çıxdı odur, ya xeyir, ya şərr. Bu tə'vilat müştəbehkarlıq yoludur ki, bu libas ilə öz mətahların xərcə versinlər, amma belə xüsuslarda şəriət tə'vil qəbul etməz. Hər şey ki, zahiri-şəriətə zərər yetirə, lazimül-hədd olur.

4) Bizim peyğəmbər rəhmətül-aləmin olduğuna bizim dünya və axirətimizi mə'mur istəyib, dünya mə'murluğuna elmi-əbdanı və axirət abadlığına elmi-ədyanı əsbab qərar verib və bu elmi-əbdanda şərabı

---

[1] Mətləb budur

[2] Şairlər yolundan azmış adamlardır.

[3] O adam ki, zərrə qədər xeyir iş görsə nəticəsini görər, əgər zərrə qədər şər iş görsə yenə nəticəsini görər.

[4] Kuzənin içində nə varsa bayırına da o sızar.

çox müzürr bildiyinə qədəğəni-şədid edib. Ona binaən ki, şərab içən ya məst olur ya xumar. Təhsili-dünya və axirətdən qalıb xar və zəlil olur. Əlbəttə razı olmaz ki, nəhyi-şədid olan şey məcazən ya tə'vilən mədh olunsun. Qərəz, hər sahibi-əql mültəfit olsa bilər ki, tə'vilat özün gunahdan xaric etmək üçün üzr yoludur, amma şəriət qəbul etməz. Əgər deyələr ki, miləli-xaricə nədən şərab içməklə zəlil, xar olmayıb? Cavab: onlar ah içir, kifaf key dəhəd in badəha bəməstiyi-ma[1], deyib palçıq küpünü boşaldıb, ət küpünə doldurmazlar. Onların içində çox içib məst olan üçün heç bir yerdə məhəl yoxdur, xüsus əhli-divan və əhli-ləşkər ola bilməz ki, aləmi-badi-fənaya versin.

5) Şəriət ki, hakim və soltani-əslidir, hər şeyi ki, qadağan buyurub, onun müzakirəsi həm qadağandır, məgər bər səbili-nəhy və təhdid. Amma müzakirə mədh yolundan xah tə'vilbərdar ola, xah olmaya, lazımülhədd olur. Pəs necə ki, namaz müxlisləri föhşayi-münkirdən saxlar, əgər nəzmi-şəriət möhkəm ola, ümum nası föhşayi-münkirdən saxlayıb, məcburi-e'mali-xeyrə salik edər.

6) Ənvari-xəmr ya vildani-müxəlləd ki, Qurani-məciddə zikr olub, o ayatın şüəranın şe'rinə şəbahəti yoxdur, onun ziddidir. Bu badə və sadəpərəstliyi nəhy etmək üçün o ne'mətləri cəzayi-üxrəvi qərar verib.

7) Şeyx Bəhainin muradı eşqi-vəchi-həsəndən əmarid deyil, nisvandır, tənagəhu, tənasəlu babətindən buyurub.

8) O əş'ar şayəd ki, Əbu Əli kəlamı ola. Ona binaən ki, ol cənab həkimdir. Bərfərz özü aqil həm olsa, zahiri-şəriətə nüqsi olan kəlamı deməz, xah tə'vilbərdar ola, xah olmaya. Zira ki, o, bu hikmətə xəbərdardır ki, əvamünnas tə'vilin qanmayıb yoldan çıxar.

Ehtimal var şüəra öz mətaların rəvac etməkdən ötrü o əş'arı ona bağlayıblar, çün bu qəbil əsnaf öz mətalarının rəvacına binaən bir ərəbi ya farsi kəlami-peyğəmbər ya imam ya üləma dilindən qayırıb deyirlər. Belə ki, kimyagər və məşşaqlar xüzilfərrar vəttəlqa[2] kəlamın mövləl-kövneyn Əli əleyhüssəlama nisbət verib xalqı aldadıb, xanəxərab edirlər. Bu kəlamın xilafına dəlili-vazeh budur ki, imam sərgərdanlıq sərmayəsi xalqın əlinə verməz.

9) Əşcəüs-səqəleyn Əli əleyhüssəlamın fərmayişi o şəxs xüsusundadır ki, öz mövlasına ağ olan şüəra kəlamına nə dəxli var ki, əğrazi-nəfsanilə din qardaşların həcv edirlər.

---

[1] Bu badələr bizim sərxoş olmağımız üçün kifayət etməz.

[2] Qaçanların və kəbindən boşananların

10) Məni həcvi-şüəradan qorxutmuşduz. Mən ayinə kimiyəm, hər kəs məndə öz camalın görər və bir də kəlam şəxsin ətri və buyidir, gülün ətri öz lətafətin və mütəəffin şeyin buyi öz xəbasətin zahir edir.

11) Məktubi-cədidinizdə yazılan mətalib mübahisələrdir ki, əl elmü nüqtətün kəssərəhümül-cahilun[1] babətindən suyu həvəndə döyən kimi döyməkdən yar-yoldaşdan geri qalıb, öz evimizi xərab etmişik. O cavablara yaxşı əqli və nəqli cavablarım var, lakin vaxtımız yoxdur. Olur ki, bə'dha kəm və piş yazılsın.

*Əhsənül-Qəvaid*

* * *

Badkubəli molla elmi-əbdan bəhsində mətləbi-xəmisi belə bəyan edib. Dünya və dünyəvi ibarətdir bu aləmdə ömr edən vaxtda vaqe olan ümurdan ilaxirə.

Əvvələn, şəxsi-sail dünya və dünyəvi, axiri və üxrəvi mə'nasının sualın etməyib ki, biz onlardan ibarət olan ümuru bəyan edək.

Saniyən, əgər elmi-əbdanı cənab molla məhz dünyaya tə'vil edibsə, pəs işlərin ibtidası ki, bielmi-kamil məhəlli-vüqu'dan kənardır, o əşxasi ki, dünyada zindəganlıq edib və ənva ülumdan əlləri xalidir, axirət əməli ki, bir qeyri aləmə mövqufdur, nə yol ilə demək olur ki, məhsusi dərk eləməyən kəs mə'qulə yol tapa bilsin.

Salisən, ümuri-vaqeə ki, bu zaman ömrdə vaqe olur, əgər şəxs bəsirət gözü ilə abavü əcdadının məişətin öz məişəti ilə mütabiq eləsə, görə bilər ki, tərəqqi-elm və məratibi-məişət və süubəti-ümur bir payədədir.

Rabiən, ümuri-vaqeə hər millət və hər tayfa içində yaxşı olsa, mərkəzi-xeyir və yaman olsa, mərkəzi-şərrə race olacaqdır. Əməli-xeyir əgər məcus və nəsari əlindən çıxa xeyir və əməli-şərr əgər müsəlman əlindən çıxa şərdir. Sailin mətləbi ə'mali-xeyir üstündədir ki, əsbabi-mədəniyyəti cəm edər.

Xamisən, ne'məti-dünyəvi və üxrəvi həzrəti-Məhəmmədül-Mustafa buyurmaqlığı ilə əhli-islam üçün müəyyən olunubdur. Elmi-əbdan və əqli məaş qüvvəsi ki, şərafəti-insana dəlildir, şəxs əmələ gətirsə, aləmi-ənasir ilə nizam tapar ki, behiştdən nümunə olur.

*Heydəri*

[1] Elm bir nöqtədir, cahillər onu çoxaltmışlar.

## ELM XƏBƏRLƏRİ

Dərya suyunu içmək olmadığına səbəb oldur ki, onun duzu çoxdur və əgər onu qaynadıb buğa döndərib, sonra soyudub, su edəsən, ol vaxtda onun duzları o qaynadığı qazanda qaldığına özü şirin və içməli olur. Çünki suyu qaynatmağın zəhməti çoxdur, ona binaən bir ingilis maşın ixtira edib ki, onun içində su günün istisində buğa dönüb, soyuyub şirin olur. Zikr olan maşın bir ağac qutudur, uzunu altı və eni bir arşın, hündürlüyü bir çərək, qutunun qıraqlarının qalınlığı bir barmaq, onun üstə şüşədən qapaq qayırıllar ki, bir başı o biri başından iki barmaq hündür olur. Qapının alçaq başının altında bir novça qayırıllar. Ol qutunun içinə bir barmaq dərinlikdə dərya suyu töküb onu günün altda qoyanda isti şüşədən keçib suyu mürur ilə buğa döndərib, ol buğ şüşə qapağın üstə yığılıb, soyuyub suya dönüb, sonra axıb onun alçaq başında olan novçaya tökülüb dışqarı çıxır. Zikr olan qutuda bir gündə 1500 stəkan şirin su əmələ gəlir.

Xörək insanın mə'dəsindən rədd olan suya qarışanda əriyin və sonra Qana qarışıb, bədəni saxlayır. Biz yediyimiz ət həmçinin əriyir və belə ərimiş ətə pepton deyirlər. İngilisin London şəhərində bir zavod bina olunub ki, ətə bə'zi şeylər vurmaq ilə onu pepton edib, qutulara töküb, füruş edillər. Onun adına soyuq ət deyirlər ki, onu bir neçə il saxlamaqdan xarab olmur. Soyuq əti naxoşa vermək yaxşıdır, ələlxüsus ol naxoş ki, onun mə'dəsi gücdən düşmüş ola.

## TƏZƏ XƏBƏR

Bu il Qafqazın Badkubə və qeyri quberniyalarında çox quraqlıq olduğuna indi bahalıqdır. Məsələn, buğdanın putu Şirvanda 1 manat, Badkubədə 90 qəpikdir. Badkubəyə İrandan düyü çox gəldiyinə putu 55 qəpiyə olub. Ona binaən bə'zi kəslər 3 hissə buğda ununa bir hissə düyü unu qarışdırıb çörək bişiriblər. Deyirlər ki, çox ləzzətli olur, şirin olur. Düyü buğdadan qüvvətsiz olduğuna (insana ət gətirən şeylərin qədəri buğdada birə üç düyüdən ziyadə olur) ol çörəyin elə qüvvəti olmaz. Ona binaən məsləhət edirik ki, düyüdən süzülməyən aş bişirib onu ət, balıq, lobya, noxud ilə ya aşı soyudub çörək kimi yağ, pənir ilə yesinlər.

* * *

Keçən aprelin 28-də Badkubədə ermənilər teatr çıxartdılar ki, ondan cəm olan məbləğ ilə bu il gimnaziyadan qurtaran fəqir uşaqları Peterburqa elm təhsil etməyə göndərsinlər.

* * *

Şirvan uyezdinin Zərdab kəndindən yazırlar ki, bu il çox çəyirtgə əmələ gəlib, amma quraqlıqdan ələfiyyat olmadığına bir-birini yeyib tələf edirlər.

* * *

Bu halda yer üzündə olan qəzetlər tamam Osmanlı işindən danışır. Osmanlının İstanbul və qeyri şəhərlərindən gedən teleqram dünyanı doldurub. Bosnə və Qerdseqovinədə olan cəng dəxi şiddət edir. Bolğar vilayəti həm cəng başlayıb. Krit cəzirəsinin, hətta İstanbulun öz əhli dövlətdən özləri üçün bə'zi ixtiyarlar istəyirlər. Xülasə, işlər çox pərişandır. Mahmud Nədim paşa ki, soltanın əvvəlinci vəziri idi əzl olub, onun yerinə sərəsgər Hüseyn Ovni paşa tə'yin olub. Bu səbəblərə binaən indi Rus, Avstriya, Prus vəzirləri Berlin şəhərinə yığılıb məsləhətdədirlər. Deyirlər Osmanlı ilə cəng edən vilayətləri Avstriya əsgəri zəbt edəcək ki, dövləti-Osmani onların əhlinə və'd elədiyi ixtiyarları verincən orada qalsın. Xülasə, tamam Avropa dövlətləri sə'y edirlər ki, cəng olmasın.

* * *

Yazırlar ki, İran dövləti Qarun çayının kənarlarını ki, Şəttül-ərəb tərəfdədir, bir firəng kampaniyasına altmış ilə icarəyə verib ki, orada qənd qamışı, pambıq, üzüm, şimşadi-leyl əksin, atəş gəmiləri saxlasın, fabrikalar açsın.

* * *

Amerikanın Filadelfi şəhərindən yazırlar ki, bu may ayının 10-da əcayibatxana açılacaq.

* * *

Ə'lahəzrət padşahi-imperaturi-Rus Berlin şəhərinə səyahətə gedib.

* * *

Peterburqun şəhər icmaı hökm edib ki, şəhərdə olan bisahib itləri tələf etsinlər və hər kəs it saxlamaq istəsə, hər itə 1 manat şəhər üçün xərc versin.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*2-ci sənə* *10-cu nömrə*

*Fi 15 cəmadiələvvəl, sənə 1293*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Pəncşənbə günü*




*Fi 27 may Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktubat göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## DAXİLİYYƏ

Qafqaz vilayətində dövlət tərəfindən məktəbxanalar barəsində təzə qayda qoyulmuş idi. Ol qaydaya görə hər bir məktəbxanada, xah dövlət tərəfindən açılmış ola. Gah məxsusi ola, gərək qeyri elmlərdən savayı rus dili həm oxuneydi və hər bir məktəbxanaya baxmaqdan ötrü dövlət tərəfindən əlahiddə çinovniklər tə'yin oleydi. Ermənilərin ruhanilərin ol qaydadan xəbərdar olub cənab sərdara ərizə verib, bəyan ediblər ki, onların kilsələrinin yanında olan məktəbxanalarda ancaq ruhanilik öyrənillər və erməni ruhanisi üçün rus dili bilmək lazım deyil. Ol səbəbə cənab sərdar yazıb təvəqqe elədiyinə binaən indi zikr olan qaydanı belə dəyişdiriblər. Ermənilərin kilsələrinin və müsəlmanların məscidlərinin yanında açılan məktəbalardan savayı hər bir məktəbxana olsa, orada gərək rus dili oxunsun və bu məktəbxanalara baxmaqdan ötrü əlahiddə çinovniklər tə'yin olunub ki, bu il sentyabr ayından məktəbxanalara baxacaqlar və bir də hökm olunub ki, əvvəl zaman Gəncə və Badkubə quberniyalarının hər birində kənd əhli üçün dövlət tərəfindən 3 məktəbxana açılsın. Onların üçü bu il Gəncə quberniyasında açılacaq, amma Badkubə quberniyasında hələ açılmayacaq. Çünki ol məktəbxanalarda dərs deməyə müəllimlər yoxdur ki, rus dilindən savayı xalqın dilini həm bilsinlər, ona binaən Qori şəhə-

rində bir məktəbxana açılıb ki, orada oxuyan şagirdləri sonra müəllim eləsinlər. Ol məktəbxanada 20 nəfər erməni və gürcü padşahlıq xərcilə oxuyacaq. İndi "Kavkaz" adlı qəzet yazır ki, doğrudur, müsəlmanların məktəbxanaları üçün müəllimləri oxutmaqdan ötrü sonra əlahiddə məktəbxana açılacaq, amma indi müsəlmanlardan hər kəs xahiş etsə, zikr olan Qoridə açılan məktəbxanaya öz uşaqların öz xərcilə qoya bilər. Oraya oxumağa girən kəs gərək uyezdni şkolada oxumuş ola və özü 16–19 yaşında ola. Orada 3 il dərs deyiləcək.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

5 min ildir ki, insan barama qurdun bəsləyib onun baramasından ipək qayırır. Əvvəl zaman onu Çin məmləkətində saxlayırlar imiş, sonra mürur ilə hər bir tərəfdə. Hətta soyuq tərəflərdə, məsələn Moskva şəhərində saxlayırlar. 22 il bundan sabiq Firəngistanın cənubi tərəfində barama qurduna naxoşluq düşüb, bir az müddətdə elə şiddət edib ki, hər ildə xalqa 90 milyon manatacan zərər olub. İpək çəkən zavodlar boş qaldığına çoxu bağlanıb, fabrikaçılar ki, ipək parçaları qayırırlar, qeyri vilayətlərdən gələn ipək baha olduğuna yoxsul olublar. Hətta kənd əhli barama qurdundan əl çəkib, tut ağaclarını qırıb, onun yerində əkin, ziraət etmək istəyib. Bu səbəblərə məhkəmeyi-dövlət tut ağaclarını qırmağı qadağan edib hükəmalardan iltimas edib ki, zikr olan naxoşluğun səbəbini bilib onun əlacını tapsınlar. Hükəmayi-Firəngistan bir neçə il zəhmət çəkib iki firqə olub. Hər bir firqə öz təsəvvürünü belə bəyan edir.

Firqeyi-əvvəl ki, onun rəislərinin birisi məşhur Pasterdir, deyir: ol naxoşluğun səbəbi oldur ki, indi barama qurdunu ol qədər saxlayırlar ki, onu saxlayan kəslər qurd çox olduğuna onları yaxşı saxlaya bilmirlər. Onun mənzili ya soyuq, ya isti, ya natəmiz olur ki, naxoşluq əmələ gəlir. Gərək onlar saxlanan mənzil böyük və quru ola ki, onun havası təmiz olsun. Onun akoşkaları ola ki, işıq olsun. Onun istisi həmişə 15–20 dərəcə ola, yarpaqları qurda verəndən irəli bir az saxlayasan ki, onların üstə olan şəbnəm qurusun. Belədə əgər bə'zi qurdlar naxoşlasa onları götürüb atmaq ilə qeyrilərini naxoşluqdan mühafizət etmək olur. Zikr olan qayda ilə Paster bir neçə il qurdları öz evində bəsləyib onlardan ba-

rama hasil edib. Ona binaən 4 il bundan sabiq məhkəmeyi-dövləti-Firəngistan (indi Firəngistanda padşah yoxdur. Dövlət işini məhkəmə mülahizə edir ki, ol məhkəmənin calislərini camaat zübdə edir) zikr olan Pasterə 4 min manat pensiya tə'yin edib ki, ömrü olduqcan hər ildə ol məbləğ ona verilsin.

Firqeyi-digər deyir ki, barama qurdunu insan çoxdan bəslədiyinə onlar elə zəif olub ki, insan nə qədər zəhmət də çəksə, onların zəif bədəninə naxoşluq dəyib onları tələf edəcək. Ona binaən onları saxlamaqdan qeyri barama qıran qurdları bəsləyib onların baramasından ipək çəkmək yaxşıdır. Ol qurdlardan, ələlxüsus, palıd və gərçək ağaclarının yarpağını yeyən qurdların baraması yaxşı olur. Ona binaən indi tamam Avropa vilayətlərində palıd və gərçək kəpənəklərinin qurdlarını ol ağacların üstə tor içində bəsləyirlər. Əgərçi indi onların baramasının ipəyi az olur, amma ümid var ki, baramaların ipəklisini onlardan qurd çıxartmaq ilə bir qərinədən sonra onlar da tut ağacının qurdu kimi çox ipəkli barama qayırsınlar.

Bu firqənin bə'zi calisləri o fikrə düşdülər ki, ipək yerinə hörümçək toru işlətsinlər. Onlar zikr olan torları yığıb. Onlardan sap qayırıb, parça toxuyaydılar ki, ol parça bərklikdə və şəfəqdə ipək parçadan yaman deyil idi. Amma hörümçəkləri cəm edib onları bəsləmək çətin olduğuna ol fikrə əməl edən yoxdur.

## MƏKTUBAT

Baharın əvvəlindən ta 22 şəhrhal rəbiüssani bizim Dağıstan ətrafına yağış düşmədiyinə binaən, ğəllə və taxıl tərəqqiyə üz qoymuşdu. Maldarlar ələf çox bitmədiyinə binaən öz mallarını satmaqda idilər. Amma tarixi-məzburda Allahın rəhməti nazil olub. Yağış gəlməyi ilə ümid olunur ki, əkin və ziraət əgər artıq yaxşı olmasa, yaman da olmayacaq.

Bu il cənab naçalniki-oblast knyaz Məlikovun dəsturül-əməlilə Qoysu çayından bir böyük arx gətirib və 20 verst kimi suyu aparıblar. Payız su Petrovskinin ətrafına gələcək və gələn il Petrovski ilə Tarxunun aralığından keçib Minas uzunu deyən arx ilə dənizə töküləcəkdir. Zikr olunan arxın tuli 70 verst olacaq və təxminən 300 verst gəzandərgəz (kvadratnı), yə'ni 40000 desyatin ki, bu vaxta kimi boş və bifayda yerlər idi, məzrəə olub, hasil əmələ gələcək.

Cənab-hakimi-oblastın bu ətrafı abad eləmək sə'yini zeyldə zikr olan asari-xeyirdən qiyas etmək olur.

1) Şura və Petrovski poçt yollarının şossesi (daş yolu),

2) Şura ətrafının bağları. Bir neçə il bundan sabiq qoxumuş sular dayanıb, kəsafət havaya bais olurdu, amma indi o yerlərdə xalq bulaqlar başında və ağaclar kölgəsində istirahət edirlər.

3) Fövqdə zikr olunan arx, 32 para dəhat əhlinin ki, 2784 ocaq hesab olunur, xoşbəxtliyinə və quraqlıqdan xilas olmaqlarına bais olur. Petrovski bargahının dürüst olmağı. Poçt yollarının düzlənməyi. Teleqraf cədvəlinin çəklənməyi. Dağıstan məmalikinin əmnü aman olmağı. Xalqın bəylər hökumətindən istixlası. Teymurxan-Şuranın progimnaziyası. Məhkəmeyi-ədliyyə bina olunması və bunlardan savayı asari-xeyirlər müəzzəmileyhi-məzkur müddəti-hökumətində əmələ gəlib.

Teymurxan-Şura naçalniki-oblastın məhəlli-iqamət və hökumətidir. Ətraf və həvalisinə nisbət ki, xalqın kəsrəti-icmasına bais olur, ticarət və dadistəd əhli və qoşun camaatı Dağıstan ətrafında olan qalalardan bu şəhərdə artıqdır. Rusiya, İran, Qafqaziya əhlindən neçə tacirimö'təbər bu şəhərdə ticarət edir və ticarət əmrinin rövnəqi qeyri şəhərlərə nisbət bilmüzaəf görünür. Əsgərlərdən başqa şəhərin dörd qismətindən bir qisməti rus milləti və üç qismi İran və Qafqaziya əhlindəndir. Yekşənbə günləri cəmiyyəti-kəsir zükur və ünas xəlaiqi ətrafdan cəm olub ənva-əqsam mə'kulat gətirib satıllar. Bilcümlə Dağıstan xalqının ünas tayfası sövdə eləməkdə zükur qismətindən səriştəsi artıqdır. Cəmi ev tədarükün, hətta onun məlbusatın xatunu sövdə edib, bazardan alır. Mə'kulatdan savayı bə'zi vaxtlar Qazıqumuk vilayətindən ənva yun şallar və Kopçi mahalından gümüş və qızıl ilə ziynət verilmiş tüfəng, yaraq, Şuranın ətrafında qayrılan şişkə və xəncər tiğələri çox olur. Teymurxan-Şuranın ab-havası yay fəslində o qədər səlamət deyil. Meyvəcatdan üzümü yaxşı olmaz, amma ağac yemişi ki, nemsələr bağında əmələ gəlir və özgə məmləkətlərin yaxşı yemişlərindən götürüb peyvənd ediblər, qeyri yerlərin yemişindən nəhayətdə yaxşı və mümtazdır. Qafqaziya və İran müsəlmanlarının çoxları evlənib əhlü əyalları var. Bilcümlə Dağıstan məmləkətinin ünas tayfası qeyri vilayətlər əhlinə müzavicət eləməyə meyli-məxsusları var.

*Heydəri*

* * *

F ə s i l 12. Ticarət, əgərçi nəzərə asan gəlir, amma elm istər. Əqli-külli buyurur: ya mə'şərət-tüccar əlfiqhü sümmə mətcər[1]. Elmi-ticarətdə ziyadə mülahizə və təcrübat lazımdır. Hər Hafiz kitabına ya münəccim saatına baxanda dadistəd edənlərə əgərçi tacir deyirlər, amma onların ticarəti kor-koranədir ki, təqlidi-xəridfüruş etməkdən gah nəf', gah zərər edirlər. Bə'zi kəslər ki, nəzərdə çox nadandır, nadir ticarətdən tənxahi-külli cəm edir, amma bə'zi ki zirəkdir, ziyan edir. Xalq deyir ki, Allah ona verdi, buna vermədi. Ay qardaş, Allah əf'ali-dünya üçün bir qayda qoyub və hər şeyə bir təqaza və bir xasiyyət verib ki, o xasiyyəti ondan almaz. Məsələn, atəşin təqazası yandırmaqdır, o xasiyyət daim ondan büruz edər. Bir dəfə həzrət İbrahimxəlili yandırmadığına atəş xasiyyətdən düşməyibdir. Pəs insan bilxassə möhtacdır məişətə. Belə ki, Qurani-məcid buyurur: Nəhnü qəddərna məişətəhüm fil-həyatid dünya[2]. İnsan məişətə labüddür, amma təriqeyi-məişətdə muxtardır. Elm yolu ilə məişət edən tərəqqi edər, elmsiz tərəqqi tapmaz, xarab olur. Qərəz, insanın təriqeyi-məişətdə faili-muxtar olmağına ayati-əhadis o qədərdir ki, bu yerdə küncayiş olmaz. Əgər şəxs təfəkkür ilə bizim və sair millətlərin ticarətinə mütəvəcceh olsa, vazeh olur ki, onlar elm ilə ticarət etdiyinə külli-nəf'lər götürürlər. Məsələn, böyük şərakətlər və kompaniyalar bina edib külli dadistədlər edərlər, buxar gəmiləri və qeyrə saxlarlar, maşınlar bina edərlər və bu işlərdə 100 və ya 500 şərik olur, tənxahları bitəfavüt, amma işləri elə müntəzəm olur ki, şəriklərdən əgər biri xaric ola ya bir özgəsi daxil ola, heç niza və məəttəlçilik olmaz. Amma bizdə elm və nəzm olmadığına, əgər bir əmələ 2 ya 5 nəfər şərik ola, bir il şərakətlik və bir neçə il dava edərlər və bə'zi vaxtda dava varisdən varisə qalar. Bizim Badkubədə bir neçə buxar gəmisi şərakət ilə alıb, 2 il dava ilə işlədib, sonra gəmi bağlanıb, davaları divanxanalarda uzun gedir.

Baqisi fəsli-digər.

*Əhsənül-Qəvaid*

---

[1] Ey ticarət əhli, əvvəl ticarət elmini öyrənin, sonra onunla məşğul olun.

[2] Həyatda onların ruzilərini biz müəyyən elədik.

* * *

Dağıstanın Xunzaq mahalında bir qoca kişi 5 gün piyada gəlib Dərbəndin 6 verstliyində əyləşib rahat olan vaxtda iki nəfər birəhm adam onun çuxasın, papağın, çarığın və əsasın alıb qaçıblar. Fəqir kişi başıaçıq, ayaqyalın gəlib Dərbəndə çıxdı. Onun 120 sinni var, amma özü hələ zirəkdir və ağzında 4 dişi var.

Dərbənddə natarius tə'yin olandan bəri çox adam tələbkardan fərağat olmaqdan ötrü və əmniyyəsini (malını) övrətlərinin ya qeyri kəslərin adına yazdırır. Hərçənd tələbkarlarda həm insaf yoxdur, amma qorxuram ol kəslər bir tərəfə qərzdar qalmasınlar və o biri tərəf fərağətlik ilə malı yesinlər.

Mayın 7-də 5 saat yağış yağıb, ziraətlərə ziyadə nəf' yetirdi, xəlaiqi şad elədi. Amma 2 gün sonra bir bərk yel əsdi ki, küçə-bazarda durmaq mümkün olmadı və çox zərər elədi, üzüm və qeyri meyvə ağaclarının yemişini töküb bostanları, səbziyatı bilmərrə tələf edib. Deyirlər ziraətə həm zərər olubmuş. Amma zikr olan tufandan iki gün sonra bərk yağış yağdı. Ümidvarıq ki, ziraətə xeyir eləsin. Təxminən zikr olan yeldən 15 min manatacan zərər olub.

*Məhbus Dərbəndi*

* * *

Teymurxan-Şuradan rəbiüssaninin 24-dən yazırlar: novruz bayramından indiyəcən bir qətrə yağış yağmadığına ziyadə quraqlıq idi. Amma indi bərk yağış yağır. Ümidvarıq ki, əkin, ziraət yaxşı olsun. Cümə günü axşam saat 12-də knyaz Məlikovun mütərcimi Əbdülqahir bəyin evinə yanğı düşüb onu yandırıb, bilmərrə tələf elədi. Yanğından xilas olan şeylərin bə'zini saldatlar və qeyri kəslər oğurlayıblar. Zərərin qədəri 4000 manatdan ziyadədir.

## TƏZƏ XƏBƏRLƏR

Rus, Prus, Avstriya vəzirləri may ayının 11-də Berlin şəhərində Osmanlı işindən ötrü məşvərət edib, kağız bağlayıb, onun üzünü Firəng, İngilis, İtaliya vəzirlərinə göndəriblər. Firəng və İtaliya dövləti ol kağızı qəbul edib qol çəkiblər, amma İngilis ona razı olmayıb.

Doğrudur, ol kağızın məzmunu hələ mə'lum deyil, amma qəzetlərdə yazırlar ki, ol kağızı təsdiq edən dövlətlər Osmanlı dövlətindən təvəqqə edəcəklər ki, öz tabeləri xaçpərəstlər ilə bu ay cəng eləməsin, keçmişdə yazılan Andraşinin sülhnaməsinə əməl eləsin. Qeyri dövlətlərin xaçpərəstlərindən və müsəlmanlardan bir qism tə'yin eləsin ki, zikr olan sülhnaməni dürüstlük ilə əmələ gətirsin. Ondan masəva, zikr olan dostlar danışıq edib ki, Osmanlı dövlətini və onlar ilə cəng edən xaçpərəstləri qorxudub ol sülhnaməni qəbul elətməkdən ötrü sərhəddə əsgər saxlasınlar və cəng gəmilərini Ağ dənizə göndərsinlər. Bu halda o gəmilər Mərmər dəryasının boğazına yığılıblar.

* * *

Osmanlı dövlətinin bu qədər əsgəri və əsgəriyyə tədarükü olmaqlıq ilə dövlət işlərini dolandıran kəslər bir az xaçpərəst tayfasını zəbt eləyə bilməkliyi İstanbul şəhərinin müsəlmanların qeyrətə gətirib. Bu may ayının 11-də 25 mindən ziyadə məscidlərdə tə'lim tapan tələbələr Soltan Əhməd məscidinə cəm olub, birləşib gedib həzrət Soltan Əbdüləzizin sarayını əhatə edib, soltana rubəru ərz ediblər ki, şeyxülislam Həsən əfəndini və sədri-ə'zəm Mahmud Nədim paşanı əzl eləsin. Millət məclisi, yə'ni bir divanxana ki, onun calislərin camaat zübdə edə və o divanxana dövlət işlərini dolandıra bilsin, zikr olan millət məclisi həzrət soltana məvacib tə'yin eləsin ki, ondan ziyadə xərc olunmasın. Camaatın belə dövlət üzünə ağ olmağını görüb qeyri dövlətlərin konsulları və İstanbulda sakin olan tabeləri özlərini mühafizət etməkdən ötrü cəng gəmiləri gətirdib, orada məskən ediblər. İndi may ayının 18-dən tel gəlib ki, camaat Soltan Əbdüləzizi xaric edib, onun yerinə mərhum Soltan Məcidin oğlu Murad əfəndini soltan edib.

* * *

İstanbul şəhərindən may ayının 8-dən yazırlar ki, həzrət soltan mərhum Soltan Məcidin uşaqlarını dustaq edib.

* * *

Osmanlı dövlətinin Salonik şəhərində bir xaçpərəst qızı istəyib ki, islam olsun, amma xaçpərəstlər və qeyri dövlətlərin konsulları razı olmurlar imiş. Ona binaən camaat konsulların üstə tökülüb Firəng və Prus

dövlətlərinin konsullarını öldürüb. Osmanlı dövləti onları öldürənlərdən 6-sını boğazından asdırıb, qeyrilərini həm tənbeh elədəcək.

* * *

Badkubədə ermənilərin oxuyan uşaqlara kömək etməkdən ötrü bina olan icmaı ki, hər ildə 4 min manatacan məktəbxanalar xərc edir, bu may ayının 23-də ol icma bina olmağını yada salıb, öz calisləri üçün qonaqlıq eləmişdi.

* * *

“Türküstan” qəzeti yazır ki, martın 3-də Daşkənd şəhərində Əbdülmö’mün və Mirğalan şəhərində Molla İshaq ki, adını Poladxan qoyub, ruslar ilə cəng edərmiş, boğazından asdırıblar. Ondan savayı zikr olan qəzet yazır ki, dövlət tərəfindən komissiya tə’yin olunub ki, Kokan xanlığının, yə’ni Fərğan oblastının yerlərini, xalqını və onlar keçmişdə xana verdiyi təhmilatın qədərini mə’lum etsin.

* * *

4 il bundan sabiq pruslar ilə firənglərin cəngi olan zaman Parij şəhərini əhatə etmişdilər. Ol vaxt aclıq olduğuna hər bir şeyi, o cümlədən siçan əti də yeyirlərmiş. Çünki siçan insana çox zərər edən heyvandır, ona binaən indi istəyirlər ki, həmişə siçan yeyilsin. Bu səbəbə indi Belği vilayətində bir icma bina olub, adı siçanyeyən. Onun calisləri həftədə bir dəfə cəm olub siçan əti yeyirlər.

* * *

Rusların baharda da bir bayramları olur ki, evlərini söyüd və qeyri ağacların budaqları ilə bəzəyirlər. Çünki ağacların ab-havaya çox xeyri var, ona binaən indi qadağan olub ki, ol bayramda ağac budaqlarını qırıb evlərini bəzəsinlər.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского
Губернского Правления.

*2-ci sənə* *11-ci nömrə*

*Fi 1 cəmadiəlaxir, sənə 1293*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Cümə günü*




*Fi 11 iyun Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## DAXİLİYYƏ

Baran ki dər lətafəti-təb'əş xilaf nist
Dər bağ lalə ruyədü dər şurəbum xəs[1].
*Sə'di*

Əkin yerindən danışanda ərz elədik ki, hər bir qism ələfiyyatın bir qeyri xörəyi var. Məsələn, buğdaya lazım olan xörək olmasa, nə qədər zəhmət çəkib buğda əkilsə, əmələ gəlməz. Onun əvəzinə alaq otları bitər ki, onların xörəyi var. Habelə hər bir millətin adət və rəftarı elm ilə düz gəlməsə, o millət elm təhsil edə bilməz. Çünki bir neçə dəfə bizim müsəlmanlar üçün elm təhsil etmək vacib olduğundan danışmışıq, ona binaən indi bizim adətlər ona mane olmağından danışaq.

Əgər bir elm sahibi öz kefi istədiyi təki bizim içimizdə rəftar edə, əvamün-nas onu dinc qoymaz. Məsələn, çəkmə geyməkdə bir günah yoxdur və hər kəs fikir eləsə görər ki, çəkmə geymək ilə insan müsəlmanlıqdan çıxmaz. Amma bir şəxs bizim namərbut başmaq yerinə çəkmə geyəndə şüəralar onu həcv edir. Mollalar ona minbərdən lə'nət oxuyur, əvamün-nas ona salam vermir. Xülasə, hamımız birləşib onu kafir hesab edib o qədər incidirik ki, biçarə naəlac qalıb, öz millətini atıb, gedib xaricilər ilə üns tutur ki, onun övladı onların içində böyüyüb, onların təriqəsinə daxil olur.

---

[1] Təbiətinin lətifliyinə şübhə edilməyən yağış bağda lalə bitirər, şoranlıqda kol-kos

Əlbəttə, belədə nə qədər sə'y edək ki, buğda bitsin, olmaz, alaq otları olacaq və bir qərinədən sonra onları biçib əvəzinə qeyri hasil əkəcəklər.

Ey millət təəssübü çəkən qardaşlar, aləmi-məhşərdə va ümməta! – deyən peyğəmbər olacaq. Amma indi biz elə bihəmiyyət olmuşuq ki, xaricilər va millәta – deyib öz işlərini möhkəm edən vaxtda vanəfsa – deyib nə ki milləti işlərimizə rövnəq vermirik, hətta zəhmət çəkib elm təhsil edənlərimizi incidib qovmaq ilə millətimizi kor edirik. Pəs vaxt keçməmiş elm kitabları gətirib, məktəbxanalar bina edib, öz dilimizdə təhsili-üluma məşğul olun ki, müsəlmanlıqda qaim olasınız. Mıx bərk vurulduqcan onu çıxarmaq çətin olur.

Ey elm təhsil edən cavanlarımız! Doğrudur, bizim vətən qardaşlarımız ilə üns tutmaq çətindir, siz danışdığınızı onlar başa düşməyib, əf'alınızı şəriətə namüvafiq hesab edib, sizə kafir deyib incidəcəklər.

Doğrudur, qeyri millətlər sizin kamalınızı görüb sizə artıq rütbə verəcəklər, amma insaf deyil ki, beş gün ömrün ləzzətindən ötrü milləti, qardaşlarınızı atıb, onları kor və sərgərdan qoyasınız. Pəs ləzzətidünyaya tamah etməyib öz qardaşlarınızı əməli-xeyrə vadar edib, qoy şüəralar sizi həcv etsin, mollalar lə'nət oxusun, əvam-ünnas daşa bassın, siz millət üçün zəhmət çəkirsiniz və bişəkk gələcəkdə millətin gözü açılanda sizi şəhid hesab edib, sizə rəhmət oxuyacaq.

## MƏKTUBAT

Şamaxıda bir camaat uçkolası bina olub ruhani okrujnoy məclisinin nəzarətində Şamaxı sakini Hacı Seyid Əzim Məliküşşüəra öz oğlu Mircəfər namı haman uçkolaya elm təhsil etmək üçün qoymaqdan xalqın məzəmmətin görüb öz oğluna nəzm ilə nəsihət verdiyinin bəyanıdır:

Cəfər, ey qönçeyi-gülüstanım!
Ey mənim bülbüli-xoşəlhanım!
İki yüz yetmiş üçdə, bə'd həzar,
Mö'tədil fəsl idi, zəmani-bəhar.
Səni həqq mən fəqirə qıldı əta,
Kə'beyi-qəlbimə yetişdi səfa.
On beş ildir ki, ey ətayi-ə'zim,

Sənə adab eylərəm tə’lim.
Yetibən əqlə sərəfraz oldun,
Dəxi məndən ki, biniyaz oldun.
Əql peyğəmbərin qılıb rəhbər,
Öyrən adabi-məzhəbi, Cəfər!
Demirəm mən gedən təriq ilə get,
Əqli tut, ol gözəl rəfiq ilə get.
Sənə bürhan deyil təriqi-pədər,
Gör nə yol getdi zadeyi-Azər.
Demirəm rus ya müsəlman ol,
Hər nə olsan, get əhli-ürfan ol.
Ey gözum nuru, ey ətayi-xuda,
Sənə Şirvanda oldu nəşvü nüma.
Lilləhül-həmd, xitteyi-Şirvan
Saniyi-İsfəhandır əl’an.
Gərçi viranə oldu zəlzələdən,
Çıxmayıb mə’rifət bu mərhələdən.
Var hər guşədə yüz əhli-kamal,
Hər biri əhli-elmi sahibi-hal.
Xassə kim, padşahi-kişvəri-Rus,
Edəni təxti-ədlü dadə cülus.
Eyləyir tərbiyət kəmal əhlin,
Gətirir halə hər məhal əhlin.
Hər vilayətdə açdı məktəblər,
Çatdılar feyzə əhli-mənsəblər.
Oxunur onda müxtəlif dillər,
Həll olur onda cümlə müşküllər.
Ey oğul, bu dəlili-bişəkdir,
Adəmi-bisəvad eşşəkdir.
Rəmzi – “həl yəstəvi”[1] müdəlləl imiş,
Bilməyəndən bilən kəs əfzəl imiş.
Həq buyurmuş ki, ixtilafi-lisan
Ne’mətimdəndir, ey güruhi-cahan!
Kim ki, bəs bir dil eyləsə hasil,
Oldu bir ne’mətə o kəs vasil.
Cəhd elə ne’məti-təmamə yetiş,
Elm təhsil qıl, məqamə yetiş.
Ey gözüm, hər lisanə ol rağib,
Xassə kim, rusidir bizə vacib.
Onlara ehtiyacımız çoxdur,
Bilməsək dil, əlacımız yoxdur.
Çatmayıb şər’dən bizə bu xəbər –
Ki, ərəbdən səva dil oldu hədər.

[1] Bərabər olarmı?

Nə ərəbdir xuda, nə rumü nə zəng,
Nə həbəşdir, nə rusü türkü firəng,
Xah boğ, xah tanrı, xah xuda,
Birdi mə'nada, ey düri-yekta.
Ləfz edirsə ifadə mə'nanı,
Sərf edər əhli-mə'rifət anı.
Bir hədisi-səhihdir bu xəbər,
Söyləyibdir cənab peyğəmbər –
Ki, Süleyman nəbi əleyhüssəlam
Hər güruhin dilin bilirdi təmam.
Ey oğul, bil bu rəmzdən mətləb,
Deyil əlhəq lisan lisani-ərəb.
Həqq özü hər lisanə danadır,
Hər lisan həq yanında zibadır.
Var bizim dörd kitabımız, ari,
Hər biri bir lisan ilə cari.
Biri "Tövrat" idi giranmayə,
Gəldi ibri dilində Musayə.
Biri "İncil" idi, birisi "Zəbur",
Hər biri bir lisan ilə məşhur.
Çün Məhəmməd ərəbdən etdi zühur,
Öz lisanında qıldı həq mə'mur.
Türkidən göndərəydi gər ani,
Türki dildə olurdi "Quran"i.
Xassə kim, məzhəbi-imamiyyə,
Xah Bağdadü xah Şamiyyə.
Cümlə bu e'tiqadə guyadır –
Ki nəbi hər lisanə danadır,
Xah rusi lisani, xah firəng,
Bilir ani imam bafərhəng.
Bir lisani ki, bəs bilirmiş imam.
Sən də bilsən nə eybi, ey gümnam?

* * *

Cənab ağanın kəlamı çox nazik eyham olduğuna qorxuram onu oxuyanlar başa düşməsinlər. Ona binaən lazım bilib bəyan edirəm ki, o cənabın kağızlarından mə'lum olur ki, bu şe'rlər ilə ağa bizi və bizim qəzeti həcv edib. Ey ağa, qurbanət şəvəm, biz haçaq demişik:

Demirəm rus ya müsəlman ol,
Hər nə olsan get, əhli-ürfan ol.

Haşa bu sözü biz deməmişik, amma həmişə deyirik:

Ey oğul, bu dəlili-bişəkdir,
Adəmi-bisəvad eşşəkdir.

Yə'ni deyirik eşşəyin müsəlman olmağından çifayda? Adam gərək elm təhsil edib insan olsun ki, müsəlmanlığa qabil olsun.

* * *

F ə s i l 13. Əməli-ticarət üçün niza' baisi-təzyi'i-mal və abrudur və cəmi eyiblər elmsizlikdən çıxar. Cəmi mühəssən ümuratın başı elmə bağlıdır. Heç əməl yoxdur ki, elmə möhtac olmasın. Elmi-ticarət bizim nəzərimizdə çox həqirdir. Deyirik hər kimin pulu olsa, hər vaxt ticarət edə bilər, amma gərək deyək hər kəsin elmi-ticarəti ola, pulsuz da ticarət edib, pul qazanır və hər kəsin elmi-ticarəti olmaya, pulnan da ticarət edə bilməz. Elmi-ticarəti olan tacirlər tədbirati-ticarət ilə onun əlini işdən çıxarıllar. Elmi-ticarəti olmayan pulu da ola, yə'ni miras ya tapmaq kimi olan pullardan ona yetişmiş ola, genə onu tələf edib, yaman günə qalır.

İndi bizim içimizdə elm ilə ticarət edən az olduğuna bir tövr ilə dolanırıq. Əgər ticarət elmi olanlar bizim içimizə çox gələlər, o vaxt bizlər gərək özgələrə əmələcat olaq və onu bacarmasaq fəhləliyə gedək ya haləti-qüdrətimizdə mülk və qeyrədən bir zad götürmüş olaq, onunla dolanaq. Belə ki, İstanbulda müsinn adamlar xudkatibə və başqalara deyiblər və həm deyirlər ki, o vaxtdan ki, Avropa camaatı bu məmləkətə ayaq açdı, yövmən-fəyövmən büsati-ticarəti bizim əlimizdən çıxardıblar.

Qərəz, gün-gündən dünya abad olur və xalq ziyadələndiyinə darısqal yerlərdən genişliyə yeriyir, necə ki, bir vaxt elm Məşriqdə olduğuna, Məşriq abad olub, xalq Məğribə çəkilib və elm o yerlərdə işlənib. Məşriqdə xalq eyş, məcalis, badə və sadəyə məşğul oldular və şüərasilə təmə'inə əf'ali-məzburi nəzm edib külli hizbin bima lədeyhim fərihun[1] babətindən o əş'arlardan kitablar yazıb, özləri oxumaqdan başqa məktəbxanalarda ətfala əsbabi-tədris elədilər. Belə ki, əlhal genə mə'muldur. Bəs ki, adət olub onun eybini deyəndə inciyirlər. İndi Məğrib kamil və darışlıq olub. Xalq yeriyəcək Məşriqə. Onlar elm sahibi olduğuna ümuratı dolandıracaqlar. Pəs əlaci-vaqiə piş əzvüqu

[1] Hər bir insan yığnağı özünün əldə etdiyi şeylə fərəhlənir.

bəyad kərd[1]. Əgər indi biz öz lisanımız və öz ixtiyarımız ilə məktəbxanalar bina etməyək və büsati-elm başlamayaq, ərusi-madər hekayəti olur ki, dedi: qızım, açmasan açdırallar. Pəs o vaxt onlar öz təriqələrilə oxudacaqlar: hər dü can suzənd, amma in küca və on küca[2].

Müxtəsər, elmsiz heç zad olmaz. Əl-elm sümməl-əməl, əl-əməl bila elmin vəbalün. Elm sahibi ilə elmsizin heç bir şeyi müqabilət və müqaviməti olmaz. Elmi-ticarəti olan abad, olmayan xarab olur və büsati-ticarəti çox şəbihdir büsati-səltənətə...

Hər kira imrari-həqq amuxtənd,
Möhr kərdəndü dəhanəş duxtənd[3].

Kitab üçün səfər nəzərdədir, fəsli-digər məktub yazıla ya yazılmaya, müxalimdən istid'ayi-əfvi-nisyan və ləğziş olunur.

*Əhsənül-Qəvaid*

"Əkinçi" qəzetində Əhsənül-Qəvaid ilə şüərayi-Şirvan mabeyində düşən mübahisədə o nizaiiste'cal ilə islah eləmək səlahiyyəti əncampəzir olduğundan bəməzmun Vəsləhu beynə əxəveyküm[4]. O barədə ərzi-kəlam eyləyirəm ki, o iki firqənin niza'i-xilaf ləfzi qəbilindən olub hər iki tərəf müddəasında bərhəqdir və lakin məhəlli-kəlamları özgədir, yə'ni Əhsənül-Qəvaid həzrətləri nəsihət məqamında zəmm edən gərək. Şe'rin o qismi olsun ki, kizbi və böhtanı və həcvi-mühərrəmi və təşbibi-qeyri-məşrui mütəzəmmindir, necə ki, o qismin xüsusunda itlaq olunubdur: ayeyi vəşşüəra yettəbiühümul-ğavun[5] ümumi ilə və hədis liən yümtəli cövfə əhədikum qəbihən xeyrən ləhu minəyyümtəli şe'rən[6] o qismin haqqında varid olub və eyzən o qismin haqqındadır. Əşşərrü mizmarün min məzamiri-iblis[7] hədisi və həm o xüsusda cənab Əbu-Əs'əd İsfahani inşa edib tərəktüş şe'rə lişşüərai ənni əyətişşe'r

---

[1] Hadisənin əlacını gərək o baş verməzdən əvvəl edəsən.

[2] Hər ikisi can yandırandır, amma bu hara, o hara.

[3] Hər kimə haq yolu öyrətdilər,
Ağzını möhürlədilər və tikdilər.

[4] İki qardaş arasında barışıqlıq yaradın.

[5] Şairlər azğın, yoldan çıxmış adamlardır.

[6] Şe'ri əzbərləyib beynə doldurmaqdansa, hər cürə qəbih şeyləri qarına doldurmaq xeyirlidir.

[7] Şər iblisin qavallarından birisidir.

min-səqtil məta[1]. Şüəra həzrətlərinin dəlaili ki, şe'rin mədhini iqtiza eləyir, gərək mühəvvəl olsun, o qism şe'rə ki, elmə və hikməti və tən-şiti ixvanı təşhizi-əzhani və mədh və həcvi-məbahi mütəzəmmindir, necə ki, o qismin xüsusunda varid olub silsileyi-istisna innəlləzinə amənu və əmilus-salehat və zikrullah[2] və həm o xüsusda varid olub hədis innə minəşşe'ri ləhikmətin və hakəza lillahi künuzün təhtəl-ərşi məfatihüa-sünnəti əlsinətüşşüəra[3] və həm şair deyib ənzəmüş şe'ri və laimün məzhəbi[4].

Pəs bu şe'r mə'quləsi zişt-ziba qismindən olub yaxşısı yaxşı və yamanı yaman olduğundan fövqdə məstur olan xilafda hər iki tərəfin kəlamı müstövcəbi-tə'vil və qabili-tə'dil imiş və həqiqətdə onların arasında niza' yox imiş. Necə ki, hədisi-şərifdə varid olub: Əş şe'rü kəlamün fəhəsənühu həsənün və qəbihühu qəbihün[5]. Fəlihaza mən bəndeyi-həqir o tayfaların hər ikisindən arzu eləyirəm ki, artıq cəngü cidal mə'rəzində dirazzəbanlıq eləyib bu dəfə bir-birilə əfv və səfh eləsinlər, necə ki ayədə varid olub: vəlatənazəu fətəfşəlu və təzhəbu rəhbükum[6].

*Məmnun Əlqədari*

## TƏZƏ XƏBƏRLƏR

İyun ayının 5-də Təbrizdən rus konsulu Badkubə karantininə tel göndərib ki, Azərbaycan vilayətinə taun naxoşluğu düşüb. O yerin Təbriz şəhərindən 55 ağac arası var.

* * *

Şirvandan yazırlar ki, bu il quraqlıq olduğuna görə köçərilər tez qalxıb yaylaqlara gəlmişdilər, amma birdən bərk qar yağıb, onların heyvanlarını yarısından ziyadə tələf edib.

---

[1] Şe'ri şairlərə tərk etdim, çünki o geyilib işlənmiş mə'tadır.

[2] O şairlər ki, iman gətirib doğru yol ilə gedirlər – onlar istisna olunur.

[3] Şe'rdə hikmət vardır və həmçinin Allahın ərşi altında bir çox xəzinələr vardır ki, o xəzinələrin açarları şairlərin dilidir.

[4] Şe'r də yaradıram və məzhəbimin dalınca da gedirəm.

[5] Şe'r kəlamdır, onun gözəli gözəl, çirkini çirkindir.

[6] Dava-dalaş etsəniz, müvəffəqiyyətsizliyə uğrayıb hörmətsiz olarsınız.

* * *

Baharda quraqlıq olduğuna Badkubə uyezdinin əkininə, ələlxüsus bostanlarına çox zərər olub.

* * *

Qəzetlərdə Soltan Əbdüləzizin əzl olmağını belə bəyan edillər: may ayının 11-də tələbələr sədri-ə’zəm Mahmud Nədim paşanı və şeyxülislam Həsən əfəndini xaric edib dincələndən sonra soltanın anası (validə) qurbanlar kəsib, onun ətini və pul paylamaq ilə xalqı soltandan razı etmək istəyib. Amma təzə vəzirlər sədri-ə’zəm Məhəmməd Rüşdi paşa, sərəsgər Hüseyn Övni paşa, şeyxülislam Xeyrullah əfəndi, vəzir Midhət paşa mayın 17-də axşam əsgəriyyə imarətinə cəm olub, jeneral Rədif paşanı Soltan Əbdüləzizin yanına göndəriblər ki, onun əzl olmağın ona mə’lum edib, sarayı 15 min əsgər ilə əhatə etsin. Gecə ikən Dolmabaxça sarayından Murad əfəndini gətirib sübh saat 7-də Məhəmməd Muradi-pəncüm ismində soltan edib, Soltan Əbdüləzizi və onun uşaqlarını və anasını aparıb Topxana sarayında məhbus ediblər. Sonra toplar atdırdıb həzrət Məhəmməd Muradi-pəncümun soltan olmaqlığın xalqa bəyan ediblər ki, tamam İstanbul əhli 3 gün 3 gecə şadyanalıq edib.

Həzrət Məhəmməd Muradi-pəncum 35 sinndədir. Avropa qaydası ilə tə’lim olunub, türk, ərəb, fars, firəng, ingilis dillərin yaxşı bilir və özü yeni türk dəstəsindədir.

Osmanlı müsəlmanlar 2 dəstədir ki, onun birinə qədim və birinə yeni türk deyirlər. Yeni türklər Avropa qaydası ilə tə’lim olunan şəxslərdir ki, o qaydanı işlədmək istəyirlər. Onların sərkərdələri xədivi-Misrin qardaşı Mustafa Fazil paşa idi ki, bu il payızda mərhum olub. İndi o dəstənin başçılarından birisi zikr olan Midhət paşadır, birisi Firəngistanda vəziri-muxtar Sadiq paşadır, birisi Xəlil Şərif paşadır ki, mərhum Mustafa Fazil paşanın qızı prins Nazlını alıb ki, məzkurə Nazlı firəng, ingilis və qeyri Avropa dillərin yaxşı bilirdilər. Midhət paşa sədri-ə’zəm, Sadiq paşa vəziri-xəzanə və Xəlil Şərif paşa vəziri-məktabxana olacaqlar. Xülasə, indi ümurati-dövlət yeni türklər əlindədir və deyirlər onların ixtiyar olmağına, yə’ni Soltan Əbdüləzizin əzl olmağına bais İngilis vəziri-muxtarı İlliot olub.

Həzrət Məhəmməd Muradi-pəncüm ona xəzanədən verilən iki milyon manat məvacibdən 500 min manat xəzanəyə qaytarıb. Ondan savayı soltanın məxsusi mə'dən, zavodların və qeyrə xəzanəyə bağışlayıb və bir də hökm edib ki, vəzirlər məsarifi-xəzanə üçün məktəbxanalar xüsusunda millət məclisi bina etməkdən ötrü və qeyrə təzə qaydalar bina etsinlər.

Mayın 24-də Soltan Əbdüləziz qolundan qan alıb özünü öldürüb. Ondan sonra onun 100 milyon manat pulu çıxıb ki, onu xəzanə zəbt edib, bir hissəsini qulluq əhlinə məvacib verib ki, onlara bir ildir məvacib verilmir imiş: bir hissəsini dövlət borclularının pulunun sələmini verib və artıq qalanını saxlayıb ki, cəng üçün məsrəf olunsun.

* * *

Berlində Osmanlı işlərindən ötrü yazılan sülhnamənin üzünü dövləti-Osmaniyə pişnəhad etməmiş, yeni türklər Soltan Əbdüləzizi xaric edib, işləri dəyişdirdilər. Çünki ol sülhnaməyə görə Osmanlı dövləti ayın müddətində öz xaçpərəst tabelərilə cəngi qurtarmasa, ol sülhnaməyə razı olan dövlətlər gərək güc ilə onu qurtareydilər, ona binaən İngilis buna razı olmayıb öz cəng gəmilərini Osmanlıya köməyə göndərdi və belə deyirlər ki, 700 min qızıl da göndərib ki, əsgərə xərc etsin. Firəng dövləti əvvəl o sülhnaməyə razı olmuşdu, amma sonra geriləyib məsləhət elədi ki, tamam Avropa dövlətləri Osmanlı işləri barəsində təzədən məsləhət etsinlər. İndi Berlindən tel var ki, bu günlərdə rus, Prus, Avstriya vəzirləri o barədə təzədən məşvərət edəcəklər. Pəs Avropa dövlətlərinin arasında danışıq qurtarmayıb, lakin Serb və Qaradağ əyalətlərinin əhli rus generalı Çernovu və qeyri əfsərləri gətirib öz əsgərlərinə nizam öyrədib, dava üçün tədarükdədirlər. Deyirlər onlar özləri Osmanlı ilə cəng başlayacaqlar. Həzrət Məhəmməd Muradi-pəncüm Avropa dövlətlərin irəliləyib özü cəng edən xaçpərəst tabelərinə altı həftə möhlət verib ki, bu müddətdə cəng etməyəcək və peşman olub geri qayıdana kömək edəcək.

* * *

İyun ayının 5-dən tel var ki, sərəsgər Hüseyn Övni paşanı və sədriə'zəm Məhəmməd Rüşdi paşanı ki, qədim türk dəstəsindən idilər, xalq öldürüb.

* * *

Qəzetlərdə mərhum Soltan Əbdüləzizin bədxərcliyini belə yazırlar: onun 6 min nökəri, 1200 övrəti, 625 atı, 48 həkimi, 12 mollası, bir neçə münəccimi var imiş ki, onlara ildə 15 milyon manat xərc olurmuş.

* * *

"Novı teleqraf" qəzeti yazır ki, Mahmud Nədim paşa əzl olandan sonra camaatın xofundan qaçıb Rusiyanın Odes şəhərinə gəlib.

* * *

Tələbələr mayın 11-də Soltan Əbdüləzizə ərz edən zaman demişdilər ki, Rus dövlətindən təvəqqə olunsun ki, öz vəziri-muxtarı general İqnatyevi İstanbuldan aparsın. Ona binaən cənab İqnatyev bir gün piyadə tamam İstanbulun küçələrin gəzib ki, xalq görsün ki, o qorxmur.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского
Губернского Правления.

*2-ci sənə* *12-ci nömrə*

*Fi 15 cəmadiəlaxir, sənə 1293*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Cümə günü*




*Fi 25 iyun Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## E' L A N

İvanov adlı dişqayıran usta general Lazarevin evinin altında mənzil tutub. Dişi olmayanlara diş qayırır ki, əsli dişdən ona təfavüt vermək olmaz.

## DAXİLİYYƏ

Əgərçi bizlərdə adətdir ki, ümurat əhlini üzünə tə'rif edib, dalda qeybət edəllər və ümuratdan çıxanda ola kəs hamının yadından çıxar, amma Avropa vilayətlərində bu adət yoxdur. Onlar elm sahibləridir və elm yolu ilə hər kəs insandır və insanlığın əvvəlinci şərti insaf, doğruluq və əldən gəldikcə qeyrilərə yaxşılıq eləməkdir. Belədə ümurat əhli yaxşılıq elədiyinə onu tə'rif etmək Avropa qaydasına namüvafiqdir. Lakin Avropa vilayətlərində bir adət var ki, ondan biz bixəbərik. Onlarda bir kəs elm yolu ilə ümuratı dolandırmaqlıq ilə millət işlərinə rövnəq verə və millətin irəli getməyinə bais ola, ol kəs üçün yadigarlıqlar bina edib onun millət işlərinə elədiyi yaxşılıqları yazıb, mə'lum edirlər ki, onun ismi tarixlərə düşüb baqi olsun.

Bu səbəblərə görə nə qədər ki, cənab Staroselski bizim Badkubədə qubernator idi, o bizim qəzet haqqında elədiyi yaxşılıqlardan danışmırdıq, amma indi ol cənab Badkubədən çıxıb gedib, ona binaən onun

yaxşılıqlarından bir neçə kəlmə danışmağı biz özümüzə vacib bilirik. Cənab Staroselski bizim qəzetin bina olunmağına bais olub. 3 il bizə izn vermirdilər ki, qəzeti çap etdirək. Buna ümdə səbəb bu idi ki, Badkubədə dövlət tərəfindən qəzetlərə mülahizə edən adam yoxdur. Amma ol cənab bizə zamin olub ol izni bizim üçün aldı. Bir neçə müsəlman birləşib söz vermişdik ki, hürufat gətirdib qəzeti çap etməkdən ötrü əlahiddə çapxana açdıraq. Amma biz hürufatı İstanbuldan gətirəndən sonra ol icma bərhəm oldu və biz özümüz çapxana açdırmağa məqdur olmadıq. Ol zaman cənab Staroselski zikr olan hürufatı qubernski pravleniyanın çapxanası üçün aldı ki, indiyəcən orada bizim qəzet çap olunur. Sonra uyezdni naçalniklərə hökm yazdı ki, kəndlərə poşt işləmədiyinə onlardan qəzet istəyən olsa, çaparlar ilə onlara qəzet göndərsinlər. Xülasə, cənab Staroselski həmişə "Əkinçi" qəzetinin xeyirxahı var idi. Ona binaən biz özümüzə vacib bilib bu bir neçə kəlməni onun yaxşılıqları barəsində yazıb, bizim qəzetin dostlarına bəyan edirik.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Heyvanatdan əmələ gələn, əkin yerini qüvvətli edən şeylərin birisi sümükdür ki, onu ya dəyirmanda çəkib, ya əl ilə əzib, ya bə'zi şeylər vurmaq ilə yumşaldıb işlədirlər. Sümüyü dəyirmanda çəkmək maşın ilə olur. Ona binaən bizim adam üçün bu tövr ilə onu işlətmək məqdur deyil. Amma əl ilə əzmək asandır. Bundan ötrü yaxşı olur ki, onu bir az yandırasan. Məsələn, çörək bişən təndirin odunu çıxarıb onun içini sümük ilə doldurub ağzını örtüb bir neçə saatdan sonra çıxarıb çəkic ya dəmir ağaclar ilə əzəsən. Çünki bu tövr ilə sümüyü narın etmək çətindir və sümük nazik olmayanda əkin yerində tez çürüməz, ona binaən onu bir az əzib çürüdüb sonra yerə çəkmək yaxşıdır. Onu çürütməkdən ötrü at, qoyun nəcisinə, torpağa, külə, yanmış, amma su dəyməmiş əhəngə qarışdırıb, taya vurub onun üstünə gündə bir dəfə su, ya mal sidiyi töküb bir neçə gündən sonra açıb, soyudub, yerə çəkib şuxm etmək gərək. Çünki sümük bir az da yananda onun ələfiyyata xörək olan şeylərinin bir hissəsi tələf olur, ona binaən yaxşı olur ki, onu bişirib sonra zikr olan qayda ilə çürüdüb işlədəsən. Sümüyü belə bişirirlər: bir böyük qazanı manclıq tiyanı kimi odun yanan yerin içinə möhkəm edib onu dibinə ot çəkib, üstünə sümük yığıb, ağzınacan su

ilə doldurub, ağzını bərkidib, 24 saat qaynatmaq gərək. Qazanın dibinə ot çəkməkdən murad oldur ki, sümük onun dibinə dəyib yanmasın. O qaynayan vaxtda hərdən bir üstə su tökmək gərək ki, sümüklər həmişə qaynamış su içində olsun. Sonra onu çürüdən vaxtda onun suyunu tayanın üstə tökmək yaxşıdır. Sümüyü heç əzməmiş və bişirməmiş də çürütmək olur. Ona bişmiş, amma su dəyməmiş əhəng ilə yarıbayarı qatışdırıb, ondan taya vurub, üstün torpaqlayıb, 5-6 həftə mürur ilə soyuyanda sümük çürüyür. Amma lazımdır ki, tayanın yeri taxtalanmış ya daş ilə döşənmiş ola ki, onun suyu axıb getməsin. Sümüyü zikr olan qaydalar ilə çürüdəndə əgər ondan mütəəffin iy gəlir isə, yaxşı olur ki, tayanın üstə əzilmiş qarğa duzu çəkəsən ki, sümüyü havaya dönüb tələf olmaqdan mühafizət etsin və bir də sümüyü bilmərrə yandırıb, onun külünü əkin yerinə qarışdırırlar, amma belə çox yanmış sümük elə qüvvətli olmaz.

## MƏKTUBAT

F ə s i l 14. Bir şair bəndəni həcv edib, həqiqət bizim mətləbimizi sübut və öz qabiliyyətin büruz edib. Çün bizim onilə ədavət ya rəfaqətimiz olmadığına bu neçə beyt ona işarədir:

Qürəba ru bəkari-xiş pərdaz
Bədihəxaniyü meyxanə kün saz
Həman bahəmpərani-xud bepər baz
Künəd həmcins, bahəmcins pərvaz[1].

Və həcvdən qeyri məktubən yazır ki, sən xalqı təvəkküldən salıb dünyanı mədh və şe'ri qədh edirsən. Əvvələn mən hüsni-əş'arı əşşe'ri fil-kəlam kəl-milhi fittəam[2] babətindən mədh etmişəm, necə ki öz mətləbimizə ayat və əhadis gətirmişik. Pəs danışıq batil və bihudə əş'ar üstədir ki, onların əvəzində kütübi-elmi, elmi-hesab və qeyrədən ətfal üçün oxumaq lazımdır. Heç zişüur həsənə qəbih və qəbihə həsən deməz.

---

[1] Qarğa, get öz işinlə məşğul ol,
Bədihəxanlıq və meyxanə düzəlt,
Həmin öz qaydalarınla yenə uç.
Həmcins həmcinsi ilə pərvaz edər.

[2] Kəlamda şe'r təamda duz kimidir.

Saniyən, biz xalqı təvəkküldən salmarıq, çün təvəkkül bə'd əzelm və tədbir gərəkdir, ona binaən deyirik: elm və tədbir sahibi gərək olmaq, ya təvəkkül əhli olasan. Məsəl, gəmiyə oturub təvəkkül ilə dəryaya getmək, biəsbab özün dəryaya salıb demək:

Gər nigəhdari-mən anəst ki mən midanəm
Şişəra dərbəğəli-səng nigəh midarəd[1].

Yainki:

Əgər tağı-aləm bəcünbəd zica
Nəbürrəd rəngi ta nəxahəd xuda[2].

Çün hikməti-banieyi-ilahi hər şeyə bir xasiyyət verib və hər əmələ bir nizam qurub, bu sözlər nəinki təvəkküldür, bəlkə özü nizamdan çıxıb sahibinə küfrandır. Belə ki, həzrət rəsuli-əkrəm üçün xəbər verdilər ki, neçə nəfər xalqdan kənar olub ibadət edirlər həzrət onun yanına təşrif-fərma olub, onları o aləmdən mən' edib buyurdular: daxil olun xalq içinə və kəsbi-məişət edin, ta siz xalqdan və xalq sizdən nəfbərdar olsun. Ərz elədilər ki, biz əhli-təvəkkülük və Allah ruzirəsandır. Həzrət buyurdular: biduni-təhsil və sə'y təvəkküldən fayda olmaz, bəlkə Allah düşmən tutar bikar adamı və onun duasın müstəcab etməz. Pəs, canimən, əvvəl gərək əsbab fərahəm gətirmək, ondan təvəkkül etmək. Aya millət, dövlət üçün əsbabi-tərəqqiyat, alati-hifzimillət, dövlət və rövnəqi-ümuri-ticarət və sənaət və qeryə lazım deyil? Əlbəttə, lazımdır. Əgər olmaya, bəqayi-millət müşkül olur. Pəs lazım olan surətdə nə qədər kamil ola yaxşıdır. Bizə tərki-dünya buyurmayıblar və tərki-dünya həm etmək ilə millət üçün tərəqqi hasil olmaz. Lihaza, bizim məqsudumuz budur ki, işlər elm ilə olsun ki, nəf' artıq ola. Ona söz yoxdur ki, biz hamı millətdən ziyadə təhsili-dünya üçün çalışırıq, amma elm olmadığına dalı qalmışıq. Pəs təhsili-dünya təriqeyi-həqq ilə pişrəfti-ümuri-millət üçün eyni axirətdir. Ey qardaşlar, sə'y edin ta möhtac olmayasınız. Əgərçi dünyanın binası ehtiyac plədir, amma bəqədri-mümkün gərək möhtac olmamaq. Aləmdə ondan böyük eyb yoxdur ki, şəxs öz əməlin möhkəm etməyə. Qonşudan möhtac

---

[1] Əgər məni qoruyan mən bildiyimdirsə, o, şüşəni daşın bağrında saxlayar.

[2] Əgər dünyanın qılıncı yerindən oynasa,
Allah istəməsə, bir damarı da kəsməz.

olan şəxs üçün neçə qism ölüm var, biri odur ki, bu zəmanə xalqına izhari-hacət edə:

On ki şiranra künəd rubəhməzac
Ehtiyacəst, ehtiyacəst, ehtiyac[1].

Nə qədər elm və kamal sahibi-olduqca insan bu ehtiyaclardan məhfuz qalır, ona binaən təhsili-elm lazımdır, yoxsa nə ki dosta, bəlkə düşmənə həm möhtac olur.

*Əhsənül-Qəvaid*

## ELM XƏBƏRLƏRİ

Çünki yağsız zindəganlıq etmək müşküldür və Avropa dövlətlərində xalq çox olduğuna çox mal saxlamaq olmur, ona binaən yağ baha olur. Bu səbəblərə Amerikada bir zavod bina edib, mal piyindən inək yağına oxşayan yağ qayırıllar. Zavod gündə 720 put yağ çıxardır ki, inək yağı kimi yumşaq və dadlı olur. Ol zavodda piyi 2 saat suda saxlayıb, sonra maşın ilə xırda doğrayıb, ağac qablara doldurub, üstə su töküb, su buğu ilə qaynadıllar. Onun üzünə çıxan yağı yığıb təzədən inək südü ilə belə qaynadıllar ki, zikr olan yağ əmələ gəlir.

* * *

Avropa vilayətlərində ağac mişarlayan zavodlar var. Ol zavodlardan ağac mişarlanmaqdan əmələ gələn ovuntunu yığıb, onu belə işlədillər: onu yandırıb tüstüsündə əti qaxac edillər, ya onu ələf yerinə isladıb heyvana yedirdillər, ya mal qanı ilə qaynadıb ondan xəmir qayırıb ol xəmirdən kiçik, yaxşı şeylər, məsələn, sırğalar qayırıllar, ya onu yapışqan ilə qaynadıb, bərkidib, sonra mişarlayıb, taxta qayırıllar, ya onu palçığa qarışdırıb ondan kərpic kəsirlər ki, o kərpicləri yandıranda ağacın ovuntusu yanıb tələf olduğuna çox deşikli kərpic əmələ gəlir ki, ondan tə’mir olan otaqlar hava çox keçdiyinə ziyadə sərin olur.

---

[1] Şirləri tülkü təbiətli edən
Ehtiyacdır, ehtiyacdır, ehtiyac.

* * *

Çəyirtgəni bə'zi vilayətlərdə belə yeyirlər: onun qanadlarını və ayaqlarını ütüb bədənini yağda qovururlar, ya suya salıb bişirirlər.

* * *

Avropa məmləkətlərində kitabxanalar var ki, hər kəs gedib lazım olan kitabı orada oxuya bilir. Ol kitabxanalarda olan kitabların və hər bir məmləkətin xalqının hesabına gedib, belə bəyan edillər ki, Firəngistanda və İtaliyada hər 100 adama 12, Belğidə 11, Avstriyada 7, İngilisdə 6 və Rusiyada 1 kitab düşür.

Avropa dövlətlərində 30 illik müddətində qəhvə içmək birə səkkiz artıb. İndi hər bir məmləkətin xalqının və orada içilən qəhvənin hesabına gedəndə bəyan olur ki, bir adama Belğidə 8, Hollandiyada 7, Şvesariyada 6, Daniyada 5, Germaniyada 4, Firəngistanda 3, Avstriyada 1 girvənkə, İngilisdə 3 çetvər, Rusiyada 1 çetvər qəhvə içilir.

* * *

1873-cü sənədə Aybers adlı nemes Misrin Jizə şəhərinin yavıqlığında bir ərəbdən bir tibb kitabı alıb ki, ol kitab 3427 il bundan sabiq yazılıb. Bu qədimlikdə tibb kitabı heç yoxdur.

* * *

Amerikada bir fortepiano çalan usta 10 fortepianonun arasında teleqraf maşını qayırıb ki, onların birisi çalanda hamısı birdən çalır.

* * *

Bu il avqust ayının 1-dən 15-cən nemeslərin dəyirmançıları Berlin şəhərinə cəm olacaqlar. Orada onlara dəyirmanın hər bir mayəhtacını və onları necə işlədəndə artıq nəf' olmağı göstərəcəklər.

* * *

Çörçil adlı ingilis təbibi sinə naxoşluğu olan kəslərin bədəninin əczalarını imtahan edib deyir ki, ol naxoşluğa düşən şəxsin bədənində fosfor adlı şey azalır. Çünki fosfor ki, ondan kibritlərin başı olur, bərk zəhərdir, ona binaən onu çox az naxoşa vermək olur. Bu təcrübəni edənlər deyir ki, sinə naxoşuna fosfor vermək qeyri müalicələrdən yaxşıdır.

* * *

Rus dövləti Ceyhun, yə’ni Amu-Dərya çayının kənarını Xivə xanlığından alıb zəbt edəndən sonra sə’y edir ki, zikr olan çayı Badkubə dəryasına axdırsın. Ol çay qədim zaman Badkubə dəryasına axırmış, amma indi Aral gölünə axır. Ceyhun çayı yerini dəyişdirib, Aral gölünə axmağın səbəbini belə bəyan edillər: Xivə xanlığının əhli yayda Ceyhun çayının suyunun 12-dən 10 hissəsini öz əkin ziraətlərinə işlədillər. Ona binaən suyun içində əmələ gələn cəzirələr artıb, onun yolunu tutub ki, su Aral gölünə axır.

## TƏZƏ XƏBƏRLƏR

İyun ayının 5-də Zəkərtala şəhərində bərk yanğı olub. Şəhərin 3-dən 2 hissəsi bilmərrə yanıb. Ona binaən Rusiya qəzetləri evləri yananlar üçün pul cəm edillər. Bu səbəblərə yazıb mə’lum edirik ki, hər kəs Zəkərtala şəhərinin xalqına Allah rizasına pul vermək istəsə bizə göndərsin ki, dərhal onlara göndərək.

* * *

Badkubənin təzə qubernatoru general Puzin beş gündür ki, Badkubəyə gəlib.

Avropa dövlətlərinin hamısı söz veriblər ki, Osmanlı dövlətinin daxiliyyə işlərinə qarışmasınlar və Osmanlı dövlətinə tabe olan Serb və Qaradağ əyalətlərinin Osmanlı ilə olan işlərini daxiliyyə işləri hesab etsinlər.

* * *

Osmanlı dövlətinin öz xaçpərəst tabeləri ilə elədiyi cəng az qalmışdı qurtarsın. Avropa dövlətləri Osmanlı dövləti təzədən bina elədiyi qaydaları görüb, söz verdilər ki, onların daxiliyyə işlərinə qarışmasınlar. Həzrət Məhəmməd Murad altı həftə möhlət verdi ki, peşman olan xaçpərəstlər evlərinə qayıtsınlar. Ona binaən, onların çoxu qayıdıb gəlir idi. Bu əsnada iyun ayının 17-dən tel gəlib ki, Serb əyalətinin əhli osmanlı ilə cəng başlayıb. Onların knyazı Milan sərhəddə cəng eləməyə və ruhaniləri əsgəri dualamağa gediblər. İyunun 20-dən tel var ki, Qaradağ əhli də Osmanlı dövləti ilə cəng başlayıb. Onların knyazı Nikolay öz əsgəri ilə sərhəddi keçib Osmanlı yerinə daxil olub. Pəs işlər təzədən genə pərişan olub.

* * *

İyun ayının 5-də Midhət paşanın evində vəzirlər cəm olub millət məclisi bina etmək barəsində məşvərət edən vaxtda bir Həsən adlı çərkəs içəri daxil olub sərəsgər Hüseyn Övni paşanı, vəziri-xariciyyə Rəşid paşanı, Midhəd paşanın nökərini öldürüb, vəziri-dərya Keysərli paşanı yaralayıblar. Osmanlı qəzetləri deyirlər ki, onu mərhum Soltan Əbdüləzizin anası göndərmiş imiş ki, Hüseyn Övni paşa onun oğluna xəyanət etdiyinə onu öldürsün. Amma zikr olan kəslər məzkur çərkəzi tutmaq istəyiblər, ona binaən onları da öldürüb. Lakin xaricə qəzetlərinin bə’zi deyir ki, Hüseyn Övni paşa və Rəşid paşa millət məclisi bina olmağa razı deyil imişlər. Ona binaən onları yeni türklər öldürüblər ki, millət məclisi bina etməyə mane olmasınlar. Zikr olan çərkəzi iyunun 17-də boğazından asdırıblar.

* * *

İstanbuldan türk qəzeti yazır ki, həzrət Soltan Məhəmməd Murad ki, məxsusi soltanlıq zavodların və qeyrə xəzanəyə bağışlayıbdır, onlar ildə 5 yüz min lirə, yə’ni 3 milyon 500 min manat mədaxil gətirir. Ondan masəva həzrət soltan söz verib ki, öz saraylarında qulluq edənlərə özü məvacib versin, amma irəli onlara xəzanədən 300 min lirə verirlər imiş və bir də ol həzrət 50 at saxlayıb, artığını satıb ki, o pulu əsgəriyyəyə məsrəf etsinlər.

* * *

Misrin xədivi Soltan Məhəmməd Murada bid’ət edib. Həzrət şahənşahi-İran ona belə tel göndərib: gözünüz aydın olsun ki, abavü əcdadınızın taxtına oturmusunuz. Xudavəndi-aləm müsəlman millətinin ki, onları bizə tabe edib, şövkətini və izzətini artıq eləsin. Həmçinin tamam Avropa padşahları ona mübarəkbadlıq göndəriblər.

* * *

Serb vilayətinin mitropoliti Mixail Peterburq şəhərinə gedib ki, əsgəriyyə üçün altı milyon manat borc alsın.

* * *

Osmanlıda qoyulan təzə qayda bu məzmunda olacaq: hər bir millət və hər məzhəb dövlət üçün bir ixtiyarda olsun. Hər bir məzhəbin ruhanisi öz işlərini mülahizə etsin. Soltan genə müsəlmanlar üçün xəlifə hesab olunsun. Hər bir kəsdə ixtiyar olsun ki, millət məclisinə calis zübdə etsin. Hər vilayət 3 adam seçib millət məclisinə calis göndərsin. Onların hər birinə ol vilayət 3 min quruş məvacib versin. Hər 3 ildə bir millət məclisinə təzə calislər zübdə olunsun. Vəzirləri soltan tə'yin edir, amma onlar millət məclisinə cavabdəhəndədirlər. Dövlət məsləhətxanasının calislərini soltan tə'yin edir. Hər bir təzə qanunu onlar yazır, sonra millət məclisi təsdiq edir. Qəzetlərə ixtiyar olsun ki, hər bir mətləb barəsində dövlətdən iznsiz çap olunsunlar.

* * *

İyunun 17-dən tel gəlib ki, Bağdadda taun naxoşluğu qurtarıb.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*2-ci sənə* *13-cü nömrə*

*Fi 1 rəcəbülmürəccəb, sənə 1293*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Yekşənbə günü*




*Fi 11 iyul Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## DAXİLİYYƏ

Bir il tamamdır ki, bizim qəzet çap olunur. Ona binaən lazım bilirik ki, bu bir ilin hesabına gedək. Keçən il rəcəbin əvvəlindən təzə iləcən bizim 600-cən müştərimiz var idi. Bu il indiyəcən 283 bir illik, 57 yarım illik müştərimiz var. Bu halda ki, yarım il qurtarıb, onların 283-ü qalıb. Müştərimizin çoxu Quba, Dərbənd və Dağıstanın qeyri vilayətlərindəndir. Bizim şəhərlərdən ol qədər yoxdur. Məsələn, Qarabağdan 3, Şirvandan 3, Şəkidən 3, Lənkərandan 1, Gəncədən 1 adam qəzet apartdırır. Müştərimiz azalmağı çox təəccübdür. Əvvələn, qəzetin qiymətini artırmayıb, onu böyükləndirmişik, onun məzmunu, hətta kağızı da yaxşılanıb. Saniyən, bu halda hər səfər Osmanlı xəbərləri yazırıq və indi tamam dünya Osmanlı işlərindən danışır. Hətta bizim Badkubədə qulluq edənlər hər gündə bu barədə tel gətirirlər. Pəs bu əsnada bizim qəzetin müştərisi azalmaq təəccüb deyil? Əlbəttə, çox təəccübdür. Buna bir səbəb yoxdur, savayı bizim qammazlığımız. Bə'zisi biz yazdırdığımızı fəhm edə bilməyib öz anlamazlığından bizi müsəlmanlara düşmən və yazımızı böhtan hesab edir. Bə'zi deyir: bir şey yaz ki, ondan bir qəpik nəf' olsun. Yə'ni millət işlərindən bir qəpiyi artıq tutur. Ey qəpiyə milləti satan qardaşlar siz adınızı müsəlman qoyub qeyrilərin müsəlmanlığına şəkk edirsiniz. Vay, vay, sizin halınıza ki, müsəlmanlığın şərtlərindən bircə namaz qılıb, oruc tutmağı bilirsiniz.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Barama qurdunun ağzından bir su qismi şey çıxır ki, hava dəyməkdən ol şey bərkiyib ipək olur. Qurd barama qıran vaxtda bir yerdə dayanıb, ağzından çıxan ipəyin ucunu bir şeyə yapışdırıb, başını fırlandıranda o ipək sapdan onun ətrafında barama əmələ gəlir. Hər barama bir sapdan olur ki, onun tuli 400 arşına qədərdir. Ondan masəva qurdun ağzından yapışqana oxşayan bir şey çıxır ki, sapı bir-birinə yapışdırıb baramanı möhkəm edir. Bu yapışqana oxşayan şey isti suda əriyir. Ona binaən ipək çəkən vaxtda baramanı isti suya salırlar ki, ol şey əridiyinə sap aralansın. Baramanı qaynar suya salanda ol şey birdən əridiyinə yumaqdan sap birdən çıxanda pırtdaşıb düyün düşən kimi, ipək də düyün düşür. Amma su çox isti olmayanda, yə'ni ılıq olanda yapışqana oxşayan şey mürur ilə əridiyinə yumaqdan sap mürur ilə aralanan kimi ipək sapı bir-bir aralandığına düyün düşmür və bir də tiyanın içində baramanın qədəri mə'lum olmayanda onların hamısının sapı birdən aralanmadığına ipəyin bir ucu yoğun, bir ucu nazik olur. Xülasə, bizim qayda ilə ipək çəkiləndə onun bir tərəfi yoğun, bir tərəfi nazik və özü düyün-düyün olduğuna alçaq ipək hasil olur ki, onun putunu 100 manata da sata bilmirik.

Firəngistanda və İtaliyada ki, onların ipəyinin pudu 400 manata gedir, ipəyi belə çəkirlər: bir otağın divarlarına samavar puçu kimi bir neçə puç möhkəm edib bir qeyri otaqda böyük qazanda suyu qaynadıb onu novçalar ilə hər puça aparırlar. Onların hərəsinin altında bir kiçik tiyan var ki, puçu açanda ona isti su tökülür. Onu tiyanların içində ılıq oluncan, yə'ni elə oluncan ki, adam onun içində əlini saxlayanda azar etməsin, saxlayıb, sonra say ilə onun içinə 7-8 ya 10-12 barama atıb kiçik, hamvar ağac ilə onları tərpədib, hər baramanın ipəyinin ucunu tapıb onlara çarxa dolandırırlar ki, o bir çarxın üstə hamı tiyanların ipəyi yığılır. Hər tiyanın yanında bir uşaq ya övrət durub tiyanın suyu soyuyanda ona isti su tökür və əgər baramanın birisini ipəyi qırılsa, onun ucunu tapıb qeyri ipəklərə qarışdırır ki, ipək sapı bir havada, bir yoğunluqda olsun. Tiyana tökülən baramanın qədəri sapın yoğunluğuna baxar. Nazik sap istəyən az və yoğun sap istəyən çox barama tökər. Amma adətdir 7-10 barama tökərlər. Pəs Firəngistanın və İtaliyanın ipəyi bizim ipəkdən birə dörd baha satılmağa səbəb oldur ki, onların ipəyi bir yoğunluqda olduğuna ondan çox ə'la əlvan parçalar qayırıllar, amma bizim ipək nahamvar və düyün-düyün olduğuna ondan

bimiqdar tafta ya onun kimi qeyri parçalar toxuyurlar. Pəs, bizim mancələqçilər, əgər zikr olan qayda ilə ipək çəkməyə məqdur olmasanız, laməhalə bunu yaddan çıxarmayın ki, tiyanın suyu gərək ılıq ola, qaynar olmaya və baramanın qədəri mə'lum ola ki, ipək bir yoğunluqda olsun. Belədə yəqin ipəyi birə-bir artığa satarsan.

## MƏKTUBAT

Bir çocuq öz anası rəhmindən düşüb dünyaya gəldiyində və körpə lisanı açıb cüzvi fərasət kəsb elədiyi vaxtda öz pədəri və anasından savayı dünyada heç kimsə böyük yoxdur, – deyib fəhvasında bulunurdum. Caizdir bunun üçün ki, həmişə gözü qabağında onları görür və onların məhəbbətlərilə bəslənir, onlardan eşitdiyi sözlər üzərinə və verib aldığı şeylərə göz keçirib əfkar edir. Öz pədəri və anasından yaxşıca öyrəndiyindən, əvvəl hər bir ləvazimata lisanı təpərindəki qədər yek-digərinə az-az ism verir. Ondan sonra su, çörək, süd, çay deməyi başlar. 4-5 sinninə təcavüz etdiyi vaxtda küçələrə çıxıb gəzmək istər. Özgə bir səbəb üçün deyildir, ancaq daş atmaq, torpaq sovurmaq ilə gün keçirsin. Təəccüb budur ki, çox ana övladlarını bu halda gördüklərində sükut edib bir söz deməz. Lakin hər bir çocuq məktəbxanalardan əvvəl birinci dərəcə gərək tərbiyət və tərbiyətsizilyi öz pədər və anasından öyrənməlidirlər. Ona binanə hər kəs daima mədyundur ki, övladına mədəniyyəti öyrədib, tərbiyət versin ki, ol çocuq da irəlidə insanın tamam sifəti ilə dünyada günlər və saatlar keçirtsin. Bu əfkar dəxi hər bir anada bulunması lazimənləndir. Bir kərə düşünməlisiniz ki, bu həzaran səbt etmək və fəna sözlər söyləmək əcəba çocuqlar bunları kitabdamı oxuyurlar? Haşa. Bu lüğətlər heç bir zaman çap olunmamış və olunmaz. Ancaq övladlar körpə zamanı öz pədər və analarından öyrəniblər. Çox pədər övladımı söyərəm deyərəm deyim, başlar ona fəna sözlər öyrətməyə, zavallı çocuq da yaman sözlər ağzından çıxarmağa adət edib, sonra eşiyə çıxdığı vaxtda dəxi bu misilli bir çənd sözlər tərbiyəsiz yoldaşlardan eşidib, günbəgün artmağa başlar və belə böyüdüyünə mədəniyyətdən məhrum olur. Əgər pədərləri və anaları tərəfdən kömək olmasa yalqız məktəb çocuğu tərbiyə və mədəniyyət sahibi etməyə məqdur deyil.

Əcəba, nə əfkar sahibi ola bilir bir övlad ki, gündüz axşama qədər məktəbdə oxuyub öz xanəsinə gedəndə ata və anasından fəna sözlər

eşidib onların bəd əməllərinə yoldaş ola? Haşa, belə oxumaqdan bir nəf' olmaz. Fəqət çox pədərlər və analar öz övladlarını özləri tərbiyət etmədiyindən başqa onların əfkarlarına dəxi zərər gətirməyə səbəb olurlar.

*Kars konsulunun mütərcimi Xaçatur Qorxmazov*

## ELM XƏBƏRLƏRİ

Cənab Vamberi (9-cu nömrənin daxiliyyəsinə bax) Məğrib-zəmin ilə Məşriq bir-birindən elm öyrənməyi belə bəyan edir: həzrət xəlifələrin zamanında ki, Məşriqdə elm və adət artıq idi, Məğrib, yə'ni Avropa əhli onların elm kitablarını gətirdib, öz dillərinə tərcümə edib, uşaqlarına oxutmaqlıq ilə bir qərinədən sonra tərəqqi edib, təzə elmlər ixtira edib, əhli-islamdan çox irəli gedib onlara hər bir yolda faiq gəldilər. Əhli-islam Avropa əhlinin gücünü görüb elə fikir elədi ki, büsat ancaq əsgəriyyə nizamındandır. Ona binaən Osmanlı, İran, Əfqanıstan, hətta Buxara dövlətləri Avropadan nizami-əsgəriyyə öyrədənlər gətirdib öz əsgərlərinə nizam öyrətdilər ki, guya sağ və ya sol ayağını irəli ya geri qoy deməyi bilmək ilə əsgər qüvvətli olur imiş. Onlar heç fikir eləmədilər ki, qarnı ac, bədəni üryan əsgərin nizamından bir fayda olmaz ki, əsgərə nizam öyrədəndən irəli qanuni-külliyə qoyub xalqı xoş güzəran etmək gərək ki, təhmilat artsın və onunla əsgərə məvacib vermək olsun ki, elmsiz əsgər güclü ola bilməz. Gərək elm yolu ilə hansı xörəkdən insanın bədəni qüvvətli olmağı bilmək. Gərək elmi-tibbiyyədən xəbərdar olan həkimlər olsun ki, ona müalicə edə. Əsgərə hər bir elmdən xəbərdar sərkərdə lazımdır. Xülasə, onlar bunu başa düşmədilər ki, nizami-əsgəriyyə hər bir tərəfdən nizami-külliyəyə bağlıdır. Əvvəl, nizami-külliyyə qoyub elm-ədəbi artırmaq gərək ki, sonra nizami-əsgəriyyədən bir şey hasil olsun.

Osmanlı dövləti ki, qeyri-islam dövlətlərindən Avropa əhlinə yavuqdur, bu səbəblərə bir neçə ildir ki, nizami-külliyyə qoyub məktəbxanalar bina edib, hər bir elmi öz tabelərinə öyrədir, amma ol məktəbxanalarda ancaq kişilər oxuyur, ünas tayfası elmdən bixəbərdir. Çünki tərbiyətin binası ana ilədir, uşaq 7-8 yaşına gəlincə ona ana tərbiyət edir, ona binaən ünas tayfası tərbiyətsiz qaldığına, Osmanlı dövlətinin kişilərə elm öyrətməyindən ol qədər nəf' olmur.

## TƏZƏ XƏBƏRLƏR

Bu halda Osmanlı dövlətinin yerləri kürreyi-ərzin 3 qit’əsində vaqedir. Asiya qit’əsində məşhur vilayətlər: Ərəbistan, Bağdad, Şam, Suriya, Hələb, Diyarbəkr, Antaliya, Konya, Ankara, Aydın, Trabzon, Ərzurum, Sivas, Qəstəmonu vilayətləri.

Afrika qit’əsində: Misir məmləkəti, Biladi-nobəcəşn məmləkəti, Nəvahiyi-məğrib, Trablisi-qərb əyaləti, Tunis əyaləti. Zikr olan vilayətlərin əhli islamdır. Bircə Trabzon, Ərzurum, Şam vilayətlərində erməni və bir az gürcü sakin olur və bir də Afrika qit’əsində olan əyalətlər Osmanlı dövlətinə ancaq xərc verillər, amma ümuri-daxiliyyələri öz ixtiyarındadır. Avropa qit’əsində Rumeli deyilən yerdir ki, aşağıda zikr olan vilayətlərə təqsim olunur: cənubda vaqe vilayətlər:

1) İstanbul vilayətidir ki, mərkəz vilayəti padşahi-ali Osman, şahənşahi-ədalətnişan, xilafəti-ila axirül-dövranın paytəxti-səltənət və qərargahi-xilafətləri olan İstanbul şəhəridir.

2) Ədirnə vilayəti ki, onun məqərri-hökuməti Ədirnə, yə’ni Adryanopol şəhəridir.

3) Səlanik vilayəti ki, onun mərkəz vilayəti Səlanik şəhəridir.

4) Qaradağ sərhəddində vaqe olan Yaniyə vilayətidir ki, onun məqərri-hökuməti Yaniyə şəhəridir.

Vəsətdə vaqe vilayətlər:

1) Tunə vilayəti ki, onun şimal tərəfindən sərhəddi Əflan və Bağdad əyalətləri və məğrib tərəfdən Serb əyalətidir. Bu vilayətin məşhur qalaları Ruscəq, Vidin, Nişdir. İndi Serb əsgərləri rus generalı Çernyayevin sərkərdəliyi ilə Niş qalasının ətrafında cəng edirlər və bu qalanı alıb, İstanbulun üstə getmək istəyirlər.

2) Üskub vilayəti ki, Serb və Qaradağ əyalətlərinin arasındadır. Onun məqərri-vilayəti Bizəhrin şəhəridir. İndi Serb əsgərləri general Zaxin (ruhanidir) sərkərdəliyi ilə bu vilayətə daxil olub. Təzəbazar qalasını əhatə ediblər. Onların xahişi budur ki, bu vilayəti alıb, Qaradağ əsgəri ilə birləşsinlər.

3) İşqudra, yə’ni Qaradağ əyaləti ki, onun 140 min nüfusu var və ümuri-daxiliyyəsi öz ixtiyarlarındadır. Osmanlıya xərc verillər. Bu əyalətin paytaxtı Çetənə şəhəridir.

Şimalda vaqe vilayətlər:

1) Bosnə vilayəti. Onun şimal və qərb tərəfləri Avstriya məmləkətinin macar və Dalmaçya yerləridir, şərqi Serbistandır, cənub

Qaradağ və Üskub vilayətidir. Bosnə 7 livaya münqəsim olur. Onların birisi Qerdseqovinədir ki, Qaradağ sərhədində və birisi İzvərnəqdir ki, Serb sərhədində vaqedirlər. Bu vilayətin məqərri-hökuməti saray Bosnə şəhəridir. Bir ildir ki, Bosnə vilayətinin əhli Osmanlı dövlətilə cəng edir. İndi Qerdseqovinə ləvayəsinin əhli Qaradağ və başqa ləvayələrin əhli Serb knyazlarına itaət etmək istəyirlər. Serb əsgərləri general Alimpoviçin sərkərdəliyi ilə İzvərnəq ləvasına daxil olublar.

2) Serb əyaləti. Onun şimal tərəfi Avstriya məmləkətinin Macarıstan vilayəti, şərqi Əflan əyaləti və Tunə vilayəti, qərbi Bosnə vilayəti və cənubu Üskub vilayətidir. Onun bir milyon nüfusu var, məqərri-hökuməti Belqrad şəhəridir. Ümuri-daxiliyyəsi öz knyazlarının ixtiyarındadır. Amma hər ildə Osmanlı dövlətinə 4600 kisə vergi verir.

3) Əflan əyaləti (Valaxiya). Onun şimalı Bağdad əyaləti və Avstriya məmləkəti, şərq və cənub tərəfləri Tunə vilayəti, qərbi Macarıstan və Serb əyalətidir. Onun məqərri-hökuməti Bukreş şəhəridir, 2 milyon 6 yüz min nüfusu var. Ümuri-daxiliyyəsi öz ixtiyarlarındadır. Osmanlı dövlətinə 5000 kisə vergi verir.

4) Boğdan əyaləti ki, ona ruslar Moldaviya deyirlər, onun şimal və qərb tərəfləri Avstriya, şərqi Rusiya və cənubi Əflan əyalətinin yerləridirlər. Mərkəz əyaləti Yaş şəhəridir. Onun 1 milyon 2 yüz min nüfusu var. Ümuri-daxiliyyəsi öz ixtiyarlarındadır. Osmanlı dövlətinə ildə 3 min kisə vergi verir. Zikr olan vilayətlərdən başqa Osmanlı dövlətinin ixtiyarında Cəzairi-Bəhri-Səfid var ki, onların böyük cəzirəsi Krid vilayəti hesab olunur. Bu vilayətlərdən başqa keçmişdə Osmanlı dövlətinin ixtiyarında Yunan vilayəti (Qresiya) olub ki, bu halda onların əlahiddə padşahı var.

Zikr olan Avropa qit'əsində olan vilayətləri Osmanlı dövləti tarixi-hicrətin 765-ci sənəsində təsxir edib. Onların əhli tamam xaçpərəst olublar. Sonra 20-50 il bundan sabiq dövlət başısoyuqluq elədiyinə onların bə'zi bilmərrə aralanıb və bə'zi ümuri-daxiliyyəsin öz əllərinə alıblar. İndi Bosnə vilayəti həm ümuri-daxiliyyəsin öz əlinə almaq istəyir. Bizim vilayətdən köçən çərkəsləri və Krım əhlini Osmanlı dövləti bu vilayətlərdə sakin edib ki, oralarda islam çox olsun.

* * *

Peterburqda universitetin professoru Lazar Budaqov rus, türk və tatar dillərində bir lüğət qayırıb, 615 vərəq, qiyməti 5 manat. Xahiş edən "Əkinçi" qəzetinin idarəsindən xəbər bilsin.

* * *

İvanov adlı dişqayıran usta general Lazarevin evinin altında mənzil tutub dişi olmayanlara diş qayırır ki, əsli dişdən ona təfavüt vermək olmaz.

* * *

Osmanlı dövləti bərk tədarükdədir. Çərkəzlərdən 15 min, Krım tatarlarından 22 min əsgər düzəldib. Bosnə müsəlmanları və xaçpərəstlərin katolikləri tamam qalxıb, serblər ilə dava edirlər. Serbistan ilə Qaradağ cəng başlayanda elə fikir eləmişdilər ki, Osmanlı dövlətinin xaçpərəst tabeləri hamısı onlara kömək edəcək, amma Yunan, Bağdad, Əflan əhli onlara bilmərrə kömək etmirlər. Tunə vilayətində sakin olan bolğarlar və albanlar tərpənirlər, amma onlardan elə kömək yoxdur. Misir və Tunis əsgərləri gəlib, Əbdülkərim paşa özü Niş qalasının əsgərinə sərkərdə gedib.

* * *

Serb əyalətinin 1 milyon xalqı var. 10 ildən ziyadədir ki, onlar Osmanlı ilə cəng etmək fikrinə düşüb təzə əsgər qanunu bina edib, zavodlar açıb, top, tüfəng, barıt, güllə-qayırmağa məşğuldurlar. Zikr olan qanuna görə Serbistanın hər bir kişisi 20-50 yaşınacan əsgər hesab olunur. Onların 4 min həmişəlik əsgəri var idi və artıq qalan kəslər hər ildə 2 ay bir yerə cəm olub nizami əsgəriyyə öyrənirdilər. İndi ki, cəng başlanıb, hamını yığıb 150 min əsgər düzəldiblər. Çünki Serbistanın tamam mədaxili 3 milyon manatdır və bu məbləğ ilə ol qədər əsgəri saxlamaq olmaz, ona binaən xalq öz məxsusi pulların, övrətlər qaş-daşların satıb əsgərə məsrəf edirlər.

* * *

Cəng barəsində gələn tellər bir-birinə bərəks gəlir. Ona binaən cəng necə olur, demək olmur. Serbistandan gələn tellər tamam deyir ki, Serb və Qaradağ əsgərləri Osmanlı əsgərlərini basıb, amma qeyri yerlərdən gələn tellərə binaən, Osmanlı əsgəri Serb, Qaradağ əsgərlərini basıb, onların yerlərinə daxil olub. Osmanlı qaydası ilə təzə soltan gərək Əyyub məscidində həzrət Osmanın qılıncını bağlıya ki, ona xəlifeyi-dövran deyələr.

İyul ayının 6-da həzrət Məhəmməd Muradi-pəncüm ol qılıncı bağlıyacaq. Deyirlər ol vaxt cənab Midhət paşa millət məclisi barəsində yazdığı qanunu xalqa bəyan edəcək.

* * *

Hüseyn Övni paşanın yerinə Əbdülkərim paşa, Rəşid paşanın yerinə Səfvət paşa tə'yin olub.

* * *

İyunun 29-da Reyxştat şəhərində Rus və Avstriya imperaturiə'zəmləri görüşüb sözləşiblər ki, Osmanlı və Serb cənginə qarışmasınlar.

* * *

"Tayms" qəzetində Hindistanın Benqal əyalətinin Kəlküttə şəhərindən iyunun 25-dən tel var ki, İngilis dövlətinin təhti-hökumətində olan Benqal və Bombey əyalətlərinin müsəlmanları mərhum Soltan Əbdüləzizin yasına məşğul olub, həzrət Məhəmməd Muradi-pəncümə mübarəkbadlıq göndəriblər.

## E' L A N

"Odesski vedomosti" qəzeti yazır ki, Serb knyazının adamı gəlib Osmanlı ilə cəng etməkdən ötrü borc pul yığır. Bir şəxs 4 min manat verib. Ol adam indi Peterburqa gedib ki, orada həm borc eləsin.

* * *

Xədivi-Misrin oğlanları İbrahim paşa və Fuad paşa Firəngistana səyahətə gediblər.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*2-ci sənə* *14-cü nömrə*

*Fi 15 rəcəbülmürəccəb, sənə 1293*

* * *

*Poşt xərci basdıran iledir*

* * *

*Yekşənbə günü*




*Fi 25 iyul Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Quba şəhərində Hacı Nəcəfqulu və Məşədi Məhəmməd adından Əhsənül-Qəvaidə yazılıb, bizim adımıza göndərilən həcv kağızını yazana bəyan edirəm ki, cənab Əhsənul-Qəvaid bu halda İrana səfərə gedib. Çünki cənab molla bizi Əhsənül Qəvaid hesab edib, ona binaən biz Əhsənül-Qəvaidin əvəzində ol cənaba ərz edirik ki:

Gər nəbinəd beruz şəbpərə çeşm,
Çeşmeyi-aftabra çe günah?[1]

* * *

Bir şəxs bizə bayatı göndərmişdi ki, belə başlanırdı:

Qonşu getdi, biz qaldıq, haray ellər, ay ellər,
Yaman günə biz qaldıq, aman ellər, ay ellər...

Onu çap etmək mümkün olmadı.

## DAXİLİYYƏ

Avropa əhlinin qəzeti iki qism olur, birisi ki, gündə bir neçə dəfə, ya gündə bir, ya intəhası həftədə bir çıxır, ona qəzet deyirlər. Birisi ki, iki həftədə, ya ayda bir, ya ildə 2-6 dəfə çıxır, ona jurnal deyirlər. Qəzet, əxbarati-yövmiyyədən xəbər verir və özü bizim qəzet kimi bir vərəq üstə çap olunur, amma jurnal kitab kimi 100-500 vərəq olur və

[1] Əgər yarasanın gözü gündüzlər görmürsə, günəşin günahı nədir?

özü elm və qeyri xəbərlərdən danışır. Avropa tayfasının hər birinin bir neçə qəzeti və jurnalı olur, hətta bizim həmçeşmimiz ermənilərin 10 qəzetləri və 3 jurnalları var. “Əkinçi” qəzeti bina oluncan bizim heç bir qəzetimiz ya jurnalımız olmayıb. Doğrudur, Tehranda bir neçə ildir ki, “Ruznameyi-İran” çap olunur, amma ondan heç kimsəyə nəf yoxdur. Bina bərin ona qəzet demək olmaz.

“Əkinçi”nin adını qəzet qoymaqdan muradımız ancaq yövmiyyə xəbərlər yazmaq idi. Amma bizim eldə jurnal olmadığına naəlac qalıb həmi təzə xəbərlərdən, həmi elm və qeyri xəbərlərdən danışırıq. Lakin qəzetimiz kiçik olduğuna və gec-gec çıxdığına nə təzə xəbərlərin hamısından, nə qeyri xəbərlərdən çox yazmaq olmur. Bu səbəblərə ya gərək qəzeti böyükləndirmək ya onu tez-tez çıxarmaq. Qəzeti bir az böyükləndirmək məqdur oldu, amma hürufat az olduğuna dəxi böyükləndirmək olmur. İndi lazım gəlir qəzeti tez-tez, yə’ni həftədə bir çıxarmaq. Amma həftəlik qəzetin xərci də birə-bir ziyadə olacaq. Ona binaən onun qiymətini də birə-bir artırmaq, yə’ni onun bir ilinə 6, yarım ilinə 3 manat qiymət qoymaq gərək. Çünki müştərilərimizin bə’zi təvəqqə edirlər ki, qəzeti həftədə bir dəfə çıxardaq, ona binaən yazıb bəyan edirik ki, əgər təzə ilədək 300-cən adam xahiş edə ki, 6 manat verib qəzet apardacaqlar, ol vaxtda gələn ilin ibtidasından qəzeti həftədə bir çıxardacayıq. Amma lazım bilib bunu da bəyan edirik ki, bizim adamın qəzet oxumaq həvəsinə baxanda demək olur ki, onlardan nə ki 300, bəlkə də 100 də altı manat verən müştəri olmayacaq.

Ay qardaşlar, sözün doğrusunu demək gərək, əgərçi bu halda bizim 290-a qədər müştərimiz var, amma onların hamısını müştəri hesab etmək olmaz. Onların 140-ı Badkubə quberniyasının kəndlərindəndir ki, onlar üçün qeyrilər qəzet apardır. Bə’zi bizim dostumuz olduğuna bizə görə apardır, bə’zi onu apardıb öz aşna-dostlarına sövqat göndərir. Mərhaba belə müştərilərə. Onların müştəriliyindən çe hasil?

Ay qardaşlar, bizlərdə qardaşlıq həmiyyəti yoxdur: qart-qurt rus dili bilənlərimiz rus qəzeti gətirdillər ki, onu əvamünnas görüb onlara artıq hörmət eləsin. Şaltay-baltay rus yazısı bilənlərimiz rus qəzetlərinə məktublar göndərirlər ki, onlar çap olunanda ruslar ona hörmət etsin. Heyhat, biz kor olmuşuq ki, bircə qəzeti də saxlaya bilmirik və bununla belə qeyri millətlərə gülürük. Bəli, niyə gülməyək, onlar axmaqdırlar. Məsələn, bizim həmçeşmimiz gürcülərin bir neçə qəzetləri var, amma onilə indi Kutais şəhərində bir icma bina olub 5 min

manat cəm edib ki, gələn ildən həftəlik qəzet çap etdirsin, qiyməti 7 manat və əgər çap elətmək zərər eləsə, o, 5 min manatı ona məsrəf etsin.

Məgər bizim tavanalı şəxslərimiz yoxdur ki, belə icma bina edək və nə ki, bir, bəlkə 5-10 qəzet çap elədək? Genə Allaha şükür, tavana kəslərimiz çoxdur, amma... həzərat, bağışlayınız yeri düşüb ərz edəcəyəm – onların bə'zi müftə qəzet apardıb indiyəcən pulunu verməyiblər. Bə'zi qəzet oxumağı günah hesab edir ki, guya qəzet oxumaq şəriətə namüvafiqdir. Bunun qabağında sizə nə deyim? Sizdə taxsır yoxdur. Allah lə'nət eləsin ol kəslərə ki, bu böhtanı bizim şəriətə deyib, şəriətimizi bihörmət və sizi sərgərdan ediblər!

## MƏKTUBAT

"Əkinçi" qəzetinin 6-cı nömrəsində Osmanlıda inşa və nəşr olunan elm kitablarını gətirdib öz dilimizə tərcümə elədib çap etməkdən danışıq olmuşdu. Doğrudur, Osmanlı dili bizim dil ilə düz gəlmir, amma onların elə təfavütü yoxdur ki, birindən o birinə tərcümə etmək lazım ola. Ancaq Osmanlı kitabı oxuyanda diqqət ilə oxumaq gərək. Ona binaən ki, onların dilində ərəb, fars və qeyr millətlərin sözləri çox olduğuna onu birdən dərk etmək çətindir. Bunu sübut etməkdən ötrü elmi-hikməti-təbiiyyə kitabından bu fəsli yazır: Sədanın sür'əti bəyanındadır. Sədanın qulağa hüsulu ancaq bir vasitə ilə olub. Vasitə olmadığı təqdirdə səda hiss olunmaz, hətta şüşədən məsnu' bir balon (şüşə qabı) dərunində vaqe sığırçını balon məzbur hava ilə məmlüvv olduğu halda sədası hiss olunub, havası təmamən təxliyə olunduqda əsla hiss olunmaz və havada sədanın sür'əti saniyeyi-vahidə zamanında 39 və 34 (metrə arşıni-şahi qədərdədir), yə'ni 16 və 448 yaxud təqribən dörd yüz əlli zira'i-Osmani miqdarı olduğu biltəcrübə sabit olub. Sür'əti-məzburə rütubətli və ruzgarlı havada tək təxəllüf etməz isə də, soyuq və ya sıcaq havada müxtəlif olmaqla 10 dərəceyi-hərarətdə 337 metrə və sıfr dərəceyi-hərarətdə 331 metrə olduğu biltəcrübə istixrac olunmuşdur. Bina bərin uzaq bir məhəldə bir top atıldığı surətdə, əvvəl anda alovu görünüb bir az vaxt mürur etdikdən sonra sədası hiss olunur. Zira ziyanın hərəkəti qayət səri' olmağın ibtida alov müşahidə olunaraq sədanın hərəkəti ol qədər səri' olmadığından bir az

vaxt mürur etmədikcə hiss olunmaz və dəxi sədanın havada olan sür'əti vasitəsilə bir məhəlin bə'd və məsafəsi hesab oluna bilir. Şoylə ki, məhəli-məzburda bir top əndaxt olunduqda alovu müşahidə olunduğu vaxtda bir saniyəli saata nəzər olunaraq sədanın vüruduna qədər hərgah saniyə mürur edir isə, ol miqdar saniyə dörd yüz əlli zira'ə zərb olunduqda, hasili-zərb məhəli-mərqumun zira' cəhətilə bə'di olmuş olur və işbu təriq bə'zi gecə vaxtı vüqu bulan, müharibələrdə düşmənin uzaqlığı bilinmək murad olunduğu təqdirdə bundan başqa bir çarə olmadığından faideyi-əziməsi olduğu hərbiyyun nəzdində müsəlmandan bulunmuşdur.

Əgərçi zikr olan fəsil ibtidayi-elm olmağına çətin görünəcək, amma onun belə görünməyinə səbəb oldur ki, biz elmi-hikmətdən bixəbərik. Əlbəttə, ibtidai-elmdən danışan kitabı çox asanlıq ilə oxumaq olur. Pəs bizim dərdimiz ancaq ol kitablar vilayətimizdə olmadığıdır. Ona binaən İstanbulda sakin olan həmvətənlərimiz yaxşı elərdilər ki, Məkkəyə gedənlərimizə ibtidayi-elm kitabların göstəreydilər və əgər hər Məkkəyə gedən özü ilə bir neçə kitab gətirsə, bir neçə ilin müddətində məktəbxanalarımızın hamısında ol kitablar oxunur.

*7 200 4 1 2 10*[1]

* * *

İran sərhəddindən iyul ayının 8-dən müxbirimiz yazır ki, Təbrizdən məktubi xəbər var ki, ə'lahəzrət şahənşahi-İran xəllədəllah mülkəhu[2] bə'zi qəvanini-cədidə barəsində ki, İranda cari olacaq hökmi-mükəddər buyurublar və ol əhkamı bir kitabça edib, o kitabçanı cənab cəlalətməab ağayi-əsl, ağayi-sahibi-divan, hakimi-Təbriz bu dəfə Tehrandan Təbrizə varid olduğu halda icra buyurubdular ki, o kitabça 5 fəsildir və müxtəsərən bunlardırlar:

1) Üləmayi-giram ehtiramı cəmi' hakimlərə vacib və lazımdır.

2) Bəst hər yerdə və hər yerdən mövqufdur.

3) Cəmi' əməllər mütabiqi-şər' gərək qət' olsun və əgər bir axund bir xilafi-şər' hökm buyura, bə'd əz-isbat gərək Ərdəbil şəhərinin qalasında məhbus olsun.

---

[1] Bu rəqəmləri əbcəd hesabı ilə oxuduqda Zərdabi alınır.

[2] Allah onun mülkünü əbədi eləsin.

4) Qətli-siyasət, tənbehi-rüşvət hər yerdə mövqufdur, hər taxsırkar öz taxsırına görə Tehrana göndərilib orada həbs olacaq.

5) Xaric dövlətlər mətaı qadağan olub ki, kimsə alıb-satmasın və libas etməsin. Libas ümumən İran mətaından olacaq. Bu əhkamı cənab Müstəbad ağayi-Nizamül-üləma səlləməllahi tala gərək üləmaya iblağ eləsin və onlar dəxi qəbul eləmək barəsində sənəd versinlər, elə ki iblağ olub və qəbul ediblər.

## TƏZƏ XƏBƏRLƏR

Kutais şəhərində gürcü dilində çap olunan "Droeba" qəzetinə Osmanlı dövlətinin Gürcüstan vilayətinin Kobulet qəryəsindən yazırlar ki, Avropa dövlətləri Osmanlının xaçpərəst tayfaların azad etməyə sə'y edirlər, amma Kobulet və Ajar qəryələrinin əhli keçmişdə cəbrən islam olduğuna onların barəsində heç danışıq yoxdur. Lakin onlar hazırdırlar ki, təzədən xaçpərəst olub Osmanlı dövlətinin əlindən xilas olsunlar.

* * *

Daşkənd şəhərində türk dilində çap olunan "Türküstan qəzeti"nə Orenburq şəhərindən yazırlar: qəzetğə baslıq üçün bul yerdin xəbər yazıb, yəbər almadım. Səbəb ol ki, bul yerdə çəndan pakizə yazmaqğə müvafiq xəbər bulmadı. Hala həm çəndan ləzzətliğ xəbər yoqtur. Şundağ həm bulsa hər nə bulğan vaqeəni yazıb yəbardım.

Uşbu vəqtlar Orenburqda turğan kişilarğə kub xoşnudluğ hasil bulğani Səmər şəhərindən başlab Orenburğa atəşi-ərabə gilturmaq üçün yullar işlanib turğanidir. Uşbu il noyabr ayıdə xuda xahlasə işlar təmam bulub Orenburqdan Rusiya vilayətləriğə atəşi-ərabə burmağı cari bulsa, kiraһül-hal Orenburqdin Rəsiyyəğə baradurğan mal və əcnaslar ərabəbilan barıb turubdur. Noyabr ayıdin sonra xah mal və xah adam Rəsiyyəğə barmaq lazım bulsa, atəşi-ərabə bilan baradurğan bulur. Saniyən uşbu gunlar ilkari Xoqindğə xan bulub, Turğan Xudayar xan Orenburq şəhərində turubdur və anin zən-fərzəndlari Türküstan vilayətiğə tabe həzrət Soltan digan şəhərdə Turğan imiş. Uşal zən-fərzəndlarin yəqində Orenburğa alıb giladır deyib itadırlar. Bizlar Orenburqda işituk kim, Taşkənddin Xoqəndğə tiliqraf alıb barmaqğə işlanib turubdur deyib bu xəbərğə kub xürsənd bulduk.

* * *

Serbistanın 150 min əsgəri 4 hissə olub, onun birisi Serbistanı saxlamaqdan ötrü qalıb. Qeyriləri Osmanlı yerlərinə daxil olub cəng başladılar. Bir hissəsi Alpiç sərkərdəliyi ilə Drina çayını keçib Biləni qalasının üstə gedib, onu alıb Bosnəyə gedib ora əhlindən əsgər düzəltmək istəyirdi, amma Osmanlı əsgəri Muxtar paşanın sərkərdəliyi ilə onları basıb Drina çayından keçirdib qovdu. İndi Alpiç Zəvazik qalasının ətrafında durub. O biri hissəsi Təzəbazar qalasının üstə gedib, istəyirdi ki, Qaradağ əsgərlərinə yetişib Bosnədə olan Osmanlı əsgərlərinin yolunu kəsib, onları tələf eləsinlər, amma əsakiri-şahanə bu hissəni basıb Serbistan sərhəddinə qovub. Bu hissənin sərkərdəsi Zax idi, amma o basıldığına, onu xaric edib, yerinə Nikoliç adlı şəxsi qoyublar ki, ondan bir xəbər yoxdur. Üçüncü hissə general Çernyayevin (Çernyayev rus generalıdır ki, 2 min əsgər ilə Daşkənd şəhərini alıb tamam Türküstanı zəbt etmişdi) sərkərdəliyi ilə sərhəddi keçib Niş qalasının yanında bir neçə qalaçalar almışdı. İndi bir neçə gündür ki, onların tərəfindən heç bir xəbər yoxdur. Mə'lum olur ki, onlar öz muradlarını dəyişdiriblər. Onlar istəyirdi Niş qalasını alıb gedib Tuna vilayətinin əhli bolqarları yığıb, Ədirnə və İstanbul şəhərlərinin üstə getsinlər, amma bolqarlardan ol qədər karsazlıq olmayıb. İndi Çernyayevin dayanmağından belə mə'lum ki, geri qayıdıb serblərə kömək etməyə gedəcək. Ona binaən ki, əsakiri-şahanə Vidyen qalasından çıxıb Osman paşanın sərkərdəliyi ilə Serbistanın Zabçar qalasına gedir. İndi tel var ki, Çernyayev öz əsgərlərilə Serbistana gedib.

* * *

Qaradağ deyilən yer bizim Badkubə quberniyasıcan ancaq olur. Onun yeri dağıstan olduğuna orada top-tüfəng yaxşı iş görmür. Bu səbəblərə oranın əhli ki 90 qəryədir, həmişə dövlət ilə cəng edib. Ona binaən 20 il bundan sabiq Avropa dövlətləri onlardan Osmanlıya xəracdəhəndə əyalət qayırıblar. Bu halda onların 15-20 min əsgəri öz knyazları Nikolayın sərkərdəliyi ilə Qerdseqovinəyə daxil olublar, bir neçə Osmanlı qalaçaları alıblar.

* * *

İstanbuldan gələn tellərdən mə'lum olur ki, ə'lahəzrət Məhəmməd Muradi-pəncüm indiyəcən həzrət Osmanın qılıncını bağlayıb. Bunun

səbəbini Avropa qəzetləri belə bəyan edirlər: kimi deyir ki, ol həzrət naxoşdur, kimi deyir mərhum Soltan Əbdüləzizin validəsi vəzirləri öldürəndən sonra ol həzrət çölə çıxmağa qorxur ki, onu da öldürməsinlər. Bə'zi deyir ki, cənab Midhət paşa millət məclisi barəsində qanunu yazıb qurtarmayıb. Ona binaən həzrət gözləyir ki, qanun tamam olsun, ta ki ol vaxtda onu xalqa bəyan etmək olsun. Xülasə, həzrət soltan nə ki çölə çıxmır, hətta çox adamı yanına qoymur, necə ki, Avropa dövlətlərinin bə'zinin vəziri-muxtarları indiyəcən öz vəkalətnamələrin ona pişnəhad edə bilməyiblər.

* * *

İyul ayının 3-də cənab Şeyxülislam Xeyrullah əfəndi üləmaları cəm edib onlara Midhət paşa millət məclisi barəsində yazdığı qanunu verib ki, onlar ol qanunun şəriət ilə düz gəlməyinin fitvasını versinlər, mollalar qəbul ediblər.

* * *

Osmanlı dövləti nizam əsgərindən savayı çərkəslərdən, başıpozuqlardan, Krım tatarlarından çox əsgər tutub. Məsələn, çərkəslərdən 50 min əsgər var, ondan masəva, Misirdən 12 min, Tunisdən 5 min əsgər köməyə gəlib. Erməni və yunan əhli 5 min əsgər cəm ediblər ki, Osmanlıya kömək etsin.

* * *

İstanbulda xaçpərəst tabeləri ilə cəng etməkdən ötrü xalq pul yığır. Məsələn, ermənilərdən bir şəxs 50 min lirə verib. Bir polk ki, İstanbulda olur, bir ayın məvacibini verib.

* * *

Keçən il gümüş mə'dənlərindən çox gümüş hasil olduğuna indi gümüş qiymətdən düşüb, bir manata 20 qəpiyəcən təfavüt var.

* * *

Rus dövlətinin İstanbulda olan vəziri-muxtarı general İqnatyev iyul ayının 12-də 6 aya Peterburqa gedib. Rus qəzetlərində yazırlar ki, cənab İqnatyev Odessanın yanında özünə bir mülk almaq istəyir ki, qiyməti 1 milyon manatdır.

* * *

Ufimski quberniyada bir müsəlman kəndində bir kəs şərabxana açmış imiş. Kənd mollası camaatı cəm edib onlara və’z edib ki, ol şərabxananı bağlasınlar, amma ona əməl etməyiblər.

* * *

Rus dövlətinin kağız pulunun qəlpələrinin hesabına gedib deyirlər ki, 10 ilin müddətində 92 qəlp pul kəsən olub. Onlardan 32 üçmanatlıq, 14 manatlıq, 13 beşmanatlıq, 12 iyirmibeşmanatlıq, 12 onmanatlıq, 8 əllimanatlıq, 1 yüzmanatlıq olub. Onların bə’zisi elə qayrılıb ki, əsli puldan təfavüt vermək olmur.

## E’ L A N

Peterburqda universitetin professoru Lazar Budaqov rus, türk, tatar dillərində bir lüğət qayırıb; 615 vərəq, qiyməti 5 manat. Xahiş edən “Əkənçi” qəzetinin idarəsindən xəbər bilsin.

* * *

Bazar küçəsində şəhər mizanının yanında təzə dükan açılıb, yaxşı Masazır duzu satılır ki, o duzun rəngi ağ və özü bilmərrə təmizdir.

* * *

Cənab sərdarın dəftərxanası bəyan edir ki, bu iyulun əvvəlində Qafqazda araq çəkənlər üçün təzə qanun qoyulub. Arağın bərkliyi gərək 40 dərəcə olsun və hər dərəcəyə 7 qəpik xərc var. Üzüm və qeyri meyvələrdən araq çəkən onun qazanının hər vedrəsinə hər gündə gərək versin maşın işləyir isə 41 qəpik, maşınsız araq çəkilir isə 5 qəpik. Kişmişdən araq çəkən maşın olsa 3 manat 90 qəpik, olmasa 2 manat 60 qəpik. Məxsusi bağı olanlar öz meyvəsindən araq çəkəndə gərək zikr olan xərci versinlər. Amma onlarda ixtiyar və şəhadətnamənin 1-7 günə alsınlar, lakin qeyri kəslər gərək bir ilə ala.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Fi 1 şə'banülmüəzzəm, sənə 1293*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Düşənbə günü*



*Fi 9 avqust Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı –*
*1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Bizlərdə ibarət ilə danışmaq adət olduğuna məktubat göndərənlərimizin çoxu sə'y edir ki, kamallı söz yazsın və əxbarat yazmağı eyib bilir. Məsələn. Zəkərtala şəhərində olan yanğı, İrəvanda və Cavadda olan sel və qeyri barəsində yazmırlar, amma yazırlar ki, imam Cəfər vaxtında teleqraf var idi. Dustan, ibarət ilə yazılan tulani mətləb jurnalda çap olunur, qəzetdə ona yer olmur.

* * *

Zəkərtala şəhərində olan yanğı barəsində qəzetimizdə yazmışdıq ki, oranın əhli üçün pul cəm edillər. Amma indiyəcən bir qəpik də göndərən yoxdur. Lakin rus qəzetlərinin idarəsinə xaricilər pul göndərillər. Biz ol ehsan edənlərin siyahısına baxdıq, amma orada heç bir müsəlman adı görmədik. Həqiqət, biz çox biqeyrət tayfayıq ki, xaricilər bizim müsəlman qardaşlarımıza beqədri-məqdur kömək edillər, amma biz bir qəpiyə heyifsilənirik.

* * *

Badkubə şəhərində 3 həftədir ki, külək əsmir. Ona binaən isti çox şiddət edib.

## DAXİLİYYƏ

Bizim Qafqaz vilayətinin bir şəhərində iki şəxs bir-birilə belə söhbət edirlər:

*Sual:* Əmi, eşitmisənmi ki, Badkubədə bir ildir filankəs "Əkinçi" ismində bir qəzet çıxardır, təzə xəbərlər yazır, hikmət ilə hər bir şeyi aşkar edir?

*Cavab:* Filankəs Şirvan vilayətinin Zərdab qəryəsinin sakini filankəsin oğlu, filankəsin nəvəsi deyilmi? Mən elə bilirdim ki, o qəzeti İvan ya Karapet çıxardır. Pəs onu filankəs çıxardır imiş. Mən onun ata-babasını tanıram. Qoy getsin. Ev buzovundan öküz olmaz.

*S:* "Əkinçi" qəzeti deyir ki, zəmanəmiz dəyişilib. İndi elm təhsil etmək gərək. Ona binaən lazımdır elm kitabları gətirdib öz dilimizdə elm öyrənmək.

*C:* O elmləri öyrənmək bizə lazım deyil. Niyə ata-babalarımız o elmsiz yolla getdilər, biz gedə bilmədik? Bizim öz elmimiz bizə bəsdir və əgər hər kəs o elmləri öyrənmək istəsə, getsin xarici dillərində öyrənsin. Dəxi elm kitablarını gətirdib öz dilimizə tərcümə etdirib çap etmək nə lazım? Və əgər çap etdirsək də o kitablardan nə olacaq? Ev buzovundan öküz olurmu?

*S:* "Əkinçi" qəzeti deyir ki, qəzet və jurnal oxumaq insanı dünyadan xəbərdar edir, öz dilini öyrədir, məzhəbində qaim edir, ona binaən hamı millətlər sə'y edib qəzet və jurnallar çap etdirillər ki, qeyri millətlər arasında payimal olmasınlar, yoxsa Qazan şəhərli molla kimi, hətta namazın niyyətini də qeyri dildə edəllər ki, deyib: Abed namazı qılamən.

*C:* Bunlar hamısı boş sözdür, pul tələsidir. Mən öz dilimizi məgər bilmirəm? Məzhəbdə qaim olmağa qəzet ya jurnal oxumaq nə lazım? Kəlmeyi-şəhadət və beş vaxt namaz bəsdir. Millət payimalmı olur? Qazan şəhərli molla xarici içində böyüyüb öz dilini yaddan çıxarmağının bizə nə rücuu var? Xülasə, bizə qəzet ya jurnal gərək deyil və əgər bir-iki axmaq bica yerə zəhmət çəkib qəzet ya jurnal çıxardırsalar da, ondan bir şey hasil olmayacaq, ona görə ki, ev buzovundan öküz olmaz.

*S:* Əmi, belədə ev sahibindən adam olmaz və buzov gəlib ona sahib olur.

*C:* Boş sözdür, – deyib qalxıb yola düşür.

## ƏF’ALİ-ƏHLİ-DEHAT

Necə ki, bir həkimi-haziq naxoşun yanına gəlib filan yerin ağrıyır, onu göstər deyəndə ona utanıram göstərməyə demək eyibdir, habelə hər bir şeyin barəsində elm yolilə danışılan sözə o şey yaman olduğuna qulaq asmamaq eyibdir. Ona binaən ki, elmdən mətləb hər bir şeyin xasiyyətini, onun nəf’ və zərərini bilməkdir. Adam olan kəs bilməkdən qaça bilməz, özünün nəf’ və zərərini bilməyə bilməz. Pəs bir şey nə qədər mütəəffin də olsa, onun nəf’ və zərərini bilib, zərərindən uzaq olub nəf’ini ələ gətirmək lazımdır. Bu səbəblərə əkin yerin qüvvətli edən şeylərin ümdəsindən ki, insan və heyvanın nəcisi və sidiyidir danışacayıq.

Keçmişdə ki, əkin yeri çox imiş, insan nəcisi murdar hesab edib, ondan uzaq olub. Amma indi insan artdığına əkin yeri az olub qüvvətdən düşdüyünə hər bir tayfa əkin yerin qüvvətli etmək sə’yinə düşüb. O cümlədən heyvanat nəcisi ilə onu qüvvətli edir. Lakin indiyəcən insan nəcisinə yavuq duran azdır. Ancaq Avropanın böyük şəhərlərinin ətrafındakı kəndlərin əhli onu satın alıb işlədillər. Məsələn, Parij şəhərinin küçələrində hacətxanalar bina ediblər və hər kəs oraya su üstə getsə, hacətxananın sahibi ona pul verir. Bu tövr ilə nəcisi yığıb kənd əhlinə satıllar.

Əgərçi bu halda Avropa əhli hər bir elmdə tərəqqi edib hamı millətlərdən irəli gediblər, amma əkin yerin qüvvətli etmək elmində onlar Çin məmləkətinin əhlindən çox geri qalıblar. Çin məmləkəti Asiya qit’əsinin şərqində vaqedir. Onun iki tərəfi Dəryayi-mühitdir və o biri tərəflərindən bir neçə min il bundan əvvəl sabiq bir hündür divar çəkiblər ki, qeyri tayfalar onların yerinə və onlar qeyri tayfaların yerlərinə gedib gəlməsinlər. Oranın ərzinin məsaheyi-səthiyyəsi 13 milyon kilometrə mürəbbei (kilometrə 3 verst qədərdir) və miqdari-süknası 450 milyon nüfusa baliğdir. Xülasə, onların yeri bizim Rusiya dövlətinin yerindən birə-üç az, amma xalqı birə altı ziyadədir, yə’ni Rusiyada hər kəsə 18 tağar yer düşsə, orada bir tağar düşər. Belədə onların yeri çox az olduğuna hətta çay və göl sularının üstə kəndlər salıb orada sakin olurlar. Əlbəttə, belə darlıqda sakin olan kəs gərək yerinin qədrini bilsin və onu qüvvətli etməkdən ötrü ziyadə sə’y etsin. Ona binaən Çin məmləkətinin əhli nə ki, şəhərlərdə insanın nəcisini və sidiyini bir damcıyacan yığıb əkin yerinə qarışdırır, hətta çöllərdə yolların üstə dövlət tərəfindən hacətxanalar tə’mir olunub, onların

üstə qarovulçular durub ki, yol ilə gedənlər lazım olsa, ol hacətxanalara getsinlər və əgər bir kəs qeyri yerə getsə ona tənbeh var. İldə 2 dəfə, bir yazda və bir də payızda dövlət tərəfindən tə'yin olan adam gedib ol hacətxanaların möhrünü sındırıb açıb, nəcisi yığıb xalqa paylayıb genə padşahlıq möhrü ilə bağlayıb gedir.

Biz yediyimiz şeylərin hər birisi bir neçə əcsamdan mürəkkəbdir. Ol əcsamların yarısı bədəndən hava qismində və yarısı nəcis ilə rədd olur. Çünki zikr olan şeylər ancaq məzkur əcsamlardan əmələ gəlir, ona binaən ol əcsamların nəcis ya qeyri surətdə əkin yerinə qarışdırmaq vacibdir ki, biz yediyimiz buğda, arpa və qeyri əmələ gəlsin. Pəs buğda nəcis qarışmış, ya sadə yerdə əmələ gələndə öz əcsamlarından əmələ gələcək, ancaq təfavüt budur ki, ol əcsamlar yerə qarışmış olanda buğda yaxşı və olmayanda buğda yaman olur.

## ELM XƏBƏRLƏRİ

İnsanın naxoşluğu iki qism olur: birisi bədən, yə'ni bədənin əczalarının naxoşluğu, birisi beyin naxoşluğu ki, ona dəli olmaq deyirik. Bədən naxoşluğu mə'lum və aşkardır. Onun yovuxması iki qism olur: birisi hava xarab olmaqdan düşür. Məsələn, qızdırma, yatalaq, vəba naxoşluqları və birisi bədən bir-birinə dəyməkdən düşür. Məsələn, çiçək, kəfət naxoşluqları. Beyin, yə'ni dəli olmaq naxoşluğu xalq arasında çox mə'lum olmağına səbəb oldur ki, belə naxoşun bədəni sağ və salamat olduğuna onu tanımaq çətindir. Məsələn, bizim Zərdab qəryəsində bir oğru var idi ki, kəndin bir başından camışı oğurlayıb o biri başında 1 manata füruş edirdi. Əlbəttə, bir neçə saatdan sonra camışın sahibi onun başını tutub oğrusundan birə-on cərimə aldırır idi, amma on ilə belə o oğru həmişə belə oğurluq edirdi. Bizim tanış hacıların birisi qənaəti-əzim ilə yaxşı pul qazanıb, amma indi ki, onun övladı və uşağı yoxdur və özünün ayağı gordan sallanıb, həmişə pənir-çörəyə qənaət edir və vəsiyyətnamə yazdırt sözünü eşidəndə qulağını yumur. Əlbəttə belə əşxaslar dəlidirlər, onları gərək mərizxanaya göndərib müalicə etmək. Həmçinin beyin naxoşluğu da yovuxma olur. Məsələn, 2 şəxs dava edən zaman onların hər biri öz xahişini yeritməkdən ötrü dava edir, ya iki millət cəng edəndə hər cəng edən kəs bilir ki, öz millət işindən ötrü cəng edir, onlar öz ağlı ilə iş görürlər. Lakin bə'zi vaxtda iki dövlət bir boş mətləb üstə cəng başlayır. Əgər o mətləbdən bixəbər naəlac davaya gedir. Elə ki, əvvəlinci

cərgə buyuruğa görə tüfəng atdı, daldakı cərgələrin adamları cuşa gəlib meydana daxil olurlar ki, beistilahi-türk meydan qızır, ol zaman quduz itə dönüb, hətta meyidin başını kəsib qarnını cırıllar. Əlbəttə bu halda onlar dəli olublar ki, ağlı ilə iş görmürlər və onların dəli olmağına səbəb əvvəlinci cərgənin adamı naəlac tüfəng atmaq olubdur.

## TƏZƏ XƏBƏRLƏR

Əgərçi Avropa dövlətləri sözü bir ediblər ki, Osmanlı öz xaçpərəst tabelərilə elədiyi cəngə qarışmasınlar, amma ol dövlətlərin əhli cəngdə zəxmdar olanda kömək etmək qadağan deyil. Ona binaən Avropa əhlindən çox adam ol cəngdə zəxmdar olan Serb və Qaradağ əhlinə pul və qeyri şeylər göndərillər. Bizim Rusiya əhli ki, zikr olan xaçpərətslərin həm dil, həm məzhəb qardaşlarıdırlar, onlara ziyadə kömək edillər. Məsələn, Moskvada sakin olan Straoobryadlar 100 çarpayı, öz pal-paltarı, dərman-davası, həkimləri, qulluqçuları ilə onlara göndəriblər. Bir Botkin adlı şəxs öz xərcilə bir neçə həkim göndərib. Tretyakov 100 min manat pul verib. Xülasə, böyükdən-kiçiyəcən bir adam qalmayıb ki, onlara pul ya qeyri şey göndərməyə. Hətta bizim Badkubədə sakin olan ruslar iyul ayının 30-da lodkada muzıka ilə gəzmək edib, onlar üçün 100 manat cəm ediblər və övrətlər yara bağlamaq üçün əsgi yığırlar.

* * *

Qəzetlərdə yazırlar ki, xəlifeyi-dövran həzrət Məhəmməd Muradi-pəncüm bərk naxoşdur və həkimlərin deməyinə görə onun dərdinə əlac yoxdur. Deyirlər ki, həzrət özü xahiş edir imiş ki, xaric olsun və öz yerinə qardaşı həzrət Əbdülhəmidi qoysun, amma vəzirlər iltimas ediblər ki, xaçpərəst tayfaları ilə olunan cəng qurtarıncan qalsın və bu məsləhəti həzrət qəbul edib.

* * *

Tiflisdə keçən ay erməni dilində təzədən bina olan “Purdez” jurnalı deyir ki, İran məmləkətində xaçpərəstlərin protestantlarının vaizləri türk və erməni dillərində vəz edib, məktəbxanalar açıb çox adamı protestant ediblər. Məsələn, Təbriz şəhərində çox erməni və müsəlman, o cümlədən bir neçə molla və seyid protestant olub. Çünki protestantlığın əvvəlinci şərtlərindən birisi qardaşlıqdır, yə’ni hər protestant olanı özlərinə qardaş hesab edib ona beqədri-məqdur kömək etməkdir. Lakin bizlərdə qardaşlıq həmiyyəti yoxdur və özümüz bir-birimizin

ətini yeməyə hazırıq. Ona binaən təəccüb bu deyil ki, bə'zi əşxas protestant olub. Təəccüb budur ki, indiyəcən protestant olanımız azdır.

* * *

İrandan rus qəzetlərinə yazırlar ki, bu il baharda Astrabadın valisi türkmənlərə tənbeh etməkdən ötrü min iki yüz sərbaz ilə Qaraçayı keçib Türkmən yerinə daxil olub. Türkmənlər Qaraçayın körpüsünü dağıdıb özləri qəflətən onların üstə tökülüblər. Sərbazlar tamam qaçıb. Körpü olmadığına Qaraçayın suyuna girəndə onlardan 230 adam öldürüblər. Türkmənlərin hamısı 300 adam olub.

* * *

Ermənilərin "Ararat" jurnalı yazır ki, may ayının 5-də günortadan sonra İrəvan şəhərində sel olub. 7-8 ev bilmərrə uçub tələf olub, 100-cən su ilə dolub. O sel şəhərin içinə bir böyük daş gətirib ki, onun ağırlığı 3400 girvənkəyəcəndir.

* * *

Ermənilərin "Miğo Hayestan" qəzeti yazır ki, erməni jurnalı "D pərsi" çap etdirən kəs naxoşlayıb. Ona binaən onu qeyri kəs basdıracaq.

* * *

Rus qəzetlərində yazırlar ki, Buxara xanı padşahi-imperaturi-Rusdan təvəqqe edib ki, onun oğlanlarının birisini məktəbxaneyi-əsgəriyyəyə qəbul etsin. İndi xəbər var ki, onun kiçik oğlanlarının birisi Peterburqa tə'lim almağa gəlib.

* * *

İyun ayının 15-də Moskva şəhərinin milləti bağında barama qurdunu elm yolu ilə bəsləməyi xalqa göstərillər imiş. Yazırlar ki, hər gündə 3-4 min adam oraya baxmağa gedir imiş.

* * *

Qəzetlərdə yazırlar ki, Kokan xanlığında ki, ona indi Fərğan müzafatı deyirlər, çox neft və daş kömürü çıxıb.

Sərəsgər Əbdülkərim paşa Niş qalasına gəlib, hökm edib ki, əsakiri-şahanə Niş və Vidən qalalarından Serbistanın içinə daxil olsunlar. Ona binaən Vidəndən Osman paşa və Nişdən Əhməd Eyyub paşa və

Süleyman paşa külli əsgər ilə sərhəddi keçib Serbistanın sərhəddə olan Zayçar və Knyajivas və qeyri qalalarını alıb indi Serbistanın knyazı Milan Vidən və Niş qalalarının qabağında olan əsgərləri bir edib rus generalı Çernyayevi onlara sərkərdə edib ki, əsakiri-şahanənin qabağını saxladı. Amma indiyəcən Çernyayevdən bir xəbər yoxdur. Serbistanın Bosnə sərhəddində olan əsgərləri Alimpiçin sərkərdəliyi ilə sərhəddə dayanıb Dərviş paşa ilə cəng edir və geri qayıdıb Çernyayevə kömək edə bilmir. Xülasə, cəng başlananda Serbistandan gələn tellər deyirdi ki, basdıq, basdıq, amma indi oradan gələn tellər xəbər gətirir ki, əsakiri-şahanə filan yeri alıb, kəlisaları və məktəbxanaları yandırıb ruhaniləri, müəllimləri, həttа övrət və uşaqları qırıb çox zülm edirlər.

* * *

Qaradağın knyazı Nikolay 20 min əsgər ilə Qerdseqovinəyə daxil olub, oranın əhlindən bir miqdar əsgər düzəldib istəyirdi Mastar və Saray, Bosnə şəhərlərinin üstə getsin. Amma Novsinə qalasının yanında ki, düz yer imiş Əhməd Muxtar paşa onu basıb, qovub, indi Qerdseqovinənin dağlarındadır. Xülasə, buranın yeri dağıstan olduğuna əsakiri-şahanə ol qədər iş görə bilmir.

* * *

Osmanlı dövlətinin Smirna şəhərindən yazırlar ki, dövlət hökm eləmişdi ki, hər vilayət iki min əsgər versin. Amma xaçpərəst tayfalar ilə cəng etməyə xahiş edən ol qədər var ki, hər vilayətdən 10 mindən ziyadə əsgər düzəlib.

* * *

Əgərçi Rumıniya əyaləti (Boğdan və Əflan) Osmanlı ilə cəng etmir, amma bu halda dövləti-Osmanidən özünə bə’zi ixtiyarlar istəyib və dövlət ol ixtiyarları vermir. Bu səbəblərə Osmanlı dövləti onun sərhəddində 45 min əsgər saxlayıb.

* * *

Osmanlı dövlətinin xaçpərəst tayfaları 3 millətdirlər. Slavyan millətі Serb, Qaradağ, Bosnə, Bolqariyadırlar ki, onların məzhəbi pravoslavnıdır. Boğdan, Əflan, yə’ni Rumıniya əhli və Bosnə xaçpərəstlərinin bə’zi katolik məzhəbindədirlər. Üçüncü millət yunandır ki, onların da

məzhəbi pravoslavnıdır. Çünki indi olan cəng millət cəngidir, ona binaən Rum və Yunan əhli slavyanlara kömək etmirlər və slavyanlardan cəng edən Serb, Qaradağ, Bosnə əhlidir. Bolqarların yeri düz olduğuna onlar cəng başlamayıblar, amma serb əhli onların yerlərini gəzib onları öyrədir ki, onlar da cəng başlasın. Bu səbəblərə onların yerində çox çərkəs və başıpozuq əsgəri durub. Qəzetlərdə yazırlar ki, onlar Bolqariyada çox zülm edillər.

* * *

Bə'zi qəzetlərdə yazırlar ki, həzrət Məhəmməd Muradi-pəncüm naxoş deyil və ol həzrət naxoşdu sözünü qədim türklər çıxardıblar ki, ondan narazıdırlar ki, millət məclisi bina etmək istəyir.

* * *

Yazırlar ki, Osmanlı dövləti 3 milyon liralıq kağız pulu kəsdirmək istəyir.

* * *

Peterburqda bir Ştiğlis adlı şəxs Osmanlı ilə cəng edən xaçpərəstlərə 500 min manat göndərib: Moskva tacirləri onlara bir milyon 500 min manat göndəriblər.

* * *

Peterburqdan iyulun 20-dən yazırlar ki, bu gün Peterburqun böyük küçələrindən getməyə yol yoxdur, oralarda mö'təbər adamların övrətləri Osmanlı ilə cəng edən xaçpərəstlər üçün pul yığırlar və ol qədər pul verən var ki, tamam küçələr doludur.

* * *

Krımdan yazırlar ki, Osmanlıdan bir neçə tələbə müsəlmanlardan cəng üçün pul yığmağa gəlmişlər imiş, amma onları tutub göndəriblər.

* * *

Osmanlı qəzetlərində yazırlar ki, guya bizim Qafqaz müsəlmanları Osmanlı dövləti üçün pul yığırlar.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*2-ci sənə* *16-ci nömrə*

*Fi 15 şə’banülmüəzzəm, sənə 1293*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Düşənbə günü*



*Fi 23 avqust Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E’lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Badkubədə avqust ayının 11-də yağış yağıb, bərk külək əsdi. Ona binaən indi hava sərin olub.

## DAXİLİYYƏ

Bir şəxs çiynində ağ dəmir düyməli palto, başında ağ furaşka, ayağında cırıldayan çəkmə, ağzında papiros sallana gedirkən, bir cavana rast gəlib, salamlaşıb, birgə getdikləri zaman cavan onun yal-kuyalına baxıb, onu ziyadə kamil hesab edib deyir: bizlərdə deyərlər ki, yer bir öküz üstə dayanıb və onun hər bir əczası tərpənsə, onun üstə olan yerin hissəsi həm tərpənər. Amma mən bunu başa düşmürəm, niyə zəlzələ olan zaman bə’zi yerin ətrafı tərpənəndə özü tərpənmir?

*C:* Öküz boş sözdür, rusların “Narodni poveriya” qəzeti deyir ki, yer Dəryayi-Mühitin içindədir, bir böyük balıq ki, ona kit deyirlər, onu dalında saxlayıb və onun tərpənməyindən yer həm tərpənir.

Cavan bunu eşidib fikrə gedəndə cənab palto söz arasına söz salmaqdan ötrü başlayır ki, dünən mənim dostum Nikolay İvanıçın mənzilində bir neçə ruslar ilə punş içən zaman rus dilində çap olunan “Pustoy” qəzetində Çılpaq oğlu Vaygünnü qaçaq barəsində mən yazdığım məktubu oxuyurduq. Əlhəqq çox yaxşı inşa eləmişdim və ol qəzeti çıxardan bu səbəbə məni tə’rif edib deyir ki, mərhaba müsəlmanda belə qabiliyyət?..

Cavan bu sözü eşidib qeyrətə gəlib deyir: niyə, məgər bizim müsəlmanlardan qabiliyyət əhli yoxdur? "Əkinçi" qəzetində cənab Heydərinin kəlamını məgər oxumamısınız?

Cənab palto ona əyri baxıb, gülüb deyir: mənim müsəlmani savadım yoxdur, amma onu bilirəm ki, müsəlmandan adam olmaz.

* * *

Hər bir qəzetin varlığının əvvəlinci şərti müştəridir. Gərək müştəri olsun ki, qəzet çap olunsun. Məsələn, İstanbul şəhərində ki, hər bir mayəhtac, çapxana, hürufat, onları düzən və qeyrə olduğuna ancaq müştəri gərəkdir. Müştəri olsa dəxi bir şey lazım deyil. Amma bizim Badkubədə onun çap olunmağının şərti çoxdur. Əvvələn, dövlət tərəfindən qəzetə baxmaqdan ötrü tə'yin olan adam yoxdur, bunu cənab qubernatora mühəvvəl ediblər. Saniyən, əgərçi şəhərimizdə 5 çapxana var, amma onların birisində müsəlman hürufatı var. Salisən, hürufatımız az olduğuna bir qəzetə ancaq çatır. Xülasə, cənab qubernator qəzet çıxmağa razı olmasa, ya çapxana bağlansa, ya hürufat xarab olsa, gərək qəzetimiz bərhəm olsun. Müştərimiz az olduğundan keçən nömrələrdə danışmışıq, indi qeyri şərtlərdən danışaq. Bizim təzə qubernator bir neçə gün Badkubədə qalıb Rusiyaya gedib və gələn ay geri qayıdacaq. Ol cənab qəzetimiz çap olmağa razı olmağını bilmirik. Qəzetimiz Qubernski pravleniyanın çapxanasında basılır. Onu təzə qubernator gələn az qalmışdı ki, bağlasınlar, amma bir tövr təzə iləcən saxlayıblar. Sonra nə olacaq, mə'lum deyil.

Hürufat bir şeydir ki, işlənməkdən xarab olur. Əlbəttə, 1-2 ilə bizim hürufat da xarab olacaq.

Pəs bizim qəzet baqi deyil. Hərgah müştərimiz də olsa və biz onu çap etdirməyə razı da olsaq, zikr olan şərtlərin birisi olmasa, gərək onu bərhəm edək. Bu qədər şərtlər ilə bir qəzeti imtahan üçün çıxardır idik və əgər müştərimiz çox olseydi, təzədən hürufat gətirdib Tiflis şəhərində ki, orada dövlət tərəfindən qəzetlərə baxmaqdan ötrü müəyyən olan divanxana var, əlahiddə çapxana açıb, gedib orada həmişə qəzet çıxarmağa məşğul olacaydıq. Amma çifayda müştərimiz az olduğuna iş baş tutmur və əgər gələn il ənva müsibət ilə çıxarda bilsək, gərək Allaha şükr edək.

## ƏF'ALİ-ƏHDİ-DEHAT

Əkin yerini qüvvətli etməkdən ötrü hər bir heyvanatın nəcisi və sidiyi işlənir. Ələlxüsus qaramalın nəcisi ki, onları əkinçi öz yerini şuxm etməkdən ötrü gərək saxlasın. Nəcisi yerə qarışdırandan irəli, gərək çürüdəsən. Bundan ötrü malın altına ot ya bəlim ya saman ki, heyvan yeməkdən artıq qalıb ya qeyri lazım olmayan otları çəkib, onu gündə bir nəcis ilə birgə yığıb içi kərpic ya daş ilə döşənmiş və üstüörtülü quyulara iki arşın qalınlıqda doldurub yayda hər gündə bir və qışda həftədə bir onun üstə ya mal sidiyi töküb qarışdıranda, 10-15 gündən sonra çürüyüb tamam olur. Belə çürümüş nəcisi aparıb əkin yerinə çəkmək gərək. Amma onu aparmaq məqdur olmasa, quyunun üstün torpaqlayıb onu əkin yerinə çəkilən vaxtacan saxlamaq gərək. Nəcisi hər bir vaxtda yerə çəkmək olur, amma yaxşıdır ki, onu yer toxm olunmamış çəkəsən ki, nəcisin içində alaq otlarının toxumu olmuş olsa, ol otlar çıxanda yeri malalayıb, alağı tələf edib, toxm edəsən. Nəcisi ərradələr ilə əkin yerinə aparıb, töküb, kürək ilə bərabər dağıdıb, sonra yeri xış ya mala ilə, yə'ni dayaz şuxm edib qarışdırmaq gərək. Onu lazımdır ki, dərhal qarışdırasan, yoxsa nəcis gün və yağış dəyməkdən xarab olur. Hər desyatinə (desyatin bir parça yerə deyirlər ki, uzunu 80, eni 30 sajın, yə'ni 2400 gəzəndərgəz sajın olsun) 1-3 min pud nəcis lazımdır. Bir min pud çəkilən yerə gələn il təzədən nəcis çəkmək gərək, amma 3 min pud çəkilən yerə ol nəcis 3 il bəsdir.

## MƏKTUBAT

"Əkinçi" qəzetinin 14-cü nömrəsində sizin müxbiriniz İran dövlətində cari olacaq qəvanini-cədidə barəsində yazmışdı. Həqiqət ziyadə şad olduq ki, bizim İranda həm qanun qoyulacaq. Ol qanunun müxtəsər məzmununa baxıb bu bir neçə kəlməni yazıb cənabınıza göndərirəm və əgər layiq bilsəniz, təvəqqə edirəm onu çap etdirəsiniz:

1) Üləmayi-giram ehtiramı cəmi' hakimlərə vacib və lazımdır. Bundan belə mə'lum ki, ehtirami-üləma hakimlərdən başqa kəslərə lazım deyil. Tutalım ol qanun ehtirami-üləmanı hamıya hökm edəcək, amma bunu bilmək ki, ehtiram nə ilə olur? Bir kəs ki, elm və ədəbdən bixəbərdir, nə qədər hökmi-müəkkid oluna, ehtiramdan həm bixəbər

olacaq. Belədə məktəbxanalar açıb xalqa elm və ədəb öyrətmək yaxşı deyilmi ki, cəbrən ehtiram elətmək lazım olmasın?

2) Cəmi' əməllər mütabiqi-şər' gərək qət' olsun və əgər bir axund bir xilafi-şər' hökm buyura bə'd əz-isbat gərək Ərdəbil şəhərinin qalasında məhbus olsun. Bundan əqdəm məgər işlər şəriət ilə qət' olunmurdu? Keçmişdə ki, onlar ölümdən qorxmayıb şəriətə əməl etmirdilər, indi edəcəklərmi? Pəs belədə onları elm və ədəb öyrədib adam etmək yaxşı deyilmi ki, bitənbeh şəriətə əməl etsinlər?

3) Bəst hər yerdə və hər yerdən mövqufdur. Bəst İrandan başqa heç bir məmləkətdə qalmayıbdır. Əlbəttə onun varlığı xalqın elmdən bixəbər olmağını sübut edir. Pəs elm olsa, bəsti mövquf etmək lazım deyil, özü özbaşına mövquf olur.

4) Qətli-siyasət, tənbehi-rüşvət hər yerdə mövqufdur. Hər taxsırkar öz taxsırına görə Tehrana göndərilib orada həbs olacaq. Belə mə'lum olub ki, nə qədər bərk tənbeh oluna, taxsırkar azalmaz, amma xalq nə qədər artıcaq elm öyrənə, ol qədər taxsırkar az olur. Pəs əgərçi qədim tənbehdən indi qoyulan ə'latər və insaniyyətə layiqraqdır, amma yaxşı deyilmi ki, məktəbxanalar açıb xalqa elm və ədəb öyrətmək ki, taxsırkar az olsun?

5) Xaric dövlətlər mətaı qadağan olub ki, kimsə alıb-satmasın və libas-ümumən İran mətaından olacaq. Bir kəsin qarnı ac olanda ona demək olurmu ki, çörək yemə və əgər deyilsə də, ol kəs ona əməl edə bilərmi? Əlbəttə, onun qarnını tox etmək gərək ki, bu hökmə əməl edə bilsin. Həmçinin İranda nə mətalar var ki, qeyri yerlərdən gələnlər qadağan olunsun? Nazik kətana öyrənən bez geyə bilərmi? Pəs yaxşı olurdu ki, xalqa elm öyrədib hər bir mətaı ə'lalandırmaq ki, nə ki xalq, bəlkə xaricilər də ol mətaları satın alıb işlədsinlər. Pəs hər bir şey elm ilə olurmuş, belədə İran üçün qoyulan qəvanini-cədidənin əvvəlinci fəsli gərək xalqa elm öyrətmək oleydi.

*Xeyirxahi-İran*

## ELM XƏBƏRLƏRİ

Təcrübə ilə biliblər ki, insanın ağlı beyin ilədir, yə'ni insanın beyni artıq olduqcan ağlı da çox olur. İndi Lauson həkim deyir ki, nə qədər dəli olan adamın beynini çəkmişəm, onlar sağ adamın beynindən ağır gəlib. Ondan masəva artıq dəli olanların və çox aqil kəslərin beyni bərabər olur.

* * *

Mə’lumdur ki, dəli olmaq ona deyirlər ki, insan bir şeyin fikrinə düşüb, həmişə onun fikrində ola. Pəs millətə və insaniyyətə xeyri olan şeyin fikrində olana bizlər çox aqil deyirik, amma heç bir kimsəyə xeyri olmayan şeyin fikrinə düşən dəli deyirik. Amma onların hər ikisi çox fikir elədiyinə ikisinin də beyni ağır olur.

* * *

Keçən il həkimlər Qras şəhərinə cəm olan zaman uşaqlar və övrətlər karxanalarda fəhləlik etmək barəsində belə yazırlar: gərək onlar gecələr və cümə günləri işləməsinlər. 16–17 yaşı olan 8, 14–16 yaşı olan 6 saatdan ziyadə, ondan kiçik olanlar və habelə övrətlər 7 həftə doğandan irəli və 8 həftə doğandan sonra gərək işləməsinlər.

* * *

Şvetsiya məmləkətində bir siçan var ki, onların çoxu hər ildə özbaşına dəryaya girib, üzüb, üzüb qərq olub, tələf olurlar. Bu əcayibatın səbəbini indiyəcən hükəmalar bilmirdilər, amma indi, Kruqiç adlı həkim deyir ki, qədim zaman siçanlar üzən tərəfdə bir cəzirə olub ki, onlar gedib orada özlərinə xörək taparlar imiş, lakin bu halda əgərçi ol cəzirəni dərya qərq edib, amma siçanlar atadan qalan adətə görə (hər bir heyvanın adəti də onun övladında tapılır) genə ol cəzirə tərəfə üzüb qərq olurlar. Pəs, elm nə ki, bu halda, hətta keçmişdə olan şeyləri aşkar edir.

## TƏZƏ XƏBƏRLƏR

Təbrizdən ermənilərin “Mşak” qəzetinə iyunun 25-dən yazırlar ki, Xoy şəhərində seyidlərin məqbərəsi var ki, orada bir neçə molla həmişə sakin olur. Ol mollaların birisi bir təəccüb yuxu görüb. Bu il Kərbəla tərəfində taun naxoşluğu olduğuna İran dövləti oraya getməyi qadağan edib. Zikr olan molla bir gün yuxudan durub xalqa mə’lum edib ki, yuxusunda həzrət imamları görüb və ol həzrətlər ona buyurublar xalqa mə’lum olunsun ki, Kərbəla ziyarətindən xalq məhrum olmaqdan ötrü ol həzrətlər köçüb zikr olan məqbərədə sakin olublar. Ona binaən xalq buraya ziyarətə gəlsin. Bu sözü xalq eşidib oraya ziyarətə gedillər və deyirlər ki, şəfa tapan çoxdur, amma onların heç birisini görən yoxdur.

* * *

Bu məktubu oxuyanda Avropa şəhərlərinin birisində vaqe olan əhvalat yadıma düşdü. Bir neçə il bundan irəli bir şəhərdə vəba naxoşluğu olan zaman xəbər çıxır ki, bir kilsədə həzrət İsanın anası Məryəmin şəkli ağlayır. Bu xəbər ol yerin padşahına yetişəndə özü gəlib onu görür. Ona binaən hökm edir ki, kilsənin divarını uçurtsunlar. Ol vaxtda mə'lum olur ki, keşiş bir hovuz qayırıb onun içini su ilə doldurub, oradan şəklin gözünə su damcı-damcı gəlib tökülür. Əgərçi belə mö'cüzə hər bir məzhəbdə düşər və ona inanan çox olur, amma hükəma onlara qail deyil.

* * *

Osmanlı dövlətinin Suriya vilayəti ki, ona xristiyanlar Palestinya deyirlər və orada Şam, Şərifi-Qüds, Şərifi-Beyrut və qeyri şəhərlər var, keçmişdə yəhudilərin vətəni olub. Amma həzrəti-İsa əleyhüssəlam vəfat edəndən sonra bir Rum şahı məmləkəti-yəhudini payimal edib ki, indiyəcən yəhudiləri yer üzünə dağılıb hər bir tərəfdə dadistəd edirlər. Məsələn, bizim Rusiya dövlətində 4 milyon yəhudi var ki, onlardan heç bir əkinçi yoxdur, hamısı sənətkarlıq ya tacirlik edirlər. Keçmişdə ki, Avropada ol qədər elm olmayıb, yəhudilərə çox zülm ediblər, amma onilə belə onlar öz dillərində və məzhəblərində qaim olduqlarına yəhudi milləti indiyəcən tələf olmayıb. Elə ki, Avropada elm tərəqqi edir, yəhudilərin çoxu öz adəti-qədiməsindən çıxıb xaçpərəst olurlar. Ona binaən bir neçə il bundan sabiq Avropada olan yəhudilər bir icmai-milləti bina edillər ki, ol icma özlərinin qədim dillərində 5 qəzet çıxardıb, hər məmləkətin yəhudilərinə göndərir ki, onları öz dillərində və məzhəblərində saxlasın. Ondan masəva ol icma bu xəyala düşüb ki, Osmanlı dövlətindən zikr olan Suriya vilayətini satın alıb yəhudiləri oraya aparıb, təzədən yəhudi məmləkəti qayırsın. İndi ol icma çıxardan "Həmğeyd" qəzeti yazır ki, bundan ötrü icma 56 milyon manat cəm edib və onun calisi Qəvaddali bu halda İstanbula gedib ki, dövləti-Osmani ilə Suriya vilayətinin barəsində danışsın.

* * *

Əhməd Muxtar paşa Qaradağın knyazı Nikolayı basandan sonra onun dalıncan Qaradağa gedən vaxtda onun üstə Qaradağ əhli tökülüb, əsgərinə çox zərər ediblər. Deyirlər onun 20 min əsgərindən 5 min qalıb və bu əsgər ilə qaçıb Tribnə qalasında dayanıb. İndi Dərviş paşa 20 min

əsgər ilə ona köməyə gedir. Muxtar paşanın zikr olan davasında Qaradağ əhli Səlim paşanı öldürüb, Osman paşanı əsir ediblər. İndi tel gəlib ki, Muxtar paşa Klik qalasının üstə gedir. Mə'lum ki, kömək yetişib.

* * *

Həzrət Məhəmməd Muradi-pəncümün naxoşluğu çox əcayib naxoşluqdur. Gah tel gəlir ki, həzrət ölüm halındadır, gah yazırlar ki, həzrət sağ və səlamət hər gündə öz lodkasında səyahət edir. Xülasə, belə mə'lum olur ki, qədim və yeni türklər miyanında niza' var. Avropa politiklərinin bə'zi deyir ki, Serblər ilə cəng qurtarandan sonra qədim və yeni türklər bir-birilə cəng edəcəklər.

* * *

Osmanlı əsgəri Serbistana daxil olub, bir neçə qala alandan sonra knyaz Milan öz paytaxtı Belqrad şəhərinə gəlib vəzirlər ilə məşvərət edib. Əgərçi vəzirlərin hamısı razı olublar ki, Osmanlı ilə davanı mövquf etsin və qeyri dövlətlərin konsulları ondan bu barədə iltimas ediblər, amma zikr olan knyaz razı olmayıb və deyib ki, əvvəlcən dava edəcək, sonra general Çernyayevi hamı əsgərə sərkərdə edib, genə sərhəddə gedib. Osmanlı əsgəri düz yerdə olan qalaların hamısını alıb gedib Aleksanas qalasının üstə ki, Belqrada gedən yolun üstədir. 3 gündür Serbistandan tel gəlib ki, Osmanlı əsgərini basdıq. Ona binaən knyaz Milan davanı mövquf etməyə, yə'ni barışmağa razıdır. Amma, həqiqət, dava necə olmağı mə'lum deyil.

* * *

Qarabağdan yazırlar ki, cənab knyaz Usmiyevin mülkündə bir hacı Molla Ələkbər adlı şəxs maşın ixtira etmək fikrinə düşüb ki, öz-özünə düyü döysün, təmizləsin və bir də çox dərin çaydan su çıxartsın.

* * *

Amerikada vaqe olan Brazil imperiyasının imperatoru Don Pedro-düvvüm, Daniyanın və Yunanın padşahları və İtaliyanın padşahının oğlu bu halda Peterburqa səyahətə gəliblər.

* * *

Qəzetlər yazırlar ki, bizim vəziri-qəvaninin dəftərxanasında danışıq var ki, mirovoy sudlara ixtiyar verilsin ki, qeyri şəhərlərdən göndərilən ərizələrə mülahizə edib, ərizə verən özü olmasa da, onu qət' edə bilsinlər.

* * *

“Tiflisski vestnik” qəzeti yazır ki, bizim vəziri-əsgəriyyə bu avqust ayında Tiflis şəhərinə gələcək.

* * *

Rusiyanın Voloqod quberniyasında qədim zaman Zıryan adlı bir tayfa sakin olurmuş. Yazırlar ki, ol tayfa indi elə azalıb ki, onlardan bir neçə kənd qalıb və onlar həm qeyri tayfalara elə qarışıllar ki, bu yavuq zamanda bilmərrə tələf olacaqlar.

* * *

Qəzetlərdə yazırlar ki, bizim padşahi-imperaturi-ə’zəm öz külfəti ilə avqustun 16-da cənubi Rusiyaya, yə’ni Krıma gedəcək.

* * *

Rusiyanın cənub quberniyalarında tənbəki əkillər, amma yaxşı tənbəki əmələ gəlmir. İndi yazırlar ki, onlara yaxşı tənbəkinin toxumunu paylamaq ilə hər kəsin tənbəkisi yaxşı olsa ona ən’am verməklə istəyirlər tənbəkini yaxşılandırsınlar.

* * *

Qəzetlərdə yazırlar ki, Şərifi-Məkkə İstanbula tel göndərib ki, əgər lazım olsa, ərəblərdən 20 min atlı əsgər göndərim. Amma ona yazıblar ki, lazım deyil.

* * *

Avqustun 20-dən tel gəlib ki, əsakiri-şahanə hər bir tərəfdə basılıb, xaçpərəstlər təzədən Osmanlı yerinə daxil olublar. Vəzirlər Soltan Muradı xaric edib, yerinə onun qardaşı Əbdülhəmidi soltan ediblər.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub.

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*2-ci sənə* | *17-ci nömrə*

*Fi 1 rəməzanülmübarək, sənə 1293*

* * *

*Poşt xərci basdıran illədir*

* * *

*Çaharşənbə günü*



*Fi 8 sentyabr Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## DAXİLİYYƏ

Bizim Qafqaz vilayətinin adını eşidib üzünü görməyən elə fikir edir ki, bizim adam belə gözəl yerdə cənnətdə olan kimi kef-damağa məşğuldur. Ol kəslər üçün bizim köçərilərin zindəganından bir neçə kəlmə danışaq:

Qışın çilləsində axşam düşüb. Obanın qazmalarını tamam qar basıb. Ora-buradan qar içindən tüstü çıxır. Mal-qara qayıdıb qazmalara gəlib. Obanın əhli övrət kişiyə qarışıb. Kimi əlində kürək ağılların içinin qarını atır, kimi tövləyə mal sürüyür, kimi köpəklərə yal bişirir, kimi qurd yaralayan malların yarasına baxır, kimi götrüm düşən malları qazmaya sürüyür. Xülasə, böyükdən-kiçiyə hərə bir işə məşğuldur.

Qaranlıq düşüncən xalq malları rahatlayıb qazmalara çəkilir. Bircə köpəklər çöldə qalıb, çaqqalın səsini eşidib, ağız-ağıza verib, ağlaşma ağlayan kimi ulaşırlar. Çovğun şiddət edir. Hərə əlimizə bir uzun dəyənək alıb bizim kirvə hacının qazmasına gedirik. Köpəklər səsimizi eşidib üstümüzə tökülür. Biz dal-dala verib özümüzü qoruya-qoruya obanın içinə daxil oluruq. Qazmalardan səs gəlir: ay it, hey! Amma heç kimsə görünmür.

Hacının qazmasına yetişincən köpəklərin qədəri elə artır ki, getmək məqdur olmur. Dalımızı hacının qazmasına verib ucu dişlənməkdən gödəlmiş dəyənəklər ilə özümüzü qoruya, ay hacı, gəl – deyib, dad edirik. Hacı ay it, ay it – deyə başında öküz çulu çölə çıxıb, bizi tanıyıb,

qazmaya gətirib öz qızı Tükəzə deyir: ay qız, ayağa dur, əziz qonaqlar üçün yer qayır.

17 yaşında bir qırmızıyanaq, tərgöyçək qız gözlərini ovxalaya durub iki eşşək alığı gətirib buxarının qabağında bizim üçün qoyub hacının buyurmağına görə başlayır bizə aş bişirməyə.

Buxarının qabağında oturub qazmaya baxırıq. Onun bir küncündə buxarı yanır ki, hərdəm külək onun tüstüsünü içəri doldurur. Bir küncündə bir yaralı keçi və iki təzə doğulmuş buzov bağlanıb. Bir küncündə qancıq eşşək yanı xotuxlu bağlanıb. Bir küncündə hacının tulası doğub öz küçüklərini əmizdirir. Divarın üstə köndələn bərkinmiş ağacın üstə 5-6 toyuq yatıb.

Hacı buxarının qabağında çöməlib qabax qəlyanı rahatlayıb, başında od qoyub bizə verib danışır. O cümlədən öz övrəti Şahpəri vəfat etdiyini belə nağıl edir: bu il yayda biz dağda olan zaman rəhmətlik Şahpəri naxoşlayıb gecə nalə edirdi. Bizim qız da yatmışdı. Gördüm çöldə itlər bərk basır. Nə qədər səslədim olmadı. Çölə çıxıb heç kəsi görməyib, itlərə acıqlanıb, içəri girib, gördüm başına döndüyüm Şahpəri Allah rəhmətinə gedib. Mən evi yıxılmış heç bilmişəmmi ki, itlər basan əzrail imiş, çıxıb itlərin ağzından onu qurtarmışam, o boynusınmış alaçığın o biri tərəfindən girib Şahpərinin canını alıb gedib...

Ey bu kəlmələri oxuyan, dəxi bəsdir, bizim hacı başqa danışdığı sözlərdən və Tükəz bişirdiyi aşdan danışmıram, amma bunu ərz edim ki, Allah o aşı heç kafirə nəsib və hacını heç kimsəyə həmsöhbət etməsin.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Bizim Qafqaz vilayətinin ab-havası dəyişilməyi mə'lumdur. Keçmişdə yayımız belə isti və qışımız belə soyuq olmayıb. Buna ümdə səbəb meşələr azalmaqdır. Meşə olan yer nəmiş olduğunda havada su buğu ziyadə olur və su buğunun bir xasiyyəti var ki, çox tez qızmaz və qızanda tez soyumaz. Bu səbəbə yayda isti olanda havada olan buğ tez qızmadığına hava elə isti olmaz və qışda soyuq olanda buğ tez soyumadığına elə soyuq olmaz. Əlbəttə, vilayətimizin ab-havası dəyişilməyə səbəb meşə azalmaq olduğuna gərək təzədən meşə salmaq (Keçən ilin 2-ci nömrəsinə bax). Amma meşə salmaq çox vaxt istər. İndi lazımdır bu ab-havaya münasib iş görmək.

İnsan hər bir tərəfdə sakin ola bildiyinə hava bir az isti və ya soyuq olmağı ona kar etməz, amma insan saxladığı heyvanat və ələfiyyat üçün havanın bir az dəyişilməyi də tə'sir edir. Məsələn, qədim zaman biz barama qurdu üçün tikdiyimiz ev, yə'ni küm yaxşı iş görürdü. Ol vaxt baharda elə soyuq olmurdu, amma indi baharda olan soyuqlardan qurdlar naxoşlayıb tələf olur. Ona binaən lazımdır ki, kümləri qeyri tövrdə tə'mir edək. Küm gərək quru, işıq, isti və onun havası təmiz olsun. Bu səbəblərə onu daşdan, kərpicdən tikmək ya ağacdan tikib suvaqlamaq yaxşıdır. Onun gərək böyük akoşkaları olsun ki, küm işıq ola və hava isti olan zaman onları açıb havanı təmizləmək olar. Akoşkaların gərək tordan pərdəsi ola ki, qurdları quşlardan və qeyri heyvanatdan mühafizət edə. Kümdə gərək peç ya buxarı ola ki, soyuq olanda onları qalamaq ilə kümü qızdırmaq ola. Xülasə, bu halda bizim barama qurdlarının tələf olmağına ümdə səbəb soyuq, nəmişlik və kümlərin havası xarab olmaqdır. Ona binaən bizim kümdarlara məsləhət edirik ki, qurd bəsləməkdən nəf'bərdar olmaq istəyirsələr, onlar üçün yaxşı küm tə'mir etsinlər.

## MƏKTUBAT

Bizim dostlardan bir xarici yazır ki, bir ay bundan sabiq Ş... şəhərində bir karvansaranın hücrələrində dükanları olan mö'təbər müsəlmanlardan xəbərləşib bildim ki, onların heç birisi "Əkinçi" qəzetini gətirtmir. Buna çox təəccüb edib onlardan sual elədim ki, niyə qəzet gətirdib oxumursunuz? Mənə cavab verdilər ki, onu çox oxumaq istəyirik, amma qiyməti artıq olduğuna gətirdə bilmirik. Ona binaən mən onlara məsləhət elədim ki, siyahı ilə pul yığıb bir qəzet gətirsinlər ki, onu tamam karvansarada hücrəsi olan oxuya bilsin. Bu səbəbə mənim dostum hacı M... siyahı açıb başladı pul yığmağa. Amma zikr olan hücrə sahiblərindən bir şahıdan (5 qəpik) artıq verən olmadığına bir manat yarımı yığa bilməyib, ol siyahını mənə verib söylədi ki, iş başa gəlmədi. Çünki zikr olan karvansarada hücrəsi olanların əksəri tavanadır, onların bə'zi, məsələn, ağa Q... ildə 20-30 min manatlıq alış-veriş edir, ona binaən bu xəsislik onların biqeyrətliyinə dəlalətdir. Bina bər in ol siyahını cənabınıza göndərib təvəqqə edirəm ki, beyadigariyi-milləti-islam onların adını qəzetə salasınız.

Zikr olan siyahıya baxıb orada bizim tanışlardan bir neçəsinin ismini gördük. Əlhəqq onların hamısı əhli-tavanadırlar və məzkur ağa

Q... nın 40–50 min manata tavanası çatar. Ona binaən zeyldə yazılan kağıza bavər etməyib ol siyahını qəzetə salmadıq. Amma cənab ağa Q...dan iltimas edirik ki, əgər o kağız doğru isə sifariş ilə ya siyahı ilə 8 qəpik yığıb bir kağız yazıb bizə mə'lum eləsinlər, biz mədyun olarıq ol qədər müsəlman qardaşlarımız qəzet oxumağa xahişmənd olsalar, onlar üçün bir qəzet müftə göndərək.

## ELM XƏBƏRLƏRİ

Keçən il yer üzündə 97 zəlzələ olub. Onlardan 3 ay qışda 34 ki 15–i yanvarda, 7–si fevralda, 12–si dekabrda. Baharda 28 ki 12–si martda, 7–si apreldə, 9–u mayda, yayda 21 ki 10–u iyunda, 6–sı iyulda, 5–i avqustda. Payızda 14 ki 3–ü sentyabrda, 2–si oktyabrda, 9–u noyabrda vaqe olub. Onların hamısından bərki Novi Qranada vilayətinin Köküt şəhərində olub ki, bir zəlzələdən 16 mindən ziyadə Adam tələf olub.

* * *

İndiyəcən 3 qism dəyirman var idi ki, onların bə'zi su ilə, bə'zi külək ilə, bə'zi maşın ilə işləyirdi. Amma bu halda nemeslər sə'y edirlər ki, ziya, yə'ni işıq ilə işləyən dəyirman bina etsinlər. Bu dəyirmanın külək dəyirmanı kimi qanadları var ki, o qanadlar qara rəng ilə boyanıblar. Günün ya qeyri işığı gələn şeyin işığını büllur şüşələr ilə cəm edib ol qanadların üstə salanda onlar hərəkətə gəlib dəyirmanı işlədillər.

* * *

İnsanın zindəganı onun ömrü uzun ya gödək olmağa səbəb olduğu mə'lumdur. Məsələn, kənd əhlinin ömrü şəhər əhlinin ömründən uzun olur. Keçən il Riçardson adlı ingilis hükəması bəyan edib ki, əgər bir şəhərdə evlər, küçələr və qeyrə elm yolilə tə'mir oluna, ol vaxtda orada sakin olan 100 il ömür edər. İndi yazırlar ki, London şəhərində bir icma bina olub, zikr olan qayda ilə bir təzə şəhər salmaq istəyir.

* * *

Tarixlərdən mə'lumdur ki, bizim Qafqaz vilayəti Avropa və Asiya qit'ələrinin miyanında olduğuna qədim zaman Asiya qit'əsinin əhli ziyadə olanda orada sakin olan tayfalar Qafqazdan köçüb Avropaya

gedir imiş. Çünki Qafqazın yeri və ab-havası həmişə yaxşı olub, ona binaən ol tayfaların hərəsindən bir neçə adam Qafqazda düşüb qalıb. Sonra ərəblər gəlib onların çoxunu islam edib. Amma dini-islam ol tayfaları birləşdirməmiş hökuməti-ərəb payimal olduğuna ol tayfalar hələ öz dilini danışıb adəti-qədiməsi ilə zindəganlıq ediblər. Hətta bə'zi yerdə islam heç bina tutmayıb. Məsələn, Osetin tayfası ki, dağlarda sakindir, indiyəcən islam, xristian, bütpərəst məzhəblərinin adablarını birgə işlədillər, elə külfət var ki, 3 qardaşın biri müsəlman, biri xristian, biri bütpərəstdir. Əgərçi sonradan Qafqaz müsəlman dövlətlərinin ixtiyarında olub, onlardan heç kim ol tayfaları birləşdirmək sə'yində olmayıb. Belə də əgərçi Qafqazda islam qeyri millətlərdən ziyadədir, lakin o millətlər birləşiblər, amma biz ittihadi-islam dalıycan olmayıb bir-birimiz ilə düşmənlikdən başqa rəftar etməyib indiyəcən hərə bir tərəfə baxa qalmışıq və nə ki bizim dağlarda sakin olan çərkəz, abadxiz, şəpsuğ, adiğ, çeçen, kabarda, ləzgi və qeyri tayfalar bir-birini düşmən hesab edib, həmişə dava edirlər, hətta bizim Şirvan uyezdi ki, həməvəqt bir olub indiyəcən birləşməyib, kimi türk, kimi fars, kimi tat dili danışır. Belədə məktəbxanalar açıb, qəzetlər çıxardıb bir-birimizin dilini öyrənib dərdindən xəbərdar olmaq bizlərə vacib deyilmi?

## TƏZƏ XƏBƏRLƏR

Həzrət Məhəmməd Muradi-pəncüm soltan olandan sonra ona bir naxoşluq rücu olur ki, əlacı olmaya. Çünki bu əsnada xristianlar ilə cəng başlanır, ona binaən onun naxoş olmağını xalqa mə'lum eləməyib vüzəralar onun əvəzində hökumət işlərini dolandırırlar. Elə ki, xalqa onun naxoşluğu məlum olur və qaideyi-osmaniyyəyə görə gərək hökumət, xilafət, həzrət Osmanın övladının əlində olsun, ol vaxtda xalq arasında danışıq olduğuna vəzirlər hökumət işini dolandırmaqdan ötrü bir məclis bina edillər ki, o məclis həzrətin atasından, qardaşı Əbdülhəmiddən və iki vəzirdən olub. Zikr olan məclis Avropada məhşur olan 40 nəfər həkimi-haziq gətirdib ona müalicə elədir. Amma axırda ki, ol həkimlər hamısı ondan əl çəkir, onun izni ilə qardaşı Əbdülhəmid onun yerinə soltan olur. Yazırlar ki, indi Həzrət

Məhəmməd Murad heç kimi tanıya bilmir və elə zəif olubdur ki, danışmağa amanı yoxdur. Həzrət Əbdülhəmid soltan olandan irəli yazırlar ki, ol həzrət qədim türk dəstəsindəndir, amma indi ol həzrət Midhət paşaya və qeyri yeni türklərə elədiyi hörmətdən mə'lum olur ki, o da yeni türk dəstəsindəndir. Həzrət Əbdülhəmid mərhum Soltan Məcidin ikinci fərzəndidir. Həzrət Məhəmməd Muraddan 2 yaş kiçikdir. Deyirlər avqust ayının 27-sində həzrət Osmanın qılıncını bağlayıb. Ona soltan Əbdülhəmidi-düvvüm deyəcəklər.

* * *

Keçən səfər yazmışdıq ki, Qaradağ əhli Muxtar Paşanın üstə tökülüb, Osman paşanı əsir edib. İndi "Qolos" qəzetinin müxbiri yazır ki, zikr olan Osman paşa Qaradağın Çetni qəryəsində ki, Qaradağ knyazının paytaxtıdır, ona deyib ki, o şirvanlıdır və irəli rus qulluğunda olub, amma sonradan Osmanlıya gedib. Osman paşa özünü Əsir olmağını belə danışır: bizim üstümüzdə Qaradağ əhli birdən töküləndə mənim əsgərim qaçmaq istədi. Mən qılınc ilə onların qabağını saxlayan zaman mənim qılıncım sındı. Bu halda məni əhatə edib dəstgir elədilər. Amma Muxtar paşa bu əhvalatı İstanbula belə yazıb ki, mən öz zirdəstimdə olan paşalara hökm eləmişdim ki, filan günü filan saatdan öz əsgərləri ilə filan yerdə məni gözləsinlər. Amma Osman paşa və Səlim paşa ol vaxtdan 4 saat irəli zikr olan yerə gəldiyinə Qaradağ əhli onların əsgərini pərakəndə edib və onlar qaçıb, mənim əsgərimə rast gəlib, onu da qaçırtdığına mən naəlac qalıb Tribnə qalasına qayıtdım. Belə mə'lum olur ki, İstanbulda Muxtar paşanın sözünə inanırlar, ona binaən ki, ona təzədən əsgər tapşırıblar.

* * *

Keçən nömrədə çap olunan əsakiri-şahanə basılmaq xəbəri doğru olmadı. Zayçar, Knyajivaz qalalarından Osmanlı əsgəri Aleksanas qalasının üstə getdiyini ol qalaları serblər təzədən alıb ol xəbəri çıxartmışlar. Amma sərəsgər Əbdülkərim paşa Aleksanas qalasının altında 60 min əsgər cəm edib 8 gün gecə-gündüz cəng edib, ol qalanın bürclərini və ətrafında olan dağları alandan sonra general Çernyayev Aleksanas qalasında 10 batalyon əsgər qoyub özü Deliqrad qalasına gedib ki, əsakiri-şahanə onun dalınca gedib, ol qalanı əhatə edib cəng edir. Xülasə, cəng Serbistan yerində olur və hər tərəfdə əsakiri-şahanə serblərə faiq gəlir.

* * *

Ümdə düşmən Serbistan əhli olduğuna Osmanlı dövləti Qaradağ əhlinə məhəlgüzar olmurdu. Amma indi serb əsgərinə faiq gələndən sonra hökm olunub ki, Muxtar paşa, Dərviş paşa hərə bir tərəfdən Qaradağın yerinə daxil olsunlar.

* * *

Aleksanas davasından sonra Serbistanın knyazı Milan qeyri dövlətlərin vəziri-muxtarlarına bəyan edib ki, barışıq etməyə razıdır. Ona binaən bu halda Avropa dövlətlərinin vəziri-muxtarları İstanbul şəhərində danışıq başlayıblar. Onlara sədri-ə'zəm mə'lum edib ki, divanda onların iltimasına mülahizə oluncan davanı qurtarmaq olmaz və bir də barışıq olsa, gərək bilmərrə olsun, vaxt ilə olmasın, necə ki, serblər xahiş edirlər. Sülhnamənin şərtləri mə'lum deyil. Amma Osmanlı deyir ki, serblər ona davanın xərcini versin və sərhəddə olan serb qalalarının birisində həmişə Osmanlı əsgəri dayansın.

* * *

Əgərçi sülh barəsində danışıq var, amma dövləti-Osmani bərk tədarük edir. Məsələn, Batum qalasında min fəhlə işləyir. Silistriya, Ruşçəq və qeyri qalalar da əsgərlər üçün altı aya sursat, yə'ni azuqə yığır. İndi "Pravitelstvenni vestnik" qəzeti yazır ki, Ərzurum, Bayazid və Qars qalaların bərkidirlər, oralara top-tüfəng və azuqə yığırlar. Hökm olunub ki, Ərzurum vilayətindən 25 batalyon əsgər və 10 min lirə məbləğ cəm olunsun.

* * *

İndiyəcən yunan əhli serblərə kömək etmir, amma Krit cəzirəsində sakin olan yunan əhli tərpənişdiyinə dövləti-Osmani oraya 15 min əsgər göndərib və yunan əyalətinin sərhəddində Makedoniya vilayətində ol sərhəddi saxlamaqdan ötrü əsgər cəm edillər.

* * *

Əgərçi indi olan Osmanlı davasına Avropa dövlətləri qarışmırlar, amma öz xahişi ilə davaya gedən və pul göndərən çoxdur. Məsələn, Aleksanasda olan davada serblərin bir polkundan 30 rus əfsəri öldürüblər. Həmçinin deyirlər ki, Osmanı əsgərində ingilis və Avstriya əfsərləri var.

* * *

Serbistan pul borc edir. Rusiyada onlara ixtiyar verilib ki, 6 milyon manat borc etsinlər. Banglarda Serbistanın qəbzlərinin biri 15 min manata satılır.

* * *

İskəndəriyyədən avqustun 7-dən yazırlar ki, Həbəş padşahı İoan təzədən Misir ilə dava başlayıb. 2 min Misir əsgəri oraya gedib.

* * *

Vəziri-muxtari-Rus general İqnatyev İstanbulda sülh barəsində danışıq olduğuna otpuskdan qayıdıb İstanbula gedib.

* * *

Qarabağdan yazırlar ki, oranın əhli istəyir öz şəhərlərində gimnaziya açsın, bu şərt ilə ki, onlar mədyun olurlar 70 min manat versinlər, amma baqi xərcini dövlət versin. Ol 70 min manatı da onlar xəzanədən borc istəyirlər ki, hər ildə onun bir hissəsini xəzanəyə doldursunlar.

* * *

Hacıtərxandan avqustun 7-dən yazırlar ki, kalmıkların yetim uşaqlarından ötrü xristian ruhaniləri təzə məktəbxana açıblar. Oraya 10 uşaq gedib.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Fi 15 rəməzanülmübarək, sənə 1293*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Çaharşənbə günü*




*Fi 22 sentyabr Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## E' L A N

Badkubə şəhərinin malakan hissəsinə çiçək naxoşluğu düşüb. Ona binaən polisəxana mə'lum edir ki, hər kəsin çiçəyi olan naxoşu ya çiçəyi döyülməmiş uşağı olsa, şəhərin həkimi Vaxramova mə'lum etsin ki, bu naxoşluğa müalicə etmək ona mühəvvəl olunub.

## DAXİLİYYƏ

Xeyirxahi-İranın 16-cı nömrədə çap olunan məktubu barəsində bir şəxs elədiyi suala cavabdır: necə ki insan cismdən və ruhdan mürəkkəbdir və bunların hər birisi əlahiddə şeydir, amma onların bir yerdə olmağı hali-həyata bais olur, habelə elm iki qism olur: Əl elmi-ilman: elmül-əbdan, elmül-ədyan və onların hər birisi bir qeyri aləmdir. Amma onların hər ikisi götürdüyü səmərədən nəf'bərdar olmayana xoşgüzəranlıq müyəssər olmaz. Bizlərdə indiyəcən zikr olan elmlərə təfavüt verməyib onların hər ikisini bir məktəbxanada, bir ustaddan, bir qayda ilə öyrənirlər. Amma bu qayda qədim zəmanə qaydasıdır və zəmanə dəyişildiyinə gərək ol qayda həm dəyişilsin.

İnsan dünyaya gələn zaman hər kəs gərək özü üçün hər bir şeyi, məsələn, papaq, başmaq, çuxa və qeyrə tikeydi. Əlbəttə, belədə ol işlərin heç birisini yaxşı əmələ gətirmək məqdur deyil idi. Ona binaən

insanın qədəri artanda hərə bir işə məşğul olur, yə'ni kimi başmaqçı, kimi dərzi və qeyrə olduğuna hər bir sənət tərəqqi edib. Habelə əsbab və alatielmiyyə olmayanda ya az olanda hər bir tayfa zikr olan elmlərə təfavüt verməyib onların hər ikisinin bir ustaddan, bir məktəbxanada öyrənirdi, yə'ni hər kəs oxuyub həmi molla, həmi hükəma olurdu. Başda sarğı olmayana hükəma demirdilər. Amma bizim zəmanədə ki, təcrübati-elmiyyə artıb, ol elmlərin hər birisini oxutmaq üçün qeyri məktəbxana və qeyri müəllimlər lazımdır. Doğrudur, bizim də məktəbxanalarımız var, amma onlardan ümdə mətləb elmi-ədyan oxutmaqdı. Elmi-əbdanı ya heç oxutmuruq ya oxutsaq da ona elə sə'y etmirik. Amma təqazayi-zəmanəyə görə və millətin pişrəvindən ötrü lazımdır ki, biz də qeyri millətlər kimi elmi-əbdanı elmi-ədyandan ayırıb, onun üçün qeyri məktəbxana bina edib, qeyri müəllimlər tə'yin edək. Belədə həmi mollamız molla, həmi hükəmamız hükəma olub, hər bir elm tərəqqi edər, yoxsa bu halda olan kimi hər iki elmin dalınca birdən düşdüyümüzə onların hər ikisindən avara oluruq. Pəs biz ərz elədiyimiz məktəbxana bizim məktəbxana deyil ki, orada başımıza qapaz vurub, ayağımızı falaqqaya salıb, adab, təharət, qüsl və qeyrə öyrədirlər. Amma elmi-əbdan məktəbxanasıdır ki, onları təzədən bina etmək gərək.

## MƏKTUBAT

*Yazıldı Moskva şəhərində sentyabrın 3-də*

Doğrudur, bizim müsəlmanlar arasında arif və qanacaqlı əşxaslar çoxdur, amma bizim bə'zi işlərimizə baxan gərək bizi Dəşti-qıpçaq əhli hesab etməsin. Buna səbəb oldur ki, bizim adəti-qədimə zəmanə rəftarı ilə düz gəlmir. Biz qanacağımızı artırmağa sə'y edəndə adətiqədimələri dəyişdirməyə sə'y etmirik. Məsələn, 15-20 gün bundan sabiq bizim Şuşa şəhərində axşamdan bir saat keçmiş 7 əlixəncərli adam ... bəyin oğlu ... bəyin sərkərdəliyi ilə ... xanımın evinin üstə tökülüblər ki, onun qızını aparsınlar. Qızı və anasını zəxmdar ediblər, amma ətrafında sakin olanlar haraya gəldiyinə qızı apara bilməyiblər. Təəccüb bu deyil ki, belə iş bizim içimizdə büruz edib. Amma təəccüb budur ki, hamı silist edənə deyib ki... bəy tək olub, onun yoldaşı olma-

yıb və dəxi bunu fikir etmirlər ki, gələn səfər məzkur bəy bir qeyri babanın qızını aparacaq və bir də cənab ... bəy özü haraya gələnlərin qabağına çıxıb deyir imiş: nə var? Övrət uşaq doğur, getməyin.

Mərhəba bizim qədimi adətlərimizə. Bu bizim işlərimiz, bu bizim qüvvətli cavanlarımız, bu da bizim ... atamız.

*Nəcəf*

## ELM XƏBƏRLƏRİ

*Beyadigari-sakini-Şirvan*

Zəlzələ 3 qism olur: ləpə kimi, tullama, dolandırma. Ləpə kimi olanda yer su ləpələnən kimi tərpənir, yə'ni onun bir tərəfi qalxanda, o biri tərəfi düşür. Tullama olanda yer tullanıb düşür. Dolandırma olanda yer fırlanır.

Ləpə kimi zəlzələdən küləkdən ağac əsən təki evlər tərpənir və əgər ləpə böyük olmasa onlar uçmur. Bu qism zəlzələ elə zərər etməz. Tullamanın gücü və zərbi ziyadə olur. Dolandırmanınkı, dəxi ziyadə olur. Bu 3 qism zəlzələ ya hamısı birdən, ya ikisi birgə vaqe olur. Onlardan tullama ilə dolandırma birgə olanda zəlzələ ziyadə şiddət edir. Zəlzələ qəflətən başlanıb 1 dəqiqə ancaq çəkir. Çox vaxt da 1-2 saniyədən artıq olmur. Amma bə'zi vaxtda bir neçə gün gedir. Bə'zi vaxtda onun dairəsi az, bə'zi vaxtda çox olur. Məsələn, Şirvanda olanda Badkubədə olmur. Amma qeyri yerdə onun dairəsi 700 min ağacdan ziyadə olur və bir də zəlzələ ya bir tərəfə düz gedir, ya bir yerdən hər bir tərəfə gedir.

Düz gedən zaman bə'zi yerdəki onun binası möhkəm daşdır, mə'lum olmur. Amma binası boş olan yerdə şiddət edir və hər tərəfə bərabər gedən zaman zəlzələ əmələ gələn yerdə şiddət edir, amma uzağa getdikcə gücdən düşür.

Zəlzələnin səbəbi indiyəcən mə'lum deyil, bə'zi hükəma qövlünə görə kürreyi-ərzin içi çox isti olduğuna orada olan şeylər tamam əriyib və onlardan hava qismi şeylərin qapağının altında olan çuxurlara yığılanda su buğu çaynik samavarın üstə qaynayanda onun qapağını tərpədən kimi, yerin qapağını tərpədir ki, ona zəlzələ deyirik. Bə'zi deyir ki, yağış ya qar suyu yerə hopub, axıb gedib, özgə yerdən bulaq olub, yerin

üzünə çıxan zaman yerin altı ilə axanda orada olan şeyləri özü ilə apardığından yerin altında böyük kalafalar əmələ gəlir ki, bu kalafaların kənarları uçmaqdan yer tərpənir. Zəlzələnin səbəbi yerin altında olduğuna, onu görüb bilmək məqdur deyil. Əlbəttə, onun səbəbi ki, mə'lum deyil, əlacı da yoxdur və habelə onun vaxtını da bilmək müşküldür. Bəzi vaxtda zəlzələ olandan irəli yer guruldayır ki, bununla onun vaxtını bilmək olur. Amma çox vaxtda yer ya heç guruldamır, ya guruldayandan sonra zəlzələ olmur. Bə'zi vaxt da zəlzələ olanda yer çatlayır ki, bu çatdaq düşəndə bir elə yekə olur ki, bir dəfə belə çatdağa 10 minəcən adam düşüb, sonra çatdağın kənarları gəlib qovuşduğuna onlar bilmərrə əzilib tələf olub. Bə'zi vaxt da ətrafda olan bulaqların suyu kəsilib, sonra birdən çay kimi ətrafı qərq edir ya onların suyu həmişə isti olur.

Xülasə, zəlzələ özü bir əcayibat olduğundan masəva, qeyri əcayibatlara həm səbəb olur. Lakin bununla belə hükəma naümid olmayıb, onun səbəbini və əlacını axtarır.

Məlumdur ki, zəlzələ hər dəqiqədə 7-8 ağac yol gedir, amma teleqraf bir dəqiqədə kürreyi-ərzi dolanır. Ona binaən hükəma məsləhət edir zəlzələ olan yerlərdə top qoyub teleqraf ilə zəlzələnin xəbəri gələndə onu atıb sərhesab etsinlər. Amma belə xəbər vermək ilə bizim Şirvanda olan zəlzələdən ki, onun dairəsi kiçikdir, xilas etmək olmaz.

Pəs, sakinani-Şirvan, sizin dərdinizə heç də əlac yoxdur. Həmişə canınız qorxuda və malınızdan naümid gərək olasınız. Ona binaən lazım bilib məsləhət edirik ki, ya gedib başqa yerdə sakin olasınız, ya gözəl vətəninizin buyini eşitməkdən ötrü naəlac qalıb, orada sakin olasınız, Evlərinizin binası möhkəm olan yerdə uzunu bir mərtəbə və əgər məqdur olsa ağacdan tə'mir edəsiniz ki, zəlzələ onlara artıq zərər etməsin.

## TƏZƏ XƏBƏRLƏR

İstanbuldan qəzetlərə yazırlar ki, keçmişdə xədivi-Misrin vəziri olan Apram paşa ki, Qara dəryanın boğazının kənarında öz mülkündə sakin olurmuş, özü üçün bir yol qayırdanda onun xəbəri sədri-ə'zəmə yetişib, sonra silist başlayıblar və indi mə'lum olub ki, o yola 2 milyon manata qədər xərc olunub. Onu elə təmir ediblər ki, onunla 100 min

əsgər çox böyük toplar ilə Qara dəniz tərəfdən boğazda vaqe olan şahanə qalalardan kənar gedib İstanbula daxil ola bilir. Deyirlər yolu Apram paşa bir xarici dövlətin xərci ilə tikdirib. Ona binaən onu dövlətə xəyanət etməkdən ötrü məhbus ediblər.

* * *

Həzrət Soltan Əbdülhəmid-düvvümün soltan olduğunu belə yazırlar: avqustun 17-də sədri-ə'zəm Məhəmməd Rüşdi paşa şeyxülislam Xeyrullah əfəndinin yanına gedib həzrət Məhəmməd Muradın naxoşluğunu bəyan edib. Ol vaxtda şeyxülislam fitva verib ki, əgər padşah iki ay yarım əlacı olmayan naxoşluğa giriftar ola və onun gələcəkdə şəfa tapmağına ümid olmaya, onun yerinə qeyrisini padşah etmək olur. Ona binaən sabahısı günü sədri-ə'zəm vəzir-vüzaranı və üləmaları Topqapı sarayına yığıb onlara zikr olan fitvanı məlum edəndən sonra vüzəralar Namiq paşa, Midhət paşa, Xəlil Şərif paşa gedib Həzrət Əbdülhəmidi gətirib taxta oturdub, ona bey'ət edib Əbdülhəmidi-düvvüm ismilə soltan ediblər ki, ol saat xaricilər bu əhvalatı xalqa məlum edib, 3 gün 3 gecə şadyanalıq olub. Həzrət Məhəmməd Muradın öz xahişinə görə onu Boğazda vaqe olan Bəylərbəyi sarayında sakin edib ona ayda 33 min manat məvacib təyin ediblər.

* * *

16-cı nömrədə yazmışdıq ki, Qarabağda cənab hacı Molla Ələkbər düyü döyməkdən və çaydan su çıxarmaqdan ötrü maşın ixtira etmək fikrinə düşüb. İndi bir şəxs bizə danışdı ki, ol cənab hər iki maşını tamam edib və Qarabağda bir icma bina olub ki, hər kəs xahiş etsə o maşınları aparıb onun yerində quracaq. Zikr olan icma Əlvənd qəryəsində ki, Kür çayının kənarındadır, bir az yer icarə edib su çıxardan maşının çarxlarını gətirib bu halda Badkubə şəhərinə adam göndərib ki, əhəng və qeyri mayəhtac alsın. Ol icmanın adamı deyib ki, iki aya maşın qurulub tamam olacaq və maşının 36 növçəsi olacaq, hər birinin deşiyi bir çərək qədərdə və onların hamısından birdən su çıxacaq.

Doğrudur, çarx ilə su çıxarmaq çətin deyil, amma bu qədər su çıxarmaq təəccübdür, ələlxüsus, Kür çayının Əlvənd olan yerindən ki, orada su çox lal axır.

Q a r a d a ğ. Keyvan vilayətində təhmilati-dövlət müəyyən edəndən çox artıq alırlar. Məsələn, Səğən qəryəsi gərək ildə 25 tümən versin,

amma onlardan 700 tüməndən artıq alırlar. Xülasə, zülm ol qədərdir ki, İsfahan ermənilərinin çoxu baş götürüb Rusiya yerinə köçüllər.

* * *

Rusiya Badkubə dəryasının şərq tərəfini zəbt edib, orada Krasnovodsk şəhərini bina etməkdən bir murad budur ki, Xivə və qeyri Asiya xanlıqları ilə alış-veriş etsin, amma oralarda karvan getməyə susuzluq və türkmənlərin çapovulçuları mane olurlar. İndi "Bakinskiye izvestiya" qəzetinə yazırlar ki, keçən avqustun 5-də Krasnovodskidən 6 rot saldat, 100 kazak, 100 türkmən atlısı toplar, 800 dəvə, 17 dəvə ərradəsi ilə general Lomakinin sərkərdəliyi ilə Xivəyə gediblər. Onların bu səfərdən muradı budur ki, yolun üstə quyular qazıb, su çıxardıb, türkmənlərdən oralarda kənd salıb, Xivəyə gedən yolu abad etsinlər.

* * *

Həzrət Əbdülhəmidi-düvvüm 32 yaşındadır. Uşaqlıqda Parij şəhərində məktəbxaneyi-hərbiyyədə tə'lim olunub. Elmlərdən elmi-hərbiyyəni və elmi-coğrafiyanı xoş tutur. Onun bir övrəti var imiş, amma övladı olmadığına, ikisini də alıb və genə övladı yoxdur. Həzrət uşaq olan zaman onun anası mərhum olduğuna onun ögey anası onu oğulluğa götürüb. Çünki valideyi-soltana əlahiddə hörmət olunur, məsələn, mərhum soltan Əbdüləzizin validəsinin həmişə 80 xacəsi, 100 kənizi olurdu, ona binaən həzrətin analığı istəyir ki, ona da bu hörmətləri etsinlər. Amma həzrət buna razı olmur. İrəli sarayda qulluq edənlərin hamısına oradan xörək gedirmiş ki, mərhum Soltan Əbdüləzizin zamanında sarayın yeməyinə hər ayda 60 min lirə osmani xərc olurmuş. Amma indi həzrət hökm edib ki, ol şəxslər hamı saraya cəm olub orada xörək yesinlər və bu qayda ilə onlara 20 min lirədən ziyadə xərc olunmayacaq. Keçmişdə vəzirlər soltanın yanında otura bilməz imişlər. Amma həzrət onları oturdub, papiros verib, sonra onlar ilə məsləhət edir.

* * *

Bu halda olan Osmanlı davasının səbəbi mə'lumdur. Bosnə və Qerdseqovinə əhli onlara çox zülm olur deyib, bir il dava edəndən sonra Avropa dövlətlərinin vəkilləri Berlin şəhərinə cəm olub sülh yazmışdılar ki, dövləti-Osmani onların ixtiyarlarını artırsın və əgər öz

xahişi ilə artırmasa bu işə qarışsınlar. İngilis bu danışığa razı olmadığına ol sülh bərhəm oldu. Bu əsnada Serb və Qaradağ əhli Osmanlı dövlətinin xristian tabelərinə ümid olub cəng başladılar ki, Osmanlı tayfasını Avropa qit'əsindən çıxarıb, orada xristian dövləti bina etsinlər. Avropa dövlətləri sözü bir elədilər ki, bu cəngə qarışmasınlar. İndi 3 aydır ki cəng olur, Avropa dövlətləri xalq bica yerə qırılmağını görüb vasitə düşüblər ki, davanı qurtarsınlar və 2 həftədir ki, İstanbulda dövlətlərin vəkilləri bu barədə danışıq edirlər. Onlar iltimas etmişdilər ki, 3 ay barışıq olsun, amma Osmanlı dövləti buna razı olmayıb, hökm edib ki, 10 gün dava olmasın və ol vəkillərə məlum edib ki, aşağıda zikr olunan şərtlər ilə sülh etməyə razıdır:

Serbistanın 1857-ci iləcən Osmanlı əsgəri dayanan qalalarında ki, olsun paytaxti-Serbistan Belqrad və qeyrə, genə Osmanlı əsgəri saxlasın.

Zikr olan ildən sonra bina olan qalalar ki, olsun Aleksanas və qeyrə, dağılsın.

Serb knyazı Milan İstanbula üzr istəməyə getsin.

Serbistan 10 mindən ziyadə əsgər saxlaya bilməsin.

Serbistan Belqraddan Niş qalasına dəmiryolu qayırtsın.

Serbistan davanın xərcini Osmanlı dövlətinə versin.

Qaradağ əhli keçmişdəki qayda üzrə qalsın.

Əgərçi dövlətlərin vəkilləri bu şərtlərə razı deyillər, amma ümidvardırlar ki, dövləti-Osmani bir az da güzəşt etsin. Ona binaən yazırlar ki, bişəkk sülh olacaq. Bu halda 10 gün vədə qurtarıb. Ona binaən əgərçi sülh barəsində danışıq var, amma genə cəng edillər. Aleksanasın yanında bu gün 3 gündür gecə-gündüz dava olur.

* * *

Padşahi-imperaturi-əzimi-Rus Krıma səyahətə gedib. Yazırlar ki, Osmanlı dövləti onun pişvazına 3 adam göndərib.

* * *

Əgərçi sülh barəsində İstanbulda danışıqdır, amma teleqraflardan məlum olur ki, Rusiyadan öz xahişi ilə Serbistana davaya gedən gün-gündən artır. İndi əvvəl zaman təki bir-bir getmirlər, dəstə-dəstə gedirlər ki, hər dəstə 500 və dəxi ziyadə adam olur.

* * *

Osmanlı davası başlananda Bolqar xristianları ki, slavyandırlar və özləri Osmanlıya tabedirlər, istədilər serblərə kömək eləsinlər, ona binaən dövləti-Osmani oraya çox çərkəs və başıpozuq göndərmişdi. Onlar ziyadə zülm elədiyinə bunun sədası tamam Avropanı basdı. Ona binaən İngilis oraya silist eləməyə adam göndərmişdi. Onlar mə'lum edib ki, bolqarlardan 12 min adam öldürüb, 17 qəryə yandırıblar. Burada da Avropa əhli Osmanlıdan ziyadə narazı olmuşdu.

İngilis xalqı öz padşahlarına ərizə vermişdi ki, Osmanlı dövlətinin düşmənləri ilə birləşib xristianların yerlərini Osmanlıdan alıb, əlahiddə dövlət bina etsin. İndi tel var ki, İngilisin əvvəlinci vəziri xalqa mə'lum edib ki, nə Osmanlının Avropadan qovmaq və nə ol xristianlardan əlahiddə dövlət bina etmək mümkün deyil.

"Türkestanskiye vedomosti" qəzeti yazır ki, təzədən qıpçaqlar Fərğanın sərhəddinə cəm olub, Rusiya ilə dava başlamışdılar. Amma general Skoblev onları pərakəndə edib.

* * *

Avqustun 27-də həzrət Soltan Əbdülhəmidi-düvvüm həzrət Osmanın qılıncını bağlayıb.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Fi 1 şəvvalülmükərrəm, sənə 1293*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Cümə günü*




*Fi 8 oktyabr Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## E' L A N

Gələn il qəzetimiz genə 2 həftədə bir çıxacaq. Qiyməti 3 manat olacaq. Ona binaən mə'lum edirik ki, onu xahiş edən, il qurtarmamış onun qiymətini bizə göndərib öz ismini və sakin olduğu yeri məlum eləsin.

## DAXİLİYYƏ

16-cı nömrədə yazmışıq ki, gələn il 300-cən 6 manat verən müştəri olsa qəzeti həftədə bir dəfə çıxardacayıq. Amma indiyəcən həftəlik qəzet istəyən 4-5 adam var və yəqindir ki, təzə iləcən belə qəzet istəyən 100-dən ziyadə olmayacaq. Pəs belədə təzə iləcən gözləyib sonra gərək qəzeti bəhrəm edək. Amma vaxt elə gəlir ki, onu bəhrəm etmək insaf deyil. Ona binaən bu vaxtda meydan xali qalmasın deyibən məlum edirik ki, gələn il genə qəzet iki həftədə bir çıxacaq və qiyməti 3 manat olacaq. Bir məsələdir at ölüncən otlar. Biz də bəsdir sözünü müştərilərdən və ya qeyridən eşidənəcən gərək danışaq. Sonra...

Həzərat, neçə dəfə ərz eləmişik ki, bu şərtlər ilə qəzet çıxartmaq olmaz. Gərək Tiflisdə çapxanamız olsun ki, həmişəlik qəzet çap olunsun, yoxsa 1-2 ilə bizim qəzet bərhəm olacaq. Belədə lazımdır ki,

bizim tavana kəslər qəzet fikrində olub bir icma bina etsinlər ki, onlardan vüsul olan məbləğ ilə çapxana açılsın, qəzet basılsın. Haşa bu iş bir tək adam işi deyil. Bizə məlumdur ki, heç kəs özünə tavana deməz. Pul ver sözü heç kəsə xoş gəlməz. Amma insanda insaf da gərək olsun. 10–15 nökər, ya at, ya Tula, ya quş saxlayan, Qafqazda qeyri tayfaları xristian etməkdən ötrü bina olan icmaya calis olub ildə 500 manat verən onun beşdən bir hissəsini öz dilində qəzet çap olunmağa məsrəf etsə məgər günah olar?

Ey müsəlmanlar, vaxt keçməmiş fikrinizi birləşməyə verin ki, dağınıq millət çox tez puç olur.

Dağıstanda Mehdi xan Usmiyev Qeytaği yazır ki, qəzetini qiymətini artırmayıb onu həftədə bir çıxardaq ki, tavana kəslərimiz onun artıq xərcini versinlər və özü mədyun olur ki, ayda 10–15 manat göndərsin. Bizim bu halda iki həftəlik qəzet çıxarmaqdan ötrü zəhmətimizdən savayı ildə 5–6 yüz manat zərərimiz olur və əgər onu həftədə bir çıxartsaq, gərək zərərimiz 1000–1200 manat olsun. Belədə 1–2 adamın cüz'i köməyindən karsazlıq olmaz, yaxşıdır ki, cəm olub 5–10 min manat yığaq, onun sələmi ilə həmişəlik və qiyməti az qəzet çıxarmaq olsun.

Ey millət təəssübü çəkən qardaşlar, əgər qəzetin xeyrini başa düşüb onun baqi olmağını istəyirsiniz, indi vaxtdır. Dəmir qızmış ikən onu döymək gərək, yoxsa sonra onu qızdırmaq düşvar olur.

* * *

17-ci nömrədə Qarabağ əhli öz şəhərlərində gimnaziya açmaq qəsdinə düşdüyü xəbərini yazmışdıq. Çünki bu iş təzə işdir, ona binaən lazım bilirik ki, bu barədə bir neçə kəlmə danışaq. Əlbəttə, hər kəs öz xərcilə məktəbxana bina etmək istəsə, ona mane yoxdur. Amma qanuna görə məktəbxana iki qism olur: ya orada hər bir elm gərək rus dilində oxunsun, ya onları hər kəs öz dilində oxuda bilər. Amma lazımdır ki, bu məktəbxanada rus dili həm oxunsun və elmləri qeyri dildə oxudan müəllimlər gərək dövlət tərəfindən imtahan olunalar. Əgərçi bu halda bizim qonşu ermənilər və qeyri ancaq ikinci qism məktəbxana açırlar, amma bizim üçün belə məktəbxana açmaq məqdur deyil. Ona görə ki, bizim nə ki elm oxumuş adamımız, hətta elm kitablarımız da yoxdur. Pəs bu halda bizim müsəlmanlardan məktəbxana açan gərək əvvəlinci qism məktəbxana açsın ki, hər elm rus dilində

oxunsun. Lakin belə məktəbxana açan gərək yaddan çıxarmasın ki, gələcəkdə gərək bizdə adam olaq və hər bir elmi öz dilimizdə oxudaq. Ona binaən indi açılan məktəbxanalarda öz dilimizi oxutmaq nə ki lazımdır, bəlkə vacibraqdır.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Çünki qoyunun nəcisi quru olduğundan qaramal nəcisindən tez xarab olur, ona binaən onu aşağıda zikr olan qayda ilə işlətmək dəxi yaxşıraqdır. Əkin yerində tordan yataq qayırıb onun içinə qoyunları gecə yatmağa və gündüz yornuğunu almağa salıb bir neçə gündən sonra toru aparıb qeyri yerdə yataq qayırmaq ilə tamam yeri qüvvətli etmək olur. Torun eni gərək 3 arşın olsun və gözlərindən qoyunun başı keçməsin. Onun uzunu qoyunun qədərinə baxar, qoyun çox olduqcan onu da uzun etmək gərək. Onun hər iki tərəfinə bir yoğun kəndir keçirdib, ağac mıxlar ilə yerə bərkidib, yataq qayırmaq gərək. Yaxşıdır ki, bu yatağı çahargül edib onun hər küncünə bir 3 arşın uzunluqda və onların arasında hər 30 arşına bir 2 arşın yarım qədər də mıx vurasan və əgər ol yerdə qurd, çaqqal olur isə gecələr gödək mıxların hərəsinə bir it bağlayasan. Min qoyun ilə 2 gün 2 gecədə yarım desyatin yeri qüvvətli etmək olur. Bu qədər yer üçün qayrılan yatağın uzunu 120, eni 90 arşın olur. 3-cü günü sübhdən toru aparıb təzə yerdə qurub yatağın yerin bir neçə tərəfdən şuxm edib, gün qızmamış qoyununun nəcisini yerə qarışdırmaq gərək, yoxsa gün qızanda nəcis qüvvətdən düşüb xarab olur. Çünki qoyun nəmiş yerdə yatanda naxoşlayır, ona binaən belə yataqlarda qoyunu baharın ortasından payızın ortasınacan saxlamaq yaxşıdır. Elə ki nəmişlik düşdü, qoyunu gərək həmişə saxlanan yataqlarda saxlayasan. Zikr olan qədərdə qoyun ilə bir ildə 70 desyatindən artıcaq yer qüvvətli etmək olur.

## ELM XƏBƏRLƏRİ

Teleqrafxanalarda bir əsbab işlənir ki, ona qalvanoskop deyirlər. Bu əsbabın qiblənamənin miqnatisi kimi miqnatisi var ki, onun tərpənməyi ilə qalvanizmin çox ya azlığını bilirlər. Martinq cəzirəsində

teleqrafçı görüb ki, miqnatis tərpənəndən bir az sonra zəlzələ oldu, ona binaən bu təcrübəni qeyrilər də imtahan edillər. Deyirlər ki, zəlzələ olmağını 1-2 saat irəli bilmək olur.

* * *

Amerikada yazı yazmaqdan ötrü bir maşın ixtira olunub ki, fortepianoya oxşayır. Onun hər dilini basanda bir hərf yazılır. Deyirlər bu maşın əl ilə yazmaqdan birə-bir tez və yaxşı yazır.

* * *

Hod adlı nemes bir ataş ərradəsi qayırmaq fikrinə düşüb ki, su üzündə işləsin. O yazır ki, gəminin altına ox qayırıb, onun uclarını boçkaların üstə saxlayıb ona zikr olan ərradəni qoşanda gərək gəmi vapordan birə beş tez getsin.

* * *

Avropada şüşəni elə yetirirlər ki, yumşaq olur. Belə şüşədən bəzi parça toxuyurlar. İndi yazırlar ki, Basti adlı firəng bir icma düzəldib Parij şəhərinin ətrafında bir böyük karxana bina edib ki, yumşaq şüşədən hər bir qism şey qayırsın.

* * *

Çünki xarab olmuş sudan bədənə ziyadə zərər olur, ona binaən hükəma məsləhət edir ki, belə suyu qaynadıb sonra içsinlər və əgər qaynatmaqdan su yaxşı olmasa, ona bir az lumu turşusu töküb qaynadıb sonra turşu qədər də soda salıb içsinlər.

* * *

Parijdə yanğı xəbərini verməkdən ötrü maşın qayırıblar ki, teleqraf məftili kimi onun iki rezinəyə bükülmüş məftili var. Onları imarətin hər bir tərəfinə aparıb birisinin ucuna qalvanizm maşını və birisinin ucuna zəng bağlayırlar. Bir yerə yanğı düşəndə məftillərin rezinəsi yandığına, onlar bir-birinə dəydiyinə zəng səda edib, imarətin sakinlərini xəbərdar edir.

* * *

Bu çağacan Avropada kağızdan bəzi şeylər qayırırdılar, amma indi Amerikanın Nyu-York şəhərində bir karxana bina olub ki, kağızdan

hər bir qab-qaşıq ki, od üstə qoyulmur, məsələn, boşqab, kasa və qeyri qayırıllar. Bu qabların yaxşılığı budur ki, özü yüngül olur, onu qalaylamaq gərək deyil, ondan su süzülmür, yerə düşəndə sınmır. Kağızın üstə qalın lak çəkildiyinə xörəkdə işlənən turşu və qeyri ona kar etmir və bir də bu lakı hər qism rəng ilə boyamaq olur, hətta ona qızıl suyu da çəkmək olur.

## TƏZƏ XƏBƏRLƏR

İstanbuldan firəng dilində basılan "Tems" qəzetinə yazırlar ki, Osmanlı dövlətinin Anadolu vilayətində sakin olan ermənilər öz patriarxlarından iltimas ediblər ki, dövləti-Osmanidən təvəqqə eləsin:

1) Məxsusi yerlər barəsində təzə qanun qoyulsun. 2) Dərəbəyilərinə hökm olsun ki, erməniləri incitməsinlər. 3) Təzə qayda qoyulsun ki, erməni uşaqları 21 yaşınacan islam ola bilməsin. 4) Ermənilərin şahidliyini divanlarda qəbul eləsinlər. 5) Patriarxa izn olsun ki, ermənilərə zülm olanda silist elətsin.

* * *

Rusiyada təzə qayda qoyulub ki, xalqın atlarının hesabına gedib onun qədərini bilsinlər ki, cəng vaxtında məəttəllik olmasın. Yazırlar ki, bir tək Peterburq şəhərində 34900 at yazılıb.

* * *

Bir xəbər çıxmışdı ki, İran dövləti Osmanlı dövləti ilə kağızlaşıb ki, cəng olsa, kömək eləsin. İndi Tehrandan yazırlar ki, bu xəbər boş sözdür.

* * *

Gələn il Qafqaz vilayətindən cəm olası xərcin qədəri: tövcü 1934833 manat, içgi xərci 1010800, neft xərci 232788, tənbəki xərci 413000, duz və zəy xərci 226645, tamojnı xərci 1265375, gerbavoy kağızdan 219500, sudebni poşlin 114500, dadistəd xərci 415000, xırda xərclər 218250, qızıl-gümüş şeylərə prob vurmaqdan 900, dağlardan 10800, poştdan 234500, xəzanəyə yetişən mülklərdən 735, padşahlıq mülklərinin icarəsindən 519500, meşələrdən 134820, qeyri xərclərdən 315036, cümlətani 7272982 manat, yə'ni bu ildən 166729 manat artıq cəm olacaq.

* * *

Avstriyanın Osmanlı sərhəddində vaqe olan Raquza şəhərindən yazırlar ki, Qaradağ knyazının izni ilə əsir olan Osman paşa zikr olan şəhərdə gəzməyə gedib.

* * *

Ermənilərin "Mşak" qəzetinə Axalkalak şəhərindən yazırlar ki, müsəlmanlar oğurluğu zurna-qabal ilə eləyirlər. Bir dəstə adam gəlin aparırıq deyibən yola çıxıb gedib-gələni soyurlar.

* * *

"Tiflisski vestnik" qəzeti yazır ki, bu halda Tiflis və İrəvan quberniyalarında bir neçə qaçaq dəstəsi var. İskəndərin dəstəsində 10, kor İsmayılın dəstəsində 8, Mehrəlinin dəstəsində 7 adam. Ondan masəva deyirlər ki, bir neçə dəstə Osmanlı sərhəddindən təzədən keçib. Bu yavuq zamanda Tiflis şəhərinin yanında bir karvandan ki, orada 115 dəvə və 100 at var imiş, 15 dəvə və 20 at yük ilə belə qovub aparıblar.

* * *

Padşahi-imperaturi-ə'zəmi-Rus hökm edib ki, Krım müsəlmanlarından qaçıb Osmanlıya gedən geri qayıtsa, onlara mane olmasınlar.

* * *

20 il bundan sabiq Firəng, İngilis Osmanlı ilə birləşib Rusiya ilə elədiyi cəngin barışığı Firəngistanın Parij şəhərində olduğuna ona Parij sülhü deyirlər ki, ol sülhnaməyə Rus, Firəng, İngilis, Osmanlı, Avstriya, Prussiya, İtaliya qol çəkib. Ol sülhnamənin bir şərti budur ki, Osmanlı dövləti Avropa dövləti hesab olunsun və zikr olan dövlətlərdən iznsiz heç bir dövlət Osmanlı ilə cəng eləməsin. Həmçinin zikr olan sülhnaməyə görə Serb, Qaradağ və qeyri əyalətlərə ki, Osmanlıya xərac verillər, bəzi ixtiyarlar verilib. Keçən nömrədə yazılan Osmanlı Avropa dövlətlərinin vəkillərinə pişnəhad elədiyi şərtlərin bəzisi zikr olan sülhnaməyə namüvafiq olduğuna Avropa dövlətləri ona razı olmadılar. Bəzi dövlətlər xahiş elədilər ki, Serbistan keçmiş qayda üzrə qalsın, Qaradağa bir parça dərya kənarından yer verilsin. Bosnə, Qerdseqovinə, Bolqariya vilayətlərinə bəzi ixtiyarlar verilsin,

yə'ni onların hər birisi Serbistan kimi əlahiddə Osmanlıya xərac verən əyalət olsun ki, ümurati-daxiliyyələri özlərində ola. Bu şərtlər zikr olan Parij sülhnaməsinə namüvafiqdir deyib bə'zi dövlətlər də buna da razı olmadılar. Bu səbəblərə sülh barəsində danışıq tulani oldu. Ona binaən hamı dövlətlər xahiş edirlər ki, sülhnamə bağlanıncan vədə ilə barışıq olsun və bu barədə Osmanlıdan təvəqqə eləmişdilər. İndi tel gəlib ki, vüzərayi-Osmani məşvərət edib belə və'də ilə barışıq istəyirlər, altı ay, yə'ni mart ayının 15-cən cəng olmasın. Ol yerlər ki, bu halda Osmanlı əsgərinin əlindədir, altı ayın müddətində orada əsgər də olmasa, Osmanlı ixtiyarında qalsın və bir də bu 6 ayın müddətində hər iki tərəfə qeyri yerlərdən kömək, ya pul ilə, ya əsbabi-hərbiyyə ilə, ya adam ilə olmasın. Serb əhli bu şərtlərə razı deyil və Avropa dövlətləri razı olmağı məlum deyil.

* * *

"Bakinski izvestiya" qəzetinə Krasnovodskidən yazırlar ki, general Lomakin Xivənin sərhəddinə yetişəndə Xivənin xanı onun pişvazına çıxıb. Deyirlər onların miyanında belə danışıq olub: çünki Xivənin xalqı onların hökumət əhli ziyadə bədbihesablıq elədiyinə onlardan narazıdır və istəyir Rusiyaya tabe olsun, ona binaən zikr olan xan deyib ki, əgər Rusiya dövləti mənə bir az güzəran versə, mən öz xanlığımı Rusiyaya verərəm.

* * *

Gəncədən "Tiflisski vestnik" qəzetinə yazırlar ki, keçən sentyabrın 23-də şəhərin milləti bağında Osmanlı slavyanları üçün pul yığmaqdan ötrü gəzmək qayırmışdılar. Orada çox müsəlman var idi, onlar çox pul verdilər.

* * *

Məsələn, Hacı Abbas Allahverdi oğlu bağa girməkdən ötrü altı şahı əvəzinə 10 manat verdi. Cümlətani 556 manat cəm olub.

* * *

İstanbul qəzetlərində yazırlar ki, Osmanlı dövlətinin Peterburqda olan vəziri-muxtarı Kabuli paşanın övrəti bir kitab yazıb adı "Vətən". Ol kitabı öz xərcilə çap elədib satdırır ki, ondan cəm olan məbləğ Osmanla əsgərindən zəxmdar olanlara məsrəf olunsun.

* * *

Bolqariyanın əhli İngilisə iki adam göndərib ki, onlara olan zülmləri oranın padşahına mə'lum edib iltimas eləsin ki, İngilis də onlara kömək eləsin.

* * *

İngilis paytaxtı London şəhərində bir icma bina olub ki, Osmanlı ilə cəng edən serblərə kömək eləsin. Yazırlar ki, ol icma sentyabrın 13-cən 39 min manat cəm edib onlara göndərib.

* * *

İstanbuldan yazırlar ki, dövlətə xəyanət etməkdən ötrü məhbus olan Apram paşanın işinə bu yavuq zamanda mülahizə olunacaq.

* * *

İngilisin xalqı Osmanlı ilə cəng edən xristianların tərəfini saxlamaq bundan mə'lum olunur ki, indiyəcən İngilisdə 262 dəfə xalq cəm olub. Osmanlı ol xristianlara elədiyi zülmlərdən danışıb. Bu səbəbə Hindistanda çap olunan müstəqil qəzetləri İngilisin xalqına məsləhət edirlər ki, Osmanlının tərəfini saxlasın.

* * *

"Türküstan" qəzetində yazırlar ki, Xoqənd xanlığının ixtiyarında köçəri qırğızlar var idi ki, Rusiya Xoqəndi zəbt edəndən sonra onlar gedib Alay dağında sakin olurdular. İndi onlar Abdulla bəyin sərkərdəliyi ilə Rusiya ilə dava başladığına general Skoblev gedib onları pərakəndə edib. Deyirlər ki, Alay dağını da Rusiya zəbt edəcək.

Zikr olan qəzet yazır ki, Daşkənd şəhərində avqustun 15-də gimnaziya açılıb.

* * *

Tiflisdə təzə ildən gürcü dilində "İberiya" adlı qəzet çap olunacaq.

* * *

"Kavkaz" qəzeti yazır ki, Qafqazda qeyri tayfaları xristian etməkdən ötrü bina olan icma keçən il Abxaziya və Osetiniyadan 450 adam xristian edib.

* * *

Gələn həftə Badkubənin klubunda Osmanlı slavyanları üçün teatr çıxardacaqlar.

* * *

Bu oktyabr ayının 2-də Badkubənin məhbusxanasından dustaqlar qaçıblar. 5 adam indiyəcən tapılmayb.

* * *

“Vraçebni vedomosti” qəzeti yazır ki, sentyabrın 12-cən Rusiyadan Qaradağ və Serbistana 338 həkim gedib.

* * *

“Donski qəzet” yazır ki, kalmıklar Osmanlı slavyanları üçün 35 at göndəriblər.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*2-ci sənə* *20-ci nömrə*

*Fi 15 şəvvalülmükərrəm,*
*sənə 1293*

* * *

*Poşt xərci*
*basdıran ilədir*

* * *

*Cümə günü*



*Fi 22 oktyabr Rusiya,*
*sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı –*
*1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## E' L A N

Gələn il qəzetimiz genə 2 həftədə bir çıxacaq, qiyməti 3 manat olacaq. Ona binaən məlum edirik ki, onu xahiş edən, il qurtarmamış onun qiymətini bizə göndərib, öz ismini və sakin olduğu yeri məlum eləsin.

## DAXİLİYYƏ

Bir məsəldir ki, cidanı torbada gizdətmək olmaz. Habelə bu halda təzə xəbər çox olduğunu gizlətmək məqdur deyil. Amma bu xəbərlər elə xəbərdir ki, hər kəs onların barəsində az danışıb çox eşitmək istəyir. Belədə qəzet çıxarmaq nəhayət çətindir. Hər müştəri gözünü dikib ki, qəzet gəlib ona təzə xəbər gətirəcək, amma qəzet çıxardan...

Məlumdur ki, qəzet çıxarmaqdan ötrü gərək izn olsun və izn istəyən zaman qəzet çıxardan gərək məlum eləsin ki, filan və filan mətləblərdən danışacaq. Ona binaən qəzet üçün vaxta münasib danışmaq əgərçi məqdurdur, amma... olmaz ki, izn olan mətləblərdən bir mətləb üstə həmişə danışılsın. Ol vaxtda qəzet izn olan qaydadan çıxdığına qanuni-çapiyə görə gərək onu bəhrəm etsinlər. Bu səbəblərə bizim çox xəbər istəyən müştərilərimizdən üzr istəyirik ki, təzə xəbər az yazılmaqda bizi günahkar hesab eləməsinlər. Əgərci bu halda təzə xəbər çoxdur, amma qəzeti təzə xəbər etmək mümkün deyil, lazımdır ki, qeyri mətləblərdən həm danışılsın.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Hasar ya torpaqdan, ya ağac, qamış, kol və qeyri quru şeylərdən və ya kök ağacdan olur. Onilə ya evləri, ya həyət-bacanı, ya bağ-bostanı və ya qeyri əkini mühafizət edirlər. Torpaqdan çəkilən hasarlar ki, ona xəndək deyirik zəhməti çoxdur, amma yağış, küləkdən tez xarab olur. Ağacdan, koldan, qamışdan və qeyri quru şeylərdən çəkilən hasar vaxt ilə tələf olur və bir də belə hasar nə ki ol yeri yanğıdan mühafizət etmir, bəlkə özü buna bais olur. Bu səbəblərə zikr olan hasarların hamısından kök ağacdan çəkilən hasar yaxşıdır ki, vaxtilə xarab olmaqdan başqa gün-gündən artıb möhkəm olur. Ondan masəva, belə hasarlanan yer kölgə olduğuna nəmiş olur. Ona binaən orada ol qədər quraqlıq olmaz, yanğı, külək, yağış və qeyri ona kar etməz. Bə'zi quşlar və ya qeyri heyvanat ol ağacları məskən edib, ol yerdə əmələ gələn əkinə zərər edən cücüləri tələf edir. Onların kölgəsində insan və mal-qara üçün xoş keçinir. Onların ilbəil qırılan budaqlarını odun kimi yandrmaq olur. Xülasə, hasar yerinə ağac bitirtməyin ziyadə nəf'i var, ələlxüsus isti tərəflərdə. Ağac ya xəndək üstə ya düz yerdə gərək əkilsin. Onları əvvəl zaman mal-qaradan saxlamaqdan ötrü hasarlamaq gərək. Lazımdır ki, əkilən ağaclar bir boyda olsun ki, böyük ağaclar kiçiklər bitməyə mane olmasın. Bu səbəbə yaxşıdır ki, ol ağacların toxumunu bir qeyri yeri şuxm edib orada əkib 1-2 ildən sonra çıxarıb, hasarın yerində şitil edəsən. Onların bir-birindən arası ağacın budaq atmağına baxar. Əgər ağac budaq atırsa, hər sajına 3-4, yoxsa 5-6 ağac əkilir. Onları şitil edən zaman gərək bir az saxlayasan ki, gələn il quruyan ağacları çıxarıb onların yerinə təzədən şitil edəsən. Belə hasardan ötrü hər bir qism ağac əkmək olur, amma yaxşıdır ki, bir hasarda bir qism ağac ola və bir də bağ-bostanın ətrafında əkilən ağac gərək elə ağac olsun ki, onda çox cücü olmaya, yoxsa onlar əkinə zərər edər. Məsələn, alma, çinar, qovaq ağacları belə hasardan ötrü çox yaxşıdır. Belə hasarda ya ağacları bir-birinə yavuq bitirdib hər il onların budaqlarının başını bərabər vurmaq gərək ya onları çox sıx etməyib, dibindən boğazlayıb, sonra dibindən çıxan budaqları bir-biri ilə hörmək gərək və ya onları aralı əkib onların arasında bartikan kolu, ya quru kol əkmək gərək.

## MƏKTUBAT

Oktyabr ayının 10-da saat 12-də Badkubədən Hacıtərxana getməkdən ötrü "Baryatinski" vaporuna oturub yola düşdük. Zikr olan atəş gəmisi Badkubə dənizində olan vaporların çox böyüklərinin birisidir ki, onun 30 sajın tulu və 120 at gücücən gücü var. Badkubədən çıxanda gilavar, yə'ni qiblə küləyi əsdiyinə yelkənləri açıb, hər saatda 20 verst gedib, sabahısı günü sübh zamanı Dərbəndə yavuqlaşanda gördük ki, şimal tərəfindən bir qara bulut qalxıb bizim tərəfə gəlir. Ol vaxtda bizdən irəli 3 yelkən gəmisi, gilavar əsdiyinə yelkənlərin açıb gedirdi. Zikr olan bulutu görüb vaporun əmələcatı bir-birinə dəyəndə kapitan öz yerinə qalxıb əlində durbin bulut gələn tərəfə baxıb hökm elədi ki, dərhal yelkənləri yığıb hər kəs öz yerində hazır olsun. Xülasə, tufanın tədarükü olundu. Xəzri, yə'ni şimal küləyi mürur ilə yavuqlaşdı. Qabaqda gedən yelkən gəmiləri bir-bir yox oldu. Axırda bizim atəş gəmisi özündən çox böyük ləpələrin içinə düşdüyünə, bizim üçün dünya yox oldu. Ləpələr başımızın üstün keçib, gəminin o biri tərəfinə töküldüyünə hətta göyü də görmək müşkül oldu. Hərə gəminin bir tərəfinə yapışıb durduq. "Baryatinski" irəli gedə bilməyib lövbər atıb dayandı. Ləpə onun dəmir ilə bərkinmiş qıraqlarını sındırıb apardığına kapitan hökm elədi ki, lövbəri yığıb, Badkubəyə qayıdaq. Bu minval ilə qırx iki saat suyun içində yemək-içməksiz və yuxusuz qalıb, çaharşənbə günü oktyabrın 13-də sübh tezdən Badkubə bargahına daxil olduq.

## ELM XƏBƏRLƏRİ

Osmanlı dövlətinin Avropa qit'əsində olan vilayətlərində (Serbistandan, Qaradağdan, Boğdan Əflandan, yə'ni Rumelidən savayı) 3 milyon 460 min müsəlman , 4 milyon 513 min xristian sakin olur. Millət hesabı ilə türk osmanı 1326000, qrek 1137000, alban 1011000 ki, onlardan 723000 müsəlman olub, rumın 200000, slavyan tayfası ki, olsunlar serb 1388000 ki, onlardan 463000 islam olub. Bolqar 2877000 ki, onlardan 1860000 islam olub. Rus 10000, qeyri tayfalar: erməni yüz min, yəhudi 700, qaraçı 104000, çərkəs 144000, tatar 120000, ərəb 2500, Avropa əhli 60000.

* * *

İngilisin paytaxtı London şəhərində 4 milyona qədər adam sakin olduğuna orada hər bir mə'kulat, ələlxüsus, ət çox bahadır. (İngilisdə hər gün ət yeməyən adam olmaz. Ona binaən ingilisin fəhləsi çox qüvvətli olur ki, onlardan bir fəhlə görən iş qeyri yerlərin 3-4 fəhləsinə bəsdir). Bu səbəblərə Amerikadan Londona ki, onların arasında Dəryayi-Mühit vaqedir və eni bir neçə min verstdir, ət gətirib satıllar. Yazırlar ki, bundan ötrü Amerikada əlahiddə gəmi ixtira olunub ki, onun necə təmir olunmağı mə'lum deyil. Gəminin içini təzə ət ilə doldurub onun havasını dəyişdirib soyudurlar ki, ət xarab olmayb, gəlib Londona yetişir.

* * *

Cəng edən zaman adam özünü itirməyi bundan məlum olur ki, meydanda qalan tüfənglər yaxşı dolunmamış olur. Məsələn, Amerika davasında cəngdən sonra meydandan 24000 tüfəng yığıblar ki, onların ancaq 4-dən biri yaxşı doldurulmuş imiş, baqisi tamam yaman dolmuş olub, yəni bir tüfəngə 2-dən tutmuş 40-can güllə salınmış olub. Bu təcrübə qeyri cənglərdə həm aşkar olub.

* * *

Rusiyada yanğı çox olmağına bir səbəb də budur ki, kəndlərdə evlərin üstün qamış, bəlim və qeyri ələfiyyat ilə örtürlər. İndi bir şəxs yazır ki, ol şeyləri bu tövr ilə yanğından mühafizət etmək olur: suyun içinə gil torpağı töküb, qarışdırıb, zikr olan ələfiyyatı onun içində bir neçə gün saxlayanda onlar sonra elə tez yanmırlar.

* * *

Başın tükü ağarmaq iki qism olur: ya qocalıqdan, yəni zəiflikdən, ya başın dərisi naxoş olduqda tük ağarır. Əlbəttə, zəiflikdən ağaran tükə əlac yoxdur, amma adam cavan olan zaman başın dərisi naxoş olduğuna, onun tükü ağarmağa başlayanda ona müalicə edib tükü ağarmaqdan saxlamaq olur. Lakin lazımdır ki, müalicəni tüklər ağarmamış elədəsən, yoxsa onları təzədən qaraltmaq mümkün deyil.

## TƏZƏ XƏBƏRLƏR

Badkubədə oktyabrın 10-da bərk xəzri əsib çox yelkən gəmisi tələf edib. İki atəş gəmisini – birisi “Baryatinski” və birisi “İran” şikəst edib. Badkubənin Corat qəpyəsinin əhlinin qoyun sürüsünü ki, 950 qoyun olub, aparıb dənizə qərq edib. Sürünün çobanı bu zaman vəfat edib.

* * *

Bir neçə ildir ki, Badkubə şəhərində məxsusi bang açılıb. Keçən ildən bəri onun calislərinin miyanına ikitirəlik düşüb. Bir dəstənin başa Karapet Pavloviç Lalayev idi ki, bangı dolandıranlardan narazı olub, istəyirdi onların yerinə öz adamların intixab eləsin. Bu oktyabr ayının 15-də calislərin hamısının məclisində bangı dolandıranlar zikr olan Lalayevdən ərz elədiyinə, məclis onu xaric etmək istəyib. Ona binaən Lalayev ərizə verib calislikdən xaric olub.

* * *

Peterburqda akademiyanın əcayibatxanası var ki, altı hissədir: birinci hissədə 7000 çap olunan qədim kitab var. 2-ci yazma kitabxanasıdır ki, orada 1200 müsəlman kitabı ərəb, fars, türk dillərində, 1200 Xəta, Mancur, Yapon, 100 Tibeti-Monqol, 200 gürcü, erməni, 200 sanskrit, yə’ni qədim Hindistan dillərində. 3-cü hissədə üstü yazılı daşlar və qeyri qədim şeylər, o cümlədən perqament üstə yazılan Quran saxlanır. 4-cüdə 20000 pul ki, çoxu qədim müsəlman dövlətlərinin sikkəsidir. 5 və 6-cı hissələrdə müsəlmanların və yəhudilərin çox qədim şeyləri saxlanır.

* * *

“Tifliski vedomosti” yazır ki, oktyabrın 10-da axşam saat səkkizdə Osmanlı dövlətinin Tiflis şəhərində olan jeneral-konsulu cənab Bidjiti və onun övrətini öldürüblər. Ol cənab özü qrek, övrəti polka və hər ikisi xristian imişlər. Konsula xəncər ilə 20 yara yetişib. Onları öldürən məlum deyil, amma belə məlum olur ki, onlar Evin yolunu yaxşı bilirlər imiş. Bir saat və bir üzük aparıblar.

“Qolos” qəzeti yazır ki, hökm olunub Peterburqda sakin olan, qulluqda olmayan əfsərlərin, yə’ni hərbiyyə qulluğunda olmuş adamların hesabını yazıb mə’lum eləsinlər.

* * *

Zikr olan qəzet yazır ki, Kronştadtda təmir olunan “Pyotr veliki” adlı cəng gəmisi qurtarıb, oktyabrın 2-də Ağ dənizə gedib. “Birjavoy vedomosti” qəzeti yazır ki, Kronştadtdan ki, Peterburqun Nargin qalasıdır, 22 çox böyük top cənubi Rusiya, yəni Qara dəniz kənarına göndərirlər ki, o topları əvvəldən istəyirdilər Kronştadtda saxlasınlar.

* * *

Keçən il Moskvada olan tüccar bangında 7 milyon manat kəsr gəldiyinə onu bağlayıb bangın işlərini dolandıranları və 7 milyon manatı borc alıb verə bilməyəni dəstgir edib, indi onların işinə Moskvanın Okrujnoy sudunda mülahizə edillər. Bu işdə 20 adam taxsırlanır. Bir neçə yüz şahid və bir neçə min tələbkar var ki, zikr olan bangın calisləri imişlər.

* * *

“Qolos” qəzeti yazır ki, Buxara xanının iki oğlu Peterburq şəhərinə gəlib. Kiçik oğlu məktəbxaneyi-hərbiyyəyə girib və böyük oğlu səyahət edir.

* * *

Gələn dekabr ayının 20-dən Odessa şəhərində əkin, ziraət əsbablarını oraya cəm olan kəslərə göstərəcəklər. Hər kəs xahiş etsə ol vaxtda gedib zikr olan əsbabları görə bilər.

* * *

Oktyabrın 19-da Badkubəyə tel gəlib ki, Peterburqda çap olunan “Pravitelstvenni vestnik” qəzetində ki, onu dövlət basdırır, yazılıb: padşahi-imperaturi-ə’zimi-Rus və vəziri-muxtarı general İqnatyevə hökm edib ki, Osmanlı dövlətinə mə’lum eləsin: əgər Osmanlı dövləti iki günəcən 6 həftəlik ya iki aylıq sülhə razı olmasa, ya bu halda serblər ilə olunan cəngi mövquf eləməsə, zikr olan vəziri-muxtar öz əmələcatı ilə İstanbul şəhərindən çıxıb, Rusiyaya qayıdacaq. Oktyabrın 21-də Osmanlı əsgəri Aleksanas qalasını alıb.

* * *

*“Тифлисски ведомости” qəzetində çap olunan tellər:*

Oktyabrın 6-da Parijdən. Deyirlər ki, Rusiya ilə Avstriyanın arasında 6 həftəlik sülh barəsində danışıq olub və əgər Osmanlı ona razı

olmasa, ol vaxtda Bosnə və Bolqariyanı Avstriya və Rus əsgəri zəbt edəcək. Ona binaən cəng olacaq xəbəri çıxıb.

Oktyabrın 9-da Londondan, İngilis dövləti qeyri dövlətlərə mə'lum edib ki, Osmanlı istəyən 6 aylıq sülhə razı olub. Ona binaən Osmanlıya deyə bilməz ki, 6 həftəlik sülh eləsin.

Oktyabrın 10-da Parijdən. İstanbulda xəbər çıxıb ki, İngilis dövləti Osmanlıya kömək eləmək istəmir. Ona binaən xalq çox bidamağ olub. Dərviş paşaya kömək yetişmədiyinə, Qaradağ yerindən çıxıb gedib.

* * *

*"Pravitelstvenni vestnik" qəzetinin 220-ci nömrəsində çap olunan tellər:*

Oktyabrın 4-də İstanbul. Rusiya dövləti Osmanlı istəyən 6 aylıq sülhə razı olmadığına çox qəmgin olublar.

"Framdelbat" qəzeti yazır ki, İtaliya dövləti də Osmanlı istəyən sülhə razı deyil.

Firəngistanın "Debat" qəzeti yazır ki, əgərçi Rusiya Osmanlı istəyən sülhə razı olmayıb, amma bundan belə təsəvvür etmək olmaz ki, cəng olacaq.

İngilisin "Tayms" qəzetinə Tehrandan tel var ki, guya Rusiyanın məsləhətinə görə İran dövləti Osmanlı sərhəddinə əsgər göndərmək isitəyir.

* * *

Zikr olan qəzetə Osmanlı dövlətinin Trabzon şəhərindən yazırlar ki, Avstriya vaporları gətirən topların bir hissəsini Kars və Ərzurum qalalarına göndərdilər və bir hissəsi orada saxlanıb.

* * *

"Ajenti-jeneral Rus" qəzeti yazır ki, Osmanlı istəyən 6 aylıq sülh tələyə oxşayır. Ona binaən Rusiya ona razı olmayıb istəyir ki, altı həftə sülh olsun və belə mə'lum olur ki, qeyri dövlətlər də buna razıdır.

* * *

Oktyabrın 6-da Rusiyanın vəziri-muxtarı general İqnatyev öz küfləti ilə İstanbul şəhərinə daxil olur oktyabrın 15-də özünün vəkillik kağızını həzrət Əbdülhəmidi-düvvümə pişnəhad edib, həzrət sultan sabahısı günü onu danışığa çağırıb.

* * *

Oktyabrın 4-də Moskva şəhərinin camaat məclisində padşahi-imperaturi ə'zəmin adına belə kağız yazıb göndəriblər: camaat, Moskva həmişə Rusiya dövlətinin qeyrət çəkəni olub. Hər bir tövr ilə onun şövkəti artıq olmaqdan ötrü kömək etməyə hazırdır və bunilə belə təvəqqə ediblər ki, Osmanlı ilə cəng edən slavyanlara kömək eləsin.

* * *

İstanbulda olan ermənilərin millət məclisi kağız ilə Osmanlı dövlətindən təvəqqə edib ki, təzə qoyulan qanunu tamam Osmanlı tabeləri üçün qoyulsun və bu kağızı firəng dilinə tərcümə edib, tamam Avropa dövlətlərinə göndəriblər.

* * *

Odessa şəhərindən ki, Qara dəniz kənarında vaqedir, "Moskovski vedomosti" qəzetinə yazırlar ki, iki həftə bundan irəli bərk alış-veriş olurdu. Elə ki, Qara dənizdə olan gəmiləri dövlət əsgər aparmaqdan ötrü kirayə tutdu, alış-veriş sükut edib və genə yazırlar ki, bir neçə adam istəyir bir icma bina eləsin ki, ona calis olan ingilis karxanalarında qayrılan şeyləri alıb satsın.

* * *

Yazırlar ki, İngilisdə kağız kimi barıt ixtira ediblər ki, onun tüstüsü az olur, tüfəngi elə qaraltmır, az nəm çəkir və ucuz əmələ gəlir.

* * *

"Qolos" qəzetinə Amerikadan yazırlar ki, oranın karxanalarında Osmanlı dövləti üçün bir neçə milyon tez atılan tüfəng və onlar üçün güllə qayırırlar.

Qaradağ vilayətinin Çeteniya şəhərindən yazırlar ki, Osmanlı paşa ki, izn alıb Raqoziya şəhərinə getmişdi, genə geri qayıdıb.

* * *

"Qolos" qəzeti yazır ki, oktyabrın 10-da Osmanlı dövlətinin vüzəra məsləhətxanasının rəisi Kamil paşa mərhum olub.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского
Губернского Правления.

*Fi 1 ziqə'dətülhəram, sənə 1293*

* * *

*Poşt xərci basdıran illədir*

* * *

*Şənbə günü*




*Fi 6 noyabr Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## E' L A N

Gələn il qəzetimiz genə 2 həftədə bir çıxacaq, qiyməti 3 manat olacaq. Ona binaən mə'lum edirik ki, onu xahiş edən, il qurtarmamış onun qiymətini bizə göndərib öz ismini və sakin olduğu yeri mə'lum eləsin.

## DAXİLİYYƏ

Aşağıda bir məktub yazılıb ki, bir qızın bir gözü firəngi göy və biri həbəşi qaradır. Əlbəttə, belə şey təəccübdür, amma onun səbəbini elm yolu ilə aşkar etmək olur. İnsanın dərisinin altında qara rəngdə şey var ki, ondan həmi dəri, həmi qaş-göz, baş və qeyrə qara olur, necə ki, həbəşlərdə olur. Bəzi insanın ol qara şey bir yerində çox, bir yerində az ya heç olmur. Məsələn, bizim tayfanın dərisinin altında ol şey olmadığına dəri ağ, amma bəzi yerdə, məsələn, əmcəklərin qıraqlarında, baş, gözdə olduğuna onlar qara olur. Bə'zi vaxtda insanın dərisi naxoş olduğuna ol şey bilmərrə olmur, belədə baş, göz və tamam bədən ağ olur ki, belə kəslərə ağbaş deyirik. Habelə dərinin naxoşluğu ya tamam bədəndə ya onun bə'zi yerində ola bilir. Məsələn, bə'zi adamın uşaqlıqdan başının bir hissəsi ağ və qeyri yerləri qara olur. Gözün rəngi də ol şey ilədir. Əlbəttə, belədə onun biri qara, biri ağ olmaq

təəccüb deyil, naxoşluqdur. Gözdə olan rəngin bədənin qeyri yerlərində olan rəngdən təfavütü oldur ki, bu rəng həmişə qara olmaz. Məsələn, uşağın gözü əvvəl zaman bir rəng olur, amma sonra dəyişilib qeyri rəng olur, buna səbəb ol şey dəyişilməkdir və onun dəyişilməyinə səbəb günün işığıdır. Belədə ola bilir ki, bir gözün rəngi o birisindən tez dəyişilsin. Ol vaxtda onların hər birisi bir rəngdə olur.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

İnsan üçün zindəganlıq etmək gün-gündən düşvar olur. Bir qərinə bundan əqdəm bizim vilayətdə ol qədər yoxsul yox idi ki, indi var. Əlbəttə, bir qərinədən sonra dəxi ziyada olacaq. Buna səbəb nədir? Necə ki, bir tavana şəxsin övladı onlara yetişən irsi xərc edib artırmayanda dövlət tələf olur və ol varislər yoxsulluğa düşər, habelə dünyada olan xeyir-bərəkəti artırmayanda onlar mürur ilə azaldığına insan üçün zindəgəanlıq çətin olur. Məsələn, 20-30 il bundan əqdəm bizim Kür çayı hər ildə daşıb ətrafı qərq edərdi ki, oralarda olan çalalardan birə əlli hasil gəlirdi. Amma indi ol çay 3-4 ildə bir dəfə də daşmır və daşanda ətrafı elə qərq etmir. Avam bunu görəndə deyir ki, su azalıb və keçən günü yada salıb ah çəkir. Doğrudur, su azalıb və buna səbəb oldur ki, zikr olan çayn başında sakin olan kəslər odun bahalandığına orada olan meşələri qırıb azaldıblar. Amma oturub ah çəkməkdən fayda yoxdur, təzədən meşə salmaq gərək ki, su artsın. Lakin təzə meşə gəlib meşə olunca bir qeyri tövr ilə bunun çarəsinin dalınca olmaq gərək, ya arx qazmaq ilə, ya maşın, ya çarx qurmaq ilə, ya dağların ətəyində bəndlər bağlayıb oralarda qışda əmlə gələn suyu saxlayıb sonra işlətmək ilə əkini sulamaq lazımdır və bir də hər əkinçiyə mə'lumdur ki, daşmış çay suyu ilə sulanan yer arx ilə sulanan yerdən artıq hasil gətirir. Buna səbəb oldur ki, ətrafda olan yerlərdən su gəlməkdən çay daşır və su ol yerlərdən gələndə xırda daşları, yə'ni torpağı aparmaqdan lilli olur ki, bu lil əkin yerin qüvvətli edir. Belədə arx ilə sulanan yeri ya keçən nömrələrdə ərz olunan tövrlər ilə qüvvətli etmək gərək, ya çay daşanda ətrafı qərq etməsə də, onun suyunu arxlarda saxlayıb lil arxın dibinə yığılanda onu yığıb aparıb əkin yerinə çəkib yeri qüvvətli etmək gərək. Çayın kənarında bir ya bir neçə çaxnaq, ya arx qazıb, daşmış çayın suyunu oraya buraxıb bir-iki gün,

yəni onun lili çaxnağın dibinə yatınca saxlayıb sonra suyu süzüb təzədən çayın suyu ilə doldurub bu minval ilə çaxnaqlara çox lil yığıb onu ərradələr ilə aparıb əkin yerinə qarışdırmaq gərək. Əgər lil qüvvətli isə, hər desyatinə 200 çanaq bəsdir ki, bu çanağın eni, uzunu, dərinliyi bir arşın ola. Bəzi çayın lili nə ki yeri qüvvətli etməz, amma dəxi xarab edər, ona binaən yeri belə qüvvətli edəndən irəli yaxşıdır ki, bir parça yerə ol lildən qarışdırıb imtahan edəsən və əgər ondan yer qüvvətli olsa, tamam yerə həm qarışdırasan.

## MƏKTUBAT

İnsan bir şeyə adət edəndən sonra onun yamanlığını bilməz. Məsələn, burunotu çəkmək bir yaman adətdir, amma onu çəkən üçün ondan xoş şey olmaz. Habelə bizim məktəbxanalarımızdan yaman məktəbxana dünyada tapılmaz, amma ona elə adət eləmişik ki, guya ondan ə'la məktbxana dünyada olmaz.

Uşağın bədəni mum kimi bir şeydir, uşaqlıqda ona hər nə surət verilsə, o surət onda baqi olacaq, yə'ni məktəbxana insanın insan olmağına baisdir. Belə də bizim məktəbxanalara baxan gərək bizi adam hesab eləməsin. Biçarə uşağı gətirib mollaya verəndə əvvəl zaman molla onu bir böyük şagirdə tapşırır ki, ona ustad deyirlər. Ustad onu öyrədir: əlifdən beyetən, yüyürdüm evətən... Xülasə, bir neçə günün müddətində onu özü kimi edir. Məktəbdə mollanın falaqqası və çubuğu, ustadın və qeyri şagirdlərin qapazı, evdə ata və ananı yumruq, silləsi və onların hamısının bəd əməli biçarə uşağın bir az zamanda oğru, yalançı və hər bədbihesablıqdan xəbərdar edir. Necə eləməsin ki, bu şərtlərdən daş daşlığı ilə əzilib tamam olar. Uşağın zərif bədəni buna davam edərmi?

Bizim müəllim uşaq üçün cəlladdır. Uşağı döyməyə, papiros çəkməyə adət edən təki adət edib deyir: uşaq döyülməsə oxumaz. Guya ol biçarə eşşəkdir ki, bizləməsən yeriməz. Ata və ana uşağı ona tapşıranda deyir: əti sənin, sümüyü mənim. Döy ki, adam olsun və dəxi bunu fikir etmir ki, belə döyülməkdən özü bu günə qalıb və belə vay günə onun övladı həm qalacaq.

Ey uşağı olan və onlara tə'lim edən, rəhm edin ol biçarələrə ki, onlar sizin düşməniniz deyillər, onlar ilə adam kimi rəftar edin ki, adam olsunlar. Barı bunu yaddan çıxarmayın ki, sizin sillə, yumruq,

falaqqa, çubuq eşşəyi adam etməz. Uşaq meymun təki hər şeyi görsə, ona əməl edər və əgər uşaq bir bəd əmələ mürtəkib olmuşsa, onda taxsır yoxdur, taxsır ol kəsdədir ki, bu əməli ona göstərib, yə'ni taxsır sizdədir. Dəxi ol biçarəni niyə döyürsünüz?

İndi kitab və müəllimlərdən bir neçə kəlmə danışaq. Biz məktəbxanada oxunan "Leyli-Məcnun", Hafiz və qeyri uşaq kitabı deyil. Onları ki, böyük oxuyanda Şura gəlir, uşaq başına nə kül töksün onları oxuyub eşqbaz, cür'əkeş olmasın və birdə bizi oxudanda məhz oxuyub yazmağı, öyrədirdilər və dəxi sə'y edən yoxdur ki, bir xeyri olan şey də öyrətsin. Məsələn, Məcnun elədiyi qələti oxudunca elmi-coğrafiya kitabı oxusaq, həm yazıb oxumağı öyrənnik, həmi dünya üzündə olan vilayətlərdən xəbərdar olarıq.

Müəllimimizdən danışandan irəli bir misal çəkək: qədim yunan əhlinin bir qism ruhanisi olub ki, onlara "avğur" deyirlər imiş. Xalq ziyadə avam olduğuna onlar çox bədbihesablıq edillər imiş. Onlarda bir adət olub ki, bir-birinə rast gələndə hər iki "avğur" gülər imiş, yə'ni belə gülməkdən bu eyham çıxır imiş ki, əgərçi sən məni avam hesab edirsən, amma yaddan çıxarma ki, sən də mənim təki avamsan. Əlhəqq bizim müəllimlər bir-birinə baxanda gərək avğur kimi gülsünlər ki, onların hər ikisi avamdır. Amma xalq onlardan avam olduğuna onların işi işdir. Əlbəttə, ələ falaqqa və çubuq alıb lifbeyi öyrətmək ilə adam müəllim olmaz (biz elmi-ədyan müəllimlərinin üstə danışmırıq ki, onların işi başqadır). Əgər bizim handa bir yaxşı müəllimimizdən sual edəsən ki, on üç dəfə on doqquz nə qədərdir, sənə cavab verməkdən ötrü bir saat barmaqların yumar ya təsbeh çəkər. Pəs belə də avam olduğumuzu gizlətməyib sə'y edib, elm təhsil etmək yaxşı deyilmi?

*Nəcəf*

* * *

Göyçaydan yazırlar ki, bu il oranı quraqlıq tutub, su azalıb, ziraətlərə vəfa etmir və yerdə ot, ələf yoxdur, heyvanatlar qırılır. Camışın biri 10 manata, inəyin biri 3-4 manata, qoyunun biri bir manata ya yarım manata alan yoxdur. Bir neçə gün bundan əqdəm bərk külək əsib bir para bağları yandırdı.

3 ay bundan sabiq Qəbələ mahalında Qutqaşın qəryəsində 7-8 nəfər qaçaq bir təzə gəlin övrətin evinə gəlib hücum edillər ki, evi basıb onu aparsınlar. Haman övrət, evdə kişi və qeyri adam yox, xə-

bərdar olub onların qabağına çıxıb tüfəng ilə onların birisini öldürüb. Sonra qaçaqlar hücum edib ki, onun meyidini alıb aparsınlar, övrət qoymayıb. Sonra onlar tüfəng atıb haman övrəti zərərsiz zəxmdar edillər, amma bunilə belə övrət meyidi vermir, qaçaqlar gedir.

Göyçay uyezdində Bekdul qəryəsində bir qız var 8 yaşında ki, onun gözünün biri firəngi göy və biri həbəşi qaradır.

## TƏZƏ XƏBƏRLƏR

Badkubənin qubernatoru cənab Puzin oktyabrın 27-də Badkubə şəhərinə daxil oldu.

* * *

Oktyabrın 11-də olan tufan o günü Dərbənd, Petrovski, Poti, Suxum şəhərlərində həm olub.

* * *

Osmanlı dövləti təzədən qoymaq istədiyi qanun belə olacaq: Osmanlıya tabe olan tayfalar can hesabilə 25 yaşına yetişmiş və mülkmalı olan şəxslərdən vəkillər intixab edib İstanbula göndərəcəklər ki, onlardan məclisi-ümumi bina olacaq və bu məclis iki dairə olacaq: birisi məclisi-nas ki, 120 calis olacaq. Bu məclis tamam dövlətin məsarifinə və vüsuluna və təzə qoyulan qanunlara mülahizə edəcək və birisi məclisi-am olacaq ki, onun 50-yə qədər calisini həzrət soltan tə’yin edəcək. Məclisi-am zikr olan məclisi-nas mülahizə elədiyi işlərə baxıb, onları təsdiq edib, həzrət soltana pişnəhad edəcək ki, həzrət onu təsdiq edəndən sonra ona əməl olacaq. Bu qaydanın adına konstitusiyon deyirlər ki, tamam Avropa dövlətlərində işlənir.

Osmanlı dövləti zikr olan qanunu qoymaq istədiyinə bir neçə şəxs, o cümlədən bir neçə molla həzrət soltana Avropa dövlətləri gücilə təzə qanun qoydururlar deyib bunt eləmiş imişlər. Onları dövlət tutub cəzirələrdə məhbus edib. Bu səbəbə İstanbulun üləmaları cəm olub həzrət soltana ərz ediblər ki, onlar zikr olan qanuna və həzrət elədiyi işlərin hamısına razıdırlar.

* * *

Rusiya dövləti Osmanlı sərhəddinə əsgər cəm edir. Bizim Qafqaz tərəfindən Gömrü qalasına cəm olan əsgərə knyaz Loris-Melikov, Tuna çayının sərhəddinə cəm olan əsgərə padşahzadə Veliki Knyaz Nikolay Nikolayeviç sərəsgər tə’yin olunub.

* * *

Oktyabrın 29-da padşahi-imperaturi-ə'zəm Moskva şəhərində camaata deyib ki, mən həmişə sə'y edirdim ki, cəng olmasın və bizim Osmanlı ixtiyarında olan slavyan qardaşlarımız üçün yaxşı olsun. Bu halda İstanbul şəhərində Avropa dövlətlərinin vəkilləri sülh barəsində danışıq edirlər və bizim vəziri-muxtar İqnatyev zikr olan slavyanların xeyrinə bir neçə söz deyəcək və əgər onu qəbul etməsələr, gərək cəng başlıyaq. Ümidvarıq ki, Moskva şəhərinin xalqı bizə kömək eləsin. Bunun cavabında xalq ura deyib: yə'ni ki hazırıq.

* * *

Qaradağdan yazırlardı ki, knyaz Nikolay deyib ki, əsir olan osmanlıların xərci çox olduğuna onları gərək əldən qoyaq. İndi tel gəlib ki, ol əsirlərdən əfsərləri saxlayıb qeyrilərini əldən qoyublar və qvardiya polkunun adamını bu səbəbə əldən qoyublar.

* * *

Qaradağın knyazı Nikolayın qızları Peterburqda oxuyurlar. "Qolos" qəzeti yazır ki, onlara hər ildə xəzinədən 5150 manat xərc olur.

* * *

*"Tiflisski vestnik" qəzetində çap olunan tellər:* Oktyabrın 24-də London şəhərindən. İngilis dövləti məsləhət edir ki, Avropa dövlətləri öz vəkillərini İstanbul şəhərinə göndərsinlər ki, slavyanlar ilə Osmanlı dövlətinin miyanında sülh etmək barəsində məşvərət etsinlər. Oktyabrın 24-də Parijdən, Firəngistanın İstanbulda olan vəziri-muxtarı baron Burğonu dövlət Parijə gətirdib ki, ona rubəru bir neçə söz tapşıracaq. Oktyabrın 26-da Belqraddan. General Çernyayev Belqrada gəlib Rusiyaya getmək istəyir. Deyirlər Bolqariya Bosnə, Qerdseqovinə vilayətlərinə bə'zi ixtiyar istəməkdən savayı Serbistan istəyir ki, Serb və Rumeli əyalətlərini əlahiddə dövlət eləsinlər ki, onalar Osmanlıya xərc verməsin. Amerikanın Nyu-York şəhərindən oktyabrın 26-dan. Amerika cümhuriyyətinə Ğildin adlı şəxs 4 ilə prezident, yə'ni padşah intixab olunub. Deyirlər zikr olan şəxs dərzi imiş. Oktyabrın 12-dən İstanbul şəhərindən. Osmanlı dövləti 8 həftəlik sülhə razı oldu. Bu zaman cəng olmayacaq və hər iki tərəf onun əlində olan yerdə qalacaq.

* * *

*Badkubəyə gələn tel:* noyabrın 2-dən İstanbuldan. Sülh olub. Amma əsgərlərin arasında çəkilən sərhəd üstə danışıqdır. Avropa dövlətlərinin vəkilləri ol sərhəddi çəkməkdən ötrü birləşməyiblər. Osmanlı dövlətinin cəng gəmiləri Qara dəniz boğazına cəm olub. Peterburqdan. “Russki invalid” qəzeti yazır ki, Kiyev və Xarkov şəhərlərində olan əsgərlərdən altı korpus düzəldib, Tuna çayının sərhəddinə göndəriblər.

* * *

“Qolos” qəzeti yazır ki, bilet ilə əldən qoyulan soldatlara hökm olunub ki, yığılsınlar.

* * *

“Peterburqski vedomosti” qəzeti yazır ki, oktyabrın 19-da Buxara xanının oğlanları Mirne’məddin və Mirmansur əcaibatxanaya gəzməyə getmişlər imiş. Orada olan şeylərə, ələlxüsus Fətəli şahın qılıncına çox təəccüb ilə tamaşa ediblər.

* * *

Moskvadan “Novi vremya” qəzetinə yazırlar ki, oraya bu günlərdə Serbistandan ataları cəngdə vəfat edən yetimlər gələcək.

* * *

Peterburqda sakin olan Raskolniklər cəm olub söz veriblər ki, Rusiya Osmanlı ilə cəng başlasa, dövlət üçün pul yığsınlar.

* * *

“Moskovski vedomosti” qəzeti yazır ki, gələn il vəziri-xəzanə təzədən bu qədər də pul kəsdirmək istəyir: 19 milyon 5 yüz min manatlıq imperial, 9 yüz min manatlıq 3 manatlıq qızıl, 6 milyon 5 yüz min manatlıq gümüş pulu, 7 yüz min manatlıq qara pul ki, onun 50 manatı bir pud olsun.

* * *

Osman dövlətinin Peterburqda olan vəziri-muxtarı Kabili paşa naxoş olduğuna iki aya rüsxət alıb Vyana və Parij şəhərlərinə gedib.

* * *

Dövlət tərəfindən Daşkənd şəhərinə dəmiryolu aparmaqdan ötrü tə'yin olan komissiya Qırğız səhrasına baxıb yazır ki, Orenburq şəhərindən zikr olan səhra ilə Daşkənd şəhərinə dəmiryolu aparmaq olur.

* * *

İki il bundan irəli vəkillik edən kəslər barəsində təzə qanun qoyulub ki, onları imtahan edib şəhadətnamə versinlər. Çünki bu qayda çox mülk-malı olan kəslər üçün artıq zərər idi, ona binaən onların upravlyayuşşisinə, yə'ni amilinə ixtiyar vermişdilər ki, öz ağasının işlərini şəhadətnaməsi olmasa da sudlarda başlasınlar. İndi "Birjevoy vedomosti" qəzeti yazır ki, çünki amillik adına çox kəs vəkillik edir, ona binaən danışıq var ki, o ixtiyarı amillərdən alsınlar.

* * *

Astrabad şəhərindən "Bakinski izvestiya" qəzetinə yazırlar ki, Türkmənlər ilə İran dövləti cəng edir. Bu səbəbə İran dövləti oraya 4 minəcən əsgər cəm edib.

* * *

Bir xəbər çıxmışdı ki, həzrət soltan Muradi-pəncüm mərhum olub. İndi İstanbuldan yazırlar ki, bu xəbər doğru deyil.

* * *

Bir yapon əhli İngilisin London şəhərində olanda görür ki, kərpic çox baha satılır, ona binaən yazıb Yaponiyadan kərpic gətirdib orada satır və çox nəf' edir. İndi əgərçi Yaponiyadan London şəhərinə dərya il bir neçə min verst yoldur, amma onların arasında bərk kərpic alış-verişi olur.

* * *

Yunan və Rumeli əyalətləri Osmanlıdan narazı olub, bu halda əsgər cəm edirlər. Deyirlər onların əsgəri 200 mindən ziyadə olacaq.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

2-ci sənə 22-ci nömrə

*Fi 15 ziqə’dətülhəram*
*sənə 1293*

* * *

*Poşt xərci*
*basdıran ilədir*

* * *

*Yekşənbə günü*



*Fi 20 noyabr Rusiya,*
*sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı –*
*1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E’lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## E’ L A N

Gələn il qəzetimiz genə 2 həftədə bir çıxacaq, qiyməti 3 manat olacaq. Ona binaən mə’lum edirik ki, onu xahiş edən, il qurtarmamış onun qiymətini bizə göndərib öz ismini və sakin olduğu yeri mə’lum eləsin.

## DAXİLİYYƏ

Bu halda müsəlman tayfası qeyri tayfalar arasında nöqtəli qarğaya dönüb. Hər atını minən bu tərəfə çapıb müsəlman əvamünnasa niyyətdən bixəbərdir və qeyrə deyir. Hər bir qəzetdə ki, ya ingilis, ya firəng, ya qeyri dildə çap olunur, bu danışıq var. Əlbəttə, buna səbəb Osmanlı dövləti öz xristian tabeləri ilə elədiyi cəng olub. Amma demək olmaz ki, hamı Osmanlı dövlətinin və müsəlman tayfasının düşmənidir. Bunun bir əsli səbəbi həm var.Yer üzündə olan insan bir külfət kimidir, necə ki, bir külfətdən bir şəxs işləməyib qeyrilər kəsb edən çörəyi yeyəndə hamı onu dost tutmaz və sə’y kuşeş edər ki, ol şəxs həm işləsin, habelə müsəlman milləti qeyri millətlər arasında ol şəxsə bənzər. Ona binaən qeyrilər onu dost tuta bilməz. Bu sözü düşmən sözü hesab eləməsinlərdən ötrü mətləbi aşkar edək.

Dünya üzündə hər adam özü üçün işlər, yə’ni özünün, ya əhli-əyalının xeyrindən ötrü kəsb edər, savayı əhli-elm ki, elm kəsb edən

şeylər hamı üçündür. Məsələn, bir kəs elm yolu ilə süddən necə yağ çalxalamaq gərək ki, nəfi artıq olsunu mə'lum edəndə hər oxuyan onu bilib mənfəətbərdar ola bilir. Pəs elm təhsil etməyə sə'y edən tayfa hamı üçün səy edər. Amma biz ki, elm təhsil etmək dalınca deyilik, zikr olan şəxs təki qeyrilərin kəsbindən mənfəətbərdar oluruq, ona binaən elm təhsil edən tayfalar bizi dost tutmamağı, gərək bizə giran gəlməsin, onların haqqı var. Nəhayət bu halda elm təhsil etməkdə qeyrilərdən geri qalan bir biz deyilik, bizim təki qeyrilərin kəsbindən mənfəətbərdar olan çoxdur. Amma dərdə budur ki, indi onlar da qeyrilərin sədasını eşidib küyə düşüb, bizə eyb tutub deyirlər ki, guya bizim kitablara görə qeyri tayfaları incitmək, onlara zülm əziyyət etmək... vacibdir. Haşa bu söz böhtandır, onun cavabında Sədinin kəlamını sübut gətirirəm ki, deyib:

Bəni-Adəm ə'zayi-yekdigərənd
Ki, dər afərinəş zi yek cövhərənd,
Çü üzvü bedərd avərəd ruzgar,
Digər üzvhara nəmanəd qərar[1].

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Yer üzündə olan ələfiyyat hər bir tərəfdə əmələ gəlməz. İsti tərəflərdə olan ələfiyyat soyuq tərəfdə olmaz. Məsələn, tut ağacı ki, onun yarpaqları ilə barama qurdu saxlanır, isti tərəf ələfiyyatıdır ki, bizim xeyir-bərəkətli vilayətimizdə özbaşına əmələ gəlir. Amma bunilə belə soyuq tərəflərin əhli hər bir elmdə tərəqqi elədiyinə barama qurdunu saxlamaqda, tut ağacını bitirməkdə həm bizə ustadlıq edir. Ey qardaşlar, insafdırmı ki, biz öz tut ağacımızı bitirməyi ol kəslərdən öyrənək ki, onların yerində tut ağacını bitirtmək olmur?..

Barama qurdu əvvəl zaman kiçik olduğuna ona xırda yarpaq ya onu doğruyub xırda edib verillər ki, onu yemək asand olsun. Əlbəttə, belədə fəhlə qanacaqlı olsa, ya olmasa onlar üçün yaxşı ya yaman olacaq.

---

[1] Bütün insanlar bir-birinin üzvüdürlər,
Onlar bir cövhərdən yaranmışlar,
Əgər ruzgar bir üzvü incidərsə,
Başqa üzvlər də sakit dayana bilməz.

Ona binaən Avropa vilayətlərində tut bağı salanda elə salırlar ki, onun bir neçə ağacı həmişə kiçik olduğuna onun yarpağı həm xırda olur. Bağ salmaq istəyən tut ağacının meyvəsini ki, ona biz tut deyirik, bir yerə toxm edib gələn il onları çıxardıb, bir qeyri yerdə şitil edib, 3-4 ildən sonra bağ yerində şitil edirik. Bağın yerində gərək cızıqlar çəkib orada ağacları elə şitil edəsən ki, onlar cərgə-cərgə olsun və bunların arasında gərək kiçik yol qalsın ki, sonra onların yarpağını xırda əl ərradəsi ilə kuma gətirmək olsun. Lazımdır ki, cızıqlar kum tərəfdə sıx, yə'ni bir-birinə yavuq və o biri tərəfdə aralı olsun ki, kum tərəfdə olan ağacın yeri az olduğuna, onlar kiçik yarpaqları həmişə xırda və nazik olduğuna, onları əvvəl zaman qurd yesin, amma o biri tərəfdə ağaclar aralı əkildiyinə onlar böyük və yarpaqları çox olsun. Məsələn, kum tərəfdə cızıqların bir-birindən arası bir arşın, sonra bir arşın bir çərək, arşın yarım, iki-üç arşın olsun və habelə hər cızıqda şitil olunan ağacların bir-birindən arası bu minval olsun və dəxi yaxşı olur ki, kum tərəfdə bir-iki cərgənin ağacları bitəndən sonra onların dibindən boğazlıyasan ki, onların dibindən çıxan budaqlarının yarpaqları dəxi nazik olur.

## MƏKTUB

Rəşt şəhərindən şəvvalülmükərrəmin 18-dən. Ermənilərin Tiflis şəhərində "Mşak" adlı təb' olunan qəzetində İran torpağında olan ermənilərə zülm olmaq barəsində yazdığı mətləbə cavabdır.

İran məmləkətində ermənilərin çox ehtiramı var, onlara heç vəch ilə zülm və əziyyət yoxdur. İstirahət ilə öz işlərinə məşğul etmək olur, bavücud ki, islam məzhəbində şərab bərk qadağandır, genə onlara mane olan yoxdur. Onlar özləri üçün şərab saxlamaqdan əlavə dükançılıq həm edirlər.

Rəşt şəhərində dükançını belə öldürüblər: bir övrət ol dükançının yanına gedib-gəlirmiş. Küçə əhlinin qeyrətinə küncidə olmaz. Övrətə deyirlər oraya getmə, erməniyə təvəqqe ilə deyirlər: qonşu, bu övrətə öz mənzilinə yol vermə. Bavücudi-in genə övrət ermənin mənzilinə gedir. Erməniyə deyərlər ki, biz sənə dedik övrəti mənzilinə gətirmə, genə gətirdin. Erməni deyər gətirəcəyəm və əlavə bir neçə nalayiq sözlər həm deyər. Bu söz xalqa çox nagüvar olub, haldan çıxıb. İctima və şuriş bir tövr ilə olub ki, hakim çarə eləyə bilməyib, zəbani-surx

sərsəbz midəhəd bərbad[1] Bə’d əzon darül-məlafeyi-Tehrandan məxsus mə’mur gəlib, neçə nəfərlərə tənbeh edib, neçə nəfərlər dustaq edib. Pəs, mənim dostum, məmləkətdir, gah vaxt bir belə iş ittifaq olur. Amma bir adamdan ötrü bir şəhəri qətli-am etməzlər. Müntəha bir neçə nəfər müttəhim adamlara tənbeh edərlər. “Əkinçi” qəzetinin 4-cü nömrəsinə bax ki, yazmışdıq: bəni-Adəm hamı qardaşdır. Gərək qardaşlar arasına sülh vermək. Pəs Tiflis şəhərində müsəlmanlara ermənilərdən varid olan əziyyətləri mülahizə elə, fikrin bu olsun qardaşlar arasına sülh verəsən, nəinki bu qism mətləbi qərəz ilə qəzetə yazasan ki, qardaşlar arasına ədavət düşsün. Mən öz müsəlman qardaşlarıma ərz edirəm ik, insanlıq şərtlərinin birisi süluk və rəftardır.

Çinan banikü bəd rəh ro ki, bə’d ərz mürdənət Ürfi,
Müsəlmanət bəzəmzəm şuyədü hindu bəsuzanəd [2].

Məsələn, bir müsəlman bir erməniyə ya bir erməni bir müsəlmana əziyyət ya məhəbbət edə, o adam əvəzin onun özünə etməsə, din qardaşına edər. Yaxşılıq yaddan çıxsa, yamanlıq çıxmaz. Pəs heç vaxt yamanlıq etməyin ki, məbada əvəzin sənə etməsə, qardaşına eləsin.

*Əhsənül-Qəvaid*

## ELM XƏBƏRLƏRİ

Badkubədə oturub hər gündə xəzri gətirən toz gözümüzü doldura. İndiyəcən küləkdən və onun səbəblərindən danışmadığımıza səbəb budur ki, bizim adam hər şey Allahdandır deyib. Onun səbəbini axtarana eyib tutur. Əlbəttə, hər şey Allahdandır. Amma Allah-taala hər şeyi yaradıb, hərəsinə bir xasiyyət verib ki, bu xasiyyət onda baqidir. Bu xasiyyəti elmi hikmət ilə axtarıb tapmaq əsrari-xudaya əl aparmaq deyil. Bəlkə bu yol ilə xudavəndi-aləmin qüdrəti dəxi artıcaq sübut olur.

Hava yer üzünü əhatə edib. İnsan ol havaya balıq suya qərq olan kimi qərq olub, zindəganlıq edir ki, insanın nəfəs almağı və qeyrə hava ilədir.

---

[1] Odlu dil cavan başı güdaza verər.

[2] Ürfi, yaxşı və pis ilə elə rəftar et ki, öləndən sonra müsəlman səni zəmzəm suyu ilə yusun və hindli yandırsın.

Dünyada hər şey istidən böyük və soyuqdan kiçik olur. Bunu belə sübut etmək olur: bir halqa və bir yumruq dəmir götürsək ki, dəmir halqanın qıraqlarına dəyə ondan keçsin, o dəmiri qızdıranda böyüdüyünə dəxi halqadan keçməz. Pəs onun böyüdüyünə səbəb isti oldu. Habelə hər şey istidən böyüklənir və bir də bir şey isti-soyuqdan ağırlığını dəyişdirməz. Məsələn, zikr olan dəmir qızmış ya qızmamış bir ağırlıqda olur. Amma mə'lumdur ki, bir put dəmir və bir put pərqu bir olmaz. Dəmiri əldən qoyanda dərhal yerə düşər, amma pərqu açılmış olsa, yerə tez düşməz. Hava ki, pərqudan çox nazik olduğuna onu görmək mümkün deyil, heç yerə düşməz. Havaya isti dəyəndə bundan böyüyüb dəxi nazik olduğuna yer üzündən yuxarı qalxar. Yer üzündə bə'zi yer isti, bə'zi soyuq olmağı mə'lumdur. Məsələn, dağlarda və şimal tərəfdə soyuq, aranda və cənubi tərəfdə isti olur. İsti tərəfin havası istidən qızıb yuxarı qalxanda onun yerinə soyuq hava gəlir ki, havanın belə tərpənməyinə külək deyirik.

Baqisi yazılacaq

## TƏZƏ XƏBƏRLƏR

Oktyabrın 11-də Badkubədə olan tufan o gün Amerikada həm olub.

* * *

Bu ziqə'də ayının əvvəlindən indiyəcən Badkubədə gecə-gündüz yağış yağır.

* * *

Lənkərandan yazırlar ki, Nikolayevka qəryəsində keçən baharda bir malakanın atı bir qulan doğmuş idi ki, o qulanın əmcəyi süd ilə dolu olduğuna hər gündə onu bir neçə dəfə sağırdılar.

* * *

Keçən nömrədə yazılan İstanbulda vaqe olan bunt barəsində qəzetlər yazır ki, bir neçə paşa və üləma sözü bir etmişlər imiş ki, şəvval ayının 15-də iki dəstə olub bir dəstə gedib Topqapı sarayından peyğəmbər əleyhissəlamın səncəqi-şərifini alsın və o biri dəstə vəzirlərin məsləhət xanasını əhatə edib onları məhbus etsin, sonra hər iki dəstə

birləşib əldə səncəyi-şərif gedib həzrət soltanı xaric edib onun yerinə mərhum soltan Əbdüləzizin oğlu Yusifəddini tə'yin eləsin.

Deyirlər bu danışıqda keçmişdə sədri-ə'zəm olan Mahmud Nədim paşanın əli olub. Buntun əmələ gəlməyinə səbəb pul olub.

* * *

Padşahi-imperaturi-ə'zəmin hökmünə binaən Rusiyanın dövlət bankı dördüncü dəfə 100 milyon manatlıq, ildə yüz manata beş manat gətirən kağız ki, ona bang bileti deyirlər, satır. Hər biletin qiyməti yüz manatdır. Amma bu halda yüz manatlıq bang bileti bazarda 92 manata getdiyinə bang hər bileti 92 manata satacaq. Hər kəs indi ol bileti almağa xahiş etsə onda ixtiyar var ki, 5 ayın müddətində onun zikr olan qiymətini mürur ilə banga versin. Amma biletin sələmi bu noyabr ayının 10-dan hesab olacaq. Zikr olan təzə biletlər keçmişdə çıxan bang biletləri kimi işləyəcək. Dövlət bankının Badkubə şəhərində olan hissəsi bəyan edib ki, zikr olan şərtlər ilə təzə bang biletini bu noyabr ayının 10-dan 16-can füruş edir.

* * *

Gürcü dilində çap olunan "Droeba" qəzeti yazır ki, erməni dilində çap olunan "Mşak" qəzeti gələn il həftədə iki dəfə çıxacaq və ermənilərin "Purdez" jurnalı ki, 3 ayda bir çıxırdı, gələn il ayda bir çıxacaq. Onları çap elədənlər bu barədə izn istəyiblər.

* * *

"Mşak" qəzetinə yazırlar ki, Ərzuruma cəm olan Osmanlı əsgəri oranın ermənilərinə çox zülm edir, hətta dövlət özü bir neçə məşhur erməni boğazından asdırıb ki, onlar Rusiya dövlətinə dil veriblər.

* * *

"Mşak" qəzetinə Moskva şəhərindən yazırlar ki, orada sakin olan ermənilər Osmanlı dövlətinin Anadolu vilayətində sakin olan ermənilər üçün ki, onların haqqında dövlət zülm edir, pul cəm edillər. Bu səbəbə Suzyans adlı keşiş və'z edib deyib: Rusiya əhli öz serb qardaşlarından nə ki, mallarını, hətta canlarını əsirgəmirlər, sizdə onlar kimi olun.

* * *

"Qolos" qəzeti yazır ki, Rusiyanın vəziri-muxtarı cənab Zinovyev bu günlərdə Tehrana gedir. Padşahi-imperaturi-ə'zəmdən şahənşahi-İrana bir gümüş sandıq üzü almaz ilə nəqş olunmuş və onun vəziri üçün bir belə kasa aparır.

* * *

*“Титфлисски вестник” də çap olunan tel:*

Noyabrın 2-də İstanbuldan. Qəzetlər yazır ki, Osmanlı dövləti Avropa dövlətlərini vəkilləri sülh barəsində elədiyi məşvərətə ol vaxtda razı olacaq ki, nədən danışıq olacağını qabaqcadan mə’lum eləsinlər. Ərzurum və Şomla qalalarına çox əsgər cəm olunur.

Noyabrın 4-də Londondan. İngilis dövləti hökm edib ki, əsgər hazır olsun və İstanbula getməkdən ötrü çox polk hazır olub.

Parijdən noyabrın 5-də. Firəngistanın vəziri-muxtarı baron Burğon və sülh barəsində olan məclisin Firəng tərəfindən vəkili qraf Şodurudi sabah İstanbula gedəcəklər. Onlara dövlət tapşırıb necə iş görsünlər. Prussiya İstanbul şəhərində sülh barəsində məclis olmağa razı olub.

Parijdən noyabrın 6-da. Rusiya və İngilis dövlətləri bir-birilə cəng etməkdən bərk tədarük ediblər, amma ümid var ki, iş sülh ilə qurtarsın.

İstanbuldan noyabrın 7-də. Bu gün vüzəralar məşvərət edib qət ediblər ki, sülh barəsində Avropa dövlətlərinin vəkillərinin miyanında danışmaq olsun və Osmanlı dövləti öz tərəfindən o danışıq üçün Midhət paşanı və xaricə vəziri Səfvət paşanı tə’yin edib.

Parijdən noyabrın 9-da. İngilis tərəfindən İstanbulda sülh barəsində olacaq danışığa təyin olan Markiz Selsburi bu gün buraya gəlib bir neçə gün qalıb Firəngistanın vəziri-xaricəsi hersoq Di Kaz ilə görüşüb sonra Berlindən İstanbula gedəcək ki, yolda Prus və Avstriya dövlətlərinin vəziri-xaricələrin görüb onlar ilə danışsın.

Zemlindən noyabrın 7-də. Serbistanda olan ruslar ilə serblər pəsləşib. Rusiya onlara qorxaq deyir, amma onlar deyir ki, onların basılmasına səbəb general Çernyayev olub. Belə görünür ki, serblər dəxi cəng etmək istəmirlər.

* * *

Rusiya dövlətinin xaricə vəziri knyaz Qorçakov Rusiyanın vəziri-muxtarlarına yazıb ki, qeyri dövlətlərə mə’lum eləsinlər bir ildir ki, Avropa dövlətlərinin vəkilləri Osmanlı dövləti öz xristian tabelərilə elədiyi cəngi sülh ilə qurtara bilmirlər. Bir tərəfdən ol xristianlar taqətdən düşür, bir tərəfdən Osmanlı dövləti təzədən əsgər cəm edib onların haqqında dəxi ziyadə zülm edir. Ona binaən padşahi-imperaturi-ə’zəmi-Rus hökm edib ki, əsgər cəm olsun. Amma belə əsgər cəm etməkdən qiyas olunmasın ki, imperaturi-ə’zəmin muradı cəng başlamaqdır. Ümidvarıq ki, iş sülh ilə qurtarsın.

* * *

Berlin şəhərindən yazırlar ki, sülh barəsində danışıq İstanbul şəhərində olacaq. Avropa dövlətlərindən Firəng, İngilis, Rus, Prus, Avstriya, Osmanlı dövlətlərinin o danışıqda vəkilləri olacaq. Zikr olan danışıqda Osmanlının sərhəddi ya bir qeyri dövlətə əlahiddə ixtiyar verilmək barəsində danışıq olmayacaq. Yə'ni Osmanlının sərhəddi necə var heylə qalacaq. Danışıq məhz Osmanlıya tabe olan slavyan tayfasının ixtiyarını artırmaqdan ötrü olacaq ki, bu barədə İngilisin vəziri-muxtarı İlliot öz təsəvvürünü yazıb, qeyri dövlətlərin vəkillərinə verib.

* * *

İstanbuldan "Tayms" qəzetinə yazırlar ki, əgər bu halda İstanbul şəhərinə cəm olan Avropa dövlətlərinin vəkilləri məhz slavyan millətinin ixtiyarını artırmaq ilə sülh eləsələr, belə sülh möhkəm olmayacaq. Ona binaən ki, qeyri tayfalar, məsələn, qreklər sonra ol ixtiyarı istəyəcək. Pəs, yaxşı olurdu ki, Osmanlı dövlətinin tabelərini hamısının ixtiyarını artıreydilər.

* * *

İstanbuldan "Mşak" qəzetinə yazırlar ki, orada çap olunan erməni qəzetləri Trabzon vilayətində ermənilərə olan zülm barəsində yazdığına dövlət üç erməni qəzeti ki, biri "Məcməül-həvadis", biri "Ararat", biri "Ğayranik" olsun, qadağan edib və onları çap edənləri dövlətə böhtan deyibsiz deyibən məhbus edib.

* * *

"Birjevoy vedomosti" qəzeti yazır ki, İran dövləti Osmanlı sərhəddinə əsgər göndərib, bəyan edib ki, nə politik və nə məzhəb təriqi ilə Osmanlı dövlətinin tərəfini saxlamayacaq.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*2-ci sənə* *23-cü nömrə*

*Fi 1 zilhiccə, sənə 1293*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Düşənbə günü*




*Fi 6 dekabr Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## E' L A N

Gələn il qəzetimiz genə 2 həftədə bir çıxacaq, qiyməti 3 manat olacaq. Ona binaən mə'lum edirik ki, onu xahiş edən, il qurtarmamış onun qiymətini bizə göndərib, öz ismini və sakin olduğu yeri mə'lum eləsin.

* * *

Bir şəxs yazıb bizdən xəbər alır ki, gələn il "Əkinçi" çap olacaq ya yox? Əgər "Əkinçi" gələn il çap olmasaydı, hər nömrədə e'lamnamə çap etməzdik.

## DAXİLİYYƏ

Bizim müsəlman tayfası ingilis tayfasından nə qədər geri qaldığını "Əkinçi" qəzetinə və London şəhərində çap olunan "Tayms" qəzetinə baxmaq ilə bilmək olur:

"Tayms" hər gündə iki dəfə, "Əkinçi" iki həftədə bir çıxır. "Tayms" hər dəfə iki vərəq üstə, "Əkinçi" yarım vərəq üstə çap olunur. "Tayms"ın hər vilayətində müxbiri var ki, təzə xəbərləri yazıb mə'lum edir, onun hər fəslini bir neçə adam yazır. Amma "Əkinçi"ni yazan bir adam olduğuna bəzi vaxtda, hətta Badkubədə vaqe olan işlərdən bixəbər

olur. “Tayms” qəzetinin ingilisin qeyri şəhərlərində oxuyanlar qəzet dəmiryol ilə onlara bir gündə yetişməyi çox bilib xahiş edirlər ki, qəzet onlara dəxi tez yetişsin. Ona binaən onu çap edən teleqraf maşını kimi fortepianoya oxşayan bir maşın ixtira edib ki, onun hər dişini basanda hər şəhərdə bir hüruf düzülür. Sonra hamı şəhərlərdə bir saatda, bir dəqiqədə qəzet çap olunub tamam olur. “Əkinçi” qəzetini hər həftəyə güc ilə düzüb çap edəndən sonra palçıqlı yollar ilə öküz əradəsində, bir aya gedib müştəriyə yetişəndən sonra müştəri bir cüzvi işi olanda qəzeti kənara qoyub, bikar olanda ona baxır ya heç baxmır ya heç baxmır. “Tayms” e’lamnamə çap etməkdən hər gündə 200 manatdan ziyadə alır, amma “Əkinçi” iki illik müddətində bir manat da almayıb. “Tayms”ın 100 mindən ziyadə müştərisi var, “Əkinçi” 300 müştəriyə həsrət çəkir və bir də İngilis məmləkətində “Tayms”dan savayı çox qəzet var ki, hər gündə ya gündə iki dəfə çap olunur və onların hər birini çap edən özünün qəzet çap etmək ixtiyarını 200 min manata satmaz, amma bizim bir “Əkinçi” qəzetimiz var və əgər onu çap etmək ixtiyarını satmağa dursaq, nə ki, ona bir qəpik verən olmaz, hətta onu cəbrən də boynuna götürən tapılmaz. Buna səbəb oldur ki, ingilis əhli dünya işində mahir və hər elmdən xəbərdar olduğuna sə’y edir ki, pul qazanıb, nə ki bu dünyada çox ləzzət ilə zindəganlıq etsin, hətta axirəti gözləyib, məktəbxana və kilsə tikdirib, qeyriləri xristian etməkdən ötrü icmalar bina edir və bu səbəbə onlar kamallı və xeyirli sözün qədrini bilir ki, onlardan ol qədər qəzet oxuyan var.

Bəli doğru deyiblər ki, qədri-zər zərgər şünasəd[1]... Nəhayət, bizim müsəlman tayfası belə deyil. Axirəti gözləyirəm deyibdir ki, 5 gün dünya ömründən ötrü sə’y etmək nə lazım? Amma bunu fikir eləmir ki, dünyası olmayanın axirəti həm olmaz. Dünyada hamı bir-birilə zindəganlıq cənginə məşğuldur. Hər kəs bu cəngdə qalib oldu, ingilis tayfası kimi həmi dünyanı, həmi axirəti kəsb edə bilir, amma məğlub olan nə ki axirətdən, hətta dünyadan da məhrum, yə’ni xəsərəddünya vəlaxirə[2] olur. Ay qardaşlar, vaxt keçməmiş sə’y edin ki, elm təhsil edib zindəganlıq cəngində faiq gəlib dünya və axirəti kəsb edə biləsiniz, yoxsa bir qərinədən sonra iş tamam olur... Əlaci-vaqiə piş əz vüqu bayəd kərd[3].

---

[1] Zərin qədrini zərgər bilər

[2] həm bu dünyadan, həm də axirətdən məhrumdur

[3] Hadisənin əlacını gərək o baş verməzdən əvvəl edəsən

## ƏF'ALİ-ƏHLİ-DEHAT

İnsan əldə saxlayan heyvanat onun muradına müvafiq dəyişilmək-dən keçmişdə danışmışıq. Məsələn, bir heyvanın yunu naziki insana lazım olanda hər il onlardan yunu nazikini intixab edib saxlayanda bir qərinədən sonra yunu çox nazik heyvan əmələ gəlir. Bu səbəbə insan qoyunu ümdə onun ətindən və yunundan ötrü saxladığına iki qism qoyun olur: birisi ki, onu bizlər həm saxlayırıq, ət qoyundur ki, onun quyruğu piyli və əti yağlı olur və o birisi quyruğu piysiz və yunu nazik olur ki, ona yun qoyunu deyirlər. Bu iki qism qoyunun təfavütü bundan məlum olur. Avropa vilayətlərində mal ətinin girvənkəsi 10 qəpiyə gedəndə, oranın yun qoyununun əti 5 qəpiyə gedir. Amma bizim ət qoyununun əti mal ətindən baha satılır. Bizim qoyunun yununun putu 5 manata gedəndə yun qoyununun yunu 30–40 manata gedir. Pəs, onların təfavütü çoxdur. Əgərçi bizim mahut və qeyri karxanamız olmağına yunun naziki bizə lazım deyil və öz yunumuzdan toxuduğumuz palas, şal və qeyrə nazik yundan da toxunsa, artıq qiymətə getməyəcək. Amma bu halda hər tərəfdən yollar açıldığına qeyri tayfaların tacirləri bizim yunumuzu almağa gəlir. Belədə yaxşı olur ki, bizlərdə yun qoyunu saxlayıb artıcaq mənfəətbərdar olaq.

Doğrudur, zikr olan qayda ilə biz öz qoyunumuzun yununu nazik edə bilərik. Amma bu çox vaxt və zəhmət istər. Yaxşı olur ki, qeyri yerlərdə əmələ gələn nazik yunnu qoyunu ki, ona merinos deyirlər, gətirib saxlayaq və bir də çünki bizim adam qoyun əti yeməyə adət edib, ona binaən dəxi yaxşı olur ki, ol qoyunlardan gətirib bizim qoyuna qarışdıraq ki, onlardan törəyən qoyunun həmi yunu nazik, həmi əti yaxşı olsun.

## MƏKTUBAT

"Əkinçi" qəzetinin 17-ci nömrəsində yazılan barama qurdu saxlamağın təqviyyətində ərz olur ki, qurdun afəti təğyiri-həvadan olmağı mə'lumdur, ümdə soyuqdandır. Bina bərin lazımdır kümləri özgə tərh bina etmək ki, havası təmiz və soyuqdan məhfuz olsun. Əgərçi cənab Əlixan Nasirül-mülki-fərmanfərmayi-Gilan ki, əlhəqq ol cənab bir ne'məti-üzmadır Allah-taala Gilan əhlinə əta edib ki, daim rəiyyət və

məmləkətin abadlıq sə'yindədir, əzcümlə bu səneyi 1293-də Firəngistandan məxsus toxum gətirdib bir neçə küm ki, Gilan istilahında tulambar deyilir, akoşkalı bina edib, amma tulambarlarda barama olmayıb. Lihaza əvamünnas üçün dəstavüz olub ki, əgər soyuqdan olseydi bu kümlər xarab olmaz idi. Lihaza lazım bildik ki, onun illətin bəyan edək. Əvvələn, bu il barama vaxtı çox soyuq və yağışlıq oldu. Saniyən, əgərçi onlar hər bir tərəfdən məhfuz olub, amma alt tərəfdən məhfuz olmayıb, amma cənab Əli o toxumdan bir cüzi evdə saxladmışdı, eyb etməyib barama qayırıblar və bir də cənab Nasirəl-mülkün dəsturül-əməlinə binaən Ağa Məhəmmədibrahim taciri-kəzai iki dəfə çıxan toxumdan bir qədəri səneyi-sabiq bu tövr ilə tutmuş idi ki, eybi olmayan tulambardan bir qədər barama intixab edib, onların pərvanəsi, yə'ni kəpənəyi çıxandan sonra onları zərrəbin ilə mülahizə edib, naxoş olmayan pərvanələrdən toxum tutub, o toxumu bu səneyi-1293-də bir kümə qoyub o kümü hər bir tərəfdən yaxşı məhfuz etməyə binaən həm əvvəlinci, həm ikinci dəfə o kümdən yaxşı barama olub. Lihaza Ağa Məhəmmədibrahim məzkur mövridi-əltafi-şahanə və bir top şal cübbə ilə müxəlle və müftəxər olub. Müjdə olsun İran əhlinə ki, əlhəqq bu mətləb çox dəlalət edir həzrəti-şahənşahi-islampənahın rəiyyət və məmləkət əhvalatından baxəbər olmağına. Qərəz, çünki nəbatat və heyvanatın afəti əğləb soyuqdandır, lihaza bəndənin həm təsvirinə binaən bu kümlər fayda verməz. Əvvələn, gərək kümlər ev kimi qayrılsın ki, akoşkası olsun. 2)Gərək toxum naxoşluq dəyməyən bieyb qurddan təhsil olmuş olsun. Zira ki, əgər naxoş pərvanədən toxum tutalar, əgərçi o toxum tutub xörək yeyər, amma genə naxoş olub tələf ola bilər. Belə ki, insanda həm bəzi naxoşluq olanda övladında həm biruz edər. 3) Gərək qurdların fəzəlatı tez-tez təmizlənsin ki, üfunət edib qurdları naxoş etməsin. 4) Gərək onların xörəyi qayda ilə vermək, xüsus toxumaq xörəyin yiyən zaman. 5) Küm quru və işıq olsun, əgərçi katib bu mətalibi bə'zi ərbabi-mülkə dedim, mütəəssir olmayıb əvvələn dedilər ki, bunlar sözdür. Allah gərək novğan versin. Çün onların ağlı elmi-tədbirdən xəbəri olmadığına hər bir zadı təqdirdən bilirlər. Pəs, əzizim, naxoş üstə təbib gətirməyin və ondan mütəvəcceh olmayın ki, Allah gərək şəfa versin. Pəs Allah necə ki, təqdir qərar verib, tədbir həm qərar verib. Belə ki, görürük Avropa əhli ağıl, elmi-tədbir ilə millət və məmləkətlərin mə'mur ediblər.

Gər təvəkkül miküni dər kar kün.
Kəşt kün pəs təkyə bərcəbbar kün.[1]

Heç kəs hünəri ana bətnindən gətirməyib. Və saniyən, dedilər ki, bizim maliyyət verməyə qüvvəmiz yoxdur pulu haradan gətirib hər kümə 10 tümən məsrəf edib, təzə tor qayıraq?

Bəli, doğrudur ki, xalqın qüvvəsi yoxdur ki, bu hamı kümləri qayırsınlar və əlavə həmişə maliyyat girdarəndələr əvvələn, gərək maliyyət üçün bir qanuni-cədid bina olsun. Belə ki, indi mə'lumdur, biqaydadır. Və saniyən, tərhi-cədidi-küm qüvvə sahibləri ondan 1 ya 2 ya 3 bina etsinlər. Bir il ki, onun etibarı mülahizə oldu, ondan sonra xalq öz rəğbətlərilə qayırarlar və pulu olmayanlar pul tapar və pul sahibləri onlara etibar edər və kümlər həm öz xərcin çıxardar. Əlhəqq bu işlərdə bang yaxşı zaddır. Qərəz bu tövr ilə əməl 3-4 ildə paydar olur. Çətin əvvəl bir-iki il əməlin imtahandan çıxmağıdır və əgər ümənayi-dövlət əbdi-müddətin təvəccöh və tərbiyəti ola ümidvaram.

Əvvələn, maliyyat üçün bir qanun ərz ola ki, millət dövlətin asudəliyinə bais ola və tulambarlar üçün tədbiri ola ki, cüz'i xərc ilə tərhi-cədid qayrıla.

*Əhsənül-Qəvaid*

## ELM XƏBƏRLƏRİ

Mirvarid balıq qulağının içində əmələ gəlir ki, ona sədəf deyirlər. Bu sədəf heyvanın mənzilidir ki, onu düşməndən mühafizət edir. Zikr olan heyvanın əvvəl zaman sədəfi olmaz, amma sonra mürur ilə onun dərisindən sədəf əmələ gəlir ki, dəriyə yapışıq olur. Mirvarid dəri ilə sədəfin miyanında olur. Çünki mirvarid yumrudur və suyun damcısı həm yumru olur, ona binaən hükəma deyir ki, ol heyvanın dərisi ilə sədəfin arasında su damcısı düşməkdən mirvarid əmələ gəlir və bunu belə sübut edir. Zikr olan heyvanatlardan bir neçəsini tutub dərisini sədəfdən aralayb, onların miyanına çahargül ya xaç ya qeyri tövrdə ağac ya qeyri şey qoyub suya atıb bir neçə müddətdən sonra ol heyvanı çıxardanda onun zikr olan yerində ol ağac tövründə mirvarid tapılır.

---

[1] Əgər təvəkkül etmək istəyirsənsə işdə et,
Ək, sonra Allaha bel bağla.

Əhəng daşı iki əczadan mürəkkəbdir: birisi kalsium və birisi hamiz qarbondur. Kalsium bərk şey, amma hamiz qarbon hava qismində bir qazdır. Əhəng daşını yandıran zaman hamiz qarbon rədd olduğuna ol daş un kimim narın olur ki, ondan palçıq tutub tə'mirat üçün işlədillər. Çünki hamiz qarbon havada həm olur, ona binaən zikr olan palçıq ol qazı havadan çəkib mürur ilə təzədən əhəng daşı olur və bir də palçıq tutan zaman ona qum qarışdırmağın nəf'i budur ki, qumun dənələrinin arasilə hava palçığa tez daxil olduğuna palçıq həm tez daş olur.

## TƏZƏ XƏBƏRLƏR

Badkubənin tamojnixanasına hökm olunub ki, xalqdan tamojni gömrüyünü qızıl pulu alsın. Qızıl pulun 3 manatlığı 4 manata gedir.

* * *

Rusiyada bə'zi kəndin əhli icma ilə əkin və ziraət edir. İndi "Zemledelçeski qəzeti" yazır ki, Finlandiya vilayətində 3 il bundan sabiq bir qəryədən 15 külfət birləşib yerlərini bir ediblər ki, onu birgə əksinlər. Onlar 3 adam intixab edib ki, calislərin işləməyinə mülahizə edib sonra hasildən gələn il üçün toxum saxlayıb artığını onların arasında belə təqsim eləsin: 78-dən ziyadə yaşı olan kişi bir hissə. Ol yaşında övrət yarım hissə, 10-15 sinni olan oğlan yarım hissə, ol sinndə qız dörddən bir hissə.

Bu qaydanın yaxşılığı ondan mə'lum edir ki, zikr olan qəryənin əhli həmişə biçiz olub. Amma bu halda ol icmaı bina edənlər elə tavanalı olublar ki, əkin üçün maşınlar gətirdib öz uşaqları üçün məktəbxana açıb onun müəllimінə ildə 300 manat verillər. Belə camaat ilə iş görməyin bir xeyri də budur ki, tənbəl olan kəslər həm gərək işləsin yoxsa onlara hissə verməməkdən başqa, calislikdən də xaric edirlər. Nəhayət, bir kəs həqiqət naxoş olsa, ona hissə verillər.

Bu halda Badkubə şəhərində çiçək və yatalaq naxoşluqları var ki, onların hər ikisi yoluxmadır. Ona binaən belə naxoşu olan gərək sərhesab olub, dərhal şəhərin həkiminə mə'lum eləsin. Ələlxüsus yatalaq çox şiddətlidir ki, bir-iki gündə naxoş vəfat edir. Bu naxoşluq qarın naxoşluğu olduğuna belə naxoşu olanlara məsləhətdir ki, onu qeyri otaqda saxlamaqdan savayı naxoşun nəcisini torpaq ilə basdırıb onun paltarını gündə bir dəyişdirib, isti suda qaynadıb yusunlar.

* * *

İstanbuldan noyabrın 26-da yazırlar ki, bu günlərdə Qoşqarın hakimi Yaqub xanın adamı həzrət soltanı mübarəkbad etməyə gələcək.

* * *

Bombeydə çap olunan "Pyuz" qəzeti yazır ki, Bilucistanın Kelat şəhərinə rus konsulu gəldiyinə orada olan Hindistan konsulu acıq edib gedibdir. Ona binaən deyirlər ki, Hindistan, yə'ni İngilis dövləti Bilucistan ilə cəng başlayacaq.

* * *

İngilisin konfransa, yə'ni sülh danışığına təyin olan vəkili Selsburi Parij və Berlin şəhərlərindən gedəndən sonra ol şəhərlərdən yazırlar ki, Firəng və Prus vəziri-xaricələri ona mə'lum ediblər ki, bu dövlətlər İngilis Rusiya ilə cəng başlasa onların heç birinə kömək etməyəcəklər.

Avstriya və İtaliya ilə olan danışığın məzmunu mə'lum deyil.

* * *

Vyana şəhərində çap olunan "Korrespendas büro" qəzeti yazır ki, İngilis və Rus dövlətinin sözü sülh barəsində belə düz gəlmir. Rusiya deyir ki, Bosnə və Bolqariya vilayətlərinin xristianlarının ixtiyarını artırsınlar və bu barədə qoyulan qanuna əməl oluncan rus əsgəri Bolqariyanı zəbt etsin, amma İngilis deyir ki, Osmanlı dövləti hamı tabeləri üçün təzə qanun qoyub, onların ixtiyarını artırır və dəxi Bolqariyanı zəbt etmək lazım deyil.

* * *

*Babkubəyə gələn teleqramlar:*

Noyabrın 27-də. Dünən İstanbulda sülh barəsində danışıq başlanıb. Rusiya vəkili İqnatyevin əvvəlinci məclisdə olan danışığından mə'lum edir ki, sülh olacaq.

Dekabrın 2-dən. Avropa dövlətlərinin vəkilləri elədiyi danışıqdan belə görünür ki, sülh olacaq.

Dekabrın 1-dən Daşkənd şəhərindən. Bu gün Qaşqarın hakimi Yaqub xanın vəkili buraya gəldi.

Jeneral Çernyayev Serbistandan çıxıb getmiş idi. İndi Vyana şəhərindən tel gəlib ki, Çernyayev Kişinyov şəhərinə getdi ki, orada Rusiya əsgəri Tuna çayının kənarına cəm olur.

* * *

“Qolos” qəzeti yazır ki, Rusiya dövləti Tuna çayının kənarına 150 min və Gömrü qalasına 70 min əsgər cəm edib.

* * *

Peterburqun tacirləri mədyun olublar ki, əgər Rusiya cəng başlasa, nə qədər cəng çəksə, bu zaman təhmilatı birə-bir artıq versinlər. Bu səbəbə padşahi-imperaturi-ə’zəm onlardan razılıq edib.

* * *

İstanbuldan “Odesski vestnik” qəzetinə yazırlar ki, əgərçi sülh barəsində danışıq başlanıb, amma hər gündə təzə toplar və barıt və qeyri hərbiyyə mayəhtacı İstanbula gəlib, oradan qeyri şəhərlərə gedir. Təzədən tə’mir olunan dəmir gəmi ki, ona Mahmudiyyə deyirlər, tamam olub.

* * *

Xoqənd şəhərindən ki, onu Rusiya keçən il zəbt edib “Türkistan qəzeti”nə yazırlar ki, Xoqənd xanlığının axırıncı xanı Xudayar xan ki, indi onu Rusiyada sakin ediblər, bir məscidi-came’ tə’mir elətmiş imiş. Onun darvazasının üstə bu rübai yazılıb:

Xudavənda, bəgərdani bəlara,
Ziafətha nigəhdari to mara.
Behəqqi-hər dü geysuyi-Məhəmməd
Zəbun kərdan zəbərdəstani-mara.
Tərazəndeyi-nəqş Behzad saz
Çü arast bərlövhi-kəşşi təraz.
Məra güft tarixi-nəqşəm bəgu
Bəfərman (1289) seyid Xudayar gu.[1]

---

[1] Ay Allah, bəlanı geri qaytar,
Müsibətlərdən bizi qoru.
Məhəmmədin hər iki zülfünə and verirəm.
Bizdən qolugüclüləri xar elə.
Behzadın naxışlarına yaraşan şəklə sal.
Kəşşi lövhəsi kimi zinətləndir.
Mənə dedi ki, çəkilmə tariximi söylə,
Seyid Xudayarın (1289) fərmanı ilə de

Q e y d: Sonuncu misranı (farscasına əsasən) əbcəd hesabı ilə topladıqda rəsmin hazırlandığı tarix, yə’ni 1289-cu il alınır.

və yenə bol ibarə yazığandır: Limənil-mülk əl yövmə lillahil-vahidil-qəhhar.[1]

* * *

İstanbuldan yazırlar ki, sərəsgər Əbdülkərim paşa naxoşlayıb, Sərgər paşa Peterburqa vəziri-muxtar tə'yin olub.

* * *

"Birjevoy vedomosti" qəzeti yazır ki, Rusiyanın dövlət bangı ki, 100 milyon manatlıq bilet satırdı, Peterburq şəhərində 116 milyon manatlıq, Moskvada 19 milyon manatlıq bilet satılıb. Qeyri şəhərlərdə nə qədər satılmağı hələ mə'lum deyil.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

[1] Bu gün mülk kimə qaldı? Qəhr eləyən vahid Allaha.

*Fi 15 zilhiccə, sənə 1293*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Düşənbə günü*




*Fi 22 dekabr Rusiya, sənə 1876*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*Altı aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

**E' L A N**

Gələn il qəzetimiz genə iki həftədə bir çıxacaq, qiyməti 3 manat olacaq, ona binaən mə'lum edirik ki, onu xahiş edən, il qurtarmamış onun qiymətini bizə göndərib öz ismini və sakin olduğu yeri mə'lum eləsin.

**DAXİLİYYƏ**

Mə'lumdur ki, insan işləməkdən yorular və yorulan dincəlmək istər. Bu səbəbə qədim zamandan hər bir tayfa həftədə 6 gün işləyib, bir gün dincəlir və bu bir gündən başqa tayfanın bayramı olur ki, ondan həm murad dincəlməkdir. Şərabı halal hesab edən tayfaların belə bayramı çoxdur ki, bu günlər onlar kef-damağa məşğul olurlar. Çünki bizim müsəlman məzhəbində şərab qadağandır və şərabsız kef olmaz, ona binaən bizim bayramımız da çox azdır və onlardan murad kef deyil. Məsələn, bizim qurban bayramından murad bu deyil ki, xalq qurban kəsib onun ətini yeyib kef-damağa məşğul olsun, onun bir əsli, muradı həm var ki, qurban bayramını qeyri bayramlardan artıcaq şərafətli edir. Qurban günü tavana müsəlmanlar Məkkəyə cəm olub, bir yerdə ziyarət edib, bir-birinə öz dərd qəmlərindən xəbər verillər. Yə'ni Qurban bayramının artıcaq şərafətli olmağına səbəb oldur ki, bu

bayramda olan ziyarət ittihadi-islama baisdir. Pəs Məkkəyə getməkdən murad bir bu deyil ki, gedib ziyarət edib qayıdasan. Lazımdır ki, oraya cəm olan müsəlmanları görüb əhvalpürsan olub öz qardaşlarını tanıyıb biləsən. İndi, qardaşlar, sizdən bir sual edirəm: heç bizim Məkkəyə gedənlərdən bu səfərin əsli muradına əməl edən varmı? Haşa, heç kimsə buna əməl etmir və edə bilməz. Biz elə avam olmuşuq ki, nə ki, qeyri tayfaları, hətta öz qardaşlarımızı tanıyıb bilməyə qadir deyilik. Pəs, qardaşlar, məktəbxanalar bina edib oxuyun ki, heç olmasa öz qardaşlarınızın dilini öyrənib, müsəlmanlığın əvvəlinci şərtlərindən birinə, yə'ni Məkkəyə gedib müsəlmanların ittihadına əməl edə biləsiniz, yoxsa bizim gözəl qurban bayramı və Məkkə səfəri ölünün əyninə geyilən faxir libasa oxşayır.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Əkin yerin qüvvətli edən şeylərin hamısından quş fəzlatı (nəcisi) qüvvətlidir. Ona binaən Avropa vilayətlərinin bə'zi yerlərində göyərçin, toyuq və qeyri quşlar saxlayıb onların fəzlatı ilə alış-veriş edirlər. Məsələn, Firəngistanın şimal tərəfində şimal tərəfində vaqe olan Pade-kale vilayətində kənd əhli göyərçin saxlanan hinləri Hollandiya əhlinə icarəyə verir. Hər 900 göyərçinin hinini ildə 50 manata ki, bu qədər göyərçinin ildə 300 puda qədər fəzlatı olur və onilə bir desyatin yeri yaxşı qüvvətli etmək olur. Quşlardan qaz və ördək fəzlatı duru olduğuna elə qüvvətli olmaz. Fəzlatı əzib narın edib, əkin yerin şuxm edib, toxmlayıb, oraya çəkib, sonra malalayıb onu yerə qarışdırıllar və ya əkin göyərəndən sonra onun üstə səpirlər. Quş fəzlatı nəmiş yerdə yaxşıdır, quraqlıq olan zaman nə ki ondan nəf' olmaz, hətta zərər olur. Bə'zi cəzirələrdə su quşunun fəzlatı, sümüyü və qeyrə keçmiş zamandan yığılıb qalıb ki, bu şeyə quanı deyirlər. Bu şey bəzi yerdə ol qədərdir ki, ondan dağlar əmələ gəlib. Quanı təzə fəzlatdan da qüvvətlidir. Onun 35 pudu bir desyatini yaxşı qüvvətli edər, amma həmçinin quraqlıqda zərər edər. Bizim Badkubə dəryasının şərqində olan cəzirələrdə quanı var.

## MƏKTUBAT

*Yazıldı Moskva şəhərindən noyabrın 9-da*

Burada çoxdan qış düşüb. İndi yerin üzündə yarım arşın qar var. Mizanül-hərarət (termometr) alətinin civəsi nöqteyi-incimaddan 15 dərəcə aşağı düşür, yə'ni 15 dərəcə soyuq olur. Ona binaən ərradə əvəzinə kirşələr işə düşüb.

Şəhərimizdə cəng xəbərindən başqa xəbər yoxdur. Dövlət bangının qapısında xalq basabas ilə təzə kağız pulu alır. Tacirlərimiz padşahi-imperaturi-ə'zəmə ərizə göndəriblər ki, onlar cəng olsa 5 ilin müddətinə tacirlik xərcini birə-bir artıq verməyə hazırdırlar. Hər tərəfdə əsgər cəm olur. Sərhədə gedən dəmiryolları mal və minik götürmür, məhz əsgər aparır. Buradan gedən əsgər Bessarabiya vilayətində Tunə çayının kənarında Kişinyov və Bender şəhərlərinə cəm olur ki, orada padşahzadə Nikolay Nikolayeviç sərkərdədir. Deyirlər bu əsgərlərin müqabilində Əbdülkərim paşa olacaq və bir də Qafqazın sərhəddində Gömrü qalasına əsgər cəm olur ki, ona sərkərdə knyaz Loris-Məlikovdur və bunun müqabilində deyirlər Əhməd Muxtar paşa olacaq. Xülasə, küçə və evdə ancaq dava sözü danışılır. Havadan dava iyi gəlir. Burada təəccüb edirlər ki, Qafqazda iki milyonacan müsəlman var, amma bunilə belə bircə qəzeti də dolandıra bilmir və halonki yarımca milyon ermənilərin 4 qəzetləri və 4 jurnalı var. Əlbəttə, bu barədə bizim kənd əhlində taxsır yoxdur, mən keçən yayda onların çoxu ilə danışmışam, onlar hazırdır əli qabara-qabara, üzü tərləyə-tərləyə 3 manat cəm edib "Əkinçi" gətirsin. Amma çifayda kənd əhli poşt adını eşitməyib və qəzet gətirməyin qaydasını bilmir. Taxsır bəyzadələrimizdədir ki, qəzet gətirdib onlara paylamırlar. Əgərçi özləri üçün qəzet gətirdən bəyzadələrin hesabını bilmirəm, amma bunu bilirəm ki, bizim Qarabağda gimnaziya üçün pul cəm edənlərə onların çoxu cavab verib ki, biz niyə pul verək? Bizim ki, oğlumuz yox oxuya. Pəs biz pul verək ki, xalqın uşağı oxuyub adam olsun?.. Belə cavab verəndən millət təəssübü çəkən və "Əkinçi"nin mənzurunu qanan olarmı?

*Əsgər Gorani*

* * *

Noyabrın 27-də Moskva şəhərindən. Bu günlərdə Qarabağdan mənə iki dəftər göndəriblər: birisi cənab Mirzə Ələsgərin qəzəliyyatı və həcvidir ki, gəncəli cənab Mirzə Mehdinin üstə yazıb və birisi cənab Mirzə Mehdinin cavabıdır

İnşayi-Mirzə Mehdi 22 vərəq üstə tamam olub. Mirzə Ələsgərin inşası dəxi ziyadədir. Xudaya, bu cənabların ağzından nə qədər nalayiq sözlər çıxıb!.. Ey Ağa mirzə Mehdi, fədayət şəvəm[1], atanın pambıq atan olmağı oğula nə eyb edər? Bizim əyyamda xanzadəlik, bəyzadəlik ağıl və elm ilədir. Firəngistanın Prudon adlı hükəması deyib: mən fəxr edirəm ki, mənim yeddi arxa ata-babam rəiyyət olub.

Ey Ağa mirzə Ələsgər, bu qəzəldən çifayda ki, demisiniz:

Bu nə naz, bu nə qəmzə, bu nə işvə, nə rəviş.
Bu nə qaş , bun ə gözdür, bun ə sərvi-xoş yeriş...

Bu həcvlərin barəsində artıq danışmağı özümüzə eyb hesab edib zikr olan cənablara ərz edirik ki, siz çəkən zəhmət nahaq zəhmətdir, ondan nə bizə və nə bizim övladımıza bir nəf’ yoxdur. Belə zəhməti öz millətimizin yolunda çəkin ki, malı yoxdur, elmi yoxdur, elm tapmaq ona müşküldür.

*Nəcəf*

* * *

Dərbənd şəhərindən yazırlar ki, Kurə nahiyəsinin Yuxay məqəh qəryəsinin sakini Salman Osman oğlu tülkülər üçün tələ qurub çox tülkü və qeyri heyvan tutub, onların dərilərindən ziyadə mənfəətbərdar olur. Bu səbəbə qeyri tələçilərdən birisi – Qara bəy Seyid oğlu ona paxıllıq edib xahiş edib bir yaxşı tələ bağlaya və çox fikir-xəyaldan sonra gecə ikən gedib ki, Salmanın tələsinə baxıb onun kimi qayırsın, amma tələyə dəyəndə tələ açılıb və onun əli tələyə düşüb sınır. Onun fəryadına camaat, o cümlədən Salman özü gəlib onu tələdən xilas edib.

Kurə nahiyəsinin Aşağı Qartas kəndində Gözəl ağa adlı övrət keçən noyabr ayının əvvəlində dörd nəfər oğlan uşağı doğub, amma onların hamısı bir neçə gündən sonra mərhum olub.

[1] Qurbanın olum.

## ELM XƏBƏRLƏRİ

Bizlərdə qaramala duz verillər ki, kökəlsin. Amma indi firəng hükəması Busenqo belə imtahan edib: 3 malın xörəyinə bir neçə müddət duz qarışdırıb və 3 mala duzsuz xörək verib, sonra onları çəkib mə'lum edir ki, duz yeməkdən heyvan kökəlmir, amma duz heyvanın iştahını açır. Ona binaən onu xarab olmuş yemə də vuranda heyvan belə yemi yeyir, lakin duz çox olsa, heyvanı isal edər.

* * *

Bu halda Firəngistanın böyük şəhərlərinin ətrafında çox palıd meşəsi salıblar. Buna səbəb oldur ki, palıd meşəsində dombalan yaxşı əmələ gəlir və dombalan indi yaxşı qiymətə gedir. Məsələn, bir desyatin yerdən 3-4 ayın müddətində 400 manatlıq dombalan satılır.

* * *

Avropanın böyük şəhərlərində ağac mişarlamaqdan ötrü zavodlar bina olunub. Bu zavodlarda çox ağac ovuntusu əmələ gəlir. İndi ondan aşağıda zikr olan kimi xörək qayırıb heyvana yedirdillər: ot 5, saman 8, kök 10, əzinik buğda ya arpa dənəsi 2, ağac ovuntusu 3 girvənkə, duz 3 misqal. Bu şeyləri bir yerə qarışdırıb iki zəif düşmüş inəyə verillər. Əvvəl zaman inəklər bu şeyləri yemək istəməyib, amma sonra ona adət edəndə mürur ilə onun otunu və samanını azaldıb ağac ovuntusunu artırıblar, ta ki bir ayın müddətində dəxi heç ot və saman qarışdırmayıb ağac ovuntusunu 7 girvənkəyəcən artırıblar. Amma bunilə belə heyvan mürur ilə kökəlib südlənib.

* * *

Avropanın bə'zi tərəfində qaramal üçün sümükdən belə xörək qayırıllar: onu əzib narın edəndən sonra bu narın sümüyü buğda ya arpa ununa və ya kəpəyə qarışdırıb xamır qayırıllar. Məsələn, 50 girvənkə unu, ya kəpəyi soyuq suya salıb ona 14 girvənkə narın sümük və 6 girvənkə turşumuş xamır vurub, qarışdırıb 14 saatdan sonra bu xamırdan kündə qayırıb ocağa salıb, bişirib, onu heyvana verillər ki, bu yemi çox ləzzət ilə yeyir.

* * *

Ata həmişə çörək vermək yaxşı deyil, ona binaən ki, bu yemdən at zərif olur. Amma uzaq yol gedən zaman atı otarmağa ya ona qeyri yem verməyə macal olmasa, yaxşı olar ki, ona 2-3 girvənkə çörək verəsən və həmçinin azardan yeni duran heyvana çörək vermək yaxşıdır.

* * *

Ağac yarpağının heyvan otdan da yaxşı yeyir, amma bə'zi ağacın, məsələn, palıd ağacının yarpağı heyvana zərər edir. Yarpağı belə yığıb saxlayırlar: baharda ağacın kiçik budaqlarını qırıb ondan qom bağlayıb, yağış dəyməyən yerdə saxlayıb, qışda heyvana verillər. Yarpaq heyvanın isalını həm kəsir və bir də bə'zi ağacın, məsələn, söyüd ağacının yarpağı, çay və qəhvə insana kef gətirən kimi, heyvana kef gətirir.

*Əsgər Gorani*

## TƏZƏ XƏBƏRLƏR

İstanbuldan noyabrın 26-da yazırlar ki, Midhət Paşanın mənzilində iki qaradağlı tutublar ki, ol cənabı öldürməyə gəlmiş imişlər və genə yazırlar ki, bir neçə adam istəyir imiş keçmişdə soltan olan həzrət Muradi-pəncümü tutub Odessa şəhərinə aparsın. Amma onların hamısını tutub məhbus ediblər.

* * *

London şəhərində olan qulları azad etməkdən ötrü bina olan icma İstanbulda sülh barəsində olan konfransın calislərindən iltimas edib ki, Osmanlıya pişnəhad olan şərtlərdən birisi də bu olsun ki, tamam Osmanlı yerində qul satıb-almaq və onları saxlamaq qadağan olsun.

* * *

Ermənilərin Badkubə quberniyasında olan ruhani məktəbxanalarına mülahizə etməkdən ötrü onların üç kəlisada olan böyükləri bir adam təyin edib ki, ildə 3 min manat məvacib ilə həmişə Badkubədə oturub, ol məktəbxanalara mülahizə eləsin.

* * *

Germaniyada ki, onun bir hissəsi Prusiyadır, qəzet oxumağa elə adət ediblər ki, hər bir işi qəzetə salıb mə'lum edirlər. Məsələn, Berlin şəhərində qəzetlərdə belə e'lamnamələr çap olunur:

Mən cavan və gözəl övrəti dost tutmaram, övrətin gözü kor, ayağı şil də olsa, razıyam, amma gərək onun 40 min manatı olsun. Cavabını filankəsin üstə yazsın. 2) Dünən filan saatda, filan yerdən, filan paltarda keçən, qəddi, üzü filan övrətdən təvəqqə olunur ki, öz ismini və sakin olduğu yeri yazıb filankəsə göndərsin. 3) A filankəs (isminin baş hərfi çap olunub), bir aydır səni görmürəm, gecə-gündüz yuxu mənə haram olub. Sən demişdin filan saatda, filan yerə gələcəm, amma və'dəxilaf oldun, təvəqqə edirəm səbəbini yazıb mə'lum edəsən (Bunu yazanın isminin baş hərfi çap olunub).

* * *

Qəzetlərdə yazırlar ki, Bağdad vilayətinin təzədən taun naxoşluğu düşüb və bu səbəbə Avropa təbiblərinin icmaı dövləti-Osmanidən iltimas edib ki, ol vilayətdən əsgər yığıb qeyri vilayətlərə göndərməsin. Amma dövləti-Osmani buna razı olmayıb. Bağdaddan da əsgər yığıb Tunə və Ərzurum vilayətlərinə göndərib.

* * *

Yazırlar ki, 1878-ci səneyi-Rusiyyədə həzrəti şahənşahi İran təzədən Avropa səyahətinə gedəcək və bu səyahətdən onun ümdə muradı odur ki, İranda təzə qanunlar qoysun.

* * *

Prusiyanın millət məclisində Rusiya dövləti gömrük pulunu qızıl pulu yığmaqdan danışıq olanda vəziri-xaricə Bismark deyib ki, bu halda bizim iki dostumuz ki, birisi Rus və birisi İngilisdir, Osmanlı işlərinin barəsində dava etmək istəyirlər. Amma gərək biz sə'y edək ki, bu dava olmasın və əgər olsa da, məhz Rus ilə Osmanlı arasında olsun, qeyri dövlətlər ona qarışmasın.

* * *

Noyabrın 27-də London şəhərinin camaatı öz padşahlarına bu məzmunda kağız göndərib:

Osmanlı dövləti öz xristian tabelərinə elədiyi zülm mə'lumdur. Ona binaən biz istəmirik ki, zalıma kömək edib, öz dostumuz Rus ilə cəng edək. Bu səbəbə təvəqqə edirik ki, bizim İstanbul konfransında olan vəkilimizə hökm olsun ki, Rusiya ilə birləşib zikr olan xristianların ixtiyarını artırmağa sə'y eləsin və bir də çünki bu halda bizim dövlət işini dolandıranlar ki, onları millət məclisi intixab edib, dövlətin nəf'ini gözləmirlər, ona binaən millət məclisi cəm olsun. İndi tel var ki, padşah hökm edib ki, fevralın 8-də millət məclisi yığılsın.

* * *

*"Tiflisski vestnik"də çap olunan tellər:*

1) İstanbuldan noyabrın 30-da. Konfrans hələ açılmayıb. Amma Avropa dövlətlərinin vəkilləri general İqnatyevin mənzilində öz aralarında belə danışıq ediblər: Osmanlı dövləti Qaradağ əhlinə 12 qəryə versin və Serb əhlinə Malı Zvarnik qalasına versin.

2) Parijdən dekabrın 1-də. İstanbulda olan konfransda rus və ingilis vəkilləri birləşdiyinə Osmanlı dövləti deyib: hər qəsd ilə qeyri dövlətin əsgəri Osmanlı sərhəddini keçsə, ol dövlət ilə cəng başlayacaq.

3) Peterburqdan dekabrın 8-də General İqnatyev yazır ki, konfransın calisləri və danışıq qurtarıb. Sabah konfrans açılacaq və Osmanlı dövlətinin vəkili danışığa çağırılacaq. Öz aramızda olan danışıqda belə qət eləmişik ki, Osmanlı dövlətinin vilayətləri özləri ümurat əhlini intixab eləsin. Hər vilayətin əhlinin çoxu xristian olsa, Osmanlı ol vilayətə xristiandan vali eləsin. Ol vilayətlərlə ki, xristianlar müsəlmanlar ilə bir yerdə sakin olurlar, müsəlmanlardan da yaraq-əsbabı alsınlar.

4) İstanbuldan dekabrın 8-də. Sədri-ə'zəm Məhəmməd Rüşdi paşanın yerinə Midhət paşa təyin olub.

* * *

*Badkubəyə gələn tellər:* 1) Dekabrın 14-də İstanbuldan Konfransın əvvəlinci məclisində Osmanlı dövlətinin vəkili Midhət paşa deyib: çünki Osmanlı dövləti öz xahişi ilə təzə qanun qoyub xristian və qeyri tabelərinin ixtiyarını artırmaq istəyir, ona binaən qeyri döv-

lətlər pişnəhad edən şərtlərin heç birisini Osmanlı dövləti qəbul edə bilməz. 2) Dekabrın 16-da İstanbul şəhərindən. İngilis dövləti özünün konfransda olan vəkilinə hökm edib ki, Avropa dövlətlərinin vəkilləri yazan şərtləri dübarə Osmanlıya pişnəhad eləsin və əgər Osmanlı dövləti onları qəbul eləməsə dərhal İstanbuldan çıxıb getsin və cəng gəmilərinə hökm eləsin ki, onlar da getsin.

Rusiya dövlətinin Serbistanda olan konsulu mə'lum edib ki, əgər dava başlansa, Serbistan 20-30 mindən ziyadə əsgər cəm edə bilməz.

* * *

"Peterburqski vedomosti" qəzeti yazır ki, həzrəti-şahənşahi-İran Peterburqa vəkil göndərib ki, Osmanlı ilə cəng olsa, İran kimin tərəfini saxlamağı mə'lum eləsin.

* * *

Bu dekabr ayının 8-də Rusiyanın vəziri-muxtarı general Zinovyev Badkubəyə gəlib Tehrana getdi.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Üçüncü sənə* *1-ci nömrə*

*Fi 1 məhərrəmülhəram, sənə 1294*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Səşənbə günü*



*Fi 4 yanvar Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*6 aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Bu nömrə ilə göndərilən siyahıları Əsgər Gorani Moskva şərindən yazıb göndərib.

* * *

Dərbənddən Mehdi xan Usmiyev Qeytağı 10 manat göndərib ki, qəzet çap olunmağa məsrəf olsun və yazır ki, hər ay 10 manat göndərəcək.

## DAXİLİYYƏ

"Əkinçi" qəzetinin müştərisi ilbəil azaldığından bir neçə dəfə yazmışıq. İndi 3 ilin müddətində olan müştərimizin hesabını çap edirik ki, onu oxuyana müştəri azalmağın ümdə səbəbi mə'lum olsun. Bizim kəndlərə poşt getmədiyinə qəzet bina olan zaman cənab qubernatordan iltimas eləmişdik ki, naçalnik dəftərxanaları hər bir şəhərə qəzet apardıb kənd əhlinə paylasın. Bu səbəbə əvvəl ili 600-cən müştərimiz var idi ki, əzon cümlə 400-ə qədər kənd əhli idi ki, naçalnik dəftərxanasından qəzet gətirdirlərdi. İkinci ili əgərçi naçalnik dəftərxanaları genə xahiş eləmişdilər ki, qəzet apardıb kənd əhlinə paylasınlar, amma əvvəlinci ili qəzeti onlara vaxtında vermədiklərinə və bir neçə qeyri səbəbə görə müştərimiz birə-bir azalmışdı, yə'ni o ili 300 qəzet apardan var idi ki, onlardan 150-yə qədər kənd əhli idi. Pəs nə ki naçalnik dəftərxanasından qəzet alanların, hətta özləri qəzet apardanların qədəri azalmışdır. Bu il bir neçə səbəbə görə ümidimiz yoxdur ki,

naçalnik dəftərxanaları qəzet apartsın. Belədə əgər özləri qəzet aparanların qədəri keçən il təki azalsa təxminən 100-dən ziyadə müştəri olmayacaq. Çünki 100 oxuyandan ötrü qəzet çıxarmaq mümkün deyil, ona binaən gərək bu il qəzeti, necə ki keçmişdə həm yazmışdıq, mövquf edəydik. Amma indi zəmanə onilə saziş eləmədiyinə, onu bərhəm etsək, gələcəkdə onu çıxarmaq düşvar olacaq. Ona binaən əgərçi bu halda ancaq 50 müştərimiz var, amma genə onu çıxardırıq və ümidvarıq ki, bizim millət qeyrəti çəkən müştərilərimiz bu kəlmələri oxuyandan sonra naçalnik dəftərxanaları kimi qəzet apardıb qeyrilərə paylamaq ilə "Əkinçi"ni bu yaman ildə saxlasınlar, yoxsa ilin başınadək onu çıxarmaq müşkül olacaq.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Cəmahiri-Müttəfiqeyi-Amerika dövlətinin Nyu-York şəhərindən yazırlar ki, oranın əhli toyuq saxlamaqdan çox mənfəətbərdar olur. Bir Nyu-York şəhərində hər gündə bir milyon altı yüz min yumurta yeyilir. Ona binaən kənd əhlinin handa bir yoxsulu 50-60 toyuq saxlayıb onların yumurtasını satmaq ilə dolanır. Bir tacir 2 min toyuq alıb, onlar üçün hinlər tə'mir elədi. İndi bir neçə ildən sonra onun ildə 9 min manat yumurta satmaqdan mədaxili olur.

* * *

Almaniya, yə'ni lemes qəzetlərində yazırlar ki, meyvəni anbarlarda çürüməkdən belə mühafizət etmək olur: məsələn, eni, uzunu və hündürlüyü 7 arşın olan anbara meyvəni yığandan 2-3 gün irəli onun içində 8-10 misqal kükürd yandırıb, onun tüstüsünü evə verəndə onun içində meyvə çürüməz və ondan kükürd iyi gəlməz.

* * *

Heyvanın dırnağının yarısını belə sağaltmaq olur: 13 misqal palıd ağacının qabığını 188 misqal suda ol qədr qaynatmaq gərək ki, o sudan 13 misqala qədər qalsın. Sonra onu süzüb cecəsini atıb suyun içinə 13 misqal qabıqsız soğan doğrayıb, təzədən yarım saat qaynadıb, sonra 188 misqal piy (donquz piyi dəxi yaxşıdır) qarışdırıb su bilmərrə quruyunca qaynadıb, sonra onu bezdən süzüb, sıxıb, onun hamısını yaranını üstə quş qələmi ilə yaxıb, bağlıyasan və əgər o yara bu dərmanı bir dəfə qoymaqdan yaxşı olmasa, lazımdır ki, zikr olan qayda ilə təzədən dərman bişirib qoyasan.

* * *

Lao adlı hükəma yazır ki, sağmal heyvan yağışdan əmələ gələn göllərin suyunu içəndə ol suda zindəganlıq edən gözə görünməyən heyvanlar onun mə'dəsindən qanına və südünə keçdiyinə belə süddən yaman naxoşluq əmələ gəlir.

* * *

Amerikanın kartofelində bir qurd əmələ gəlib, onu xarab elədiyinə Avropaya ol naxoş kartofeli gətirmək qadağan olmuşdur. Amma indi yazırlar ki, ol qurd Firəngistanda və Germaniyada həm əmələ gəlib, Rusiyanın sərhəddinə yetişib.

* * *

Krımda salınan meyvə bağlarına mülahizə edən hükəmaların birisi yazır ki, daş kömrünün sumlasını meyvə ağacının dibinə sürtəndə ol ağacda heç bir cücü ya qurd əmələ gəlmir.

* * *

Bu il London şəhərində ərəb dilində bir qəzet çap olunur ki, hər gündə çıxır. Yazırlar ki, onun müştərisi var.

*Əsgər Gorani*

## MƏKTUBAT

İnsan hər bir əmələ iqdam etsə, onu artırmağa sə'y edər. Xah əməli-mə'qul, xah qeyri-mə'qul olar. Əzcümlə aşura günü ki, imam Hüseyn əleyhüssəlamın qətl günüdür, o gün xalq dəstəbədəstə olub, təkaya və məsacidə cəm olub, tə'ziyə tutub ağlar.

Neçə il bundan əqdəm bir şəxs təsəvvür edib ki, insan ağ kəfən və qan görəndə ziyadə riqqət bəhəm edib ağlar. Bu mülahizə ilə bir neçə nəfər başların tiği-dəllak ilə 4-5 yerdən cızıb, boyunlarına ağ kəfən salıb, sinəzənlik ilə təkaya və məsaciddə bu lisan ilə növbə ediblər ki, kaş aşura günü biz o aləmdə olaydıq və boynumuza kəfən salıb, qanımızı imam yolunda tökəydik. Əvvəl bu əməl Qafqaz vilayətinin Qarabağ tərəfində olub. Sonra kəm-kəm artıb əlinə qəmə, qılınc və korda alıb öz başını çapmaq hünər və təfaxür hesab olunur, başın cızan

bihünər və kəmcür'ət hesab olunub, və Təbrizdə olan qarabağlılar aşura günü dəstə bağlayıb, başların çapıb, təkyeyi-dövlətə gedib və bir neçə nəfər dustaq azad ediblər. Lihaza bu əməl Təbrizin biməğz cahillərinə ziyadə xoşayənd olub hər məhəllədə bu rəsmi kəmali-şövq ilə mə'mul ediblər, behəddi ki Təbriz əhlindən sair şəhərlərdə olanlar genə o şəhərdə ictimai edib ağkəfən olmaq bina ediblər. İndi bu rəsm çox mə'mul olub. Pəs yaxşı olur ki, bu əməli mülahizə etmək ki, aya qəvaidi-mövhum və rəsmi-məzmun hesab etmək, ya qəvaidi-hüsn? Bina bərhədisi mahəkəmə bihil-əqil, həkəmə bihişşər,[1] bu əməl həm ağıl, həm şər' yanında qəbih olmağına dəlaili-mütəkəsirə var, əzcümlə:

Heç bir aqil, kamil adam bu əmələ iqdam etmir. Pəs mə'lum ki, fi nəfseh[2] əqlün belə əmələ iqdam etməkdən ictinab edər. 2) Əgər qərib adam ki, filcümlə şüuru ola, bu rəsmidən ittila'ı olmaya, xalqı uzaqdan o halət ilə mülahizə edə, qət'ən deyər ki, bunlar cəng edirlər və əgər bir adam ona desə ki, cəng yoxdur, qəbul etməz və hərgah qəbul etsə, onları divanə hesab edər. 3) Bu qism tə'ziyadarlıq şəriətdə varid olmadığına daxili-bid'ətdir və bid'ət həramdır. 4) Hökmi-şər' budur ki, hər əməli-müstəhəbə iqdam etmək fe'li-həram, ya tərki-vacibə bais ola, o müstəhəb əməlin özün tərk etmək vacib olur. 5) Necə ki, insan heç vəch ilə bir qeyri Adama əziyyət edə bilməz, həmçinin öz bədəninə betəriqi-ovla əziyyət edə bilməz və əgər etsə, gərək hakim ona tənbeh eləsin. Pəs əziyyəti-bədən həram və hifzi-bədən vacib. Bu surətdə bu qism tə'ziyədarlıq necə ola bilir ki, müstəhəb olsun, bəlkə hərami-şədid olur. 6) Başçapan əşxas öz nəcis qanları ilə o gün xalqın libasın və zürufun nəcis etməkdən əlavə, qanların məsacid və əmakini-möhtərəmə daxil edib, onları həm aludə edirlər. 7) Şər' ki, təhti-əqldə vaqedir, hər bir şər' və fəsad olan əməldən mən' buyurub və bu əməlin zimnində bəsa olur ki, şəxs öz başın çapmaqdan tələf olur, yainki bir dava olur ki, neçə nəfər bu davadan zəxmdar ya məqtul olur. Pəs necə olur ki, əql və şər' bu əmələ razı ola? 8) Şəxsi-dustaq ki, bir şərarət cəhətilə məhbus olub ki, xalq onun şərindən məhfuz olsun, belə şəxsi azad edib, dübarə baisi-fəsad olmaq xilafi-qanuni-ədalət deyilmi? Sübhanallah, təəccübdür ki, üləmalar nə üçün mənabirdə bu qəbil əşxası mən' və məzəmmət etmir və hakimlər nə üçün onlara tənbeh eləmir?

*Əhsənül-Qəvaid*

[1] Ağıl nəyə hökm edibsə şəriət də ona hökm edib.

[2] Öz-özlüyündə.

## ELM XƏBƏRLƏRİ

Bə'zi hükəma yavıq əqrəba arasında olan kəbindən törəyənlərin hesabına gedib, deyirlərdi ki, belə kəbindən övlad az olur, ondan lal, kor və qeyri naxoş və habelə səfahətli kəslər çox törəyir. Amma indi ingilis hükəmaları bunu qəbul eləməyib, sübut edirlər ki, zikr olan naxoşluqlar hər bir qism kəbindən bir qədərdə olur, yə'ni kəbin yavıq ya uzaq əqrəba və ya əqrəba olmayanların arasında olmaq ol naxoşluqlara bais deyil, amma bə'zi naxoşluqlar ki, ata-anada olanda övladda həm olur, məsələn, göz ağrısı, sinə naxoşluğu və qeyrə kəbin yavıq əqrəba arasında olanda onlardan törəyən övladlar da arxabəarxa artıq şiddət edir. Bu barədə gətirilən sübutların birisi ki, səfahətli övlad nə səbəbdən törəməyi bəyan edir, budur: şərab içib məst olan əxşasların övladlarından səfahətlisi çox olur. Məsələn, bə'zi karxanalarda ki, fəhlələr gecə-gündüz orada qalıb, ancaq bazar günləri evə gedirlər, bu zaman şərab içib məst olan vaxtda öz övrətlərin görürlər, onların övladlarından səfahətlisi çox olur. Pəs şərab içmək nə ki, bədənə zərər edər, hətta məst olan kəs övrətə yavıq getsə, onun övladını da səfahətli edər.

* * *

İngilis həkimləri məsləhət edirlər ki, çiçək və qızılça naxoşlarına müalicə olunan zaman onları qaranlıq otaqda saxlasınlar ki, oraya günün işığı heç düşməsin və ona çıraq işığına xörək versinlər. Amma otağın havasını tə'miz saxlamaq gərək və naxoş sağalıncan lazımdır ki, o, qaranlıq yerdə qalsın.

## TƏZƏ XƏBƏRLƏR

Osmanlı dövləti qoyan konstitusyonun ümdə şərtləri budur: həzrət sultan müsəlmanlar üçün xəlifəyi-dövran və qeyri tabelər üçün padşahi-imperaturi-konstitusyon hesab olacaq, yə'ni həzrət heç bir kimsəyə cavabdəhəndə deyil. Dövlətin məzhəbi islamdır, amma müsəlman olmayan tabelərdə ixtiyar var ki, öz məzhəblərinin adablarını əmələ gətirsinlər. Qəzetlərdə ixtiyar var hər bir mətləb üstə danışmaq. Hər bir qism icma bina olunmağa mane yoxdur. Hər kəs hər bir qism məktəbxana bina edə bilər. Hamı padşahlıq qulluğuna girə bilər. Təhmilat hamıdan bir qədər də alınacaq. Hər bir tabe mədyundur ki, elm təhsil etsin. Vüzəra məclisinin rəisi sədri-ə'zəm hesab olunur. Vəzirlər

məclisi-ümuma cavabdəhəndədir, amma onları taxsırlandırmaqdan ötrü həzrət sultan hər dəfə ümənai-dövlətdən əlahiddə divan bina edir. Əgər məclis və vüzəraların sözü bir gəlməsə, həzrət sultanda ixtiyar var ya vüzəraları xaric eləsin, ya məclisi bərhəm edib hökm eləsin ki, təzədən calislər intixab olunsun. Amma təzə calislər gərək 6 aya cəm olub məclisi-ümum açılsın.

Məclisi-ümum iki dairədən əmələ gəlir: birisi məclisinasdır ki, onun calislərini xalq intixab edir (hər 100 min tabe bir calis) və birisi məclisi-ammdır ki, onun calislərini həzrət sultan özü mütəşəxxis adamlardan təyin edir. Hər ildə noyabrın əvvəlindən martın əvvəlinəcən məclisi-ümum işlərə mülahizə edir. Hər bir işə əvvəl məclisinas mülahizə edir, sonra məclisi-amm onu qəbul edəndə həzrət sultan təsdiq edir. Bu qanunu ki, onun fəsillərini tam çap etməyə qəzetimizdə yer olmadı, dövləti-Osmanlı dekabrın 11-də qoyub. Bu səbəbə İstanbul əhli Dolma-Baxça sarayına gedib həzrət sultandan razılıq edib, şadyanalığa məşğul olub.

* * *

Dekabrın 11-dən İstanbuldan yazırlar ki, bu gün konfrans, yə'ni sülh barəsində olan məclis açıldı. Səfvət paşa vəziri-xariciyi-dövləti-Osmani, məclisin rəisi Qara Teodor əfəndi və Sərkis əfəndi onun sekretarıdırlar. Hər bir calis özünün vəkillik kağızını rəisi-məclisə pişnəhad edindən sonra Səfvət paşa deyib: məclisi açıram və bu atılan toplar təzə qanun qoyulmağı xalqa mə'lum edir. Sonra calislər öz aralarında olan danışıqda yazılan şərtləri rəisi-məclisə pişnəhad ediblər və Səfvət paşa deyib ki, gərək bu şərtlərə dövləti-Osmaninin vüzəra məclisi baxıb cavab versin.

Keçən nömrədə çap elədiyimiz tellərdən mə'lum olur ki, sədri-ə'zəm Midhət paşa dövlət tərəfindən konfransın calislərinə mə'lum edib ki, dövləti-Osmani təzədən qanun qoyub öz tabelərinin hamısının ixtiyarını artırıb. Ona binaən bir-iki vilayətə əlahiddə ixtiyar verə bilməz və bu şərtlərin heç birinə razı deyil. Sonra Rus və İngilis vəkilləri mə'lum ediblər ki, əgər Osmanlı dövləti ol şərtləri qəbul etməsə, onlar gərək İstanbuldan çıxıb getsinlər. Lakin sonra gələn tellərdən belə bəyan olur ki, konfransın calisləri razı olublar ki, ol şərtlərə təzədən baxılsın və iki ay cəng olmasın. Möhləti qurtardığına təzədən 2 ay, yə'ni martın əvvəlinəcən möhlət olub ki, Osmanlı dövləti serblər ilə cəng etməsin.

* * *

Peterburqda iki məxsusi bang ki, birisi Baymakovun bangı və birisi Liveri bangı bankrot, yə'ni yoxsul olub. Hər bir bang bir neçə milyon xalqa borcludur.

* * *

Dekabrın 8-dən Qaradağın Çətinə şəhərindən yazırlar ki, şirvanlı Osman paşanı Qaradağın knyazı əldən qoyub.

* * *

Qəzetlərdə yazırlar ki, Germaniyada olan məşhur Krup zavodunda bir top töküblər ki, onun 7500 pud ağırlığı var.

* * *

İstanbuldan dekabrın 7-də yazırlar ki, konfransın Avropa calisləri öz aralarında olan danışıqda qət etməyibdirlər ki, Osmanlı dövləti Serbistana və Qaradağa yer versin, bu xəbər doğru deyil.

* * *

Tehrandan dekabrın 5-də yazırlar ki, dövləti-İran Osmanlı işlərinə çox təəşşüq ilə mülahizə edir, amma cəng olsa, Bağdadı zəbt etmək qəsdi yoxdur.

* * *

Gəncə quberniyasının Salahlı qəryəsində bir Qazan şəhərli müsəlman uşaqları üçün məktəbxana açıb onlara rus dili oxudur. İndi "Tiflisski vestnik" qəzeti yazır ki, Tiflis şəhərində sakin olan Dicon Milvil adlı ingilis ki, Londonda bina olan Tövrat icmasının calisidir, zikr olan məktəbxanaya 65 kitab və iki atlas, yə'ni kürreyi-ərzin şəklini ki, türk dilində çap olunubdur, bağışlayıb.

* * *

Bu halda Osmanlıda bina olan qanunu Midhət paşa düzəltdiyinə tamam dünyada onun adı deyilir. Ona binaən onun ömründən bir neçə kəlmə danışaq. Yazırlar ki, Midhət paşa Rumeliya vilayətinin bir qəryəsində təvəllüd edib. Mədrəsədə tə'lim olunub, İstanbulda tələbəlik ilə elmi-ədyanı tamam edəndən sonra, ruhaniliyə getməyib başlayıb Avropa əhlinin dillərini və elmlərini oxumağa. Sonra dilmanclıqdan qulluğu başlayıb mərhum Soltan Əbdüləzizin vaxtında Niş və Tuna və

Şəttül-ərəb vilayətlərində vali olub, oralarda xalqın xərcilə çox məktəb və mərizəxanalar bina edib, şəhərlər və yollar salıb, ol vilayətlər abad olmağına bais olub. Ona binaən həzrət sultan onu gətirdib sədri-ə'zəm edir, amma onun yeni türk dəstəsindən olmağını bilib 6 aydan sonra xaric edir. Keçən il tələbələr bunt edən zaman həzrət sultan Midhət paşanı rəisi-divani-padşahi eləmişdi ki, indi həzrət Əbdülhəmidi-düvvüm genə onu sədri-ə'zəm edib.

Keçən nömrədə çap olunan İngilis dövlətinin vəkili Silsburi İstanbuldan getməyi xəbər verən tel doğru olmadı. Bu barədə İngilis dövlətinin "Morninq post" qəzeti yazır ki, İngilis dövləti Osmanlı ilə danışığı kəsmək və gəmilərini apartmaq doğru deyil.

* * *

Təbrizdən "Peterburqski vedomosti" qəzetinə yazırlar ki, gecə bir neçə məscidin qapısına kağız yapışdırmışdılar ki, sahibi-divan Azərbaycan vilayətini dolandıra bilmir və əgər dövlət onu xaric etməsə, xalq özü onun divanını edəcək. Bu səbəbə Tehrandan vəliəhd mirzəyə, müctəhidə, sahibi-divana kağız gəlib. Deyirlər o məscidə yapışılan kağızı molla, ya seyidlər yazıb. Və genə yazırlar ki, bu halacan burada poşt əvəzinə çapar iştəyir idi, amma indi hökm olunub ki, bəndəri-Əbuşəhrdən Tehrana əsli poşt bina olsun. Vena şəhərində poşt markası qayırdıblar, qiyməti 1-2-5-10 şahı, üstə şahənşahi-İranın şəkli.

* * *

Badkubəyə dekabrın 30-da tel gəlib ki, konfransın calisləri razı olublar ki, piş əzvəqt yazılan şərtlərə dübarə baxsınlar və Osmanlı dövləti əsgərin bir hissəsini ki, ona rədif deyilir, əldən qoyub.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Üçüncü sənə* *2-ci nömrə*

*Fi 15 məhərrəmülhəram, sənə 1294*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Çəşənbə günü*




*Fi 18 yanvar Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*6 aylığı –*
*1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Müştərimizin qədəri bir illik 87, yarım illik 9.

## DAXİLİYYƏ

Ey mənim dostum Milləti-islamın təqdirən vəkili-namə'lumu (məktubat fəslində çap olunan kağıza cavabdır). Sizin kağıza cabəca cavab yazmaq sonraya qalsın, indi lazım bilib ərz edirəm ki, o kağız qışın çilləsində olan çovğun kimi onu diqqət ilə oxuyanın bədəninə qorxu lərzəsi salır. Əlhəqq bizim zəmanədə elmsiz qalaq millət mürur ilə puç olmağı mə'lum və aşkardır və əgər elm təhsil etmək üçün istitaət, ittifaq, vəsilə gərək imiş və bunların heç birisi biz müsəlman tayfasında yox imiş və ola bilməz imiş, pəs belədə sizin kağız bə'zi elm təhsil edənlərin sözünü təsdiq edir ki, deyirlər gələcəkdə müsəlman milləti dəxi ziyadə bisəmərə olacaq... Çünki sizin kağız onu diqqət ilə oxuyanın çoxuna belə təsir edə bilər, ona binaən bu əvvəlinci cavabımda ərz edirəm ki, iş həqiqət belə deyil. Elm təhsil etmək biz Qafqaz müsəlmanları üçün elə düşvar deyil ki, siz buyurursunuz. Bu halda bizim vilayətdə ildə 100 manat verməyə tavanası çatan 500 adam tapılar və əgər onlardan 200-cən adam işdən xəbərdar olub öz millətini bisəmərə olmaqdan mühafizət etmək istəyə, onlar hər ildə 20 min manat cəm edə bilər.

Ey mənim dostum, heç bilirsinizmi ki, bu məbləğ ilə nə qayırmaq olar? Əvvələn, onilə bir çapxana açmaq olar ki, orada qəzet və elm ki-

tabları çap olunub müftə və ya bir cüz’i qiymətə xalqa paylansın. Saniyən, Tiflis və ya yeri şəhərdə bir məktəbxan açmaq olur ki, hər 3 yüz ev o məktəbxanada öz xərci ilə bir uşaq oxutsun. Orada onlara türk, fars, ərəb dillərini öyrədib elm kitabları ilə tə’lim etməyi öyrədəndən sonra hər uşağı göndərən icma onu apardıb öz şəhərlərində və ya kəndlərində ildə evə bir manat vermək ilə məktəbxana aça bilər. Belədə tamam Qafqazın şəhərlərində və ya kəndlərində məktəbxana açdıra bilərik ki, orada öz dilimizdə uşaqlarımız tə’lim olunsun və yəqin ki, ol vaxtda indikindən yaxşı müsəlman oluruq.

Bilirəm, mənim dostum, bu sözü eşidib güləcəksiniz ki, bu xəyaldır. Doğru deyirsiniz, həqiqət, bu xəyaldır. Amma onun xəyal olmağına səbəb biz özümüzük. Bizə ki, göydən kömək gəlməyəcək, əgər bisəmərə olmaqdan özümüzü mühafizət etmək istəyirik, qəflətdə olmaq nə lazım. Yəqin deyəcəksiniz ki, ittifaqımız yoxdur, sünni, şiə sözü buna mane olur. Əzizim, bizim zəmanədə və bizim vilayətimizdə sünni, şiə sözü məhz anlamaz ağzında qalıb. Pəs, mənim dostum, halva demək ilə ağız şirin olmaz, siz də mənim kimi baldırınızı çırmalayıb meydana daxil olun ki, bəlkə zikr olan xəyal əmələ gəlsin, yoxsa doğru deyirsiniz ki, bir gül ilə bahar olmaz.

## ƏF’ALİ-ƏHLİ-DEHAT

Buğda 2 cürə olur ki, birisi payızda və birisi baharda əkilir və onların hər biri bir neçə qism olur. Buğda soyuq tərəflərdə əmələ gəlməz, onun yeri gilli və ya qumlu olsa yaxşıdır. Onu bir yerdə dalbadal bir neçə il əksən, hasil ilbəil az olur. Ona binaən yaxşıdır ki, bir il buğda əkəndən sonra yer bir il dincəlsin və ya buğdadan sonra o yerdə bir neçə il qeyri şey, məsələn, qarğıdalı, kartofel, tənbəki, yer kökü və qeyr kökü dərinə gedən şey əkəsən. Xülasə, yer dincəlməyə qalanda bir il keçəndə buğda əkmək olur, amma qeyr şey əkiləndə ol yerdə 3-4 ildən irəli buğda əkmək nəf’ etməz. Buğda üçün yeri mal nəcisi ilə qüvvətli edəndə, gərək nəcisi toxum edəndən çox irəli yerə qarışdırasan ki, yer toxum oluncan çürüyüb tamam olsun, yoxsa buğdada qarabaş deyilən naxoşluq əmələ gələr. Əhəng belə yeri yaxşı qüvvətli edər. Toxum gərək təmiz olsun ki, zikr olan naxoşluq əmələ gəlməsin. Yaxşıdır ki, toxum 2 il saxlanmış ola, olmasa onu toxum

edəndən irəli suda istadmaq gərək. Zağ suyu dəxi yaxşıdır (13–15 misqal zağ bir pud toxuma bəsdir). Nə qədər yer qüvvətli isə və yaxşı narın olmuş isə, ol qədr toxum az lazımdır və bir də onu əl ilə səpəndə çox səpmək gərək, amma maşın ilə cərgə-cərgə səpəndə az. Əgər payızda toxum olunan yer qışın nəmişliyindən bərkimiş isə, baharda onu bir dəfə malalamaq yaxşıdır. Əgər baharda buğda göyərən zaman onun yarpağı qaramtıl göy isə və sallanmış isə mə'lum edir ki, o yer qüvvətli olduğuna onun buğdası yatacaq. Belədə lazımdır onu yatmaqdan mühafizət etməkdən ötrü ol vaxtda biçəsən və ya qoyuna yedirdəsən. Baharda əkilən buğdanı o yerdə əkillər ki, qış soyuq olduğuna payızda əkilən tələf olur və ya ol yerdə kartofel və qeyr payızda yetişən şeylər əkildiyinə payızda onu əkmək məqdur olmur. Ol buğda qeyr qism buğdadır, amma payız buğdasını da baharda əkmək olur. Lazımdır ki, bir neçə il onu baharda əkib, belə əkilməyə öyrədib bu baharda yığılan toxumu əkəsən.

## MƏKTUBAT

Bizim əzizimiz və gözümüzün işığı Həsən bəy, sən hər qəzetində biz müsəlman tayfasına elmin fəzilətini və səməratını zikr edib bizə hey təklif edirsən: elm öyrənin, elm öyrənin... Çox yaxşı sözün bamə'na və nəsihətin müfid və xeyirxahlığın sabit. İndi biz hazırıq ki, sənin nəsihətini əmələ gətirək. Bizə de görək elmi harada öyrənək və kimdən öyrənək və hansı dildə öyrənək? Əgər şəhərlərdə öyrənək, şəhərlərdə məktəbxanalar yoxdur. Əgər külli şəhər xalqı padşahlıq məktəbxanalarda oxusalar, yer tapılmaz. Deyəcəksən ki, özümüz şəhərlərdə məktəbxanalar bina edək. Çox yaxşı, hansı istitaət ilə?

Bərfərz ki, etdik müəllimləri haradan alaq? Türki və farsi və ərəbi dillərində elm bilən müəllimlər yoxdur və bu dillərdə elm kitabları yoxdur, pəs necə edək? Deyəcəksən ki, rus dilində oxuyun, öyrənin, Çox yaxşı, şəhərlərdə məktəbxanalar açdıq, rus dilində elm öyrənməyə başladıq. Aya, ünas və kənd əhlimiz necə etsinlər, kəndlərdə də məktəbxanalar açaq və müəllimlər gətirdək ya yox? Əgər deyirsən açın, insaf elə, hansı istitaət ilə və hansı qüdrət ilə?

Dövləti-qəviyyeyi-Rusiya bu istitaət və qüdrət ilə, hələ kəndlərdə məktəbxanalar bina etməyibdir, biz füqəra necə edək? Əgər deyir-

sən ki, kənd əhli qalsın, ancaq şəhər xalqı elm öyrənsin, onda sənin muradın əmələ gəlməz, bir gül ilə bahar olmaz. Şəhər xalqı kənd əhlinə nisbət qətrədir dəryaya nisbət. Elmin mənfəəti o surətdə zahirdir ki, kaffeyi-nas, Prus xalqı kimi və Yeni dünya xalqı kimi, ünasən və zükurən elmdən bəhrəyab ola. Pəs bica yerə bizə tə'nə etmə, əl çək bizim yaxamızdan, buna ancaq şakir ol ki, dövləti-Rusiyanın təhtihimayətində keçən zəmanələrin qoşunkeşliyindən və çapqınından azad olub, asayiş tapmışıq və zindəganlıqdan razıyıq. Elm öyrənməyə istitaət gərək, ittifaq gərək, vəsilə gərək. Əvvələn, istitaətimiz yoxdur, səbəbini izhar etməyə cür'ət yoxdur. İttifaqımız da yoxdur. Qafqaz səfhəsində sakin olan müsəlmanların yarısı şiədir, yarısı sünnü. Şiələrin sünnülərdən zəhləsi gedir, sünnülərin şiələrdən. Heç biri birbirinin sözünə baxmaz. İttifaq haradan olsun?

Vəsiləmiz dəxi yoxdur. Ondan ötrü ki, türki və farsi və ərəb dillərində on beş ilin müddətinədək ancaq bir yarımçıq savad kəsb etməyə qadirik. Əgər müttəsil oxusaq, aya bu dillərdə elmi necə öyrənək? Sənin sözünə qoy osmanlılar və qızılbaşlar baxsınlar. Pəs olar niyə elmsizdirlər? Külli Ərəbistan bisavaddır, ərəblər ya dilənçilik, ya çapavulçuluq edirlər. Külli Anatoliya bisavaddır, külli İran bisavaddır. Ancaq İstanbulda və Tehranda və Təbrizdə beş-altı nəfər yazan və oxuyan tapılır. Səbəb odur ki, müsəlman dillərində oxumaq çətindir.

Bir də şikayət edirsən ki, sənin qəzetini alan yoxdur. Sözün çox hesabı. Kim alsın? Vəqta ki, şəhərlərdə və kəndlərdə və obalarda xanzadəmiz, bəyzadəmiz, sövdəgərzadəmiz, əkinçilərimiz, sərkarlarımız, çobanlarımız oxumaq və yazmaq bilmirlər, ünas əhli hakəza, qəzeti alıb neyləsinlər? Cırsınlar, tullasınlar? Külli İrəvan quberniyasının xalqı türki oxumaq bilmir. Qalan yerlərdəki bir paraları filcümlə oxumaq, yazmaq bilirlər alıblar, dəxi nə istəyirsən? Sənin muradın o vaxta kamilən bitər ki, bizim hətta çobanlarımız da Prus çobanları kimi oxumaq, yazmaq biləlvalər və ünas tayfamız da oxumaq bilə. Təvəqqə edirəm ki, mənim bu kağızımı biduni-ziyad və nöqsan onun cavabı ilə öz qəzetində basasan.

Yazıldı Qafqaz səfhəsində sakin olan milləti-islamın təqdirən Vəkili-naməlumu tərəfindən.

*Əvvəli-yanvar, sənə1877*

## TƏZƏ XƏBƏRLƏR

Peterburqdan “Bakinski izvestiya” qəzetinə yazırlar ki, neft cövhərindən dəxi aksiz alınmayacaq.

* * *

Badkubə uyezdinin Balaxana qəryəsində neft quyuları var ki, oradan nefti gətirib, şəhərin yanında olan zavodlardan ondan cövhər çəkirlər. Zikr olan qəryədən zavodlaracan 7 verst yoldur ki, kirayəçi ərradəçilər neftin putunu 5 qəpiyə gətirillər. Deyirlər keçən il ərradəçilər zavod sahiblərindən 500 min manatacan kirayə alıblar.

İndi Badkubə şəhərində iki kompaniya bina olub: birisi istəyir Balaxanadan nefti yer altı ilə dəmir novçalar ilə gətirsin və birisi istəyir dəmiryolu tə’mir eləsin. Yer altı ilə neft gətirmək istəyənə dövlət tərəfindən izn verilib və bu bahar onu başlayacaqlar. Deyirlər buna 100 min manatacan xərc olacaq.

Dəmiryolu tə’mir etməyə indiyəcən izin alınmayıb, amma bişəkk dövlət izin verəcək və izin barəsində ərizə göndəriblər. İndiyəcən dəmiryolundan ötrü 200 min manatacan cəm olub. Deyirlər onun 300 min manatacan xərci olacaq.

Neft cövhəri satanlar keçən il ziyadə nəf’ ediblər. Əvvəl onun putunu Moskva və qeyr şəhərlərdə bir manat yarıma, iki manata satırdılar, amma keçən il 3-4, hətta 5 manata satıblar.

* * *

Ərradənin diyircəyinin ətrafı ensiz olduqcan, ata az güc edər. Amma onun ensiz olmağı yola zərərdir. Diyircək nə qədər ensiz olsa, ol qədər yolu yarıb artıcaq xarab edər. Bu səbəblərə indi danışıq var ki, daş yolları ilə gedənlərdən alınan yol pulunu diyircəyin eninə görə alsınlar, yə’ni diyircək ensiz olduqcan, yol pulu artıq olsun.

* * *

Badkubədə qızıl pulu çox baha olmuşdur ki, beş manatlıq qızıl 7 manat yarım kağız puluna gedirdi. Deyirlər dövlət bangının Badkubədə olan hissəsi yazıb ki, Peterburqdan qızıl göndərsinlər. Ümid var ki, qızıl ucuzlansın.

* * *

İstanbulda fars dilində çap olunan “Əxtər” qəzeti barəsində yazırlar ki, bir az müddətdə iki min manatacan borca düşdüyünə mövquf olmuşdu, amma indi onu çap etməkdən ötrü bir kompaniya bina olub. Dövləti-əliyyeyi-İran tərəfindən ol kompaniyaya min tümən və’də olunub.

* * *

“Türküstan qəzeti”ndə bir şəxs zeyldə zikr olan müəmmanı yazıb onun mə’nasını sual etmişdir:

Şəhri-səbzdən çıxıbdır bir qız,
Qırx qız doğubdur hənuz həm qız.
Üstündən erkək çibin ötdüyü yox,
Yarsız bir gecə həm yatdığı yox.

Buna Səmərqənddən bu cavab yazılıb:

Şəhri səbzdən gələndir bir qız,
Özü mollayi dana qız.
Məktəb tutardı daim niz,
Hərgiz bunun yalanı yox.

Oxudardı qırx düxtərçə,
Həmrah idi gündüz-gecə.
Səbq bürurdi bir neçə,
Öz qızıdır doğanı yox.

Erkək çibin ötməmək cavabı:

Oxurdu daim ol Quran,
Dilində ayəti-mövlan.
İrür ol aşiqi-rəhman,
Naməhrəmni görganı yox.

Yarsız yatmağının mə’nası:

Gündüz qızlara tə’lim verir,
Gecələr də Allah deyir.
Allah ilə söhbət edir,
Yarsız yalqız yatğanı yox.

Əssöhbət məəallah.
Zikri onun hüvəlillah,
Yarı onun iləlallah.
Qeyri onun heç yarı yox.

Bir rəvayət üşbudur niz:

Ol yatmazdı əsla yəlğuz,
Həmrah yatar şagird qız.
Ol səbəbdən yılğanı yox,

Muni aydi Mirza Övbid.
Mirza Ümid ki, dər fərzənd,
Fənn əhlinə bulğay pəsənd,
Danalar ki, pünhanı yox.

* * *

İstanbuldan yazırlar ki, əgərçi bu halda Osmanlı dövlətinin ümuratı yeni türklər əlindədir, amma indiyəcən onların sərkərdələrinin birisi Xəlil Şərif paşa ki, xədifi-Misrin mərhum qardaşı Mustafa Fazil paşanın qızını alıb işdə deyil. Buna səbəb oldur ki, ol cənab ilə xədifi-Misrin arası yaxşı olmadığına Osmanlı dövləti bu halda ona ümurat işini tapşırmaq ilə xədifi-Misrin könlünə dəymək istəmir.

* * *

İstanbuldan yazırlar ki, içəridə olan şəhərləri saxlamaqdan ötrü yığılan əsgəri hamı tabelərdən cəm’ edəcəklər, xah müsəlman ola, xah olmaya.

* * *

Qerdseqovinədə sərəsgər olan Əhməd Muxtar paşaya qeyr yer verib, onu yerinə Süleyman paşanı tə’yin ediblər.

* * *

Sədri-ə’zəm Midhət paşa təzə qanunu xalqa mə’lum edəndə deyib: bizim padşahımız həzrət Sultan Əbdülhəmid xan bu qanun ilə öz tabelərini rövşən edib. Bu qanun ol qanundur ki, onilə Avropa əhlinin gözü açılıb, zülmətdən çıxıb, bu qədər tərəqqi edib. Pəs hər Osmanlı tabesi gərək özünü xoşbəxt hesab eləsin ki, belə padşahın dövranında zindəganlıq edir.

* * *

İstanbulda təzə qanun qoyulan günü serblər ilə olan cəngdən qayıdan tələbələr əllərində məş’əl Hacı Şükür əfəndinin sərkərdəliyi ilə Dolmaboxçaya gedib, həzrət sultandan razılıq ediblər. Həzrət Seyid

paşaya buyurub ki, onlardan bu səbəbə razılıq etsin. Ol vaxtda tələbələr: – padşahım çox yaşasın, – deyib ərz ediblər ki, həzrət konfrans yazan şərtləri qəbul eləməsin.

* * *

Osmanlı dövləti təzə qoyan qanunun bir fəsli də budur ki, məclisi-ümumidə danışıq türki dilində olacaq və 3 ildən sonra ikinci dəfə calislər intixab olanda hər kəs türk dili yazıb oxumağı bilməsə, calis ola bilməz.

* * *

Tehrandan dekabrın 23-də “London qəzet” qəzetinə yazırlar ki, bu il İranda mə’kulat az olduğuna aclıqdan qorxub, qeyri vilayətlərə mə’kulat aparmağı qadağan ediblər.

* * *

“Politik korrespondent” qəzeti yazır ki, əgərçi İran dövlətinin əmələcatı Kərbala şəhərini zəbt etmək istəyir, amma cəng etməyə əsgər və hərbiyyə mayəhtacı yoxdur. Hərçənd həzrəti-şahənşahi-İran Avropa səyahətindən qayıdandan sonra əsgəri Avropa nizamına salmağa sə’y edir, amma indiyəcən ondan heylə səmərə yoxdur və bir də bu halda İran dövlətinin əmələcatı rüşvət almaq və qeyr bizabitə əməl etmək ilə xalqı elə incidib ki, şəhərlərdə xalq bu barədə qapılara kağız yapışdırır. Belə də ola bilər ki, Avropa dövlətləri Osmanlı işi kimi İran üçün də bir belə iş açsınlar.

* * *

Dekabrın 28-də İstanbuldan yazırlar ki, şeyxülislam Xeyrulla əfəndi özünü əsgərə yazdırıb ki, müsəlmanlar ona baxıb özlərini əsgərə yazdırsınlar.

* * *

Osmanlı dövləti keçən il 7 milyon liralıq kağız pulu kəsdirmişdir. İndi dekabrın 25-dən tel var ki, hökm olunub iki milyon yarım lira xalqdan cəm olsun və bitavana kəslərin yerinə onların hissəsini tavana kəslər versin.

* * *

İstanbuldan konfransın məşvərəti barəsində gələn tellərdən mə’lum olur ki, konfrans təzədən açılıb, calislər piş əzvəqt yazdığı şərtlərə

mülahizə edib, Onları dəyişdirib, azaldıb, təzədən şərtlər yazıb Osmanlı dövlətinə pişnəhad ediblər. Osmanlı dövləti böyük divanı – ki, onda 200 calis, o cümlədən müsəlmanların, xristianların, yəhudilərin ruhanisi həm olub, – cəm edib ki, o şərtlərə baxsınlar və cənab Midhət paşa divana deyib ki, ol şərtləri qəbul etsin. Amma divanın calisləri tamam deyiblər ki, heç bir şərtə razı deyilik. Ona binaən konfrans bağlanıb və onun Avropa dövlətləri tərəfindən gələn və o dövlətlərin vəziri-muxtarları İstanbuldan çıxıb gediblər və gedən zaman Osmanlı dövlətinə mə'lum ediblər ki, əgər bir dövlət Osmanlı ilə cəng başlasa, Avropa dövlətləri ona mane deyillər. Bizim Rusiya dövlətinin vəziri-muxtarı İqnatyev ki, konfransda həmcalis idi, o tellərə görə gərək bu yanvarın 13-də İstanbuldan çıxıb gedəydi. İndiyəcən calislərin getməyi yəqinən mə'lum deyil.

* * *

Əgərçi bu halda serblər ilə martın birinəcən barışıq olub, amma Rusiyadan onlara köməyə gedənlər orada dayanıb, cəng başlanmağı gözləyirdilər, indi gələn tellərdən mə'lum olur ki, Rusiya generalı Nikitin və qeyr ruslar Serbistandan çıxıb Rusiyaya gediblər.

* * *

İndiyəcən Badkubəyə qar yağmamışdı, dünən bir az yağıb.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Fi 1 səfərülmüzəffər, sənə 1294*

* * *

*Poşt xərci basdıran illədir*

* * *

*Səşənbə günü*




*Fi 2 fevral Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*6 aylığı –*
*1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## DAXİLİYYƏ

Ey milləti-islamın təqdirən vəkili-namə'lumu (keçən nömrədə çap olunan kağıza cavabdır), cənabınız biz müsəlman tayfası üçün elm öyrənmək dişvar olduğunu bu dəlil ilə həm sübut edirsiniz ki, müsəlman dillərində yazıb oxumaq çətindir. Doğru buyurursunuz, bizim dillərdə yazıb oxumaq çətindir və buna səbəb bizim hürufatdır ki, onların bə'zi yazılmağına (zir, zəbər, puş), onu bir-birinə düzmək çətin olduğuna və bə'zisinin sədası bir olduğuna (ث س ص ya ظ ض ز ذ) onlara bir-birindən təfavüt vermək çətindir. Amma həqiqət heylə çətin deyil ki, siz buyurubsunuz. Bu halda bizim məktəbxanalarda heç bir qayda olmadığına onlar çox yaman gündədir və buna səbəb uşaqlarımızı tə'lim edənlərdir ki, elmi-tə'limdən əsla bixəbər olduğuna əvvəlinci gündən onların zəhləsini qaçırdıb, onların oxumaqdan rəğbətini kəsirlər. Amma bunilə belə bizlərdən Quran oxumağı bilməyən çox azdır. Çünki Quran oxumaq da oxumaqdır, ona binaən bizim, yasin mollası çox və əsli molla az olmamğına səbəb məhz yazıb oxumaq çətin olmağı deyil, onun bir qeyr ümdə səbəbi həm var. Adam yazıb oxumağı bir tək məktəbxanada öyrənməz. Məktəbxana işin ibtidası üçündür. Gərək məktəbxanadan çıxandan sonra həm oxumaq və bundan ötrü lazımdır ki, qəzetlər, jurnallar, kitablar olsun ki, onları oxumaq il əelm və savadh kəsb olunsun. Pəs bizim yasin mollası çox olmağa səbəb oldur ki, yasin ona lazım olduğuna məktəbxanadan çıxandan sonra onu oxuyub, əlbət-

tə, bir qeyr uğumlu şey olseydi, onu da oxuyub yasindən başqa şeydə oxumağı bilirdi.

Çünki qəzeti yasin mollası da oxuya bilir və qəzet ümdə belə kəslər üçündür, ona binaən cənabınız müştəri az olmaqdan şikayət elədiyimizə bizə tə’nə vurmaq bicadır və bunu sübut etməkdən ötrü müştərimizin siyahısını çap edirik ki, siz insaf ilə ona mülahizə edəsiniz: Badkubədən 12 (3 rus), Qubadan 3, Şirvandan 3, Göyçaydan 3, Səlyandan 2, Qarabağdan 9, Şəkidən 7, Gəncədən 1 (erməni), İrəvan quberniyasından 11, Tiflis quberniyasından 13 (2 molla), Dərbənddən və Dağıstanın qeyr yerlərindən 35 (bir molla), Rusiyanın qeyr yerlərindən 20. Cəmiən 119, əzcümlə 3 molla.

Pəs, mənim dostum, Qafqazda üçcə molla var imiş.

## Ə’FALİ-ƏHLİ-DEHAT

Həmişə və hər vilayətdə kənd əhlinin çoxu nə qədər xoşbəxt olsa, öz yerindən gələn hasil ilə özünü gələn iləcən ancaq saxlaya bilir və dəxi məqdur deyil ki, qara gün üçün bir zad saxlasın. Ona binaən abhava ona yar olmayanda, məsələn, quraqlıqdan, ya yağınlıqdan və ya bir qeyr səbəbdən onun əkini tədəf olanda qeyrlərə möhtac qalır. Ona binaən hər kənddən bir neçə müamiləçi olur ki, bu zaman çox ağır şərtlər ilə kənd əhlinə borc pul verir. Əlbəttə, belə borca girən ondan xilas olmaq müşküldür. Bə’zi birə beş, birə on verib genə ol şəxslərə borclu qalır.Bu səbəblərə Avropa vilayətlərində kənd əhli birləşib şəhərlərdə sakin olan tavana kəslərdən və ya bangdan bir cüz’i, məsələn, 500 manat bir az sələm ilə, məslən, manatı 3 şahıdan alıb (əlbəttə, camaat birgə borc edəndə az sələm ilə də pul tapar) o kəndin əhli bir icma bina edib, o məbləği onun calislərinə bir az artıq müamiləyə verib, ilbəil o borcun əslinin bir hissəsini rədd edib, artıq sələmi yığıb ondan bir tənxah qayırıllar ki, onu calislərə bir cüz’i müamiləyə verillər və ya onilə alış-veriş edirlər. Əlbəttə, bu tənxahdan vüsul olan nəf’ tamam calislərə təəllüqdür.

*Əsgər Gorani*

## MƏKTUBAT

Keçən nömrədə çap olunan milləti-islamın cənab Vəkili-namə'lumu yazdığı kağızxdan belə mə'lum olur ki, islam tayfasının biistitaət, bivəsilə, biittifaq olmağı və öz dilində oxumaq, yazmaqdan, məhrum olmağı onun yadına düşəndə biçarənin bədəni od tutub yanır və "Əkinçi" qəzeti yazdığı sözlər külək kimi anən-fəanən o odu yelləyib hərarətini artırmağa binaən, cənab Vəkil özünü bu suznak olan səhrada tənha görüb, bitab və bitaqətlik aləmində başlayıb küləyə dad-fəryad edir ki, ey külək əsmə, yandım.

Mənim məxdumum Vəkili-namə'lum, əvvələn, sizə lazımdır ki, odu söndürmək fikrinə düşəsiniz ki, oddur sizi yandıran, küləkdə taxsır yoxdur və onu bica yerə məzəmmət edirsiniz.

İkinci, cənab Vəkil, bu suznak olan səhrada özünüzü tənha hesab etməyin, sizdən əlavə neçə nəfərlər də bu səhrada var ki, onların da bədəni od tutub yanmaqdadır. Lakin tən qəzaya verib, sükut aləmində durub gözləyirlər ki, haçaq bu suznak olan səhra dönüb onlar üçün güzar olacaq.

Üçüncü, bu halda milləti-islam qüvvətdən düşmüş yer kimidir. Lazımdır ki, neçə nəfər sizin kimi öz bədənini oda yandırıb, onun külü ilə bu yeri qüvvətə gətirsinlər ki, sizin övladınız bu yerdən bəhrəyab olsun. Ona binaən lazım bilirəm ki, sizi yandıran oda bəndə də bir pilik vurum: Badkubədə sakin olan ermənilərin bir icmaı var ki, öz aralarında pul cəm edib ondan ildə 6-7 min manatacan vüsul olan müamilə ilə bir ünas və bir zükur məktəbxanası və bir çapxana açıb elm kitablarını çap edib fəqirlərə müftə və dövlətməndlərə bir az qiymət ilə verir və indi danışıq var ki, bir qəzet və bir jurnal çap elətsin.

Neçə gün bundan əqdəm erməni ruhanilərinin birisi moizə edib xalqı təhrik və təhris edib ki, bu icmaın mədaxili artmaqdan ötrü genə pul cəm etsin və haman saat xalq min beş yüz manat cəm edib icmaa verib. Əlbəttə, belə himmətli və belə ittifaqlı millət günbəgün tərəqqi edəcək.

Cənab Vəkil, buyurursunuz ki, istitaətimiz yoxdur. Bəndə bir Badkubə şəhərindən 100 nəfərəcən müsəlman adlıya bilərəm ki, hər birinin ildə 3-15 min manatacan mədaxili var və hərgah onların hər biri ildə 100 manat versə, Onların halına heç təfavüt etməz. Pəs mə'lum ki, istitaətimiz var. İkinci, buyurursunuz ki, vəsiləmiz yoxdur, yə'ni öz

dilimizdə oxumaq, yazmaq çətindir. Əzizim, bu dərdə külli millətlər mübtəla olublar. Məsələn, buyurduğunuz Prus xalqı 150 il bundan əqdəm öz dilləri çətin olmağa görə tamam oxumaq-yazmaqları latın dilində idi. Amma mürur ilə elm təhsil edib, indi öz dillərində oxumaq-yazmağı elə asanlığa çıxarıblar ki, qeyr millətlər onların dilində elm təhsil etməyə rağib olub. Pəs mə'lum ki, vəsilənin olmağı elmin olmağına mövqufdur. Qərəz, bizim elmdən bisəmərə olmağımıza ümdə mane ittifaqımızın yoxluğudur və onun yoxluğuna biz özümüz səbəb oluruq.

*Məhəmmədtağı Əlizadə Şirvani*

* * *

*Yazıldı Moskva şəhərində yanvarın altısında.*

Mə'lumdur ki, davanın alış-verişə çox zərəri olur, amma bu halda dava olacaq ya olmayacaq, namə'lum olmağı dəxi ziyadə alış-verişə zərər edir. İndi nəinki Rusiyada, hətta tamam Avropada alış-veriş sönüb. Gündə bir xəbər gəlir ki, filan bang, ya filan tacir bankrot, yə'ni yoxsul olub. Rusiyada bir neçə günün müddətində 3 bang bankrot olub.

Bu il Amerikadan neft cövhəri gətirilmədiyinə Badkubənin neft cövhərinin putu altı manat yarıma çıxıb.

Hava çox təəccüb dəyişilir, 2 həftə bundan əqdəm 2 gün görünməmiş soyq oldu ki, mizanül-hərarət civəsi nöqteyi-incimaddan 42 dərəcə aşağı düşdü, amma sonra genə qalxdı 3 dərəcəyəcən və bir həftə elə isti oldu ki, qar başladı əriməyə və çox yerlərdə kirşə əvəzinə təkərli ərradələr işə düşdü.

* * *

İstanbulda açılan konfransın calisləri Osmanlı dövləti onlar yazan şərtləri qəbul eləmədiyinə ol şərtləri hər təzə danışıqda azaltmağı buranın əhlinə ziyadə tə'sir edir... Qəzetlər çıxan kimi xalq onu göydə götürür. Hər bir qəzetin idarəsi qəzeti alan ilə dolu olur. Burada bir neçə şəkilli qəzet çap olunur ki, orada həcv əvəzinə eyham ilə hər yaman iş üstə gülüş yazırlar. Bu qəzetlərin birsində konfrans barəsində bu eyham şəkli çəkilib: bir böyük tərəzinin bir gözündə bir Osmanlı əlində qəlyan əyləşib, o biri gözü xristianların kəsilmiş başı ilə doludur. Tərəzini ingilis tutub və onun gözünə başları macar (Avstriya

dövlətinin bir hissəsi Macarıstandır) qoyur, çünki Osmanlı oturan göz ağırdır, İngilis macara deyir: Genə qoy ki, Osmanlı qalxsın.

Gəncədən yazırlar ki, çapavulçuluq və oğurluq şiddət elədiyinə danışıq var ki, oğurluq divanı mirovoy sudlardan alınıb polisa əmələcatına veriləcək.

Moskvada olan erməni tabeləri bu yavıq zamanda öz dillərində teatr çıxardacaqlar.

*Əsgər Gorani*

* * *

Aşağıda yazılan məktubu Quba şəhərindən bizə göndərib çox tə'kid edirlər ki, biz onu çap etdirək. Ona binaən naəlac qalıb onu çap elədirik. Amma lazım bilib onun hər fəslinə əlahiddə cavab yazırıq.

"Əkinçi" qəzetinin əvvəlinci nömrəsində Əhsənül-Qəvaid baş çapmaq xüsusunda bir para böhtanlar yazmışdır.

1) Yazır ki, insan hər əməli başlayanda – xah xeyir, xah zərər – sə'y edir o əməlin artıq olmağına və halonki insanda nəfsi-ləvvamə var, həmişə o nəfsin sə'yi budur ki, insanı bəd əməldən mühafizət eləsin (pəs niyə bəd əməl, məsələn, oğurluq, dələduzluq müsəlman millətində çox və qeyrilərdə az olur?).

2) Ağıllı şəxslərin baş çapmağa mübaşir olmamağı aşkar böhtandır, bəlkə ə'la və ədnadan hərə bir tövr mübaşir olur. Bir parası baş çapır, bə'zi təbl ya sinc çalır, bə'zi sinəzənlik edir. Qərəz, hər kəs öz əhvalına münasib bu əhvalatda şərikdir (neyləsin, onun güzəranı avamilədir).

3) Xaricdən görən şəxs başçapanı divanəliyə həml etmək baş çapmaqlığın haramlığına dəlil olsa gərək. Biz namaz da qılmayaq, çünki çox şəxs bizim namazı da axmaqlığa hesab edir? (pəs baş çapmaq da namaz kimi müsəlmanlığın əvvəlinci şərtlərindən imiş).

4) Nəinki baş çapan şəxslər bədən zərəri görmür, bəlkə baş çapmaq səbəbindəən bir para naxoşluqlardan səlamət olurlar, necə ki, neçə illərdir təcrübə ilə sabit olub (dəxi həkim gətirdib müalicə elətmək nə lazım?).

5) Şəriət əqlin təhtində olmaq məhz iftiradır, bəlkə əql şəriətin təhtindədirn və əgər əql şəriətdən yuxarı olsa, murad əqli-külldür ki, xatəmül-ənbiya ola, nəinki üquli-naqisə (əgər xatəmül-ənbiya da avam adama baş çapma desə qoymazlar inansın).

6) Dustaq mürəxxəs olmaz. Əgər o dustaq bitəqsirdir mürəxxəs olub. Onun mürəxxəs olmağına səbəb olan baş çapana iki səvab var və əgər təqsirli dustaqdır, onun azad olmağına bais olan baş çapana baş çapmaqdan ötrü səvab çatar, o dustağı azad eləməkdən ötrü günah (bəlkə Qubanın dustaqxanasında olanların çoxu nahaq yerə dustaq olublar?).

7) Doğrudur, hakimlərə vacibdir tənbeh eləmək o şəxslərə ki, əhkami-dini bilməyib böhtan danışa, nəinki tənbeh edə o şəxslərə ki, onların barəsində ayə və mən yüəzzim şəairəllah[1] nazil olub (buna Əhsənül-Qəvaid özü Rəştdən cavab yazsın).

8) Təəccüb budur ki, Əhsənül-Qəvaid özü iqrar edir üləmanın baş çapmağı mən' eləməyinə və bu nüktəni fəhm etmir ki, hərgah baş çapmaq haram olsa, üləma başaçıq, ayaqyalın baş çapanlarn qabağına düşməz (düşməsin neyləsin, yoxsa dolana bilməz).

9) Əyyami-sabiqdə baş çapmaq adət olmayıb. Bu əsrdə olmaq məhz iftiradır, bəlkə hər əsrdə baş çapılıb və qol vurulub. Təfavüt buradadır ki, sabiqdə bir para səbəblərə görə bir az məxfi olub (eyhamdır).

Əlhal cənab imperaturi-ə'zəmin ədalətindən hər bir küçə və bazarda tə'ziyeyi-imam Hüseyni bərpa edib, ə'lahəzrət valacahın ömrü dövlətinə duaçı olmuşuq və bunlardan əlavə, müsəlman məzhəbi yetmiş dörddən çoxdur (hansı, hansıdır) və bu məzhəblərin əksəri baş çapmağı haram bilirn (vallah Əhsənül-Qəvaid şieyi-cə'fəridir), ta ki, bəlkə bu müsibət köhnə olub yaddan çıxa (sünnü qardaşlar, al gəldi) və lakin imamiyyə məzhəb əhlləri (onlar da müsəlmandır, ya yox?) hər il baş çapıb təbl, sincilən ğəlğələ salıb qeyr millətlərə (hətta onlara da) mə'lum edir ki, bizim müsəlmanlar öz imamını öldürüb (bizim zəmanənin müsəlmanlarının bə'zi Şümürdən bədtərdir) və indi onun müsibəti saxlanmağa da razı olmur (kim sizə deyir ki, tə'ziyə saxlamayın?). Cənab Əhsənül-Qəvaid bu halacan qəzetdə elm xəbəri yazırdı (xeyr, həmişə məktub yazır), əlhal kari-zəminra saxti, bər asiman pərdaxti, ey məgəs, ərseyi-simurğ nə cövlangəhi tust. Həqiqətən, cənab Əhsənül-Qəvaid, in rəh ki, tu mirəvi bə-Türkistan əst[2] (pəs əzizim, sizin cənabınız, bu kəşakeş ilə gedən yol haraya gedir?)

*Hadimül-Qəvaid kapitan Sultanov*

---

[1] Allahın şüarlarını kim böyüdür

[2] Yerdəki işlərini səhmana saldın, indi də göyə əl atırsan. Ey milçək, simurğun meydanı sənin gəzinti yerin deyil, həqiqətən, cənab Əhsənül-Qəvaid, bu yol ki, sən gedirsən – Türküstanadır.

## TƏZƏ XƏBƏRLƏR

Yanvarın 24-də Badkubənin sobraniyasında ermənilər öz dilində teatr çıxardıb, 300 manat cəm edib, elm təhsil edən uşaqlara payladılar.

* * *

Badkubədə qızıl pul imperial 7 manat bir çətvərdir.

* * *

İstanbulda cəm olan konfransın iheç bir şərtini Osmanlı dövləti qəbul eləməyib. Konfransı bağladığına onun calisləri və Avropa dövlətlərimnin vəzirni-muxtarları İstanbuldan çıxıb gediblər. Amma Avropa dövlətləri Osmanlı ilə danışığı kəsməyiblər. Hər vəziri muxtarın yerində vəkil qalıb.

Bu halda Osmanlı dövləti özü Serb və Qaradağ əhli ilə sülh barəsində danışıq edir və bu sülhün şərtləri mə’lum deyil. Amma deyirlər Qaradağ əhli Osmanlıdan bir az yer istəyir və Osmanlı dövləti istəyir ki, bir neçə Serb qalası Osmanlı ixtiyarında qalsın.

* * *

İstanbuldan yanvarın 31-dən yazırlar ki, şeyxülislam Həsən xeyrullah əfəndi özünü əsgərə yazdırmaqdan masəva, mollalara hökm edib ki, özlərini tamam əsgərə yazdırsınlar, ta ki xalq onlara baxıb, vətənin qeyrətini çəkməyə rağib olsun, məzkur şeyxülislam Avropa elmlərin oxumuş olduğuna nə ki, təzə qanun qoyulmağa razı olub, hətta özü Midhət paşa ilə birgə ol qanunu yazıbdır.

* * *

İstanbuldan yazırlar ki, əgər Rusiya ilə cəng olsa, həzrət sultan özü Tunə əsgərinə sərəsgər olacaq və genə yazırlar ki, bu halda Osmanlı xalqı demək olur iki firqədir: birisi ki, Midhət paşanın dəstəsidir, cəng etmək istəmir, amma cəngdən də qorxmur və birisi ki, qədim türk dəstəsidir, çox xahişmənddir ki, Rusiya ilə cəng etsin.

* * *

Osmanlı dövləti konfrans yazan şərtləri qəbul eləməməyinin səbəbini “Tiflisski vestnik” qəzeti belə bəyan edir: 1) Osmanlı dövləti-

nin tabeləri tamam (slavyan millətindən başqa) dövlətdən razı olduğuna hazırdır ki, onun buyruğuna əməl eləsin. 2) Osmanlı dövləti yəqin bilir ki, o şərtləri qəbul etməyəndə Avropa dövlətlərindən, Rusiyadan başqa heç kəs cəng başlamayacaq. 3) Osmanlı dövləti belə fikir edir ki, Rusiyanın sərhədlərində Osmanlı edən tədarük Rusiya əsgərlərinə bəsdir.

* * *

İstanbuldan yanvarın 13-də yazırlar ki, həzrət sultan İran dövlətinin vəziri-muxtarı Möhsün xanı çörəyə çağırıb, ona kağız ilə mə'lum edib ki, hər bir islam, o cümlədən İran dövləti ilə dostluq saxlamağa həzrət həmişə hazırdır.

* * *

*"Tiflisski vestnik"də çap olunan tellər:*

1) *İstanbuldan yanvarın 12-də.* Konfransın calisləri İstanbuldan gedəndən irəli istəyiblər ki, həzrət sultana baş vursunlar, amma həzrət onları görmək istəməyib.

2) *Parijdən yanvarın 20-də.* Avropa dövlətləri tamam, hətta Rusiya da Serb əhlinə deyiblər ki, Osmanlı ilə sülh eləsin. Həmçinin Qaradağ əhlinə bunu məsləhət ediblər və genə Osmanlı işi sülh ilə qurtarmağa ümid çoxdur. Və genə yanvarın 21-dən. Osmanlı dövləti Serblərə yazan sülhün bir şərti budur ki, Serb əhli müəyyən olan zamanda, yə'ni bir neçə il cəng etməsin, amma serb əhli yazıb Rusiyadan xəbər alır ki, buna nə cavab verək.

3) *Parijdən yanvarın 24-də.* Osmanlı dövləti Serb və Qaradağ əhli ilə sülh barəsində elədiyi danışıq tə'xirə düşür. Sədri-ə'zəm Midhət paşa deyib: biz dava eləmək istəmirik, amma bizim düşmənlər istəyir isə, biz davadan qaçmırıq və dava eləməyə hazırıq.

4) *Peterburqdan yanvarnı 23-də.* Rusiya dövlətinin vəziri-xaricəsi knyaz Qorçakov Rusiya dövlətinin Avropa dövlətlərində olan vəziri-muxtarlarına yazıb ki, o dövlətlərə mə'lum eləsinlər: çünki Osmanlı dövləti konfrans yazan şərtləri qəbul eləməməyi o işləri dəxi pərişan edib, ona binaən Rusiya dövləti işə girəndən irəli istəyir bilsin ki, Avropa dövlətlərinin bu barədə rə'yi nədir və nə tövr ilə onlar istəyir ki, konfrans şərtlərinə əməl olunsun?

5) *İstanbuldan yanvarın 25-də.* Həzrət sultan, Midhət paşanı tutdurub Suriya vilayətinə göndərib və onun yerinə Ədəm paşanı ki, Berlində vəziri-muxtar idi, sədri-ə'zəm edib.

*Və genə yanvarın 26-da.* Qədim türklər ki, cəng etmək istəyirlər, Midhət paşanın xaric olmağına çox şad olublar, yeni türklər çox qəmgin olublar. Həzrət sultan Ədəm paşaya hökm edib ki, Midhət paşa edən işlərə əməl edib onun kimi iş görsün.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского
Губернского Правления.

*Fi 15 səfərülmüzəffər,*
*sənə 1294*

* * *

*Poşt xərci*
*basdıran ilədir*

* * *

*Səşənbə günü*




*Fi 17 fevral Rusiya,*
*sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*6 aylığı –*
*1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Müştərimizin qədəri 149, o cümlədən Dərbənddən və Dağıstanın qeyr yerlərindən 59.

* * *

Qəzeti hər iki həftədə bir pəncşənbə günləri çıxardacayıq. Bu sayaq ilə gərək ildə 26 nömrə çıxsın.

* * *

Bir şəxs bizim qəzetin əvvəlinci nömrəsində əqrəba miyannıda olan kəbin xüsusunda yazılan mətləbin və Əhsənül-Qəvaid baş çapmaq üstə yazdığı sözlərin barəsində bir kağız yazıb, məxfi göndərib, bizə bie'tiqad, biədəb, biidrak, bielm deyib, bir vərəqin üstə olmayan sözlər yazıb deyir: əgər mərdsən, bunu basdır.

Əgərçi ol cənab çox sə'y edib ki, özünü gizlətsin, amma onun qulaqları çox uzun olduğuna, onların ucu çöldə qalıb. Ona binaən cənaba ey məkəs əvəzinə ey uzunqulaq – deyib ərz edirəm ki, cənabınız top-tüfəng ilə bizi qorxuda bilmədiniz, indi məxfi kağız ilə qorxutmaq istəyirsiniz və bir də yazırsınız ki, bizi həcv edəcəksiniz. Əgər həcviniz pındıq sözü kimi olmasa, çap elədərik, amma təvəqqə edirik onu aşkar göndərəsiniz, gizdin kağızı çap etməyə ixtiyarımız yoxdur.

* * *

Əvvəlinci nömrə ilə göndərilən siyahıların birisində ki, səneyi-hicrinin ibtidası müvafiqi-səneyi-xrirstianyazılıb, belə qələt düşüb

səneyi-xristianların başında yazılıb səneyi-rusi, amma gərək yazıleydi səneyi-firəngi ki, onların 12 gün təfavütü var. Məsələn, firəng və qeyr Avropa əhlinin təzə ili olanda, yə'ni onların yanvarının birində rus hesabı ilə təzə ilə, yə'ni rusi yanvar ayının birinə 12 gün qalmış olur.

## DAXİLİYYƏ

Bizim qəzetin 24-cü nömrəsində qurban bayramının əsl mətləbi barəsində yazılan daxiliyyəni Tiflis şəhərində erməni dilində çap olunan "Mşak" qəzeti erməni dilinə tərcümə elədib, basdırıbdır. Heç görünübdür ik, bizim zəmanədə elm oxumuş adam xalqı Məkkəyə getməyə təhrik edə və ittihadi-islam fikrinə düşə və ittihadi-islam heç məqdurdurmu? Xülasə, bu tövr çox danışıb axırda deyir: neçə yüz ildir ki, islam ətrafında olan erməni, gürcü və qeyr tayfaları güc ilə islam edib və indi siz bu qədər tayfaları ittihadi-islam ilə birləşdirmək istəyirsiniz... Yox, qaytarın bizə – ki, bizim zəmanə elm zəmanəsidir və biz elm sahibiyik və elm təhsil etməyə qabiliyyətimiz var, – bizim qardaşlarımızı ki, keçmişdə onları cəbrən islam eləmisiniz. Verin bizə bizim yerləri ki, keçmişdə onları güc ilə zəbt etmisiniz və ondan sonra gedib ittihadi-islamı o səhralarda eləyin ki, orada islam bina olub və monqol tayfasını (bu tayfanı Avropa əhli biqabiliyyət hesab edir) birləşdirməyə sə'y edin... Ey cənab, Arsruni (zikr olan qəzetin münşisinin adıdır) əgərçi cənabınız doğru buyurursunuz ki, zəmanəmiz elm zəmanəsidir və bu halda ermənilər bizdən artıq elm təhsil etməyə rağibdirlər, amma... neçə yüz ildir ki, biz ermənilər ilə qonşuluq edirik, indi cənabınıza eyb deyilmi ki, bizim aramızda ədavət salırsınız... Be hər təqdir nişi-əqrəb nə əz rəhi-kinəst[1].

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Quraqlıqdan əkini mühafizət etməkdən ötrü məsləhət edirlər ki, payızda əkilən əkinin üstə qışda qar yağanda onu ağacları sürüməklə yerə yatırdasan. Belədə ondan əmələ gələn suyun çoxu yerə hopub, dərinə gedər və bu səbəbə belə yer yayda tez qurumur.

---

[1] Hər halda əqrəbin sancmağı qisasdan ötrü deyil.

Avropa əhlinin yeri az olduğuna heyvanlar üçün ələfi də əkirlər. Yazırlar ki, qarğıdalı, yə'ni peyğəmbər buğdası o ələflərin hamısından yaxşıdır. Əvvələn, onun kökü dərinə getdiyinə yeri nə ki gücdən salmır, hətta dəxi qüvvətli edir. Saniyən, onun həmi başını, həmi bəlimini at, mal yaxşı yeyir. Onu cərgə-cərgə bir-birindən bir arşın aralı əkib, yetişən vaxtı qırıb qurudub qışda iştədillər.

* * *

İtaliyada bir icma bina olub ki, ol vilayətdə əmələ gələn şeyləri aparıb qeyr vilayətlərdə füruş edir. Keçən il 5 ayın müddətində məzkur icma Rusiya və Germaniya vilayətlərində 66 milyon yumurta füruş edib.

* * *

Yazırlar ki, cənubi Rusiyada tənbəkini yaxşılandırmaqda ötrü danışıq var ki, qeyr yerlərdə əmələ gələn tənbəkilərin toxumun gətirib ol yerin əhlinə paylayıb, hər il tənbəkisi ə'la olan kəslərə ən'am versinlər.

* * *

Ləvin adlı otdan qayrılan şeyləri ki, olsun kəndir, tor və qeyrə çürüməkdən mühafizət etməkdən ötrü məsləhət edirlər ki, onları bu tövr aşa qoysunlar: iki girvənkə yarım palıd ağacını qabığını qərx doqquz girvənkə təmiz suda yarım saat qaynadıb, sonra qabığı çıxardıb, qaynanmış suyun içinə sıxıb, onun suyunu ki, qədəri 11 girvənkəyəcən olur, isti ikən bir saxsı və ya mis qaba töküb, zikr olan şeyləri ona isti ikən salıb, qırx səkkiz saat saxlayıb, çıxardıb, sıxıb, təmiz suya salıb, genə sıxıb qurudandan sonra belə aş olunmuş şeylər 10 ildən də artın nəmiş yerdə saxlananda çürümür.

* * *

Üzüm ağacının kökünə qurd düşməkdən üzüm quruyub tələf olmaqdan bir neçə əlac yazırlar. O cümlədən onlara qurd düşəndə məsləhət edirlər ki, o ağacların arasında qırmızı qarğıdalı əkmək. Ol vaxtda qurdlar köçüb qarğıdalının kökünü yeməyə getdiyinə üzüm yaxşı olur.

* * *

Qızılgül yağını Osmanlıda belə çəkirlər: təzə dərilmiş gülün yarpaqlarını suda 2 saat qaynadıb, onun cövhərini yığıb, bir də qaynadandan sonra onun üzünə yağ yığılır. Onu qaşıq ilə yığırlar. 130 min güldən 7 misqal yağ əmələ gəlir. Bu yağ çox baha satılır.

## MƏKTUBAT

*Keçən nömrədə çap olunan kağıza cavabdır.*

Cənab Sultanov, bilmirəm nə hirs sizə qələbə edib ki, bir belə kağızı yazmağa iqdam edib, xalqı başlarını xəncər ilə doğramağa təhrik və təhris edirsiniz? Əgər qərəziniz sünni-şiə arasına ədavət salmaqdır, zəhi şərarət! Aqil kəslər sə’y edirlər ki, millətlər arasında sülh versinlər, amma siz sə’y edirsiniz ədavət salmağa. Siz gedən yol da mə’lum oldu.

Hərgah qəsdiniz Rus dövlətinə xeyirxahlığınızı mə’lum etməkdir, əcəb bifəhmi. Dövləti-Rusiya yaxşı fəhm edir ki, öz qardaşlarının bədxahı olan kəs özgənin qardaşlarına xeyirxah ola bilməz.

Bir kəs ki, özündən ola ğafil,
Bir özgəni bilməyə nə qabil?

Əgrə fikriniz bu gunə sözlər ilə özünüzü mö’min göstərib, bir para nadanların tə’zim və təkrimini axtarmaqdır, qəribə biinsafi ki, nəfsinizin xahişini əmələ gətirməkdən ötrü razı olursunuz ki, islam xalqı qeyr millətlərin arasında gülüş olub, rüsva olsun.

Əgər təbabətinizi izhar edirsiniz ki, ölü başın doğrasın, dürlü sözünüz bimə’na və müalicəniz qeyri-müfid. Belə təbabət ilə xatircəməm ki, bir az müddətdə milləti-islamın dünyadan gümnam edərsiniz.

Gər tu Quran bədin nəmət xani,
Bebəri rövnəqi-müsəlmani[1].

Mənim məxdumum, neçə ildir “Əkinçi” qəzeti dad-fəryad edir ki, milləti-islam, ayıl bu qəflət yuxusundan, rehlət vaxtf qalma tənha bu pürxətər biyabanda və indi bir para adamlar ayılıb istəyirlər ki, qeyr-

[1] Əgər Quranı bu qayda ilə oxusan müsəlmançılığı hörmətdən salarsan.

lərin də ayıltsınlar, onda da siz bir ağac qapıb gəlirsiniz ki, qalmaqal salmayın, qoyun yatıb, istirahət etsin. Amma heç bilirsiniz ki, bu istirahətin nəticələri nə bəlalardır? Qərəz, bundan sonra təvəqqə oldur ki, belə kağızları yazıb və belə təbabəti etməyəsiniz.

Ey məkəs, ərseyi-simur nə cövlangəhi tust,
İn təbabət ki tu mikoni bər heyvanəst[1].

*Xalis şiə, isna-əşəri Əlizadə Şirvani*

* * *

D ə r b ə n d d ə n. Bu il bizim şəhərdə oğrular divar yarmağı adət ediblər. Bu yavıq zamanda onlar bir xanənin divarını yarmaqda, xanə sahibi və onun övrəti xəbərdar olur. Kişi istəyir çıxıb qonşulara mə'lum eləsin, övrət qoymur vıə özü durub bir ip gətirib, ortasın halqa edib, bir tərəfin kişi tutub hazır durullar. Oğrular işi tamam edib birisi başın evə daxil eləməkdə övrət ahəstəlik ilə halqanı boynuna salıb, bir tərəfə özü və bir tərəfə kişi çəkib bənd edirlər. Oğru yoldaşlarına fəryad edir ki, çəkin. Onlar həm çölə çəkirlər, axır yoldaşları qaçıb, oğrunu xanəyə çəkib, çox ilticadan sonra bu tənbeh ilə əldən qoyublar.

Bizim şəhərdə bir bəyzadə ilə bir tacir iddiayi-dostluqda məşhur idilər. Keçən il bir şəxs mərhum olur və ondan bir bab xanə, bir parça boyaq, 250 manat borc və bir neçə zükur və ünas səqirləri qalır. Xanə borc əvəzində girovda olduğuna gərək tələbkara vüsul olaydı və səqirlər anaları ilə bisərü pa qalaydılar. Mumiileyh bəyzadəni səqirlər halına rəhmi gəlib, onların boyağını müşarileyh tacirə 250 manata verib ki, və'də başınacan onu qazıb tələbkarın pulunu versin. Tacir təklifi qəbul edib, boyağı çıxardıb, əlhal tələbkar pulu istəyir. Amma tacir deyir ki, nə zikr olan təklifi eşitməmişəm nə boyaq çıxarmamışam.

*Məhbus Dərbəndi*

*Məhərrəm ayının 16-cı günündə cənubi Tabarıstandan.*

1) Bu gün bizim okruqun mərəkəz hökuməti olan Qasımkənddə okrujnoy dəftərxanada oxundu cənab voenni naçalnik Dağıstani-cənubiyyə tərəfindən buraya varid olan bir qit'eyi-tə'liqə bu məz-

[1] Ey milçək, simurğun meydanı sənin gəzinti yenin deyil, o həkimliyi ki, sən edirsən, heyvana məxsusdur.

munda ki, guya Əhkami-üzma həzrətlərindən təsdiq olunubdur ki, Dağıstan oblastında 3 yerdə mədrəsələr bina olunsun ki, övladi-vətənə rusca və həm müsəlmanca elm tə'lim olunsun və o 3 yerin birisi olacaqdır, həmin Qasımkənddə ki, burada bina olunası mədrəsənin müəllimlərinə və sair əmələsinə xəzanədən məvacib veriləcək, amma mədrəsənin və sair lazım olan məsakinlərin tə'mirini buranın əhli edəcək. Bu xəbərdən buranın bə'zi həmiyyətməndləri hesabsız şad və fərəhnak oldular.

2) Runasi mükəddərənfasın vəfatından sonra bura əhalisi onu bilküllüyyə fəramuş edib, kəmali-ehtimal ilə sair ənvai-hübubatı ziraət və qeyr ticarət eləməyə məşğul olub, məişət eləyirlər və tədric ilə əhvalları kəsbi-e'tidal eləyir.

3) Bu halda Dağıstan əhlindən çox novcahanlar öz xahişləri ilə Teymurxan-Şura şəhərinə gedib, daxili-xidməti-əskəriyyeyi-süvariyə olurlar, ələlxüsus, avar əhlindən o xidmətə rağib həddən artıqdır və həmin Kurə və Tabasarani-cənubi əhlindən oraya gedən çoxdur. Bu tövr ilə Dağıstan süvarisindən keçmişdə olan bir polkdan savayı təzədən 3 polk da tərtib olacaq.

## ELM XƏBƏRLƏRİ

Bizim zəmanə dəyişilməyi hətta çobanlara da mə'lumdur ki, boyatısında deyir:

Qarğalar laçınlandı,
Laçınlar qarğalandı...

Əlhəqq zəmanəmiz dəyişilib. İndi güc və igidlik əyyamı deyil, elm əyyamıdr və çobanın sözü doğrudur ki, bu zəmanə bizi qarğalandırıb və qeyrləri laçın edib. Lakin keçmişdə bizim xəlifələrin vaxtında islam tayfası elm təhsil etməkdə laçın imiş.

Dreper adlı ingilis hükəması ərəblər elmi dost tutmağı sabit etməkdən ötrü onların bu məsəllərini gətirir: 1) Alimin mürəkkəbi şəhidin qanına bərabərdir. 2) Necə ki şəhid əlində qılınc cənnətə gedəcək. 3) Dünya dörd şeyin üstə qərar tutub: alimin ağlının, qadirin adilliyinin, abidin duasının, igidin mərdliyinin üstə. Həzrət Əl-Mənsur namdarın evi alimilə dolu olurmuş. Həzrət Harunər-Rəşid yüz alimsiz evdən çölə çıxmaz imiş. Haman bu xəlifə hökm eləmişdi ki, məktəbxanasız məscid tikilməsin.

Ələlxüsus həzrət Əlinin dövranında elm tərəqqi edib. Həzrət özü deyib: 1) İnsanın xoşbəxtliyi elm təhsil etmək ilədir 2) Hər kəs elmə yol açdı, ona ölüm yoxdur. 3) İnsanı bilmək nurlandırır.

Ərəb hükəmaları Əl-Razi və Cəfər dünyaay tək gəliblər. Bu Cəfərə Avropa əhli elmi-kimyanın atası deyir. Bir ingilis Hükəması deyir: zikr olan Cəfər müəllimlərin müəllimidir. Min il bundan əqdəm Əbu-Sina adlı ərəb hükəması dağlar necə əmələ gəlməyindən bir kitab yazıb ki, hərgah indi onun tarixini dəyişdirəsən, bilmək olmaz ki, onu min il əqdəm yazıblar, yəni Avropa hükəmaları bu qədər zəhmət çəkibsələr də, ondan artıq bilmirlər. Amma çifayda, indi laçınlar qarğalanıb, necə ki, bizim xəlifələrin dövranında xristianlar avamlığından öz naxoşlarının üstə həkim gətirməyi günah bilib, onun ağrıyan yerlərinə keşiş yazan duanı bağlayırlar imiş, Habelə bizim zəmanədə islam tayfası ... axirət bizimdir deyib durub.

*Əsgər Gorani*

## TƏZƏ XƏBƏRLƏR

Məzənnəcati-Dərbənd: qənd pudu 8 manat, ard 90 qəpik, bürüncü-Quba 1 manat 20 qəpik, yağ 8 manat, arpa 80 qəpik, kəmyabi-cövhəri-neft 2 manat 20 qəpik, güşt girvənkəsi 7 qəpik, mal əti 6 qəpik.

Badkubə: buğdanın 25 putu 24 manat, arpa 16 manat, qəndin putu 7 manat 60 qəpik, yağ 9 manat, bürünci-Akulə 1 manat 60 qəpik, Bürünci-rəsmi 80 qəpik, neft cövhəri 1 manat 20 qəpik, qoyun əti 10 qəpik, mal əti 7 qəpik.

* * *

Bir şəxs bu il Badkubə şəhərində mərsiyəxanlara verilən məbləğin hesabına gedib: cümlətani 15 min manat cəm olub.

* * *

Kərbəladan gələn zəvvarlar deyir ki, İranda Zəncan şəhərinin 4 ağaclığında bir dağda qızıl mə’dəni tapılıb.

* * *

“Tiflisski vestnik” qəzeti yazır ki, keçən il ermənilərin Tiflis, Gəncə, Kutais quberniyalarında olan məxsusi məktəbxanalarıda 446 müəllim,

4 min ünas və zükurdan oxuyan olub və o məktəbxanalara bir ilin müddətində 70 min manatacan məsrəf olub ki, bu pulu xalq öz xahişi ilə ilbəil cəm edir.

* * *

Yazırlar ki, Midhət paşa qəsd ilə vəzirlikdn çıxıb, yerinə Ədəm paşanı qoyub ki, Ədəm paşa Prusiyanın vəziri-xaricəsi Bismarkın dostu olduğuna bilsin ki, Osmanlı Rusiya ilə cəng etsə, Prusiya kimin tərəfini saxlayacaq.

* * *

Peterburqda dekabrın 6-da Kazanski Sabor kilsəsində dua olunan vaxtda bir neçə tələbə və qeyrə dövlətin üstə nalayiq sözlər danışıb, bir ələm çıxardıb xalqa göstəriblər ki, onun üstə yazılmış imiş: torpaq və asudəlik. Polisa onlardan – ki, bir neçə yüz olublar imiş, – 21 adam, o cümlədən bir neçə övrət dəstgir edib. İndi Senat onların işinə baxıb qət’ edib, çoxunu Sibirə göndərib.

* * *

Macar tələbələri sərəsgər Əbdülkərim paşa Serbistandan qayıdanda ona bir qılınc göndərmişdilər. Onu İstanbula gətirən tələbələrə çox ehtiram etmiş idilər. İndi yazırlar ki, Macarıstanın vəziri-məktəbxanası Peşt şəhərinin universitetində istəyir Osmanlı dili oxutsun ki, bu tayfalar dost olmağa səbəb olsun və həmçinin Osmanlı tələbələri söz veriblər ki, macar dili öyrənsinlər. İstanbuldan yazırlar ki, həzrət sultan qadağan edib ki, əsgəriyyə qulluğunda olmayanlar alati-hərbiyyə saxlamasınlar.

* * *

Poti şəhərindən yazırlar ki, alış-veriş bilmərrə sükut edib, tavanalı kəslər şəhərdən gedir. Odes gəmiləri vaxtında gəlmir.

* * *

İstanbuldan yazırlar ki, millət məclisinin calislərinin çoxu intixab olunub. Martın 1-də məclis açılacaq.

* * *

*“Tiflisski vestnik”də çap olunan tellər:*

1) *Peterburqdan yanvarın 27-də.* Dövlət təzədən 18 milyon manatlıq seri kağızı kəsdirib.

2) *İstanbuldan yanvarın 27-də.* Tələbələr həzrət sultana ərizə veriblər ki, Midhət paşanı qaytarsın.

3) *Parijdən fevralın 2-də.* Midhət paşa İtaliya məmləkətinin Neapol şəhərində sakin olub.

4) *Londondan fevralın 5-də.* Vəziri-xaricənin köməkçisi millət məclisində deyib ki, Rusiya vəziri-xaricəsinin (keçən nömrədə çap olunub) cavabına indi verə bilməz. Əvvəl gərək mə’lum olsun ki, qeyr dövlətlər ona nə cavab verəcək və genə vəziri-hərbiyyə deyib: Osmanlı dövləti konfransı bağlamaq ilə bizə düşmənə olmuyub. Tammam Avropa istəyir ki, Osmanlı işinə qarışmasın və qarışmaq istəyənə mane olsun.

5) *Parijdən.* Avropa dövlətləri Rusiyanın vəziri-xaricəsinə ol vaxtda cavab verəcəklər ki, Osmanlı Serb və Qaradağ ilə sülh edib, işi özü qurtarmış ola.

*Badkubəyə gələn tel. Fevralın 13-də İstanbuldan.* Serblər ilə sülh olub. Sabah həzrət sultan onu təsdiq edəcək.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub.

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Üçüncü sənə* *5-ci nömrə*

*Fi 29 səfərülmüzəffər, sənə 1294*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Pəncşənbə günü*



*Fi 3 mart Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*Bir sənəliyi – 3 manat*
*6 aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Cənab Vəkili-namə'lumi-millətə ərz olunur ki, siz kapitan Sultanova yazdığınız cavabı binöqsan çap elətməyə nə ki, məsləhət, hətta izin də olmadı. Ona binaən ki, söz çox doğru və aşkar idi və əgər cənabınız izin versəniz, onun üstə bir nazik pərdə çəkib çap elədərik.

* * *

Peterburqda olan ot toxumu füruş edən mağazalar ilə yazışıb biz müştərilərə mə'lum edirik ki, hər kəs ot toxumu, məsələn, tənbəki, kələm, kartofel, qarpız və qeyrə istəyir isə onun hər bir qismini gətirdə bilmərik. Ona binaən bizim vilayətdə olmayan otların toxumunu xahiş edənlərdən iltimas edirik ki, əgər onları becərməyə məqdur isələr, yazıb bizə mə'lum eləsinlər.

* * *

İstanbuldan fars dilində "Əxtər" qəzeti bu il genə çap olunur. Onun ikinci nömrəsi quyruğu, qulağı kəsilmiş gəlib bizə vüsul oldu. Ondan mə'lum olunur ki, zikr olan qəzet həftədə 2 dəfə çıxır, qiyməti 10 manatdır. Rusiyada sakin olanlardan hər kəs onu gətirtmək istəsə pulunu Tiflis şəhərinə hacı Rəhim taciri-İrəvaninin üstünə göndərsin.

## DAXİLİYYƏ

Qəzet çap edən gərək bəistilahi-türk cümləqayğı olsun, yə'ni xalqın dərdini və onun əlaclarını yazıb mə'lum eləsin ki, anlayan əşxaslar əlacpəzir olsunlar. Çünki bu sözlər xalqın avamlığından nəf'bərdar olanlara xoş gəlməz, ona binaən bir tayfa ziyadə avam olduqcan onun üçün qəzet çıxarmaq ziyadətər çətin olur. Ol səbəbə ki, belədə qəzet oxuyanın çoxu xalqın avamlığından nəf' görən olduğuna xalqın gözünü açan və milləti irəli salan sözü danışmaq olmaz. Bu halda biz bu dərdə mübtəlayıq. Məsələn, bizim Quba uyezdində bir Seyid kəndi var. Bir neçə yüz ev ki, hərə bir eşşək və bir xurcun ilə il uzunu kəndləri gəzib xüms yığmaq ilə zindəganlıq edir və əgər bir kəs deyə ki, bizim şəriətdə belə deyil ki, xüms bu tövr yığılsın və məhz belə adamlara verilsin və zikr olan kəndin əhli yaxşı olurdu ki, eşşək əvəzinə öküz saxlayıb qeyr kəndlərin əhli kimi əkin və ziraət eləsin, tamam seyidlər ona lə'nət oxuyar və ya bir kəs deyə ki, tə'ziyeyi-imam Hüseyn gərək tə'ziye olsun, nəinki adın tə'ziyə qoyub əza saxlayan müsəlman qardaşlarımızın bədəni, vücudu və bə'zi cühhallarının ə'zası şəhadət verir, bəd fe'llər əmələ gətirmək ilə və gecələr məclis bərpa eləmək ilə və o məclisdə naməqbul işlər ilə və faxir libasi-ənən-sənən və zükurən və bə'zi şadyana və cahilanə və namərbut sözlər ilə, ol vaxtda hərə bir tərəfdən dəyənək çəkib onun üstə yeriyir ki, sən dini-islamı zay ktmək istəyirsən. Və ya bir kəs deyə ki, mürid bəizaqi-həqq, amma xalqa dombalaq aşdırıb onu sərgərdan qoyub rüsvayi-cəhan etmək nə lazım? – tamam müridlər ona kafir deyər.

Xülasə, sağ tərəfdə baş çapanların vəkillərinin dəyənəyini, sol tərəfdə seyid və müridlərin lə'nətini, qabaqda mollaların, mərsiyəxanların və qeyrə dad-fəryadını görüb, qəzet çıxardan labüd qalıb gərək dal tərəfə yerisin, yə'ni ya qəzeti mövquf eləsin və ya zikr olan əşxasların könlünə münasib danışsın. Doğrudur, ol əşxaslarda insaf olsa, onları mürur ilə iş üstə gətirmək olur, amma vay odu ki, onlarda insaf da olmaya və bu səbəbə heç danışa bilməyib cəhənnəm oduna yanan kimi bu dərdin oduna yanasan.

Ey zikr olan əşxaslar, bunu fəhm edin ki, sizin dolanacağınız xalq ilədir və diriliyiniz onun diriliyinə mövqufdur və necə ki, insanın qarnında zindəganlıq edən qurdlar insan yediyi görək ilə dolanır və insan vəfat edəndə onlar həm vəfat edir, habelə siz xalqın qanını sorub, onu puç edib, özünüz həm puç olacaqsınız. Pəs, çünki çox yemək adamı az yeməkdən qoyar imiş, belədə insaf yaxşı deyilmi?

## ƏF’ALİ-ƏHLİ-DEHAT

Avropa vilayətlərində əkin yerin maşın ilə şuxm etmək mə’lumdur. Lakin bu maşın ağır və baha olduğuna onu çox adam işlədə bilmirdi və bir də maşın sahibi onu bir yerdə qurub məhz ol yeri şuxm edə bilirdi. Onilə qeyr yeri şuxm etmək məqdur deyil idi. İndi İngilis vilayətində təzədən bir maşın ixtira ediblər ki, onu bir yerdə qurub sonra qeyr yerə də aparmaq olur, özü çox ağır deyil, qiyməti 3 min manatdır. Onilə 3 saatda bir desyatin yer şuxm etmək olur.

Amerikada taxılı biçməkdən ötrü bir təzə maşın qayırıblar ki, onu biçəndən sonra özü dərzlərini də bağlayır. Bir fəhlə maşını sürməyə bəsdir, amma gərək onun dalıncan 12 fəhlə gedib, maşın biçib bağladığı dərzləri yığıb taya vursun. Bu maşın hər gündə on beş saat işləyib 480 desyatin yeri bir həftəyə qurtarır. Bunilə buğda biçməyin xərci, əl ilə biçməkdən birə-beş azdır.

* * *

İngilis vilayətində qoyun qırxmaqdan ötrü bir maşın qayırıblar ki, onilə bir adam bir saatda on altı qoyun qırxa bilir.

* * *

Mə’lumdur ki, buğdanı saralandan sonra biçirlər. Amma indi olunan imtahanlardan belə mə’lum olur ki, onu bir az irəli biçmək dəxi yaxşıdır. Belədə onun danələri heç tökülmür, lakin buğda özü, onun bəlimi, samanı saralmış buğdanınkından yaman olmur.

* * *

Əkin yeri sulanır isə gərək onu duzlayasan və su gələn tərəfini bir az hündür edəsən ki, su axsın. Bizlərdə yeri suya basdırızlar, amma belədə yerin bir tərəfinə az və bir tərəfinə çox az dəyir və bir də belədə su axan zaman torpağı apardığına yeri nahəmvar edir və əkinə lazım olan şeyləri aparıb ol yerin ayağını qüvvətli edir, amma başını qüvvətdən salır. Ona binaən bir yeri düşəndə bir suya basdırmaq olur ki, onun zəhməti azdır, amma həmişə basdırmaq olmaz.

Qeyr vilayətlərdə bir neçə tövr ilə əkini suluyurlar. Əzon cümlə su gələn tərəfdən 10-15 sajın bir-birindən aralı kotan ilə arxlar qayırırlar ki, onların başı, yə’ni su gələn tərəfi dərin və ayağı, yə’ni əkin yerinə çıxan ucu dayaz olur. Bu arxlara birdən suyu buraxanda gedib onların

ayağından çıxıb, mürur ilə əkini basır və ya əkin yerində kotan ilə kön-dələn kiçik arxlar qayırıb (bir-birindən 3-4 arşın aralı), onları su ilə dol-dururlar. Belədə su arxlarda çıxmayıb yerin altı ilə gedib əkini sulayır.

* * *

Paltardan ləkəni bu tövr ilə çıxarmaq olur:

1) Qənd, yapışqan, qandan əmələ gələn ləkəni su ilə yumaq ilə, amma gərək qənd və yapışqan ləkəsimni isti və qan ləkəsini soyuq su ilə yumaq.

2) Yağdan əmələ gələn ləkəni əgər paltar sadə parçadan isə isti su və sabun ilə yumaq ilə, əgər boyanmış pambıq ya yun parçadan isə isti suda ərimiş sabun ilə əgər boyanmış ipək parçadan isə benzin, yə’ni təmiz neft cövhəri ilə, ya yumurta sarısı ilə, ya mel, yə’ni ağ torpaq (uşkolalarda iştənən) ilə yumaq ilə.

3) Yağlı rəngdən, lakdan və smaladan əmələ gələn ləkəni əvvəl gərək benzin ilə və sonra sabun ilə yumaq.

4) Stearin şamından əmələ gələn ləkəni gərək spirt ilə yumaq.

5) Qırıızı şərabdan, meyvə suyundan və qırmızı mürəkkəbdən əmə-lə gələn ləkəni, əgər paltar sadə parçadan isə, o, ləkəni əvvəl kükürd yandırıb onun tüstüsünün üstə bir az tutub dərhal su ilə yumaq ilə və əgər boyanmış parçadan isə, isti suda ərimiş sabun ilə yumaq ilə.

6) Dəmir pasından və rus mürəkkəbdən əmələ gələn ləkəni turşu, məsələn, lumu turşusu ilə yumaq ilə.

7) Neftdən, qırdan əmələ gələn ləkəni sadə paltardan sabun ilə, boyanmış pambıq və yun parçadan ol ləkəni əvvəl piy ilə sürtüb, sonra sabun və skipidar ilə yumaq ilə, boyanmış ipək parçadan da əvvəl piy ilə sürtüb sonra sabun və benzin ilə. Amma lazımdır ki, belə ipək par-çanı altından yuyasan, üzündən yumuyasan.

## MƏKTUBAT

Görünür, Qafqaz müsəlmanlarının təqdirən Vəkili-namə’lumu ancaq əbcəd səbqində ikən bir kamal hasil edib, indi məəttəl qalıb ki, xalq nə dilində və hansı müəllim ilə pərvəriş olsun. Ona binaən bizim millətin elm təhsilini cənab Vəkilə izhar edirik: elməl-təsrif, nəhv, məan, əruz, əlkəf, məntiq, ibadət, ilahiyyat, təsrif, əxlaq, yəqiq, səqa-

yiq, üsul, fiqh, əhkam, ədəbiyyə, hesab, cəbri-müqabilə, riyazət, hikmət, həndəsə, təbiə.

Bu elmləri yunan əhlindən sonra ərəblər kamala yetirib. Onlardan sonra Avropa əhli bu elmlər ilə pərvəriş alıb nə mərtəbəyə yetişməkləri aşkardır. Pəs, mə'lum ki, müəllim və müsənniflər var və zikr olan elmlərdən mürur ilə bəhrəmənd olmaq müşkül deyil. Bizdə ittifaq və Vəkilimizdə həmiyyət olsa, bizim əsrdə olan mütərcimlər ərəb kitabların fars və türk dilinə tərcümə edib bizim üçün asan edərlər. Ələlxüsus bu halda ki, qeyri məmləkətlərdə xəlayiq ittifaq olub ərəb, türk və qeyr dillər ilə pərvəriş verməyə məktəbxanalar bina ediblər. Məsələn, məktəbi-sənaye, təbiə, mülkiyyə, rüşdiyyə, bəhriyyə, hərbiyyə, e'dadiyyə...

Əlbəttə, bu məktəblərdə pərvəriş olanlar bisavad və sənət olmazlar, amma bizlər Rusiya dövlətinin təhti-himayətində şakər ola-ola məkatibi-məzkuriyyələrdən birisinin icadına himmətimiz olmamaq, cavanlara zülm, bizlərə eyib və Vəkilimizə ar deyilmi? Qafqaz vilayətinin bizim kimi nadanları milləti-islamı günü-gündən zəif edən sünni, şiə və qeyr iddiaları araya salıb ittifaqi-milləti fəramuş edib, özgə millətlərin elm-kəmalına və sənəti-əsasına mütəhəyyar qalan zaman bircə "Əkinçi" qəzeti xəlaiqin ittifaqına bais olur və bu əsnada Vəkilimizin tə'nəsi, yaxamızdan əl çək, rəvadırmı? İxvani-xeyirxahi-millətlərdən iltica olunur ki, zikr olan moizeyi-bisəməriyə guş tutmayıb, hər növ ilə xəlaiqin tərbiyyət almağına bais olsunlar.

*Dərbəndi*

* * *

Cənab Hadimül-Qəvaid 3-cü nömrədə baş çapmağın şəriəti-mütəhhərədə caiz və savab olduğunu sabit etdikdə bə'zi dəlaili-namünasiblərə cəng vurubən onu da sair vacibitaət və ibadətlər kimi taətüllah cümlələrindən hesab edibdir. Bavücudi-in ki, şəriəti-Məhəmmədiyyə o qism hərəkatların vəla tülqu bieydiküm ilət-təhlükəti[1] ayəsini məfhumuna mütabiq haramlığına hökm və ona mübaşir və məşğul olan əşxasları füsəqalar cümləsinə daxil qılıb zəmm eləyibdir.

Cənab Hadimül-Qəvaid, aya hansı dəlillərə müstəmsik olub, baş çapmağın şəriətdə caiz olduğunu sübuta yetirdikdə cürbəcür böhtanları qəvaidi-şər'iədən müstəhzər olmayıb cari edirsiniz?

[1] Öz əlinizlə özünüzü təhlükəyə salmayın.

İndi mə'lum olur ki, bizim milləti-islamın həmişə gümrah və zəlalətə düşməyinə belə böhtanlar və nahaq fitvalar ümdə səbəb olublar. Hərgah bizim millət də sair mitllətlər kimi elm və kamal və mə'rifət kəsb və təhsil etməyə məşğul olseydi, o surətdə bə'zi qasürül-əql olan əşxasların əqlən və şər'ən qəbih və qələt olan sözlərinə qulaq asıb zəlalət biyabanında sərgərdan qalmazdılar. Əlavə məcmui-üqəlamız sə'y və kuşiş edirlər ki, bir növ hər cəhətdən ədavət və inadı iki islam tayfalarının arasından götürüb ümuratı sədaqət ilə keçirtsinlər və dəxi də izdiyadına bais olursunuz. Bizim müsəlmanların tərəqqi məqamında olmağına əvvəlinci illət ol ədavətdir və bunun baq i olmağına səbəb o qism kinayə sözlərdir. Mərhəba millət xüsusində sə'y etməyinizə! Amma heyf ki, təksiz, hərgah siz kimi iki nəfər də olseydilər, milləti-islam dəxi ziyadə rövnəq tapardı.

*Məhəmmədəli İsna əşəriyi-Səlyani*

Həsən bəy, fevralın üçüncü günündə və üçüncü nömrədə yazılan cavabı oxudum və küll iqla olunan sözlərə kamilən e'tiqad etdim. Gəl bir tədbir edək. Əgər səlah görürsən, əvvələn, sən Bakı şəhərində ətfali-zükurə üçün kompaniya tərtib edib bir məktəbxana açmaqdan ötrü türki dilində bir müxtəsərcə proyekt, yə'ni tərhəndazlıq yaz. Saniyən, vilayətin mütəməvvillərindən və xalqın məzacından təsərrüfü olan əşxasdan on iki nəfər çay içməyə öz mənzilinə də'vət et. Axunda Molla Cavad sədri-məclisi-ruhani dəxi bu on kiki nəfərin birisi olsun. Salisən, proyektini olara oxu və ağlın kəsən dəlailindən məktəbxana açmağın vücubunu olara təlqin elə və təklif et ki, hümmət göstərsinlər, bir kompaniya tərtib etsinlər, necə ki, erməni camaatı tərtib edibdir və kompaniyanın əvvəlinci üzvləri bu on iki nəfər olsun. Sonra olar başqa kəslərdən öz təvəssütlərilə bu kompaniyaya üzvlər daxil etsinlər. Rabiən, gəl sən hər şəxsdən yüz manat təmənna etmə, əlli təmənna et ki, kompaniyaya versinlər və küll Bakı quberniyasından yüz nəfərin əvəzinə iki yüz nəfər siyahi et. Hər birisi əlli manat versə, guya yüz nəfərin hər biri yüz manat verən kimidir. Onra bu tədbirin nəticəsi hər nə olsa, qəzetində yaz e'lan et ki, mən dəxi oxuyum. Əgər Bakı əhli bir belə əməli-xeyrə iqdam etsə, sair şəhərlərdə məktəbxanaların açılmağını və kompaniyalar tərtib olunmağını yəqin bil, mən zamin.

*Vəkili-namə'lumi-millət*

* * *

Cənab Axund Molla Cavad, sədri-məclisi-ruhaniyə ərzi-salamdan sonra mə'lum olunur ki, bəndə Vəkilimiz buyurduğu kimi proyekti hazır eləmişəm. Ona binaən cənab axunddan təvəqqə edirəm ki, vilayətimizin mütəməvvillərindən və xalqın məzacından təsərrüfü olan əşxasdan on iki nəfər cəm edib bəndənin mənzilinə təşrif gətirsin və ya onları bir qeyr yerə çağırıb mənə mə'lum eləsin ki, gəlib zikr olan proyekti onlara oxuynm.

## TƏZƏ XƏBƏRLƏR

Osmanlı dövləti serblər ilə sülh edib, bu şərtələr ilə: 1) Serblərdə ixtiyar yoxdur ki, təzədən qala tikdirsinlər və Osmanlı sərhəddində olan Aleksanas və qeyr qalaları gərək dağıdıb tələf eləsin. 2) Serb torpağında Osmanlı dövlətinə düşmən olan icma bina ola bilməz. 3) Keçmişdə olan kimi Belqrad qalasının üstə Osmanlı baydağı asılsın və bundan savayı Serb verən xərcin qədəri və Serbistandan Osmanlı apardığı dəmiryollar barəsində əlahiddə danışıq olacaq və bir də Osmanlı dövləti deyib ki, dövlət öz bərabəri ilə sülh edir. Çünki Serb əlahiddə dövlət deyil, ona binaən həzrət sultan öz fərmani-hümayunilə o şərtləri Serb əhlinə ən'am edib, onları knyazı Milanı knyazlıqda təsdiq edib.

* * *

İngilis dövlətinin vəzirlərinin – ki, Osmanlı tərfini saxlayırlar, – düşmənləri ümid olmuşdular ki, İngilis dövlətinin millət məclisi aılnada xalq onları xaric edəcək. Amma indi gələn tellərdən mə'lum olur ki, o məclisdə olan danışıq Osmanlı xeyrinədir və vəzirlərin düşmənləri dəxi danışmırlar.

* * *

*"Tiflisski vestnik"də çap olunan tellər:* 1) Parijdən fevralın 17-də. Deyirlər ki, ingilis dövləti təvəqqə edəcək ki, Osmanlı dövləti özü qoyduğu qanunlara əməl edincən qeyr dövlətlər onun işinə qarışmasın və genə Qaradağ sərhəddində olan Osmanlı tabeləri meriditlər təzə-

dən bunt ediblər və genə İngilisin cəng gəmiləri Osmanlı dəryalarından çıxıb Malta cəzirəsinə gediblər.

*Fevralın 21-dən.* Belə mə'lum olur ki, Osmanlı dövləti xahiş elir Rusiya dövlətinə desin ki, sərhəddə cəm olan əsgəri əldən qoysun və genə general İqnatyev, gözüm ağrır müalicə edəcəyəm, – deyib Berlin şəhərinə gedib, oradan Parijə aə Londona gedəcəkdirlər. Onun muradı budur ki, Avropa dövlətlərinə mə'lum eləsin ki, əgər onlar Parij sülhnaməsini ki, onlar Osmanlıya zaman olublar, bərhəm etsə, Rusiya əsgəri əldən qoyacaq. Qaradağ ilə sülh hələ olmayıb, təzədən 21 gün möhlət olub ki, dava olmasın və bu halda İstanbulda sülh barəsində danışıq olur.

* * *

Peterburqdan "Bakinski izvestiya" qəzetinə yazırlar ki, Badkubədə qayrılan neft cövhəri günü-gündən qiymətdən düşür və buna səbəb oldur ki, Amerika cövhəri çox təmiz olduğuna hamı onu iştədir, əgərçi o, Bakı cövhərindən baha satılır.

* * *

Osmanlı dövlətinin Tehranda olan vəziri-muxtarı fevralın 27-də Badkubə şəhərinə gəlib, burada iki gün qalıb, Qafqazdan keçib İstanbul şəhərinə gedəcək ki, orada ona vəzirlik veriblər.

* * *

Deyirlər ki, Badkubə qubernatoruna kağız gəlib ki, Badkubə quberniyasının şəhərlərində bu yavıq zamanda şəhr qərardadı qoyulacaq.

Quba şəhərindən yazırlar ki, boyaq sınandan sonra Quba şəhrində oğurluq çox şiddət edib. Bu yavıq zamanda bir neçə adam gedib ki, bir evi qarət etsin, mmükün olmayıb. Ol vaxtı onlar bir bəd pişiyi tutub gətirib haman evin bacasından içəri atıblar. Pişik bu yan-o yana qaçdığına sahibi-xanə qapını açıb ki, pişik çölə çıxsın. Bu halda oğrular içəri daxil olub, evi qarət ediblər və genə Quba üyezdinin kəndlərinin birisindən yazırlar ki, Quba şəhrində "Əkinçi"nin müştərisi az olmağa bir səbəb də budur ki, keçən illər uyezdin naçalnik kənd əhli üçün gətirdiyi qəzetləri onlar qabaqcadan oxuyub, sonra kənd əhlinə göndərirdilər və indi genə ümiddirlər ki, keçmişdəki kimi müftə qəzet oxuyacaqlar və gözləyirlər ki, naçalnik kənd əhli üçün qəzet gətirsin.

* * *

“Əxtər” qəzeti yazır ki, keçən məhərrəm ayının 9-can komisyon ianeyi-hərbiyyəyə 40 milyon quruş vəchi-ianə və imdadiyyə təslim olub və genə bir ingilis zikr olan komisyona 378 quruş əsakiri-osmaniyyənin qış paltarından ötrü verib və genə yazır ki, Osmanlı əsgərindən zəxmdar olanlara ianət etməkdən ötrü London şəhərində bir cəmiyyət binə olub ki, keçən məhərrəməcən 6500 lirə cəm edib.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского
Губернского Правления.

*Fi 13 rəbiülləvvəl, sənə 1294*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Pəncşənbə günü*




*Fi 17 mart Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*1 sənəliyi – 3 manat*
*6 aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

***E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.***

Bizə Badkubə poştuna salınan məxfi kağız göndərən kəs indi bizi həcv edib, onu Qarabağ poştuna salıb göndərib. Adına Hadiyül-Müzillin Qarabaği deyir. Çünki bir ləqəb ilə insanı tanımaq olmaz, ona binaən cənaba mə'lum edirik ki, özünün və atasının adını və sakin olduğu yeri yazıb mə'lum eləməsə, bizdə ol həcvi çap etməyə ixtiyar yoxdur.

## DAXİLİYYƏ

Keçən nömrədə bizim xalqın tərəqqi etməyinə Mane olan əşxaslardan danışanda bizim müsəlmanlardan olan əmələcatdan qəsd ilə danışmaqıq ki, indi onlardan əlahiddə danışaq.

Dövləti-Rus bizim vilayəti zəbt edəndən irəli bizim Qafqaz müsəlmanları öz avamlığından dünyada bəylikdən artıq xoşbəxtlik bilmədiyinə dövlət onlar üçün elm təhsil etməkdən ötrü bina elədiyi məktəbxanalara məhz bu qəsd ilə giriblər ki, oxuyub bəy olsunlar, yə'ni basıb-kəsmək ixtiyarını kəsb eləsinlər. Əlbəttə, belə bəylik axtaran kəs xalqın xoşbəxtlik fikrini çəkməz. Onun üçün pul gərəkdir ki, kefdamağa məşğul ola və millət əvəzinə heyvan gərəkdir ki, ona hakimlik edib, öz bəyliyini zahir edə. Bu səbəblərə zikr olan əşxaslar ol məktəbxanalarda elm təhsil etmək acı olduğuna onu heç dadmayıb ancaq adətlərin dəyişdiriblər, yə'ni yeyib, içib, geyib, durub-oturmaqda özlərini xaricilərə oxşadıb, əslən elmdən bixəbər qalıblar.

Bir tərəfdən xalq bu əşxasların təzə adətlərini görüb onlardan millət üçün heç bir səmərə görməyib. Nə ki elm təhsil etməyə sə'y etməyib, hətta elm təhsil edən müsəlmanların hamısını kafir hesab edib, indiyəcən ol məktəbxanalara yavıq gəlmir. Bir tərəfdən məzkur bəylik axtaran kəslər işin belə olmağını özlərinin xeyri hesab edir, xalqın gözü açılmağa sə'y etməyib, öz adətlərinin dəxi ziyadə dəyişdirib, hətta onlarnın bə'zi həqiqət yolundan bilmərrə çıxıb, belə bəd əməllər ilə xalqı elm öyrənmək yolunu qabağını kəsib, onun dəxi ziyadə avam olmasına bais olublar.

Bilirəm, bu sözləri oxuyub həzərat bizdən rəncidə-xatir olacaq. Amma, dustan, insaf deyil ki, qeyrilərini eybindən danışıb, öz eybimizi xalqdan gizlədək. Əlbəttə, bu halda bizlərdən 5-10 elm sahibi və millət təəssübü çəkən olsaydı, bizim millət belə qara günə qalmaz idi.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Çünki kənd əhlinin güzəranı əkin və ziraət ilə olur, onlar az olanda və ya heç olmayanda onlar üçün güzəran çətin olur, ona binaən Avropa vilayətlərinin hər bir kəndində camaat anbarı olur ki, hər kəs, yə'ni icmanın calisi öz hasilinin bir hissəsini oraya yığır. Bu anbardan hasil az olan ili hər calis borc ala bili rvə qeyrlərə həm borc vermək olur və əgər mə'kulat anbarda çox olsa, onu satmaq da olur.

* * *

Amerikada çəyirtkə çox zərər elədiyinə keçən fevralda əkinçilər və bə'zi hükəma Olmağ şəhərinə cəm olub qət ediblər ki, ol quşlar ki, çəyirtgəni tələf edir, onları öldürmək qadağan olsun və hər kəs çəyirtgə və onun toxumunu yığıb icmaya pişnəhad eləsə, onun qədərinə görə ona pul versinlər.

* * *

Avropa əhli çuğundur kökünü qaramala ələf yerinə yedirdirlər. Əlbəttə, onlar böyük olduqcan yaxşırıq olurlar. Ona binaən ingilis əhli elə çuğundur əmələ gətiriblər ki, onun hər bir kökü 45 girvənkə olur.

* * *

London şəhəri Temza çayının kənarındadır. Ol çayın lilindən ingilislər yağ çəkirlər ki, ol yağdan şam qayırıllar.

* * *

İngilisin cəng gəmilərində təzə lodkalar qayırallar ki, çadır kimi qatdalanır. Ona binaən, bir gəmidə çox lodka saxlamaq olur ki, dərya-nın dayaz yerlərində onlar ilə iş görmək yaxşıdır.

* * *

İngilisin Mançester şəhərində bir karxana açılıb, mal gönündən at nalı qayırır. Yazırlar ki, bu nal yüngül olduğuna və isti-soyuqdan təğyir tapmadığına dəmir naldan çox yaxşıdır.

## MƏKTUBAT

Kapitan qardaş, baş sənin, qılınc sənin, tə'ziyə büsatı o dəlil ilə ki, sən danışırsan, xilafi-hökmi-şər və rə'yi-üləmayi-millətdir. Rüsumi-tə'ziyə hər vilayətin adətinə görədir. Kərbəlayi-müəllada, Nəcəfi-Əşrəfdə, Məşahidi-müqəddəsdə, Məkkə və Mədinədə, İranın paytaxt şəhərlərində, bələk dini-islama peyrəvilik edən dehatda baş çapmaq əsası yoxdur. Bəs nə qədər istəyirsən, başını çap. Əgər məhəbbəti, imam və şuri-tə'ziyə ilə edirsən sən bil və iman (imam əsla belə qəbih əmələ razı olmaz) ki, heç kim səni mən' eləməyəcəkdir. Amma millətlər içində məzhəbini rüsva edib baş çapmaq da şəraiti-islamdandır deyib, adına böhtan bağlama və xalq arasına ədavət salma. Bu od ki, biz düşmüşük, üfürməmiş alışır, bir yədi-qeyb gərəkdir ki, onu söndürə. Sair millətlər ölülərinə ağlasalar, biz dirilərimizə gərək ağlayaq. Nəzm:

Xəyali-xatirin hər ləhzə kim, könlüm xəyal eylər,
Belə fikri görər, hərgiz nə bir əhli-kamal eylər.

Təsaviyi-ədalət qoydu islam içrə peyğəmbər,
Müsəlmanlar buna hər dəm vifaq ilə misal eylər.

Namaz, cəm'i-cümə, həcci-minayi-məscidü minbər,
Bular hamı məhəbbət tərzi-tərğibi-vüsal eylər.

Hünər əshabının əzmi qəmu tərkibi-əczadır,
Qərəz ərbabı hər dəm kövnü kannı hübb hal eylər.

Xəyali-ittihad ilə böyüklər keçdilər candan,
Kiçiklər xəlqara kini qərari-xud cəlal eylər.

Düşiüb meydana bihudə özün əğyarə güldürmə
Ki, aqil kəs, belə karı yəqinimdir məhal eylər.

Bu fe'li-zişdi qıl təhqiq divani-şəriətdən,
Zəbani-mən'lə kərrati-nəhy buxsal eylər.

Gər islamı sevirsən, tut təriqi-rəsmi-insani
Ki, islami küdurətdən bu ad safü zəlal eylər.

Müsəlman ol, müsəlman ol, murad oldur ki, insan ol,
Xilas ol bu cəhalətdən ki, ömrün ən az məcal eylər.

Görürdük ol zaman biz rütbeyi-islamı baladə
Ki, əhli-şiəvü sünni ikisi bir məqal eylər.

Məzahib vəz' edən kin əhlinin mizani-ə'malı
Gəlir əyri o gün kim, hökmi-rəbbi zülcəlal eylər.

Səmimi-qəlb ilə hər dəm çağırır mərdi-İrani
Ki, lal olsun o dillər kim, bu işdə qiylü-qal eylər.

*Petrovski, martın 5-i Heydəri*

Əgərçi istəmirəm cənab Hadimül-Qəvaidə cavab yazım, çünki qəzet oxuyanlar müntəzir olur, lihaza ərz olur:

1) Qardaş, söz gərək filhəqiqə sidqi-səvab olsun, müstəme' qəbul edə-etməyə. Şəxsi həkimin qövlünə nöqsanı yoxdur, necə ki, təbib gərək mərəzi bilsin, davanı müvafiq desin, məriz əməl etdi, ya etmədi, təbibin borcu deyil. Pəs qardaş:

Ma süxənra becayi-xud güftim.
Gövhəri bud səftəni səftim.
Gər nəyayəd beguş rəğbəti-kəs,
Bərrəsulan pəyam başədü bəs[1].

Sizin ləqəbinizdən və sərsam kimi danışdığınız sözlərdən mə'lum olur ki, naxoş olasınız. Hadimüzzat siz cənab ilə tez müamilə etsin ki, naxoşluğunuz başqa qardaşlara dəyməsin.

2) Əməl gərək ki, bir qanun və qayda ilə mütabiq olsun. Bax, yer üzündə olan millətlərin qanunlarına ki, ağıl hikmət üzündən əksərin şəriətlərdən intixab ediblər. Hansı belə ibadət buyurub və on gəhi bizim 5 firqeyi-islam ki, aləmi-ittihadda beş barmaq kimidir əgərci 4-ü bir tərəfdə və biri bir tərəfdə vaqe olan kimi, iki dövlət hesab olur, amma ittihad məqamında bir əldir. Bu mətləbdə dəlaili-hüsn darim, amma qəzetə münasib deyil.

---

[1] Biz bu sözü deməklə deşilməli bir cəvahiri deşdik. Əgər bir şəxs bizim sözümüzə rəğbət etməsə, peyğəmbərin borcu çatdırmaqdır, vəssalam!

Qərəz, bu beş firqənin hansı kitabında belə ibadət yazılıb ki, qəmə ilə öz başını çap ki, mən tə'ziyədarlıq edirəm? Bəli tə'ziyədarlıq şiə camaatında artıq lazım və mə'muldur, belə ki, imamlar buyurub məsacidi-məhafildə beş nəfər, ya beş yüz nəfər cəm olub zikri-müsibət edib ağlarlar. Tavana kəslər pul məsrəf etmək və fəqir qardaşlar o məcalisə hazır olmaq və xidmət etmək ilə feyziyab olurlar, bəlkə çox böyük xəvaninlər fəqir qardaşları cəm edib. Süfrələri üstə oturub, onlara təam və şərbət, qəhvə vermək ilə həm tə'ziyədarlıq və həm müvaxat əmələ gətirib və özləri fəqir qardaşlara xidmət edib, bəlkə başmaq cüft edərlər. Əlbəttə, buə məli hər bir tayfa pəsənd edər və heç zişüur inkar edə bilməz, bərəks baş çapmağı heç bir zişüur pəsənd etməz.

3) Məni ehkami-şəriəti bilməyib danışan və lazımül-tənbeh hesab edibsiniz və baş çapmağı haramlıqdan döndərib və mən yüəzzim şəariəllah[1] ayəsin baş çapmağa tə'vili etməkdən görünür ki, siz buyuran 74 firqeyi-islam natamamdır ki, 75-ci firqə olasınız. Bu surətdə gərək başınızı bədəndən cida edəsiniz ki, o gün seyyidüş-şühədanın başı bədəndən cida olub.

Baqi yazılacaq

* * *

"Mşak" qəzetinin münşisi müsəlmanları vilayətlərdən çıxarmağa çox tə'cil edir və özün ağıl və elm sahibi deyir. Ağıl və elm sahibi olan çox tə'cil etməz, işin axırına baxar. Əgərçi ermənilər elmdə tərəqqi həm edələr, müsəlmanları bu vilayətlərdən çıxartmaq müşkül və məhaldır... Ey bəsa arizu ki, xak şəvəd.[2]

* * *

Bu il Gilandan qış olmadı. Nə göydən qar yağdı, nə yerdə bir qətrə buz dondu. Bu gün ki, səfər ayının 22-sidir, 15gündür ki, ağaclar yaxşı gül açıblar. Kahu heç payızdan qurtarmayıb, həmişə yeyilir. Buranın əhli çox istəyir bilsin ki, qış belə olanda bahar necə olur və novğun üçün necədir?

*Əhsənül-Qəvaid*

---

[1] Allahın şüarlarını kim böyüdür.
[2] Bir çox arzular var idi kip, məhv olur.

* * *

İnsan həmişə istəyir ki, gələcəyi bilsin. Bu səbəbə xalqın avamlığından nəf'bərdar olanlar ulduzlara, ya suya, ya insanın əlinə baxmaq ilə və ya qeyri fal ilə xalqa gələcəkdən xəbər verillər. Əlbəttə, bu xəbərlərin əsli yoxdur və əgər onların bə'zi doğru olur isə, yəqin ki, bə'zi olmayacaq, amma avam kəs doğru olanları görüb onların hamısına bavər edir. Belədə xalq gün-gündən ziyadə avam olur. Pəs hər sözü bavər etməyib, onu əqlə rücu etmək insanın tərəqqi etməyinə bais olur.

Havanın dəyişilməyindən meteorologiya elmi xəbər verir. Bu elm ilə qayrılan əsbablar ilə havanın dəyişilməyini 1-2 gün irəli bilmək olur, artıq olmaz. Amma elmi-ziraətə görə quraqlıq olan yerdə qışda yağınlıq olmaq əkin üçün, ələlxüsus, payızdan əkilən əkin üçün yaxşıdır ki, belədə yer nəmiş olur. Amma qış yağınlıq olmayanda, bahar necə olmağı bilmək mümkün deyil.

* * *

Zəkərtala şəhərindən yazırlar ki, bir dağıstanlı Əli adlı kişi saqqal və bığını naqqaş ilə didib, övrət libası geyib adını Nazlı qoyub, bir neçə ildir Zəkərtala şəhərində və onun ətrafında olan kəndlərdə qarabaşlıq edir və genə yazırlar ki, keçən noyabr ayında Car qəryəsinin dəyirmançısı qız və gəlinlər dəyirmana gələndə onları görüb hərəkətə gəlməkdən özünü saxlamaqdan ötrü, bir iti bıçaq ilə istəyib özünü axtalasın, amma ol zaman qəşş edib onu bir gün bir gecədən sonra tapıb, divanxanaya göndərib, mərizxanada ona 3 ay müalicə edəndən sonra sağ olub.

* * *

Quba uyezdinin Həsənqala kəndindən yazırlar ki, keçən fevralda ay tutulan zaman o kəndin əhli tüfəng atdığına orada sakin olan saldatlar elə fikir edib ki, onların üstə gəlirlər. Ona binaən tüfəng-yarağı götürüblər ki, cəng başlasınlar, amma əfsərlər xəbərdar olub, onları saxlayıb.

## ELM XƏBƏRLƏRİ

Necə ki, qarınca çox kiçik isə də, həmzəhmət olub özünə çox yaxşı yuvalar tə'mir edir, habelə insan da həmzəhmət olanda onun nəf'i ziyadə olur.

Avropa hükəmaları bir həmzəhmətlik elmi bina ediblər, adı elmi-qənaət politiki (politiçeski ekonomiya). Bu elm insan dünyaya gələndən bəri, onun həmzəhmət olmağına mülahizə edib, onu iki qism edir: əvvəlincə qism ki, Avropa əhli üçün qədim zəmanədə olub və bizim üçün bu halda vaqedir. İnsan, məsələn, ev tə'mir etməkdə həmzəhmət olub, belədə hər kəs bir işə məşğul olur. İnkinci qism həmzəhmət olmaqlıq bu halda məhz Avropa əhlindən vaqedir. Məsələn, saat qayırmaqdan ötrü 102 sənət var ki, hər sənətkar saatın bir hissəsini qayırır, ya gəncəfə kağızını 70 cürə ustad qayırır və ya sancağı 10 sənətkar qa yırır ki, bu 10 adam bir gündə 47000 sancaq qayırır. Bavücudu ki, bir kəs bir gündə bir sancaq qayıra bilməz. Pəs Avropa əhlinin belə tərəqqisinə bir səbəb də onların həmzəhmət olmağıdır. Ona binaən ki, insan bir işə məşğul olanda, o iş nə qədər az olsa, ol qədər insan ona artıq adət edir və bu səbəbə onu çox tez əmələ gətirir.

*Nəcəf Vəzirzadə*

## TƏZƏ XƏBƏRLƏR

Tiflisdə olan at divanxanası mə'lum edir ki, bu il oktyabr ayında Tiflis şəhərində at çapılacaq. Hər kəs at necə çapılmağı və o atların necə saxlamaq xəbərini zikr olan divanxanadan bilə bilər.

Zəngan şəhərinin 4 ağaclığında Gavənd adlı qəryədə tapılan qızıl mə'dəni xüsusunda çox danışıq var. Kimi deyir ki, dövlət bə'zi vahimələr eləyib, istəmir bu iş mə'lum olsun. Mə'dəndə qızıl ərinmir, gecə pünhan yüklənib Tehrana gedir. Əminüs-Sultan deyilən şəxs ki, bu əmələ mə'murdur, mə'dəndən bir qədər fasilə çadır qurub, gecə qızılı tapan kişinin və qeyr fəhləlrin ayağın buxovlayıb, gözün bağlayıb, oraya aparıllar. Səhərə yavıq gətirib, buxovun və gözün açıb, mə'dənin yolun basdırıllar. Kimi deyir ki, qızıl tapan kişinin hər gündə ayağını bağlayıb döyürlər və istəyirlər ki, onun başını kəssinlər. Amma bə'zi deyir ki, o kişiyə ildə beş yüz tümen məvacib verillər. Xülasə, danışıq çoxdur. Amma hamı deyir ki, qızıl çox çıxır. 100 misqal mə'dəndən 93 misqal xalis qızıl əmələ gəlir.

* * *

“Mşak” qəzeti həmişə yazır ki, Osmanlı dövlətinin zülmündən ermənilər qaçıb Rusiya vilayətləriə köçür və bir dəfə yazıb ki, filan günü bir böyük dəstə erməni başaçıq, ayaqyalın Gömrü qalasına gəlib. İndi ermənilərin qeyr qəzetlərinə Gömrü qalasından yazırlar ki, bu xəbərin heç əsli yoxdur və indiyəcən Gömrüyə bircə də erməni gəlməyib.

* * *

Rusiya dövlətinin yəhudi tabelərinə ixtiyar yoxdur ki, hər bir şəhrdə sakin olsunlar, o cümlədən bizim Qafqaz şəhərlərində. İndi “Tifliski vestnik” qəzeti yazır ki, Tiflisdə sakin olan yəhudilərə polisəxana mə’lum edib ki, gərək Tiflisdən çıxıb getsinlər.

* * *

“Kafkaz” qəzeti yazır ki, Dağıstan əhlindən cəm olan əsgərə Zəkərtala okruqu gərək 400 adam verəymiş, o cümlədən 1000 ev Car kəndi 13 adam. Onlar əsgər verpməyə razı olmayıblar ki, öz xahişi ilə istəyən getsin. Bu səbəbə cənab sərdar Dağıstan divanxanalarının hakimi general Frankiniyə hökm edib ki, 2 batalyon soldat və bir batareya top ilə gedib onlara nəsihət eləsin. General əsgər ilə Car kəndinə gələndə kəndin əhli onları öyrədənləri tutub, ona verib və 13 adam əvəzinə 30 adam əsgərə verib.

* * *

İstanbuldan yazırlar ki, məclisi-ümumin calisləri hər vilayətdə intixab olub. Bu martın 13-də məclis açılacaq. Çünki dövlət üçün əsgər saxlamaq çətindir, ona binaən zikr olan məclis gərək qət eləsin ki, dava olacaq, ya olmayacaq.

Peterburqdan yazırlar ki, bu yavıq zamanda dövlət zamin olan obliğatsiya kağızlarından Avropa vilayətlərindən Peterburqa bir milyon manatlıq satmağa göndəriblər.

* * *

*“Tiflisski vestnik”də çap olunan tellər:*

1) *Peterburqdan fevralın 28-də.* Rusiya dövlətinin “Agent” rus qəzeti yazır ki, bu halda Avropa dövlətlərinin arasında danışıq olur ki, əgər Osmanlı dövləti müəyyən olan və’dəyəcən qanunu qoymasa, neynəmək gərək.

2) *Londondan martın 2-də.* Rusiya dövləti Osmanlı işləri barəsində Avropa dövlətlərinə pişnəhad elədiyi proyekti vüzəra məclisi mülahizə edib. Vəziri-xaricə Derbi və Rusiyanın vəziri-muxtarı Şuvalov proyektin şərtləri barəsində razı olublar və ümid ki, bu günlərdə ona qol çəkilsin və genə martın 4-dən. Bu gün general İqnatyev Londona gəldi.

3) *İstanbuldan fevralın 26-da.* Qaradağın vəkilləri Osmanlı dövlətindən Nəkşəç, Spitsa qalalarını 12 kənd və bir dəryə kənarında Bargah və Bayan çayında gəmi saxlamağa izin istəyir.

*Martın 5-də.* Vüzəra məclisi Qaradağın şərtlərinin heç birisini qəbul eləmədi.

*Martın 8-də.* Qaradağın vəkilləri razıdır ki, Osmanlı dövləti onlara bircə Bayan çaynda gəmi saxlamağa izin versin.

*Martın 13-də.* Qaradağ ilə aprelin birinəcən sülh olub ki, bu zaman cəng olmasın.

*Martın 5-də.* Üləmalar və tələbələr istəyir ki, dövlət Midhət paşanı gətirsin. Bu barədə gizdin kağızlar yazıb xalqa paylanır. Xalq dövlətdən çox narazıdır.

*Martın 8-də.* Bu gün millət məclisi açıldı.

* * *

Bu halda Senatda dövlətə asi olan kəslərin işinə mülahizə edirlər. O kəslər Moskva, Tula, Oryol və qeyr şəhərlərdə bir gizdin icma bina edib, xalqa dövlət qadağan edən kitabları paylayırlar imiş. Onların bir neçəsi gürcüdür.

* * *

"Kavkaz" qəzeti yazır ki, Badkubə şəhərinin intixab edici komissiyasına cənab Cakeli rəis tə'yin olub. Deyirlər tel var ki, ol cənabı Badkubəyə qlava tə'yin ediblər.

Badkubədə çox bahalıqdır və bə'zi şey, məsələn, mal əti heç tapılmır.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

Fi 27 rəuüləvvəl, sənə 1294

* * *

Poşt xərci basdıran ilədir

* * *

Pəncşənbə günü




Fi 31 mart Rusiya, sənə 1877

* * *

Qəzetin qiyməti

1 sənəliyi – 3 manat
6 aylığı –
1 manat 50 qəpik

* * *

2 həftəlik qəzet

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Qafqaz vilayətinin məktəbxanalarının hakimi cənab sərdar buyurmağına görə hökm edib ki, padşahlıq məktəbxanalarının (gimnaziya, progimnaziya, realnı uçilişa) priqotovitelni klaslarına girən kəslər gərək rus dilində yazıb oxumağı bilsin, yoxsa onları qəbul etmək olmaz və hökm olunub ki, ol məktəbxanalara girən kəslərin yaşı bu qərardan ziyvadə olmasın: əvvəlinci klasa 12, ikinci klasa 13, üçüncü klasa 14, gördüncü klasa 15, beşinci klasa 16.

* * *

Qarabağdan yazırlar ki, ağköynək barəsində bizim qəzetdə yazılan sözlərdən ötrü bə'zi avamlar bizi həcv edib, hətta istəyirlər imiş bizdən ərizə versinlər ki, guya ol sözlər məzhəbə dəyən sözlərdir. Əgər bu xəbər doğru isə, Hadiyül-Müzillin həqiqət qarabağlı isə, Qarabağın anlayan kəslərinə ərz olunur ki, gözünüz aydın olsun.

* * *

Müştərimizin qədəri bir illik 163, yarım illik 21.

* * *

Seyyidani-Şirvan və İrəvana mə'lum olur ki, bu halda çapxanada şəhər qərardadı türk dilində çap olunduğuna, siz göndərən şe'rlər gələn nömrəyə qaldı.

## DAXİLİYYƏ

Mə’lumdur ki, xristianlar öz ölülərini üçüncü günü basdırıllar və lakin elmi-hikmət aşkar edir ki, bə’zi vaxtda insan elə yuxuya gedir ki, onun nəfəsi kəsilir, bədəni soyuyur, xülasə belə yuxu ölümə oxşuyur, amma bir neçə gündən sonra genə yuxudan ayrılır. Belə ölü ilə həqiqət vəfat edənin təfavütü budur ki, həqiqət ölünün bədəni bu bir neçə gündə çürüyür, amma belə ölüyə oxşayanın bədəni çürüməz və əgər bir həftəyəcən belə yuxuya gedən ayılmasa, onun ağzına ət suyu tökmək gərək ki, acından ölməsin. Bu səbəblərə 30 il bundan əqdəm İngilisin London şəhərində və bu halda tamam Avropanın böyük şəhrlərində camaat bir imarət tə’mir elədib, vəfat edənləri orada onun bədəni çürümək başlayncan saxlayb, sonra dəfn edir və həqiqət belə ölü hesab olunan kəslərin bə’zi yuxudan ayılır. Çünki bizim adətimizə görə mərhum olanlar dəxi tez basdırılır, ona binaən bizim yuxuya gedib, ölü hesab olunanlarımız dəxi ziyadə basdırılır. Bu səbəblərə yaxşı olurdu ki, bizim qəbirstanlıqlarda hər camaat bir imarət tə’mir edib, mərhum hesab olunanları zikr olaq qayda ilə saxlayıb, sonra dəfn edəydi.

Çünki Hadiyül-Müzillin Qarabaği kimi avamlar hər bir elm sözünü eşidəndə onu şəriətə namüvafiq hesab edib, bizi həcv edib lə’nət oxuyurlar, ona binaən lazım bilib onlara ərz edirəm ki, xudavəndi-aləm buyurub ki, ölünü basdırın, dirini basdırmağı, yə’ni insanı öldürməyi qadağan edib və sizin ağlınız naqis olduğuna ölüyə diridən təfavüt verə bilməz və bir də, ey əvamünnas, hər bir hikmət sözünü eşidəndə deyirsiniz ki, bu şəriətə rəxnə vurur. Bəvücudi ki, o söz siz sizin avamlığınıza rəxnə vurur. Məsələn, sizin əqidənizə görə başmaq, papaq geymək də, dizi üstə əl ilə çörək yemək də şəriətin şərtlərindəndir.

## ƏF’ALİ-ƏHLİ-DEHAT

Çürüyən almanın çürük yerində kiçik, gözə görünməyən ələfiyyat əmələ gəlir ki, almanın çürüməyinə bais olur. İndi yazırlar ki, ol ələfiyyatların toxumunu sağ almanın üstə salanda o çürümür, amma zədə düşmüş almanın üstə salanda ki, beləd o toxum almanın suyuna dəyir, çürüyür və bir də alma nə qədər artıq yetişmiş isə, ol qədər tez çürüyür.

* * *

Qarğıdalının (peyğəmbər buğdası) unu və bu undan bişmiş çörək tez kiflənir, yə'ni göyərir. İndi yazırlar ki, o göyərti çox bərk zəhərdir.

* * *

Bu halda Avstriya mələkətinin hükəmaları öz vilayətləri üçün quşları şikar etmək barəsində təzə qanun yazırlar. Deyirlər ki, quşların yuvasını dağıtmaq və onları tor ilə, yə'ni bir yerdə çox quş tutmaq qadağan olacaq. Çünki insan quşları əldə saxlayanda onun xasiyyətini və yediyi xörəyi bilir, ona binaən onları qəfəsdə saxlamaq qadağan olmayacaq. Və bir də çünki avam qadağan olmağa baxmayıb, öz avamlığından onları tələf edir, ona binaən hökm olunacaq ki, hər bir məktəbxanada quşların xasiyyətlərini və onlar insana elədiyi nəf'ləri oxutsunlar.

* * *

Yazırlar ki, 1848-ci səənyəcən Avropa əhli qarğıdalı iştədmirdi, sonra onu heyvana yedirtməkdən ötrü və indi özləri həm yeməkdən ötrü çox gətirdillər. Məsələn, keçən il Amerikada bircə İngilis vilayətinə 9 milyon çetvert qarğıdalı gəlib.

* * *

Bizlərdə dəmir və fulad şeyləri qayırandan sonra soyuq suya salıb soydurlar bərk olsun, amma Avropa karxanalarında onları belə soyudurlar: 2 put kit (suda olan heyvandır) yağı, 1 put mal piyi, 4 girvəngə mum bir yerdə əridib, soyudub bir neçə qaba tökürlər. Sonra zikr olan şeyləri ol qablara növbət ilə, yə'ni birisini bir qaba və o birisini qeyr qaba salırlar ki, piyi qızmasın. Sonra ol şeyləri çıxardıb, ağzını bir az silib, daş kömürü yandırıb şeyi onun üstə tuturlar ki, onun ağzında olan piy yansın. Zikr olan qayda ilə qayrılan piy bir aydan sonra xarab olur, gərək ol vaxtda onu təzədən qayırasan.

## MƏKTUBAT

Qərəz Hadimül-Qəvaid qardaş, əməl gərək mə'quliyyət və ədəb ilə olsun, ta fayda versin. Bəndəlik edən şəxs gərk ağası buyuran kimi əməl etsin. Qardaş, sizin mə'rifətinizə binaən avam ixtira edən tə'ziyədarlıq imam buyuran tövrdən yaxşıdır. Mərhəba sizin mə'rifətinizə ki, siz

mə’rifətdə olan kəslər bizi mə’rifətdən qoyub. Odur ki, hükəma deyib: düşməni-dana beh əz, nadani-dust1. Heyhat ki, sən fərasətdə olan qardaşların vücudilə bizim millət zillət və məskənətdən xilas olub hünər və izzət məratibinə yetişsin. Qərəz, cənab Hadimül-Qəvaid, necə oldu ki, sən Hadimül-Qəvaidlik ilə xeyirxahi-millət oldun, amma mən Əhsənül-Qəvaidliyimə bədxah oldum ki, mənim haqq sözlərimi ki, əql hikmətindən tülu’ edib böhtan hesab edirsiniz, amma öz böhtanlarınızı ki, məni gah Şümür, gah özgə xitablar ilə müxatəb elədiyinizi böhtan hesab etməyib, qanmıya-qamıya meydana gəlib boş top-tüfəng ilə binayi-cəng qoyubsunuz. Əlhəqq, siz gedən yol Kə’bə və Minaya gedir. Amma buyurubsunuz ki, insanda nəfsi-ləvvamə var ki, insanı şər tərəfinə getməkdən saxlar. Bəli, bu nəfsi-ləvamə qüvveyi-aqilədən hesab olur ki, insanı məlamət edir şər tərəfinə getməkdən və rahnümanlıq edir xeyir tərəfinə. Amma nəfsi-əmmarə var ki, qüvveyi-şəhviyyədə məshub olur, insanı heyvan kimi çəkir müştəhiyyat və şəhavət tərəfinə və insan bu ortada faili-muxtardır. Əgər biduni-mülahizə xeyir və şər məhz bəmülahizeyi-ləzzət şəbiyi-nəfsi-heyvana tabe oldu, ondan şərarət əmələ gələcək və hərgah beəql və təfəkkür edib, əql tərəfinə meyl elədi, nəfsi-ləvvamə və qüvveyi-aqilə qüvvət peyda edib, insanı yamanlıqdan mən’ və yaxşılığa əmr edər. Necə ki, nəfsi-əmmarə və qüvveyi-şəhviyyənin şərarətə mürtəkib olmağı qüvvəti-cəhalətdəndir, həmçinin qüvveyi-aqileyi-nəfsi-ləvvamə qüvvəti-elm ilə əf’ali-xeyrə mürtəkib ola bilir. Pəs biz müsəlmanda elmin az olduğuna binaən nəfsi-əmmarə və qüvveyi-şəhviyyə güc gətirib bizi heyvan kimi çəkir müştəhiyyat tərəfinə və illa bizim məzhəbimiz cameyi-cəmii-mühəssənat və dafeyi-cəmii-qəbaihatdır. Hərçi həst əzqaməti-nasaz biəndami-mast[2] . Qərəz, əgər nəfsi-əmmarədən kənar və qüvveyi-aqiləyə daxil olub mülahizə etsək, bizə rövşən olur ki, qəmə götürüb öz başını doğra ki, mən tə’ziyədarlıq edirəm, yə’ni ki, peyğəmbər ya imam buyurub? Yox, Təbibihaziq təcviz edib? Yox. Özgə millətləri özümüzə tamaşaçı edib, divanə dedirtməkdən başqa heç bir faydası yoxdur və heç bir əqli-səlim belə əmrə fitva verməz məgərinki həvayi-nəfs.

Ey qardaş, “Əkinçi”nin mənzurun bilməyib, ona əziyyət etməyin. “Əkinçi” bir nasehi-müşfiqdir ki, deyir, qardaş, hünəriyyat və kəmalat toxumu əkin ki, izzəti-dövlət səmərə götürəsiniz. “Əkinçi” bir

---

[1] Ağıllı düşmən nadan dostan yaxşıdır.

[2] Hər nə varsa öz yöndəmsizliyimizin üzündəndir.

vaizdir ki, bizi əbdandarlıq elmlərinə və'z və təhrik edir. "Əkinçi" bir nəfsi-ləvvamə ki, bizi yamanlıqdan məlamət edir ki, yaxşılıq tərəfinə gedək. Ona binaən ki, insan ta öz-özün məlamət etməyə, yamanlıqdan müctənib və yaxşılığa mürtəkib ola bilməz. "Əkinçi" bir aynadır ki, bizə zillət və miskənət eyiblərin nümayan edir və izzət və tərəqqihüsnlərin cilvəyə verir ki, bəlkə ta rişə dər ab əst, ümidi-səməri həst[1] ki, əməlimizin hüsnü qübhün dərk edib, onun çarəsin fikir edək. Bizdən ki keçib, bizdən sonra gələnlər şəmatətdən qurtarsın. "Əkinçi" bir təbibdir ki, istəyir pən7diyat və nəsayihin acı davaları ilə nadanlıq ixlatın bizdən dəf etsin və elmin şəhd və mə'cunilə bizim məzacımızı qüvvətləndirsin, bəlkə məzac qüvvət tapıb, mərəzi dəf' etsin. "Əkinçi" bir əzaxanadır ki, bizim hal və malımıza əza tutub ki, biz bəlkə bir çarə edək ki, bizdən sonra gələnlər nadanlıq mərginə düçar olmayalar.

Pəs gərək hünər peyda etmək. Elm və hünərsiz adam nə ki özgə yanında, bəlkə öz yanında şərməndədir. Əgərçi biz öz elm və hünərsizliyimizi nəuzübillah Allahdan bilib deyirik: hər nə Allah istəyir elə olacaq, hər nə məqdurdur onu görəcəyik, amma Allah belə istəyib, belə məqdur edib ki, hər nə əksən onu biçəsən, əsbabi-zillət zillət gətirir, əsbabi-izzət izzət.

Dehqani-saxurdə çe xoş güft bapəsər
Key nuri-çeşmi-mən, bəcüz əzkiştə nə drəvi[1].

Qardaş boş söz danışmaqdan fayda yoxdur, gərək əsbabi-tərəqqi və izzət fərahəm gətirmək. Əsbabi-zillət həmişə nadanlıq dövlətindən mövcuddur. Xalqa bədguluq etmək nə lazım? Əgər əql və elm sahibisən, bax şəxsin sözünə, əgər sənin nəf'üvə danışır əxz el əvə əgər boş danışır, burax başına, səndən ki, bir zad istəmir. Belə fikir etmə ki, cahan xalidir, əql-elmdən xaric danışana cavab verirlər. Əhlü-əqlü elmin silahı sözdür, söz ilə insanı öldürürlər.

---

[1] Nə qədər ki, kök sudadır, səmərə (meyvə) ümidi var

[2] Ağsaqqal kəndli öz oğluna necə yaxşı demişdir:
Ey gözümün işığı, nə əkmisən, onu biçəcəksən.

Xülasə, Şeyx Sə’di deyir ki, əgər nadan bilsə ki, onun üçün danışmamaqdan yaxşı zad yoxdur. Hərgiz danışmaz. Dübarə deyir ki, bunu bilsə, nadan olmaz. Ərzi-istida edirəm bundan sonra əql və elmsiz mübahisə başlamayın və məndən inciməyin, bu beytlər nəzərinizdə olsun:

Süxənhayi-mən cümlə pəndü xirəd
Əzon bərxurd hər kəs bərxurəd,
Mən əz zülməti-cəhl gəştə birun
Berəfdə bənuri-xirət əndərun.
Xudavənd babəm zirəhmət güşid
Çe loğman bəhikmət məra rəh nümud
Ki, çün xizr xurdə mən abi-həyat
Əzin pəs nədarəd bemən rəh məmat[1].

*Əhsənül-Qəvaid*

Cənab Əhsənül-Qəvaidin bu məktubu ilə baş çapmaq mübahisəsin qurtarırıq və əgər indiyəcən Hadiyu-Müzillin Qarabaği kimi kəslər sözü qanmayıb bizi təzədən həcv edəcəksələr, eləsinlər, onlara bircə cavabımız var: siz qanmazsınız.

## ELM XƏBƏRLƏRİ

Bir şeyin bir tərəfi ağır, bir tərəfi yüngül olanda ağır tərəfi aşağı düşüb, yüngül yuxarı qalxmağı mə’lumdur və habelə mə’lumdur ki, bir şeyi, məsələn, qızılı tərəziyə qoyub havada çəkəndə bir girvənkə gəlsə, tərəzinin qızıl olan gözünü suya salıb çəkəndə onun ağırlığı az olur. Bu səbəblərə indi bir maşın ixtira olunub ki, onun hərəkətə gəlməyinə nə atəş və nə heyvan gərək deyil. Bir oxa bir diyircəyi möhkəm keçirdib diyircəyin yarısını bir qabı su və ya civə ilə doldurub onun içinə salıb, o biri yarısını havada saxlayırlar. Belədə diyircəyin yarısı suda

---

[1] Mənim sözlərimin hamısı bilik və nəsihətdir, hər kim onları bilsə xeyir görər. Mən cəhalət zülmətindən kənara çıxaraq, bilik ziyasının dərinliyinə doğru gedirəm. Allah öz mərhəmət qapısını açıb mənə loğman kimi hikmət yolunu göstərdi. Xızır kimi dirilik suyu içdiyim üçün mənə ölüm yoxdur.

olduğuna yüngül, yarısı havada olduğuna ağır olur və bu səbəbə diyircək özbaşına fırranır və ona keçirilən oxu hərəkətə gətirir ki, bu ox maşını iştədir.

* * *

Mə'lumdur ki, övrət doğandan bir neçə müddət sonra onu südü olur, qeyr vaxt olmaz. İndi bir nemes hükəması yazır ki, Çin məmləkətinin övrətləri hər vaxt istəsələr, özlərini südlü edə bilirlər. Zikr olan hükəma deyir ki, 3 övrət gətirtdim ki, onların hər birsi 5–6 il idi ki, doğmamışdı və hərəsinə bir altı aylıq uşaq tapşırdım, 3–4 həftədən sonra onların hər birsinin təzə doğmuş övrət kimi südü oldu. Amma bu övrətlər uşaqları əmizdirən vaxtda özləri üçün əlahiddə xörək bişirib yeyirdilər.

* * *

İngilis hükəmaları yazır ki, London şəhərində sakin olan Çin əhlinin gözləri mürur ilə dəyişilib, yə'ni onların gözü ki, qalmıq gözüdür böyük və girdələnir, yə'ni bizim və Avropa əhlinin gözü kimi olur. Bunun səbəbi mə'lum deyil. Amma mə'lumdur ki, uşağın dayəsi çəp olanda uşaq da mürur ilə çəp olur. Pəs gözdə bir xasiyyət varmış ki, qeyr gözlərə baxmaqdan dəyişilir imiş.

* * *

Dəli olmaq bir neçə qismdir, yə'ni hər dəli olan bir qeyr şeyin fikrindən dəli olur. Məsələn, kimi deyir ki, onun başı qazana dönüb. Kimi deyir ki, mən padşaham, gərək mənim hökmümə dünya əməl eləsin. İndi Parij şəhərinin mə'rizxanalarında mə'lum olub ki, bu dəli olmaq naxoşluqları yoluxmadır, onlara qulluq edən kəslərin bə'zi o dəlilər kimi dəli olur.

## TƏZƏ XƏBƏRLƏR

*"Tiflisski vestnik"in telləri:*

1) *Martın 19-da Londondan.* Osmanlı işləri barəsində Rusiya dövləti yazan kağızı bir az dəyişdirib, ona İngilis, Rus, Prus, avstriya,

Firəng, İtaliya dövlətlərinin vəkilləri qol çəkib və ümid var ki, Osmanlı dövləti də ona qol çəksin və bir adam Peterburq şəhərinə göndərsin ki, Rusiya və Osmanlı dövlətləri əsgəri mürəxxəs nləmək barəsində danışıq eləsin.

*Martın 22-dən.* "Tayms" qəzeti yazır ki, zikr olan Avropa dövlətlərinin vəkilləri Rusiya dövlətinin vəkili qraf Şuvalovun bu sözünə həm qol çəkiblər ki, Rusiya dövləti əsgəri mürəxxəs edəcək.

İngilisin İspaniya dövlətinin paytaxtı Madrid şəhərində olan vəziri-muxtarı Ser Liyar gəlib ki, və'də ilə İstanbul vəziri-muxtarı Ser Elliotun yerinə getsin.

Prus dövlətinin sədri'zəmi knyaz Bismark imperatora ərizə verib ki, onu xaric eləsin, amma imperator onun ərizəsini qəbul etməyib, ona izin veribdir ki, əgər naxoş isə bir il işdən bərkənar olsun.

"Tayms" qəzetiyazır ki, knyaz Bismark özünü işdən bərkənar eləmək səbəbi budur ki, Rusiya dövləti onun kağızına qol çəkəndən sonra cəng başlasa, onda taxsır görməsinlər (knyaz Bismark, vəziri-xariceyi-dövləti-Prus bir aqil kəsdir ki, bir neçə ildir ki, tamam Avropanın işləri ondan keçir).

2) *İstanbuldan martın 17-də.* Məclisi-ümum bu məzmunda qət' teli həzrət sultana pişnəhad edib ki, xaric dövlətlər deyən sözlər əməl olunmasın və Qaradağ əhlinə nə ki, Nəkşəç qalasını, heç bir yer verilməsin.

*Martın 19-da.* İngilis vəkili sədri-ə'zəm Ədhəm paşaya Londonda qol çəkilən rus kağızının surətini verdi.

*Martın 22-də.* Dövləti-Osmani istəyir Rəuf paşanı Peterburqa əsgəri mürəxxəs eləmək danışığına göndərsin.

*Martın 23-dən.* Osmanlı dövləti qol çəkilən rus kağızının cavabında bir kağız yazıb ki, Avropa dövlətlərinə göndərsin.

* * *

Londonda qol çəkilən kağızın məzmunu mə'lum deyil. "Tayms" qəzeti yazır ki, bu kağızda Avropa dövlətlərini vəkilləri İstanbulun konfransında axırıncı dəfə Osmanlıya pişnəhad elədiyi şərtlər yazılb ki, onları Osmanlı qəbul eləməmişdi. O kağızda yoxdur ki, o şərtlərə Osmanlı nə müddətdə əməl eləsin və eləməsə nə olsun. Həmçinin əsgəri əldən qoymaq barəsində o kağızda bir söz yoxdur. Bu barədə əlahiddə danışıq olacaq.

* * *

İstanbuldan martın 8-də yazırlar ki, məclisi-ümum belə açıldı: calislər və əmələcat cəm olandan sonra həzrət sultan daxil olub, taxta əyləşib, onun sağ tərəfində Avropa dövlətlərinin vəkilləri və ruhanilər, əzon cümlə şeyxül-islam və şərifi-Məkkə, sol tərəfindən vüzəralar və qeyr əmələcat və xaricələrin ruhaniləri, qabaqda məclisin üzvləri olub. Həzrət daxil olanda hamı durub baş vurandan sonra sədri-ə'zəm Ədhəm paşa yeriyib həzrətin əlindən kağızı alıb, öpüb, gözünün üstə qoyub, sonra Səid paşaya verib və bu cənab onu öpüb, sonra oxuyub. Kağız oxunandan sonra həzrət sultan gedib. O kağızda Osmanlı işləri barəsində və məclisi-ümum bina olmağının səbəblərindən danışıb.

Yazırlar ki, məclisi-ümumun üzvləri 3 dəstə olub: türk, ərəb, xristian dəstələri və hər bir dəstənin sözü bir olacaq. Əgərçi deyirlərdi ki, üzvləri dövlət özü intixab edib, xalqın onlardan xəbəri yoxdur, amma belə görünür ki, onlar dövlətin bərəksinə gedir. Məsələn, Midhət paşa xaric olmağı xüsusunda dövlətdən sual olunub ki, buna səbəb nədir? Əhməd və Akif paşanı ki, dövlət məclisə rəis tə'yin edib, onun bərəksinə gedirlər.

Midhət paşanın xüsusunda bir tel var idi ki, İtaliyanın Neapol şəhərindən gəmi ilə gedib. Yazmışdılar ki, gərək İstanbula getdi, amma indi 2 həftədir ol cənab harada olmağı mə'lum deyil.

* * *

Cənab sərdari-Qafqaz hökm edib ki, Kutais quberniyasından cəm olan 400 süvari əsgərdən başqa genə 2 yüz cəm olsun. Gəncə quberniyasından cəm olan süvari əsgərə Məlik Şaxnazarov hakim tə'yin olub.

* * *

Yazırlar ki, İran dövlətinin Tiflisdə olan generalni-konsulu Mirzə Əsədullah xan Peterburqa vəziri-muxtar tə'yin olub.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Üçüncü sənə* *8-ci nömrə*

*Fi 12 rəbiüssani, sənə 1294*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Pəncşənbə günü*



*Fi 14 aprel Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*1 sənəliyi – 3 manat*
*6 aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Vəkili-namə'lumi-millət məktəbxana xüsusunda bizim Badkubə tərəfinə bir daş atandan sonra, biz hərəkətə gəlib guruldayırıq. Amma indiyəcən yağmur zühura gəlməyib.

## DAXİLİYYƏ

Bizim dostlardan birisi yazır ki, filani, nə düşmüsən xalqın üstə ki, filan qubalı belə gəldi, filan qarabağlı belə getdi, ya filan adətimiz belədir, gərək belə olsun? Başıma sözmü qəhətdir danışmağa? Belədə yəqin nə ki gələn il 5 müştəri tapmıyacaqsan, hətta bu il də gümanım var sənin qəzetini oxumasınlar. Həqiqət, dostumuz bizim əhli yaxşı tanıyır. Məsələn, Qarabağdan bir kəs bizi həcv eləməkdən ötrü ona bir nadan deyəndə tamam Qarabağ əhlinin kefinə dəyir ki, guya Qarabağda bir nadan olmaq yekə vilayət üçün eyib imiş. Dustan, vilayət nadansız olmaz, dünya belə gəlib, belə də gedəcək. Təfavüt nadanların çox-azlığındadır və bizim xahişimiz onları azaltmaqdır və bu səbəbə belə meydanbazlıq edən nadanlara cavab yazılmasa, qəzet çıxarmaq olmaz və bir də nə ki, biz nadan dediyimiz kəslərin həmşəhrləri, hətta o kəslər özü işə diqqət ilə baxsa görər ki, həqiqət bizdə taxsır yoxdur. Pəs iltimas edirik ki, bu barədə bizi taxsırkar hesab edən işə insaf ilə baxsın, ol vaxt mə'lum olur ki, filankəsə dəymə, bizim həmşəhrimizdir, ya filan sözü danışma, bizim filan adətimizə toxunur olanda iş yerimez.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Tənbəki 2 qism olur: birisi Amerirka tənbəkisi ki, onun yarpağının ucu şiş və çiçəkləri qırmızıdır və birisi Osmanlı tənbəkisi ki, onun yarpaqlarının ucu girdə və çiçəyi sarımtıldır və bu iki qismin hər biri bir neçə cürə olur.

Tənbəkinin yaxşı-yamanlığına səbəb hansı qismdən olmağı deyil, onu necə əkib-becərmək və qurudub saxlamaqdır. Tənbəki qumustan və çox gilli yerdən başqa hər bir yerdə əmələ gəlir, amma onun üçün qara, yə'ni meşə yeri yaxşıraqdır. Bu yeri toxumlayandan irəli 3-4 dəfə çox dərin şuxm edib, ona insan, ya at, mal peyini qarışdırıb qüvvətləndirmək gərək. Çünki tənbəki gərk tez əkilsin və belədə baharın sübh soyuğundan tələf olur, ona binaən onu fevralın 15-dən aprelin 15-cən bir işıq və soyuq olmayan evdə, qutularda əkib sonra isti düşəndə çıxarıb əkin yerində şitil edirlər. Eni və uzunu 5 arşın olan qutuda 3-5 misqal toxum bitirtmək olur. Hər 4 desyatin yerə bir girvənkə toxumu şitili bəsdir və bir də quruda toxum çıxanda onların yeri dar olsa, yaxşı olur ki, onu çıxarıb, bir böyük qutuda şitil edib sonra əkin yerinə şitil edəsən.

Tənbəkini may ayının ibtidasından axrınacan əkin yerinə şitil etmək gərək. Bu zaman hər otun 4-6 yarpağı olur. Şitil olandan 2 gün irəli yeri bir dəfə də şuxm edirlər və əgər yer çox nəmiş deyil isə, şitili çıxardıb basdırandan 15 dəqiqə irəli suluyurlar.

Əkin yerində bir-birindən bir arşın aralı cızıqlar çəkib, o cızıqlarda şitili bir-birindən 3 cərgə aralı basdırıllar və əgər hava isti isə, hər şitilin üstünü ot ilə 1-2 gün örtüllər və bir həftədən sonra qurumuş şitilləri çıxarıb onun yerinə təzə şitil basdırıllar.

Şitil olunandan sonra tənbəkinin 1-2 həftənin müddətində hər 2 ya 3 gündə bir əl ilə suluyurlar və ya həftədə bir suya basdırıllar. 2 həftədən sonra cızıqlarıqn arası ilə gedib onların dibini əl ilə torpaqlamaq gərək və ya kiçik kotan kimi iki tərəfli əsbabı ata qoşub, cərgələrin arası ilə sürtmək gərək ki, kotan torpağı hər iki tərəfə atıb, tənbəkinin dibini torpaqlasın və əgər sonra quraqlıqdan və ya bərk yağışdan sonra lazım olsa, bir dəfə də zikr olan qayda ilə onları torpaqlamaq gərək. Otlar böyüyüb qönçələyəndə bu qönçələri və həmçinin yarpaqların dibində təzədən əmələ gələn budaqları üsullu yolub, hər otun üstə 6-dan 12-cən yarpaq saxlamaq gərək.

Tənbəki yetişəndə onun yarpaqları solub, sallanıb, şirrənir, onların üstə sarı ləkə əmələ gəlir.

Əvvəl dibdəki yarpaqlar yetişir ki, onları dərib götürüllər, bunlardan alçaq tənbəki olur. Sonra yuxarıdakı yarpaqlar yetişdikcən onu bir-bir dərib üstüaşağı əkin yerinə atıb bir neçə saatdan sonra aparıb qurudullar və ya onların bir neçəsi yetişəndə budağı dibdən bıçaq ilə yarısınacan kəsirlər ki, onun başı yarpaqlar ilə sallanıb 1-6 gün kökü üstə qalsın, sonra aparıb qurudullar. Yarpaqları qurudandan irəli yaxşı-yaman aralayıb bir quru və gün düşməyən və havası dəyişilən otaqda, ya çardaqda belə qurudullar: ya onları dik yığırlar, ya bir ipə bağlayıb, ya bir nazik ağaca keçirdib asırlar. Onların damarları bilmərrə quruyuncan bir neçə dəfə onlara baxıb kiflənən yarpaqları götürüb atmaq gərək ki, qeyrlər xarab olmasın. Sonra onları dübarə yaxşı-yaman aralayıb hər 25 ya 30 yarpağı bir yerə bağlayıb, üst-üstə yığıb bu dəstələri anbarda saxlayıb yetişdirmək gərək. Bu zaman bir neçə dəfə onları çökürmək və dəstələri açıb havaya vermək gərək. Alıcı olmasa onları anbarda tütünçülər kimi saxlamaq gərək, yə'ni anbarın içinə iki ağac qoyub, onun üstünə bir taxta qoyub, bu taxtanın üstə tənbəki dəstələrini açıb, arasına bir neçə çay daşı qoyub saxlayırlar.

Bu anbarın bir neçə bacası olsun ki, onun havası təmiz ola. Bir desyatindən 57-120 putacan tənbəki hasil olur ki, hər put 1-5 manata satılır.

Toxumdan ötrü saxlanan otları bir-birindən aralı çəkib, onların başında olan çiçəklərdən toxum əmələ gələndən sonra təzə əmələ gələn çiçəkləri yolub, toxum quruyandan sonra onları xaş-xaş başı kimi dərib qışda saxlayıb, baharda başlardan çıxarıb əkmək gərək.

## MƏKTUBAT

*Yövm 19 şəhri-rəbiüləvvəl.* İran dövlətinin təzə general konsulu Mirzə Mahmud xani-sərtib Tiflisə varid olmağına binaən İran təbəəsi və sair tüccar və əsnafın mö'təbəri 2000-dən ziyadə pişvaz qəsd ilə bir neçə verst Tiflisdən bayıra çıxıb və 20 qoyun rəsmi-mütədavili-İran ilə qurban kəsməyə gətirmişdilər. Sərtibi-müzarileyh onlara nəhayətdə iltifat və əhvalpürsanlıq edib, qurban kəsməyə razı olmadı. Ümumxalq onun mehriban və niknəfs olduğun ki, xalq içində sabiqdən məhşur idi, müayinə görüb, ziyadə məş'uf və şad oldular.

* * *

*Bəndi-məxsusi.* Hərdəm tənha oturub fikir edirəm: xudavənda, bizim axrımız necə olacaq? Ağlımız ata-baba ağlı, getdiyimiz ata-baba

yolu, heç bir dəyişilmək yoxdur. Ata-babamız xoruz və qoç döyüşdürüb, it boğuşdurub, qurşaq tutdurub, dərviş nağılına qulaq asıb, qızıl quş saxlıyıb günlərin keçirdib, biz də ki bu yolu gedirik, tələf olacayıq. Səbəb ki, zəmanə dəyişilib. Əlbəttə, on il bundan əqdəm bizim dolanacağımız indikindən yaxşı idi və on ildən sonra dəxi yaman olacaq. Pəs biz haçaq öz dərdimizin əlacının dalıycan olub, uşaqlarımıza elm öyrədəcəyik?

Biz müsəlman tayfasında ittifaq və həmiyyət olsa, məktəbxana üçün ildə iyirmi min manat cəm etmək çətin deyil. Elə bəyzadələrimiz var ki, bir oturuma dörd aşıq oynayıb 100 manat udub-uduzurlar. Elə xanzadələrimiz var ki, İvan İvaniçi qonaq etməyə artıqraq xərc edir, ya ona xoş gələn xəlini və ya atı ona bağışlıyır. Hər bir şəhərimizdə ildə 10-15 imam ehsanı verən olur ki, yoğunboyun mollaları şişpapaq tacirləri, böyükqurşaq hacıları, qızıltəkbənd nücəbaları çaylayıb, plovlayıb yola salır. Pəs belə ehsanı Allah qəbul edərmiş, füqəraların uşaqları üçün bina olunan məktəbxanaya olunan ehsanı qəbul etməz imiş?

Ey özlərini millətə dost hesab edib laf vuran qardaşlar ki, lazım olsa, millət işindən ötrü boynuma torba salıb başaçıq, ayaqyalın kənd-bəkənd gəzərəm. Sizin bu sözlər yadıma düşəndə Sə'dinin kəlamı fikrimə gəlir ki, deyib:

Dust məşumar on ki dər ne'mət zənəd,
Lafi-yari və bəradər xandəki[1].

*N... V...*

* * *

1870 tarixdən Dərbənd və Quba ilə Rusiyanın arasında yaş yemiş dadistədi başlanıb, ilbəil tərəqqi edir. Keçən il 50-60 min putacan və çox hissəsin paraxod (vapor) ilə aparıblar. Kirayənin qədəri Hacıtərxana putu 25 qəpik, Saritsinə 40, Saratova 55, Kazana 75 qəpik. Hərçənd kompaniya kirayəni çox alır, amma boyaq dadistədindən ümidlərin qət' edən kəslər kiraya məhəl qoymayıb, bu ümid ilə dadistədin artmağını nəzərlərində tutublar ki, Rusiya vəsi' və xalqı çox məmləkətdir, hər ongah Qafqaz yemişləri Rusetin hər bir şəhərinə aparılsa və Ruset əhli həm bəhrəmənd olsalar, ol vaxt ümid var ki, Qafqazın dərya kənarında olan şəhərləri bağ-bağat ilə abad olub, xəlaiqi nəf' bərdar olsunlar. Amma səd heyf ki, kompaniyanın bir para kəm məhəlliqləri bu dadistədə mane olur:

---

[1] Sən ne'mət içində olanda qardaşlıqdan, yoldaşlıqdan dəm vuran adamı, özünə dost hesab etmə.

1) Dərbənddə olan kantor kirayənin yarısını və ya tamamını qabaqca alıb kvitansiya verir, amma paraxodun kefinə xoş gəlsə, malı götürür və illa xalqın hazır olan yemişi gələn paraxodacan tələf olur. Ələlxüsus "Mixail" paraxodunun komandiri nə xalqın malı tələf olmağa heyfi gəlir və nə alişani-Dərbənd vəkilinin təvəqqəsini qəbul eləyir.

2) Paraxod götürən yemişi matroslar heç bir hesaba almayıb, atıb yeşikləri sındırırlar və Hacıtərxana yetişən vaxt çox olur ki, yuxarı gedən malı saxlayb Hacıtərxan malını göndərirlər.

3) Yolda və kantorlarda yemişdən götürüb yeşik və çəlləkləri yarım edirlər və bə'zi vaxt da yeşik yox olur. Sahibi kvitansiyanın şərtini iddia edəndə deyirlər ki Dərbənd kantorunda iddia elə. Sahibi görür ki, malı qoyub şikayət eləsə, 5 gündə tələf olacaq, təhvilə alır və iltimas edir ki, barı kəm olanın kirayəsini almayın. Deyirlər ki, hər ongah siz belə iddialar eləsəniz, Dərbənd kantoruna yazarıq ki, minbə'd yaş yemiş götürməsin.

*Məhbus Dərbəndi*

* * *

İrəvandan siğeyi-nikah cari etmək xüsusunda yazırlar ki, axund və mollalar çox bəd bihesablıq edir. Məsələn, İrəvan mahalında Kiçik və Ari qəryəsində bir övrətə bir alicənab axund iki dəfə kəbin kəsib. Əvvəlinci kişi o övrəti 5-6 ay saxlayıb, sonra övrətin xilafi-rə'yi olub, mütəlliqə olmamış bir özgə adama gedib və həmin axund kəbini cari edib.

Mərhum Abdulla xanın övrətinə iki adam müştəri olub və ikisinin də kəbini kəsilib. Axırda birisi təngə gəlib mütəlliqə edib, baz qeyrətə gəlib və peşiman olub, genə istəyir ki, övrəti alsın.

## ELM XƏBƏRLƏRİ

Necə ki bir kəs anadan təvəllüd edəndən sonra onun ağlı mürur ilə tərəqqi edir, habelə insan dünyaya gələndən bəri mürur ilə tərəqqi edir. Həmçinin necə ki bir şəxsin ömrünü üç hissə etmək olur – uşaqlıq, cavanlıq, qocalıq, habelə elmi-tarix insan dünyaya gələndən bəri, yə'ni insanın ömrünü üç hissə edir: qədim, orta, nəcl, təzə zəmanə.

Qədim zaman insan qullar ilə dolanır imiş və zəhmət çəkmək eyib hesab olunur imiş. Ol zamanın hükəmasının birisi yazır ki, zəhmət in-

sanın bədəninə zərərdir və bir də adamı kefdən və aşna-dostlardan məhrum edir.

Orta nəcli-zaman xanlıq, bəylik, yə'ni beistilahi-türk basdı-kəsdi zamanı olub ki, bizim əhl bu zəmanədən yeni çıxır.

Avropa əhli üçün bu halda təzə zəmanə hesab olunur ki, güc, igidlik, quldurluq, əsir etməklik qadağandır. Bu zəmanəyə dadistəd zamanı deyirlər. Qədim xanlar, bəylər ki, nücəbalıq cəhətindən məşhur idilər, indi vecə gəlməzlər.

Bu zəmanədə pul bəyləri əmələ gəlib. İndi hamı pula möhtacdır. Hətta şahzadələr də bir kəmtər yəhudinin əlindən tutub, ondan pul istəyirlər.

Pəs, təzə zəmanə zəhmət zamanıdır. İndi hükəmalar sübut edir ki, zəhmət insanın bədəni üçün nəf' gətirir. Vaxt pul hesab olunur, yə'ni gərək vaxtı keçirməyib zəhmət çəkmək ki, pul olsun. Çünki zəhmət çəkmək və vaxtı keçirməmək elm ilə olur, yə'ni elmi olmayan kəsin zəhmətindən ol qədr nəf' olmaz, ona binaən bizim zəmanədə elm lazımdır. Elm yolu ilə zəhmət çəkən tayfa öz millətini güclü edər, çünki güc dövlətdədir. Məsələn, bu halda Avropa dövlətlərindən İngilisdən az əsgəri olan yoxdur, lakin İngilis əhli tavana olduğuna İngilis dövləti əvvəlinci dövlətlərin birisidir.

*Əsgər*

## TƏZƏ XƏBƏRLƏR

Neft baha satılmağının bir səbəbi budur ki, onu qeyr yerlərə çəllək ilə aparanda neft duru olduğuna çəllək axır. İndi "Russki mir" qəzeti yazır ki, Peterburqda bir firəng hükəması gəlib ərizə verib ki, mən nefti bir qeyr yerə aparmaqdan ötrü onu bərk şeyə döndərib, genə sonra duru edə bilirəm. Ona binaən dövlətdən izin istəyir ki, ona Rusiyada neft aparmaqdan ötrü icma bina etməyə ixtiyar versin.

* * *

Əgərçi bu halda Badkubənin neft quyularının bə'zisindən neft pəvvarə vurub çıxır, amma bunilə belə neftin qiyməti artır. Bu halda qara neftin yaxşısının putu 10 qəpikdir.

* * *

Londonda ərəb dilində çap olunan qəzetin xüsusunda yazırlar ki, onu bir misirli ərəb çıxarır və onun yazmağından belə görünür ki, o kəs dövləti-Osmaniyə bədgudur.

* * *

Badkubədə puli-imperial 6 manat yarımdan 7 manat yarıma, qəndin putu 6 manat 30 qəpikdən 7 manat 80 qəpiyə qalxıb.

* * *

İspaniya məmləkətini bir kəndində bir tavana kəs vəfat edən zaman üstə keşiş gətirmədiyinə keşiş deyib ki, belə şəxsin ruhunu şeytan özü gəlib cəhənnəmə aparır. Meyit basdırılandan irəli ol şəxsin evinə bir əcaib paltarda, uzunquyruq və əlində məş'əl surət daxil olub ki, hamı onu görüb "şeytan" deyib qaçıb. Bir kişi bu qiylü qalı eşidib, əlində tüfəng içəri daxil olanda, ol surət onun üstə gedib. Bu halda tüfəng atılıb ona dəyib, sonra onu soyundurub görüblər ki, zikr olan keşişdir.

* * *

*"Tiflisski vestnik"də çap olunan tellər:*

Parijdən martın 31-də Londonda qol çəkilən rus kağızına Osmanlı dövləti belə cavab göndərib: əvvələn, ol şərtləri məğlub olan millət qəbul edər, Osmanlı məğlub olmayıb və dava eləməyə hazırdır. Saniyən, Avropa dövlətləri Osmanlı işinə qarışmaqlıq ilə dövləti-Osmaniyə mane olurlar ki, öz xahişi ilə qoyduğu qanunlara əmələ eləsin. Salisən, Rusiya dövləti öz əsgərini əldən qoyuncan Osmanlı dövləti əsgərini əldən qoymuyacaq.

*Martın 31-də Vyanadan.* İngilisin cəng gəmiləri genə Osmanlı dəryasına gedir.

*Aprelin 1-də İstanbuldan.* Osmanlı dövləti Qaradağ vəkillərinə cavab elədi. Səfvət paşa, vəziri-xariceyi-Osmani Qaradağın knyazına tel göndərib ki, və'də ilə olan sülh tamam olandan sonra (aprelin 1) təzədən cəng olmasından ötrü və'də verilməyəcək.

Qaradağın vəkilləri geri qayıtdılar. İstanbulun Ağ dəniz boğazını bərkidirlər. Osmanlı dövlətinin əsgəriyyə əmələcatı İngilisin vəkilləri ilə birgə əsgər olan yerlərə getdilər.

Aprelin 2-də Osmanlının cəng gəmiləri iki hissə olub, birisi Qara və birisi Ağ dənizə getdi.

Osmanlı ilə Rusiya sərhəddinin arasında vaqe olan Rumıniya Osmanlıya cavab verib ki, Rus əsgəri Rumıniyaya daxil olsa, onlar ilə Rumıniya əsgəri dava etməyəcək. Ona binaən ki, bu barədə Rusiya ilə əlahiddə danışıq olub.

Osmanlı dövləti Tuna çayının üstə Rumıniya torpağına körpü tə'mir elədir.

Aprelin 5-də İstanbulda olan Rus konsulunun əmələcatı üçün əlahiddə gəmi gəlib, amma Rus vəkilinə hökm olunub ki, əlahiddə hökm gəlincən İstanbuldan getməsin.

Avropa dövlətlərinin vəkilləri dübarə Osmanlıdan təvəqqə elədilər ki, London kağızına razı olsun. Amma onlara genə cavab elədilər. Mədinədə olan həvadis xüsusunda İran dövləti Osmanlıdan razılıq istəyib.

* * *

Peterburqda olan bankrot, yə'ni yoxsul kəslər karxanalarını bağladığına cənab vəziri-daxiliyyə hökm edib ki, yazıb mə'lum eləsinlər nə qədər fəhlə yersiz qalıb. Belə mə'lum olur ki, bircə Peterburq şəhərində 90 min fəhlə yersiz qalıb.

* * *

Tiflisdə olan dehatiyyə icmaı Tiflis quberniyasından ötrü bu il oktyabr ayının 2-8-cən məhsulatı və əkin əsbablarının cəm edib xalqa göstərəcək. Bu zaman o əsbabları iştədməyi də xalqa göstərəcəklər.

* * *

"Tiflisski vestnik" yazır ki, aprelin 3-də cənab sərdari-Qafqaz Tiflisdən Gömrü qalasına getdi.

* * *

Tiflisdən Gömrüyə aparılan daş yolu barəsində yazırlar ki, bu yavıq zamanda tamam olacaq.

* * *

Moskvadan ticarət barəsində "Kavkaz" qəzetinə yazırlar ki, çox kasadlıqdır.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*3-cü sənə* *9-cu nömrə*

*Fi 26 rəbiüssani, sənə 1294*

* * *

*Poşt xərci basdıran illədir*

* * *

*Pəncşənbə günü*




*Fi 28 aprel Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*1 sənəliyi – 3 manat*
*6 aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Keçən nömrədə yazmışdıq ki, Badkubədə müsəlman məktəbxanası açmaq xüsusunda danışıq var. İndi belə eşidirik ki, bizim ə'yanəşxasların bə'zi mən təşəbbəhə biqövmin fəhüvə minhüm[1] cəhətindən bu xeyir işə mane olurlar. Vaxtında ol cənablara ərzimiz olacaq.

* * *

Cənab Hadiyül-Müzillin Qarabaği yazır:

Biya ki növbəti-sülhəst və atəşü inayət,
Beştəri-onki nəguyəm əz ançe rəft hekayət[2].

Ol cənab bu beyt ilə kağızını başlayıb, sonra deyir: filani, sizdə taxsır yox imiş (çox əziz olasınız ki, bizi bağışlayırsınız), taxsır Əhsənül-Qəvaiddə imiş. Ona binaən Əhsənül-Qəvaidin üstə çox danışıb, təvəqqə eləyir ki, onu çap edək və əgər qəzetdə çap etməyə izin olsa, ol cənaba mə'lum edək ki, Əhsənül-Qəvaidi həcv də eləsin.

Əvvələn, bəndə siz cənabdan küsməyi özümə eyb bilirəm və ona binaən bica yerə sülhə gəlmisiniz, mən sizdən küsməmişəm. Saniyən, hər kəs bizə ağıl və elm yolu ilə kağız göndərsə, onu çap etməyə hazırıq.

---

[1] Hər kəs özünü başqa qövmə oxşatsa, o elə həmin qövmdəndir.

[2] Gəl ki, indi sülh, barışıq və qayğı göstərmək vaxtıdır, bu şərtlə ki, daha keçmişlərdən söz açmayaq

## DAXİLİYYƏ

Bizim qəzetin muradı ümdə nəsihət olduğuna və nəsihət onu anlamıyanlara acı göründüyünə keçmişdə də onu oxuyanların çoxu alnını turşudub bizdən narazılıq edirdi ki, bu qədər nəsihət nə lazımdır?

Bu halda ki, işlər dəyişilib, bizdən narazı olan dəxi ziyadə olacaq. Həqiqət, bir şəxsin bir əczası, məsələn, dişi ağrıyan vaxtda nə ki, ləzzətidünya onun gözünə görünməz, hətta qeyr vaxtda ləzzət edən şey bu halda onu dəxi ziyadə pərişan edər. Belə naxoş olan kəs ancaq dərman-dava arzu edər. Habelə yəqinimizdir ki, indi bizim qəzeti oxuyanlar bizdən ancaq təzə xəbərlər istəyir, amma... Bizim qəzetin adı mə'lum edir ki, onun ümdə mətləbi gərək əkin və ziraət və elm xəbərləri olsun. Ona binaən əgərçi bu halda işlər dəyişildiyinə təzə xəbər artıb və qəzet oxuyanlar ona artıcaq müştaqdırlar, lakin biz nə ki, irəlikindən ziyadə xəbərlər yaza bilmirik, hətta bə'zi səbəblərə görə ol qədr də yazmağa vahimə edirik. Belədə müştərilərimizdən iltimas olunur bizdən rəncidəxətir olmasınlar ki, onların könlü istədiyicən təzə xəbər yazmaq olmur.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Bədnal atı nallıyan vaxtda yumşaltmaqdan ötrü məsləhət edillər ki, bir dəsmala bir neçə damcı keşniş ətri töküb onun burnuna tusunlar. Avropa vilayətlərində adətdir ki, hər bir əldə saxlanan heyvanat və ələfiyyatı ə'lalandıran kəsə ən'am verillər və bundan ötrü o heyvanları bir yerə cəm edib baxırlar.

Bu yavıq zamanda London şəhərində 1100 ədəd göyərçin cəm etmişdilər ki, cümləsinin qiyməti 70 min manat, əzon cümlə 162 poşt göyərçin imiş ki, bunların bir ə'lasının qiyməti 350 manat imiş. Bu göyərçin bir saatda 150 versi uçur imiş.

Süd əmən dana-buzovu isala düşəndə və habelə ayqır gücdən düşəndə məsləhət edirlər ki, onlara yumurta versinlər.

Avropa əhli əti satılan heyvanı qəsd ilə kökəldir. Bir lems göyərçinləri qarğıdalı dənəsi ilə belə kökəldib, bir qaranlıq və havası təmiz otaqda onları saxlayıb, hər gündə üç dəfə hər beş saatda bir onların hər birinin ağzına güc ilə 20 qarğıdalı dənəsi verib. Deyir ki, bu tövr ilə onlar çox tez kökəlib və onların əti çox zəriflənir.

İmtahan ilə aşkar olub ki, hər bir heyvana tə'sir edən zəhər nəbatata həm tə'sir edir. İndi bir lems hükəması yazır ki, əkin yerində

mərgəmuş olsa, nəbatata zərər edər, amma qurquşum olsa etmir, bavücudi ki, onların hər ikisi zəhərdir. Lemsistanda, yə'ni Germaniyada bir mülkədarın qoruğunda otlayan heyvanların hamısı qanqaşandığına zikr olan mülkədar bir neçə hükəma çağırıb ki, bu naxoşluğun səbəbini mə'lum eləsinlər. Zikr olan qoruqda bitən ələfiyyatı bir-bir naxoş olmayan heyvana yedirdib. Ol hükəmalar yazır ki, bu naxoşluğun səbəbi ələfiyyat deyil. Onların birisi deyir ki, qanqaşanmaq naxoşluğu soyuq dəyməkdən əmələ gəlir və özü yoluxmadır. Ona binaən gərək belə naxoş heyvanı sürüdən çıxarıb əlahiddə saxlamaq.

İngilis vilayətində hər ildə qırx milyon manatlıq meyvə yeyilir, amma bunilə belə fəqir-füqəra dad edir ki, onlar meyvə tapmır. Çünki ingilis xalqı çox və yeri az olduğuna bir arşın da xali yer yoxdur, ona binaən təzə bağ saldırmaq çox düşvardır.

İngilis vilayətində 50 min vers dəmiryolu var ki, bu yolun kənarı 2-3 arşın xalidir. İndidövlət hökm edib ki, o yolun hər iki tərəfindən meyvə ağacı əkilsin.

Rusiya dövlətinin Sibir vilayətində qaramalda bir naxoşluq olur ki, ona qaramal, ya Sibir taunu deyirlər. Bu naxoşluq qeyr yerlərə həm düşür. Ondan heyvanı mühafizət etməkdən ötrü məsləhət edirlər ki, heyvana su ilə bir neçə damcı kükürd arağı, yə'ni kuparos versinlər.

Amerikada quş yolmaq üçün bir maşın ixtira ediblər. Yazırlar ki, o maşını ilə bir saatda 50 toyuq yolmaq olur ki, əldə yolunan toyuqdan təmiz yolur. Və bir də buzxanalar üçün buz kəsməkdən ötrü bir kotan ixtira olunub.

Ağ kələmin kökünə qurd düşməkdən xarab olur. Bir hükəma yazır ki, əgər ağ kələmi bir yerdə əkib, sonra çıxarıb onun kökünü qara sabun və naşatır suyuna salıb bir qeyr yerdə şitil edəsən, ona zikr olan qurd dəymir və kələm bundan çox ləzzətli olur.

Heyvan saxlamaqda ingilis tayfası hər bir tayfadan artıq tərəqqi edib, İngiliscə olan at-mal qeyr yerlərdə yoxdur. Malı ə'lalandırmaqdaq ötrü ə'lalanmış malın erkəyinə yaxşı qiymət verib, sürüyə qoşurlar.

Keçən il ə'lalanmış erkək qoyunun birsi 1500 manatacan satılıb.

Avropa əhli piydən yağ qayırır isə, bizim əhl isə yağı saxlamağı bilmədiyinə çox vaxt onu xarab olandan sonra iştədir. Belə xarab olmuş, yə'ni iylənmiş, dadlanmış yağı nehrəyə töküb qatıq ilə çalxalıyanda yağ təzə kərə kimi olur.

*Əsgər Gorani*

## MƏKTUBAT

*Martın 25-də Moskvadan.* Axır zaman buranın sud, yə'ni divanlarında bir neçə iş qət oldu ki, çox böyük işlər idi. Peterburqda Kazan kilsəsinin qabağında olan qilü-qal işindən sonra Senatda bir buna oxşayan iş həm qət olub. Bu işdə 50-cən cavan oğlan və qız, əzon cümlə 4 gürcü və bir erməni dövlətə namünasib və qadağan olunmuş kitab və risalələr inşa edib xalqa paylamaqdan ötrü Sibirə göndərildi.

Moskvada 200-cən adam bir kompaniya qayırıb bir neçə ilin müddətində oğurluq və qəlp pul kəsməyə məşğul olmaq işinin qət edib onların çoxunu Sibirə göndərdilər.

Moskvada İran əhli çoxlanıb, tacirlərdən savayı fəhləlik edən, hətta meymun oynadan da var.

Deyirlər ki, Kurski quberniyada 3 iranlı tutublar ki, adlarını serb qoyub, kəndlərdə yağ, buğda və qeyrə cəm edirlər imiş ki, Serb əsgərinə göndərəcəyik. Onların birsinin cibində ki, adını serb keşişi qoymuş imiş, poşt kvitansiyası, yə'ni qəbzi tapıblar ki, altı yüz manat Tiflisə öz dostunun üstə göndərib.

Yazırlar ki, Maykop şəhərinə oğurluq çox olduğuna xalq cana gəlib şəhərdə məhşur olan 14 oğrunu tutub həlak edib.

Tiflisdən yazırlar ki, orada camaat bir məktəbi-sənaye açıb ki, rus-gürcü, erməni dillərində elm və sənətlər öyrədəcək. Amma bizim dildə elm kitabları yoxdur və yazıb oxumaq çətindir deyib razı olmuyublar ki, türk dilində də oxunsun.

Əlbəttə, erməni və gürcülərin çalışanı və itirib-axtaranı olduğuna onların dilində xalqa elm və sənət öyrədəcəklər, lakin bizim nə ki çalışanımız yoxdur, hətta Vəkili-namə'lumi-millət özü müqərrər olur ki, bizim dildə yazıb oxumaq çətindir və biz elm təhsil etməyə qadir deyilik. Belədə qeyrilərinin çox vecinədir ki, məktəblərdə türk dilində elm öyrədəcəklər, ya yox?

*Əsgər Gorani*

* * *

T i f l i s d ə n. "Kavkaz" qəzetinin 54-cü nömrəsində İran dövlətinin general-konsulu Mirzə Əsədullah xanın Tiflisdən Peterburqa şajderfir ləqəbilə mə'muriyyəti babında şərhi-bəyan olunmuşdu və onun nəticəsi aprelin səkkizində zühura gəlib, imkani-vüs'əti-vəqt olma-

dığına ki, onun dostları ziyafət vermək istəyirdilər, Avropa qaydası ilə bir cəm'iyi-ə'yanü əşraf Tiflisdən onun ehtiramında şəhrin xaricində bir bağda cəm olub əsbabi-eyş mühəyya eləmişdilər. Bir dəstə İran çalan-çağıranı, bir dəstə tamam dəstgahi-rus muzıkantı növbə ilə xalqı məşğul edib bəyanati-fəsihə ilə nitq deyirdilər. O cümlədən Tiflisin polismeysteri Məlik-Bəylərov ayağa durub bir nitq bəyan edib onun axrında dedi: ümidvarıq ki, bizim xalisanə qəlbi duamızı hər yerdə özünüzə yoldaş bilib, bizləri xatirinizdən fəramüş etməyəsiniz. Bu halda şadlıq və ura sədası camaatdan ücalıb 65 nəfər muzıkant İran marşı çalmağa məşğul oldu.

Xülasə, o ehtiram ki, Mirzə Əsədullah xana olundu, bu günə kimi heç bir mə'mura olunmamışdı.

Aprelin səkkizindən Tiflisin havası istiliyə mail olub, günü-gündən hərarəti artır. Bu il qış olmadığına görə buz olmayıbdır. Əgərçi Qocür dağlarından qar gətirib buzxanalara doldurublar, amma bu hərarətin qabağında davam etməyəcəkdir. Ticarət əməli bilkül rubətənəzzüldür, çox az adam görürsən ki, öz kəsbindən razı olsun.

* * *

İrandan yazırlar ki, bir şəxs yer qazan vaxtda yeddi küp qızıl tapıb 12 kürur tümən qədərdə və onu xəzanəyə götürüblər və genə yazırlar ki, fars taciri Hacı Məhəmmədəli vəfat olanda övladı və qeyr varisi olmadığına vəsiyyətnamə ilə öz varını həzrəti-şahənşahi-İrana verib ki, onun qədəri 10 kürur tümən imiş.

İrandan qızıl mə'dəni tapılmaq sözü çıxandan sonra qızıl ya cəvahirət tapılmaq xüsusunda hər gündə bir xəəbr çıxmağa səbəb oldur ki, İranda qəzet çıxmır, ona binaən hər bir xəbər ağızdan-ağıza düşüb, dərviş nağılı kimi cürəbəcürə danışılır.

## ELM XƏBƏRLƏRİ

Teleqraf ilə qeyr yerlərə kağız göndərmək mə'lumdur, indi firəng qəzetləri yazır ki, Amerikada bir teleqraf kimi əsbab ixtira olunub ki, onilə danışmaq da olur. Bu teleqrafı belə imtahan ediblər: Bostan şəhərində bir şəxs və'z deyəndə o şəhərin 150 verstliyində olan salim şəhərinin əhli zikr olan və'zə qulaq asıb, sonra ona mərhəba deməyinin və əl çalmaqlarının sədası ol vaizə gəlib və bir də Nyu-York şəhərin-

də çalınan muzıkaya bu şəhərdən 500 verst arası olan Filadelfi şəhərinin əhli qulaq asıb əl çalacaqlar. Bu əsbabın adına telefon deyirlər.

Çoxdandır ki, Avropa əhli stenoqraf deyilən bir əsbab ixtira edib və bu əsbab ilə nə qədər tez danışan adam olsa, onun sözlərini tamam yazmaq olur. Osmanlı dövləti millət məclisi bina edəndə orada olan danışığı ol əsbab ilə yazmaq mümkün olmadı, ona binaən ki, bizim hər bir hüruf bir neçə tövrdə yazılır. İndi yazırlar ki, bir Osmanlı təzə stenoqraf əsbabı qayırıb və bu əsbab ilə türk dilində olan danışığı da tamam yazmaq olur və genə yazırlar ki, bir Osmanlı bir tez atılan tüfəng ixtira edib. Bu şəxslərin hər ikisinə həzrət sultan ən'am verib.

*Əsgər Gorani*

* * *

Bizlərdə heyvanı kökəldib onun ətini yemək adət deyil, bavücudi ki, belə qəsd ilə kökələn heyvanın əti nazik və yağlı olduğuna çox ləzzətli olur.

Bir tərəfdən heyvanat (naxoş olmayan) yediyi xörək onun bədənində qana dönüb, sonra onun ətinə və qeyr əczalarına dönür və bir tərfdən heyvanat nəfəsini alır, yə'ni hava onun ağzına daxil olub öfkəsində qana qarışıb, qan ilə gedib bədənin əczalarını hava şamın piy və piltəsini yandıran kimi yandırı ki, bu yanmaqdan əmələ gələn tüstü qismində gözə görünməyən şey ağızdan rədd olur. Pəs heyvanatın kökəlməyinin iki səbəbi var: birisi xörəkdir. Gərək xörək çox və yaxşı olsun ki, çox xörəkdən ziyadə qan əmələ gəlsin və bundan əmələ gələn ətrə qeyrə də çox olsun. Və birisi bədəni yanmaqdan mühafizət eləməkdir ki, bədən az yandıqcan ət çox olur.

Xörək çox olanda ət çox olmağı mə'lumdur, ona binaən bədəni yanmaqdan mühafizət eləmək heyvanın kökəlməyinə səbəb olmaqdan danışaq.

Heyvanın bədəni yananda hərarət əmələ gəlir ki, bu hərarətdən bədən isti olur. Bu hərarətin bir hissəsi bədənin hərəkətinə və bir hissəsi fikirdirasətə gedir. Pəs hərəkət və fikirdirasət artıq olsa ol qədr bədən artıq yanır.

Xülasə, bir heyvanı kökəltmək istəyəndə gərək onun hərəkətinə mane olmaq ki, bu tgvr ilə bədəni yanmaqdaq mühafizət edəsən və bir də gərək onu bir qarnlıq və havası təmiz olan yerdə saxlamaq ki, onun gözü görməsin, qulağı eşitməsin, yə'ni onu hər bir hərəkətdən ki, fikirdirastə səbəbdir, saxlamaq gərək.

## TƏZƏ XƏBƏRLƏR

Badkubəyə hökm gəlib ki, hər 110 ev bir süvari əsgər versin. Tamam Badkubə quberniyasından 800 suvari cəm olacaq. Və bir də Qafqazda zəxmdar olan əsgərlərə kömək etməkdən ötrü bina olan icmaa izin veriblər ki, Badkubə quberniyasında ehsan yığsın.

* * *

Mə’lumdur ki, təhmilat 2 qism olur: birisi əsil təhmilatdır ki, hər kəs bir qədərlənmiş məbləğ verir və birisi xərcdir. Məsələn, kağız pulu, tənbəki xərci və qeyrə. Yazırlar ki, İtaliya qəzetində bu təhmilatların barəsində bu şəkil çəkilib: bir kəniz əlində qayçı öz itini qırxır və ətəyini tük ilə doldurub bir nökər dalıycan bir qırxıq it durub belə danışırlar. Nökər deyir ki, mən öz itimi ildə bir dəfə qırxıram və əgərçi ol zaman mənim itim dad-fəryad edir, amma dincəlib rahat olur. Kəniz ona cavab verir ki, mən öz itimi həmişə mürur ilə qırxdığıma heç çığırıb bağırmır.

* * *

Aprelin 12-də cənab sərdari-Qafqaz belə hökm edib: ə’lahəzrət imperaturi-ə’zəm mənə verdiyi ixtiyara müvafiq hökm edirəm ki, bu gündən Tiflis, Kutais, İrəvan quberniyalarında, Suxum, Çernomor, Temruk uyezdlərində qanuni-əsgəriyyə iştənsin.

* * *

Aprelin 12-də padşahi-imperatori-ə’zəm Kişinyov şəhərində hökm edib ki, əsgər Osmanlı sərhəddini keçsin, yə’ni bizim rus dövləti Osmanlı ilə cəng başlayıb.

* * *

Moskva şəhərinin dumu, yə’ni camaat məclisi qət edib ki, Moskva şəhərində zəxmdar olan əsgər üçün şəhərin xərcinə bir mərizxana açılsın 1000 adam üçün, şəhərin pulundan bir milyon manat əsgər üçün verilsin.

* * *

Peterburqdan gələn tellərdən belə mə’lum olur ki, orada çap olunan qəzetlərin dördü bağlanıbdır, yə’ni dövlətə dəyən söz yazdığına onları çıxarmaq qadağan olub.

* * *

*"Tiflisski vestnik"də çap olunan tellər:*

*Aprelin 16-da İstanbuldan.* Osmanlı dövləti hökm edib ki, Osmanlı vilayətlərində sakin olan rus tabeləri çıxıb Rusetə getsinlər. Deyirlər ki, gələn həftə həzrət sultan özü Tunə əsgərinə və onun qardaşı vəliəhd Rəşid əfəndi Kars əsgərinə sərəsgər gedəcəklər.

*17-dən*. Bu gün Osmanlı əsgəri Qaradağ üstə yeriyib.

*Parijdən 17-dən.* Rus əsgəri Rumıniya yerini keçib, Osmanlı sərhəddi Tuna çayının kənarına özü ilə 4 cəng lodkası gətirib ki, Tuna çayının üstə körpü salıb keçsin.

*Londondan 17-də.* İngilis dövləti iki general göndərib ki, birsi Osmanlının Tunə və birisi Kars əsgərində dövlət tərəfindən vəkil olsun.

*Peterburqdan 19-da.* Rusiya dövləti razı olub ki, Osmanlı dövlətinin Rusiyada sakin olan tabelərinin işinə İngilis dövlətinin vəkilləri baxsın.

*Badkubəyə gələn tellər:*

*Gömrü 17-də.* Rus əsgəri Kars şəhərinin cənubi tərəfindən Zaim kəndinə daxil oldu.

*Londondan 22-də.* İngilis və Firəng dövlətləri mə'lum ediblər ki, Rusiya ilə Osmanlının arasında olan cəngdə heç bir tərəfə kömək etməyəcəklər.

*23-də.* Deyirlər ki, İngilis bərk tədarük edir, gəmilər Malta cəzirəsinə – ki, Ağ dənizdə vaqedir, – çox tüfəng-yaraq aparır.

*Potidən.* Şəhərə topatan Osmanlı gəmiləri keçib getdi. Osmanlı dövləti mə'lum edib ki, Qara dənizin kənarından olan rus yerlərinə top atdıracaq. Ona binaən oraya gedənə 3 və orada çıxana 5 gün möhlətdir.

* * *

Keçmişdə Osmanlı Macarıstanı (Avstriya dövlətinin bir hissəsidir) qarət edib. Peşt şəhərinin kitabxanasının kitablarını aparmış imiş. İndi yazırlar ki, həzrət sultan ol kitabların bir hissəsini Peşt universitetinə, yə'ni məktəbxanasına bağışlayıb və Peştin studentləri, yə'ni tələbələri ol kitabları gətirənlərin pişvazının tədarükündədirlər.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*3-cü sənə* *10-cu nömrə*

*Fi 10 cəmadiyüləvvəl, sənə 1294*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Pəncşənbə günü*




*Fi 12 may Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*1 sənəliyi – 3 manat*
*6 aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Moskvadan Əsgər Gorani yazır ki, əgər Badkubə müsəlman məktəbxanası açmaq üçün icma bina olsa məni də ol icmaya calis hesab edin. Mən mədyun oluram bu işdən ötrü hər ildə yüz manat göndərim.

## DAXİLİYYƏ

Mə'lumdur ki, təzə xəbər çox olduqcan qəzet çıxardanların işi yaxşı olur. Bu halda ki, bizim Rus dövləti Osmanlı ilə cəng başlayıb, təzə xəbər artıb, qəzet oxuyan çoxlanıb. Hər gündə bir çıxan qəzet iki dəfə çıxır. Bir vərəq üstə basılan iki vərəq üstə basılır. Hətta ol yerlərdə ki, qəzet çıxmır, təzə xəbər istəyənlər qəzeti gözləmək tul olduğuna, qəzet çıxardanlardan əlahiddə tel gətirdillər. Məsələn, bizim Badkubəyə hər gündə iki tel gəlir. Beistilahi türk qəzet çıxardanların növğanıdır,

Belədə biz gərək ya qəzeti tez-tez çıxardaq, ya onu artıraq. Amma bunların hər birinə gərək əlahiddə izin olsun və izin almaq az çəksə, bir il çəkəcək ki, ol vaxtacan cəng də qurtarar. Belədə biz naəlac qalıb gərək irəliki kimi qəzeti çıxardaq, yə'ni həftədə bir.

Çünki iki həftəlik qəzet nə qədər böyük olsa, nə ki qeyr xəbərləri, hətta o tellərin hamısını çap edə bilməz və onların bə'zini çap edib, bə'zini etmiyəndə, mətləb dümbüridə olur. Və bir də çünki o tellərin hamısını oxuyan işin çegunəsini bilə bilmir, əlbəttə, bir neçəsini oxuyan heç bilmiyəcək. Ona binaən biz istəyirik ki, o tellərin heç birisini basdırmayaq. Amma bizim müştərilərin çoxu "Əkinçi"dən başqa qəzet oxumadığına, onlar üçün ümdə xəbərləri müxtəsər bəyan edəcəyik.

## ƏF’ALİ-ƏHLİ-DEHAT

Əkinin yaxşı olmağına bir səbəb toxum yaxşı olmaqdır. Toxumun yaxşı-yaman olmağını onun rəngindən və iyindən bilmək olur ki, bunu bir toxumu həmişə iştədən yaxşı bilir. Məsələn, buğdanın yaxşısı mum kimi təmiz, sarı olur. Ondan təzə balıq, ya iylənmiş yumurta iyi gəlir isə, onda qarabaş naxoşluğu var ki, buğda baş açanda onun dənələri qaralıb iylənib xarab olur.

Bundan savayı yaxşıdır ki, toxumu qeyr tövr ilə imtahan edəsən. Əvvələn, toxum ağır olduqcan yaxşıdır. Ona binaən toxum alan gərək onu günə sərib qurudub sonra sayıb çəksin və bunu bilsin ki, filan toxumun yaxşısının 100 dənəsi bu ağırlıqda olur ki, ondan yüngülün almasın. Saniyən, toxumun irisi yaxşıdır ki, belə toxumdan əmələ gələn ot iri olduqca havanın dəyişilməyi ona kar etməz. Və bir də gərək toxum bərabər olsun, yə’ni hamısı bir boyda olsun və təmiz olsun, yə’ni qeyr otların toxumu, ya qeyr şey ona qarışmamış olsun. Bunlardan əlavə yaxşıdır ki, toxumun bitmək xasiyyətini biləsən. Bundan ötrü lazımdır toxumdan bir az götürüb, əsgi, ya pambığa büküb, üstə su töküb göyərtmək. Onların göyərməyəni az olduqca toxum yaxşıdır. Elə ki, toxum almaq lazım olmadı, yə’ni hər kəs öz hasilinin bir hissəsini toxum edəndə onu seçmək və təmizləmək gərək. Məsələn, buğdanın dərzlərini döyəndən irəli onları silkələmək və ya üsul ağac ilə vurmaq gərək ki, ondan iri və yaxşı yetişmiş dənələr tökülsün və bu dənələri yığıb təmizləyib toxum etmək və ya toxumdan ötrü əlahiddə əkin əkib və ya əkinin bir hissəsini ki, qeyr hissələrdən yaxşıdır, saxlayıb, tamam yetişəndən sonra yığıb, gələn il üçün bir quru və sərin yerdə saxlamaq. Xülasə, toxumu səpəndən irəli onu seçmək və təmizləmək gərək və bir də bir yerdə bir əkin bir neçə il əkilir isə, yaxşıdır ki, onun toxumunu təmizləyəsən, yə’ni bir neçə ildə bir dəfə qeyr yerdən toxum alıb əkəsən və bu zaman lazımdır o toxumu elə yerdən almaq ki, onun ab-havası toxum səpilən yerin ab-havası kimi olsun.

* * *

Avropa şəhərlərinin ətrafında yağ çalxalayanlar kərə yağı bir neçə qism edib, onun ə’lasını yemək üçün satırlar və belə ə’la yağa qaymaq yağı deyirlər. Bu yağın girvənkəsi 3 abbasıya satılanda qeyri qism kərələr 50, ya 40 qəpiyə satılır. Ə’la yağı belə qayırırlar: südü bir sərin

yerdə bir gün bir gecə sərib, sonra onun qaymağını yığıb, onu çalxalayıb, yağı çıxardıb, yumuyub, duzlamayıb, ancaq sıxıb satırlar. Bundan əlavə Parijin ətrafında zikr olan qayda ilə qaymağı yığandan sonra onu 60 dərəcəyəcən qızdırıb, sonra 12 dərəcəyəcən soyudub, ondan zikr olan qayda ilə yağ çalxalayırlar ki, buna Parij yağı deyirlər və onun da qiyməti 3 abbası hesab olur.

Bə’zi yerlərdə dəxi ə’la yağ qayırırlar. Mə’lumdur ki, malı sağanda əvvəl rədd olan süd heylə yağlı olmaz, axır rədd olan yağlı olur. Malı əvvəl bir, sonra bir qaba sağıb, bu axırda sağılan südü sərib, onun qaymağını 10 saatdan sonra yığıb, südü saxlayıb, genə 10-12 saatdan sonra ondan ikinci qism qaymaq yığıb, əvvəl yığılan qaymaqdan zikr olan qayda ilə çox ə’la yağ çalxalayırlar ki, onun girvənkəsi bir manata satılır.

* * *

Toyuq və ördək yumurtdamağı xüsusunda yazırlar ki, hava xoş olan vaxtda toyuq ördəkdən birə bir artıq yumurtdayır. Lakin hava dəyişiləndə toyuğun yumurtası azalır. Amma havanın dəyişilməyi ördəyin yumurtdamağına mane olmur.

* * *

Amerikada yemişdən, yə’ni qovundan qənd qayırmaqdan bir neçə karxana açılıb. Yazırlar ki, əgərçi çuğundurun qəndi qovunun qəndindən ziyadə olur (çuğundurda 100-dən 8, yemişdə 100-dən 7), amma yemişdən qənd asandlıq ilə hasil olduğuna çuğundur qəndinin girvənkəsi 8 qəpiyə satılanda, bu qənd 6 qəpiyə satılır və yemiş qəndi ə’latər olur və əlavə bərin yemişin toxumundan yağ çəkillər.

* * *

**Məktubi-mənzum**

Ey olan hadiyi-ərbabi-zəlalət Hadi,
Ey Müzillini edən həqqə hidayət Hadi.
Eylədin sən ki, bu mehdiliyə adət, Hadi,
Elə bəs aləmə təbliği-risalət, Hadi!

Leyk peyğəmbər olan həcv eləməz ümmətini,
Kişi lazımdı çəkə ümmətinin qeyrətini,
Gərçi həcv eyləyənin yoxdu kəsən sünnətini,
Sənə bu həcv nə fərz oldu, nə sünnət, Hadi.

"Əhsənül-Qaidənin" sahibi, yaxud özü bəg,
Yazmış idi nə rəva xəlq olur ağköynək?
Sən, oba aşrı, əzizim, nəyə lazım hürmək,
Nə üçün eylədin izhari-ədavət, Hadi?!

İnşallah saba-birgün yetişir mahi-əza,
Gey kəfən, yar başuvi, tök yaşuvi, bağla qəra,
Səni meydanda görən kimsə desin: namxuda,
Eyləyibdir genə aləmdə qiyamət Hadi!

Əlüvi tutmadı bir kimsə ki, qardaş sənin,
Can sənin, cism sənin, tiğ sənin, baş sənin,
Cəm ola baxmaq üçün sünni, qızılbaş sənin,
Baxıban onlara sən eylə fəxarət, Hadi!

Kim deyir ağlama sən Kərbübəla sərvərinə?
Canımız cümlə fəda olsun onun Əkbərinə,
Ağladı ərzü səma təşnə ölən Əsğərinə,
Onu inkar edənin zatına lə'nət, Hadi!

Leyk siz bir para büd'ətlər edibsiz iycad,
Qoymusuz adını siz tə'ziyə, ey əhli-fəsad!
Sizə bu tə'ziyədən özgə həvəslərdi murad,
Mən ölüm, sən bir özün eylə mürüvvət, Hadi!

Bu deyilmi qərəzin başuvi sən çapmaqdan,
Yə'ni ki, canımı canana edərdim qurban?
Maluvi pəs nə üçün eyləməyirsən ehsan?
Quru baş çapmağa sən etmisən adət, Hadi!

Xatirin cəm elə kim, gər bu isə rəsmi-əza,
Sənə nifrin edəcək padşəhi-Kərbübəla,
Bədənin zəhmətinə şər'də yoxdur fitva,
Yoxsa var sizdə, görək, tazə şəriət Hadi?

Xaçpərəstlər hamısı açdı gözün düşdü qabaq,
Dalda qaldıq tökülüb cəhl ilə biz, ay sarsaq!
Pəs nə vəqti bizə qismət olacaq göz açmaq?
Əqlə gəl, tanrıya bax, bəsdi bu qəflət, Hadi!

Şükrlillah ki, bizim padşəhi-kişvəri-Rus,
Ol zamandan ki, edib təxti-ədalətdə cülus,
Bizləri eyləməyib elmü ədəbdən mə'yus,
Doldurub Aləmi insafü ədalət, Hadi!

Bu hədisi nə zaman zikr qılıb peyğəmbər –
Ki, olur rus diliylən oxuyan kəs kafər?
Allah, allah, bu nə böhtandır, əya hiylətgər,
İxtilafati-lisandır bizə ne'mət, Hadi!

Kim ki, bir dil bilə, bir ne'mətə ol vasildir,
Kim ki, çox bilsə, o çox ne'mətə bəs şamildir,
Leyk aləmdə hər ol kimsə ki, naqabildir,
Edəcək qeyr lisani o məzəmmət, Hadi!

Biz də müddət "Zərəbə Zeyd" kitabın oxuduq,
Rişteyi-ömrümüzü nəhv ilə sərfə toxuduq,
Barı biz taifə əzzəldə genə bir...
Olmuşuq indi dəxi eyni-nəcasət, Hadi!

Tut Həsənbəy bizə tə'lim eləyir dərsi-zəlal,
Götürüb boynuna ol, kafir olub, vizrü vəbal,
Niyə tə'limə siz ətfalı qılırsız irsal,
Bilməyirsiz niyə bəs eybü qəbahət, Hadi?

Oxudur cümlə uşaqlarını xanü bəgüvüz,
Ne'məti-rus ilə pərvərdə olub cəmdəgüvüz,
Bilməyən rus dilini bəlkə ola tək-tüküvüz,
Sizdə var hamıdan artıq ona rəğbət, Hadi!

Mərhəba mülki-Qarabağın əzadarları,
Tarı əfzun eləsin siz təki dindarları,
Seyyida, bəsdi, əgər görsə bu əş'arları
Çəkəcək tutduğu kirdarə xəcalət Hadi.

## MƏKTUBAT

Bokl adlı hükəma ingilis tayfasının və Dreper adlı hükəma tamam Avropa əhlinin elm və ağlının bu mərtəbəyə çatmağının tarixini yazıblar və bu tarixi yazmaqdan ötrü keçən zəmanələrin kitablarını tamam oxuyublar, yə'ni keçmiş zaman insanın elm və ağlı nə mərtəbədə olmağı ol zamanın kitablarını oxumaq ilə, əsbabi-ziraət və qey-

rəni mülahizə etmək ilə bilmək olur. Məsələn, 10 il bundan əqdəm paltar tikməyə maşın yox idi, amma indi var. Bu halda havaya qalxmaq məqdurdur, amma hava ilə özü xahiş edən tərəfə getmək mümkün deyil, yə'qin ki, gələcəkdə ona da əlac tapılacaq.

Pəs hər zəmanənin bir qanacağı var ki, bu qanacağı ol zəmanənin kitablarından, xalqının adətlərindən, işdətdiyi əsbab və qeyrədən bilmək olur.

Gələcəkdə bizim tərəqqi etmək tarixini yazan indiki zəmanəyə baxanda məəttəl qalacaqdır ki, nə yazsın. Həqiqət, bizim əsbablar qeyrə yüz, bəlkə min il bundan əqdəm olandan tərəqqi etməyib.

Kitablarımız... Bu halda bizlərdə kitab inşa edən yoxdur. Kitab əvəzinə həcv inşa edirik. Və həcvlərimiz həm tənəzzül edir. Məsələn, 30 il bundan əqdəm cənab Zakir mərhum Qasım bəy Qarabaği yazan həcv ilə indi Hadiyül-Müzillin yazan həcvlərə baxan görər ki, onların təfavütü çoxdur. Doğrudur, cənab Zakir də çox vaxtda boş sözlər, məsələn, bir başmaq itmək üstə danışıb, amma genə onları oxumaq olur. Lakin indi yazılan həcvlər, məst olan çəkməçi danışığına oxşadığına nə ki onları çap etmək olmur, hətta adam olan kəs onu oxuyanda əti ürpərir.

Çünki bizim zəmanə tərəqqi zamanıdır və tərəqqi etməyən tayfa günü-gündən tənəzzül edib axırda puç olacaq, ona binaən bizim şüəra qardaşlarımızdan – ki, onlar əlhəqq xalqın gözçüsüdürlər, – iltimas edirik təqazayi-zəmanəyə müvafiq xalqın gözünü açmağa sə'y eləsinlər, yoxsa hədyan danışmaq bir çətin zad deyil və ondan heç kimsəyə bir nəf' yoxdur.

*Nəcəf Vəzirzadə*

Bu səneyi – 1294 Gilanda həm qış quraqlıq keçdi və həm bahar quraqlıqdır. Bu gün ki rəbiüssani ayının 18-dir, novruz bayramından bir ay yarım keçir, yağış gəlmir və qış quraqlıq olduğuna binaən göllərdə su cəm olmayıbdır. Baharda ki, yağış yağmır, göl suyu ilə əmələ gələn ziraətlərin işi çox çətindir. Allah rəhm eləsin, amma havanın quraqlığına binaən bu halda növqan yaxşıdır və qurdlar zirəkdir. Japon toxumu bir dəfə, iki dəfə çıxanlar bu günlərdə toxuyacaqlar və Xorasan toxumları qabaq-dalı cəmadiüləvvəl ayının axırınacan çoxu toxuyacaqlar. Əgər o zamanda soyuq ilə gələn yağış yağmaya ümid var ki,

qurdlar barama toxusunlar, barama yaxşı olsun. Amma indi Allahdan yağış istəyirik. Əgər o vaxtda həm soyuğu olmayan yağış yağa genə ümid var ki, növqan yaman olmaya.

Qərəz, yağış olmasa, düyünün olmamağı yamandır. Allah taala öz fəzlindən bir növ mərhəmət eləsin ki, hər ikisi üçün yaxşı olsun.

Əgər soyuq gələn yağış yağsa da, elə soyuğu olmaya və növqan da yaxşı ola. Yəqin olacaqdır ki, qurdun xarab olmağı soyuq olan yağışdandır. Və əhvalatı genə də öz vaxtında yazacayıq. Bu məktub yaddaş üçün yazıldı.

İndi cənab Nasirül-mülkün sə'yinə binaən papiros tənbəkisi əkilmək bab olub. Ümidvarıq ki, bundan sonra onu ə'lalandırmağa sə'y edələr və Gilanın bu havasına binaən pambıq və arpa-buğda yaxşı olur.

* * *

Lənkərandan yazırlar ki, bu il qışda qar yağmadığına dağlarda qar yoxdur. Ərkvan mahalının sakinləri ki, öz çəltiklərini Viləş çayının suyu ilə suluyurlar, bu il çox az çəltik əkdilər. Hər qəryə iki evin yerini əkib ki, gələn ilin toxumu ələ gəlsin.

Zikr olan çayın suyu nə qədər az da olsa xalqa çatardı, amma onun başından 3 arx aparılıb. Birisi İməs, birisi Qazitski, birisi Miribrahim bəyin yerlərinə. Su çox olanda ol arxların xalqa zərəri yoxdur, amma bu halda çox zərər eləyir.

Və genə yazırlar ki, keçən səfər ayında Qızılağac qəryəsində bir quduz çaqqal 7 adam tutmuşdu, hamısı vəfat etdi. Və Masallı qəryəsinin qəbristanlığında məhərrəm ayında bir kaftar 3-4 qəbir qazıb meyitləri yemişdi.

## TƏZƏ XƏBƏRLƏR

Badkubədə isti düşüb, küçələrimizi genə toz basıb və bu tozdan xalqı xilas etməkdən ötrü küçələrə neft çiləyirlər.

* * *

Badkubəyə gələn tellərdən mə'lum olur ki, bizim rus əsgəri Gömrü tərəfində Bayazid və Ərdəhan qalalarını alıb. Amma Tuna əsgəri Tuna çayının keçməyi mə'lum deyil.

* * *

Mayın 11-də general Frankini Tiflisdən Badkubəyə gəlib, Tehrana getdi.

* * *

Mə'lumdur ki, zakona müvafiq manata altı qəpikdən ziyadə müamilə almaq qadağandır və habelə mə'lumdur ki, bir kəs borclu olub, onu verə bilməsə, pul sahibində ixtiyar var ki, borcdusunu dustaq eləsin. İndi yazırlar Peterburqda danışırlar ki, bu zakonların hər ikisi bərhəm olub.

* * *

May ayının 8-də Badkubənin camaat bağında Qafqazda zəxmdar olan əsgərlər üçün pul yığmaqdan ötrü seyr bina olmuşdu. Hər bağa girən bir abbası verməkdən 410 manat vüsul oldu.

* * *

Yazırlar ki, ə'lahəzrət şahənşahi-İran Serbistanın knyazı Nikolaya, keçən il serblərin əsgərinə sərəsgər olan rus generalı Çernyayevə, Rusiya dövlətinə təəllüq olan Türküstan məqribinin hakimi general Kaufmana Şiri-Xurşid ən'am edib.

* * *

Aprelin 30-da padşahi-imperaturi-ə'zəm Kişinyovdan qayıdıb Peterburqa gəlib. Yazırlar ki, camaat onun pişvazına çıxıb, çox şadyanalıq edib.

* * *

Peterburq şəhərinin camaat məclisi qət edib ki, şəhər pulundan zəxmdar olan əsgərlərə bir milyon manat verilsin.

* * *

Aprelin 16-da Moskva quberniyasının bəyzadələri cəm olub öz yerlərinin üstə hər desyatinə bir qəpik xərc qoyublar ki, bu xərci cəng qurtarıncan versinlər. Bu xərcdən ildə 95 min manat vüsul olacaq ki, onu zəxmdar olan əsgərə məsrəf edəcəklər.

* * *

Peterburqun tacirləri cəm olub qət ediblər ki, cəng qurtarıncan hər ildə pervi gildi 300 manat və vtoroy gildi 50 manat, cümlətani hər ildə 500 min manat versinlər ki, zəxmdar olan əsgərlərə xərc olsun.

* * *

Aprelin 25-dən Berlin şəhərindən yazırlar ki, Osmanlı dövləti razı olub ki, Osmanlı torpağında sakin olan rus tabelərinin işlərinə Prus konsulları baxsın.

* * *

İstanbulda olan konfransın qət'inə Osmanlı dövləti razı olmadığına, ol vaxt Avropa dövlətlərinin vəziri-muxtarları İstanbuldan çıxıb getmişdilər. Sonra cəng başlanandan irəli İngilis dövləti öz vəziri-muxtarın genə göndərib. Ol vaxt yazırdılar ki, qeyr dövlətlər cəng qurtarıncan vəziri-muxtarların göndərməyəcək. Amma indi Prusiya və Avstriya həm göndəriblər və deyirlər ki, Firəng və İtaliya da göndərəcəklər.

* * *

Badkubədə puli-imperial 7 manat bir abbası, qəndin putu 7 manat 7 şahı, neft cövhərinin putu 90 qəpik, qoyun ətinin girvənkəsi 6 qəpik, mal əti 7 qəpik, düyünün putu akulə 60 qəpik, rəsmi 30 qəpik, buğdanın xalvarı 18 manat, arpanın 14 manat, yağ kərə 16 qəpik, sarı 60 qəpik.

## E'LAN

Bizə kağız yazıb kinayə vuran kəslərə – ki, qəzeti onlara vaxtında göndərmirdik, – mə'lum olunur ki, biz qəzeti həmişə öz vaxtında göndəririk. Ona binaən onun vaxtında vüsul olmamağının taxsırı bizdə deyil.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*3-cü sənə* *11-ci nömrə*

*Fi 24 cəmadiyüləvvəl, sənə 1294*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Pəncşənbə günü*




*Fi 26 may Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*1 sənəliyi – 3 manat*
*6 aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Neçə həftədir bizim üçün məktubat göndərən yoxdur. Müştərilərimizin bə'zinin yolu bağlanıb, bə'zinin sakin olduğu yeri dəyişildiyinə və ya qeyr səbəbə ona qəzet yetişmir. Bə'zi cəng xəbəri yazmadığımıza bizdən incinib qəzet istəmir. Xülasə, bu halda "Əkinçi"nin işi çox pərişandır.

## DAXİLİYYƏ

Bizim zəmanə zəhmət zamanı olduğuna çox zəhmət çəkən artıq nəf' tapır. Ona binaən hükəma vaxta dövlət deyir, yə'ni hər kəsin zəhmət çəkməyə vaxtı çox isə, ol kəs artıq dövlətli hesab olunur. Bu səbəbə Avropa əhli hər bir işi maşına salıb ki, maşın onu təmiz və tez tamam edir, yə'ni zəhmət çəkmək vaxtını artırmaqdan ötrü işləri maşına salıblar ki, maşın işi tez gördüyünə o işi tutmağa lazım olan vaxt az olur və onun artığı qeyr işə gedir. Belədə bir iş yerinə bir neçə iş tutmaq olur. Ona binaən bir kimsə 50 il zəhmət çəkib 10 min manat qazana bilir isə, maşın ilə iş görəndə 50 il ömürdə gördüyü işi 10 ilə görüb dəxi ziyadə nəf'bərdar olur. Pəs bu halda qeyr tayfalar fürsəti fövtə verməyib zəhmətlərin artırmaq sə'yindədirlər, amma bizim tayfa... dükan-bazarlarda oturanların çoxu bir cüz'i şey yanına qoyub 4-5 müştəri gözləməkdən ötrü axşamacan yazını ayırıb gəlib-gedənə tamaşa edir ki, guya bu zaman bir qeyr iş görmək günah imiş. Küçələrdə cavanlarımız

ya papağını əyri qoyub ay balam, ay balam çağırır, ya bir-birinə yaman deyir, meydanlarda kimi dərviş nağılına qulaq asır, kimi xoruz, kimi qoç döyüşdürür. Xülasə, heç bir həvəs ilə zəhmət çəkən yoxdur, hamı ya tənbəllik edib, işdən qaçırıq, ya bikar oturub Allahdan buyuruq deyirik.

Belədə təəccübdür ki, bizim tayfa indiyəcən tələf olmayıb və buna səbəb budur ki, keçmişdə biz eninə yeyib, uzununa gəzmişik, amma indi... yerlərimiz qüvvətdən düşüb, xeyir-bərəkət qaçıb, elmdən xəbərdar olan kəslərin yeri darlıq elədiyinə gəlib bizim yerlərdə zindəganlıq edirlər. Belədə bizlər bu tənbəllik və bikarlıq onların ilə müqabilində dura bilməyib, zindəganlıq cəngində məğlub olacayıq və necə ki, daşmış çayın suyu mürur ilə ətrafı qərq edir, habelə biz də o tayfaların arasında mürur ilə tələf olacayıq.

Bilmirəm, bunları oxuyan deyəcək ki, bu sözlər boş sözdür, Allah ruzirəsandır, heç kəs acından ölməz. Bəli, doğrudur ki, allah ruzirəsandır, amma ruzi ilə ruzinin təfavütü çoxdur... Pəs, qardaşlar, zəhmətinizi artırın ki, bikarlıq və tənbəllik insan üçün zəhərdir. Zəhmət çəkmək vaxtını uzadmağa sə'y edin ki, sizin ruzi düşmənlərinin əsbablarını ələ gətirəsiniz.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Bizim meyvələr ilə elmdən xəbərdar olan bağbanların meyvələrinin təfavütü çoxdur. Bizim meyvə, meşədə özbaşına bitəndən bir az yaxşıdır, amma onlarınkı iri və abdar olduğuna onun biri bizimkinin 3-4-dən ağır olur. Buna səbəb oldur ki, onlar nəbatatın nəşv-nümasından xəbərdar olduğuna kefləri istəyən kimi ya onların gülünü, ya yemişini, ya kökünü və ya budaqlarını yaxşılandırırlar. Məsələn, alma, armud, gavalı, gilas və qeyr bunlara oxşayan yemişləri belə yaxşılandırırlar: payızda budaqların üstə qönçə əmələ gələndə o kiçik budaqları elə kəsirlər ki, onun bir hissəsi bir-iki qönçə ilə ağacın üstə qalır. Belədə ağac sorduğu xörək çox yemiş yerinə az yemişə getdiyinə bunlar çox iri və abdar olur. Ya baharda ağacın yarpaqları açılandan sonra kiçik və özü yemiş gətirən budaqların ucunu dırnaq və ya bıçaq ilə kəsirlər. Belədə ol budağın uzanmağına lazım olan xörək yemişlərə getdiyinə bunlar iri olur və ya budağın qabığını üsul bıçaq ilə soyurlar ki, ağacın yarpaqları soran xörək o qabıq ilə aşağı gedə bilməyib budaqda olan yemişlərə getdiyinə onlar iri olur.

* * *

Çin məmləkətinin xalqı çox və yeri az olduğuna oranın bağbanları çox kiçik meyvə ağacları bitirdillər. Məsələn, bir ustol, yə'ni kürsünün üstə yekə bağ salırlar ki, bir ağacın boyu bir arşından da az olur, amma bunilə belə meyvə gətirir.

Yazırlar ki, ol ağacları belə bitirdillər: böyük ağacın bir budağının dibinə torba keçirib, onun içinə qara torpaq doldurub, onun üstə ol vaxtacan su çiləyirlər ki, budağın torpağın içində olan hissəsindən köklər əmələ gəlir, sonra onu kökdən aşağı kəsib qutularda bitirdillər.

Əgərçi Avropa bağbanları həm bu tövr ağac bitirdə bilirlər, lakin onların ağacı sonra böyüklənir.

* * *

Meyvə ağacının meyvəsindən, yə'ni toxumundan çıxan ağacın meyvəsi turş, yə'ni meşə ağacının meyvəsi kimi olduğuna bu ağacların toxumunu əkib sonra onlardan çıxan ağaca yaxşı meyvə gətirən ağacın bir kiçik, üstə 2-3 qönçəsi olan budağını calıyırlar. Çünki bu toxumların bə'zinin, məsələn, xurma toxumunun qabığı qalın olduğuna onlar bir neçə ildən sonra göyərir, ona binaən onları tez göyərtməkdən ötrü Avropa bağbanları bu toxumların qabığını üsul yarıb sonra əkirlər. Yazırlar ki, belə yarılan toxum 3-4 günə göyərir.

* * *

Bizlərdə meyit yuyanda iştənən kafur Hindistan dəryasının cəzirələrində bitən kafur ağacının budaqlarının içində hasil olur. Yazırlar ki, bir böyük ağacdan yarım girvənkə ancaq hasil olur. Çünki o meşələrin sahibləri ağacı qıranda onun böyük-kiçikliyinə baxmayıb hamısını dibindən kəsirlər, ona binaən yazırlar ki, əgər onlar bu qayda ilə o ağacları qırsalar, kafur çox baha olacaq.

* * *

Mə'lumdur ki, sağmal malı çox olan kəslər üçün süddən ya qatıqdan yağ çalxamaq çox zəhmətdir. Ona binaən bir kəsin südü çox olanda onu sərib, qaymağını yığıb, qaymaqdan yağ çalxalayır. Əvvələn, qaymaq az olduğuna ondan yağ çalxamaq asandır. Saniyən, bu yağ süddən ya qatıqdan çalxalanan yağdan ə'la və artıqraq olur və bir də, mə'lumdur ki, süd sərməyin zəhməti çoxdur. Hava isti olanda və ya qablar təmiz olmayanda süd xarab olur. Südü çox saxlayanda onun

qaymağı turş olur, az saxlayanda onun bir hissəsi süddən rədd olmur. Bu səbəblərə indi Lefildet adlı bir nemes qaymaq yığmaqdan ötrü bir maşın ixtira edib ki, tüfəng lüləsi tövrdə böyük dəmir qutunun içində bir ox var və bu oxun üstə dəmir qanadlar var, oxun bir ucu qutunun dibinə möhkəmlənib və o biri ucu qutunun ağzından çölə çıxıb ki, orada ona dəstə möhkəm olub. Qutunun içinə südü töküb ağzını qapaq ilə möhkəm örtüb, dəstəni fırrandıranda ox hərəkətə gəlib, onun qanadları südü tərpətdiyinə onun qaymağı yığılır.

Yazırlar ki, bu maşın ilə 300 girvənkə süddən 20 dəqiqəyə tamam qaymağı yığmaq olur.

* * *

Çünki bir iki sağmal malı olan üçün onun südü az olduğuna ondan yağ çalxamaq müşküldür, ona binaən Avropa kəndlərində camaat yağ çalxamaqdan ötrü bir mənzil bina edir ki, hər sağmal malı olan hər gündə bir qədər, məsələn, 2-3 kasa süd oraya verir və bu mənzildə ondan yağ çalxalayıb hər kəsin öz hissəsini ona verillər.

## MƏKTUBAT

"Əkinçi" qəzeti həmişə bizim müəllimlərə və onlara uşaqlarını tapşıranlara töhmət edir ki, onların hər ikisi uşaqlara yağı olub ol qədr incidirlər ki, biçarə bildiyin də yaddan çıxarır. Əlhəqq, bu söz doğrudur, amma bu barədə bizim müəllimlərdə taxsır yoxdur. Müəllim bir sənətkar babadır öz sənətilə qeyr sənətkar kimi dolanır, yə'ni öz bildiyini uşaqların valideyninə satıb zindəganlıq edir. Və çünki sənətkarın yaxşı-yamanı olmağına səbəb camaatdır, məsələn, yaman başmaq tikəndən başmaq alan olmasa, o başmaqçı ya gərək yaxşı başmaq tiksin ya başmaqçılığı bərhəm etsin, habelə müəllimin yaxşı-yaman olmağına bais camaatdır və əgər camaat başa düşə ki, bu tövr tə'lim uşağı xarab edir və xahiş edə ki, qeyr tövr uşaqlara tə'lim olunsun, müəllim naəlac qalıb camaat istəyən tövrdə tə'lim edəcək yoxsa zikr olan başmaqçı kimi gərək müəllimliyi bərhəm etsin. Əlbəttə, şagirdin ata-anası deyəndə ki, molla onu döy, əti sənin, sümüyü mənim, molla naəlac qalıb döyəcək, yoxsa ay başı gələndə ona pul verən olmaz.

Hər kəs xəyal edirsə ki, bizim indiki müəllimlər birdən-birə başlayıb təzə qayda il tə'lim edəcək, nahaq fikrə düşüblər. Onlar nə qədər qabiliyyətli olalar və nə qədər xahişdə edələr, bunu edə bilməzlər.

Ona binaən ki, onların bu təzə qaydadan əsla xəbərləri yoxdur. Pəs bir camaat xahiş etsə ki, uşaqlara təzə qayda ilə tə'lim olunsun, ol vaxtda gərək bizim gimnaziyada ya uyezdni uşkolada oxumuş kəslərdən müəllim eləsin, yəqin ki, bizim indiki müəllimlər 4 ilə öyrətdiyini bunlar bir ilə öyrədəcək. Ona binaən ki, bunlar az-çox elmdən xəbərdar olub, onu tə'lim etməyin qaydasını həm az-çox bilirlər.

Tə'lim etmək asan deyil, bu özü elmdir ki, Avropa əhli ona elmi-pərvəriş deyir.

Bizim müəllimlər qol gücünə biçarə uşağı yarımcan edib əlif-bey öyrədib sonra əlhəmdülillahı əzbərlədib korazehin edirlər. Amma elm oxumuş müəllim uşağı həvəsə gətirib əmcəkdən kəsilmiş uşağı çörəyə, suya öyrədən kimi əlif-beydən sonra ona qaranı tanıdır.

Pəs, qardaşlar, gərək mürur ilə təzə məktəbxanalar bina edib, az-çox elmdən xəbərdar olanları oraya müəllim tutmaq.

Bir baxın bizim qonşu ermənilərin elm təhsil etməyinə. Qafqazın hər bir şəhərində onların gimnaziyaya bərabər məktəbxanaları var. İrəvan yavıqlığında hətta akademiyaları da var. Amma bizim bircə də elm oxuyan məktəbimiz yoxdur. Ay qardaşlar, yaddan çıxarmayın ki, uşaqlar millətin ümididirlər və bunu bilin ki, Avropa əhlinin bir məsəli var ki, deyir: millətin gələcəkdə xoşbəxt ya bədbəxt olmağına bais uşaqların əvvəl yaxşı, ya yaman tövr ilə əlif-beyi oxumağıdır.

*Gorani*

* * *

Teymurxan-Şuradan cəmadiyələvvəlin 17-dən yazırlar ki, bu il yağış çox yağdığına xalqın ziraəti yaxşıdır. Bu gün səkkiz gündür ki, bazara tut gəlib: girvənkəsi 1-2 qəpiyə satırlar. Amma hər il tut 20 gün bundan sonra yetişir idi. Və bir də hava çox dəyişilir. Məsələn, bir neçə gün bundan əqdəm 20 dərəcə isti var idi, amma bu gün bir dərəcə soyuq var.

Teymurxan-Şuranın ətrafında oğurluq artıb. Bu günlərdə poştu kəsmişdilər, amma kazaklar gedib geri aldılar.

## TƏZƏ XƏBƏRLƏR

Aprelin 28-dən padşahi-imperaturi-ə'zəmi tərəfindən bu hökm sadir olub: aprelin 12-də Osmanlı dövləti ilə cəng başlandığına biz hökm elədik ki, Bessarab quberniyasında, Xerson və Tavriç quberniyalarının dərya kənarlarında, Krım nimcəzirəsində qanuni-əsgəriyyə işləsin. Habelə ol vaxtda cənab sərdari-Qafqaza ixtiyar vermişik ki, zikr

olan səbəbə görə Qafqaz vilayətini hansı tərəfində lazım bilsə, qanuni-əsgəriyyə iştədsin. Ona binaən indi lazım bilib qanuni-əsgəriyyə iştənən yerlərdə əsgəriyyə qulluğunda olmayan kəslərin taxsırlarına görə onlara tənbeh etmək xüsusunda hökm edirik: əvvələn, əsgəriyyə qanunu iştənən yerlərdə əsgəriyyə qulluğunda olmayan kəslərə əsgəriyyə qanunu üzrə tənbeh olunsun, aşağıda zikr olan taxsırlara görə:

Padşahın üzünə ağ olmaqdan və dövlətə xəyanət etməkdən ötrü.

Qəsd ilə əsgərə lazım olan mayəhtacı odlamaq və qeyr tövr ilə xarab etməkdən ötrü habelə qəsd ilə teleqrafları, dəmiryollarını, su arxlarını, körpüləri, bəndləri və qeyr keçənəcəkləri xarab etməkdən ötrü.

Düşmənin hərəkətindən, yə'ni hansı tərəfə getməyindən xəbərdar olub və bir qeyr xəbər ki, onu piş əzvəqt bilmək ilə onun əlacını etmək olur, bilib lazım olan yerinə mə'lum eləməməkdən ötrü.

Qarovulçuların üstə hücum etməkdən ötrü, əsgəriyyə qarovulçularına əliyaraqlı sərxudluq etməkdən ötrü və qarovulçuları zəxmdar etməkdən və öldürməkdən ötrü.

Saniyən, cənabani-sərdari-Qafqaza və Odes okruğunun sərəsgərinə ixtiyar verilir əsgəriyyə qanunu iştənən yerlərdə əsgəriyyə qanunu ilə taxsırlandırmağa hökm eləsinlər bu taxsırkarları: qəsd ilə bir kəsi öldürənləri, soyanları, bir kəsin evini kəsənləri, odlayanları, suya basdıranları və qeyr təqsiri-kəbirə ilə taxsırlananları və hər bir xalqın asudə zindəganlıq etməyinə mane olan işlərdə taxsırlananları.

Salisən, Qafqazda və Odes okruğunda qanuni-əsgəriyyə iştənən yerlərdə bu hökmün 1-ci və 2-ci fəqərələrində zikr olan taxsırkar övrət olsa, onlara ancaq ol vaxtda əsgəriyyə qanun üzrə tənbeh olunsun ki, onlar bu taxsırı kişi ilə birgə etmiş ola və bu zaman əsgəriyyə divanının calisləri gərək qanuni-külliyə üzrə ona tənbeh eləsinlər.

* * *

Cənab-sərdari-Qafqaz hökm edib ki, Terski oblastda Kubanski oblastın Batalpaşi, Maykop, Zakuban uyezdlərində və Yekaterinodar uyezdinin 3-cü hissəsində qanuni-əsgəriyyə iştənsin.

* * *

İrəvandan "Tiflisski vestnik" qəzetinə yazırlar ki, Gəncə quberniyasından cəm olan süvari əsgərlər aprelin 30-da İrəvan bazarında dükançı ermənilərdən şey alıb pulunu verməmək istəyib, dava salıb tüfəng, xəncər ilə 16 adam yaralayıblar ki, bunların biri dərhal, dördü sonra vəfat edib. Cənab qubernator əsgər ilə gəlib dava edənləri aralaşdırıb.

* * *

Badkubə quberniyasından cəm olunan süvari əsgərə polkovnik Miribrahim bəy Talışxanov hakim, yə'ni polkovoy komandir tə'yin olub.

* * *

Mayın 20-də Peterburqdan yazırlar ki, ə'lahəzrət padşahi-imperaturi-ə'zəm həzrət vəliəhd ilə belə Ploeşt şəhərinə ki, Tuna əsgəri dayanan yerdir, getdi.

* * *

Gürcüstanın bəyzadələrindən 200 adam öz xahişi ilə əsgər olub.

* * *

İstanbuldan yazırlar ki, millət məclisi qət edib ki, keçmişdə sədri-ə'zəm olan Mahmud Nədim paşanın padsuda, yə'ni divana versin.

* * *

Parijdən yazırlar ki, Midhət paşa orada gizdin sakin olur.

* * *

Londondan yazırlar ki, iyun ayında dörd yüz il tamam olur ki, İngilis vilayətində çapxana açılıb. Ona binaən tədarük edirlər ki, o günü şadyanalıq olunsun.

* * *

"Bakinski izvesti" qəzeti yazır ki, vəziri-xəzanə öz təsəvvürünü dövlət məsləhətxanasına pişnəhad edib ki, neft cövhərindən gələn ilin ibtidasından aksiz xərci alınmasın.

* * *

"Odesski vestnik" qəzeti yazır ki, Borçalı mahalında bu il çəyirtgə çox zərər edib.

* * *

"Tiflisski vestnik" qəzeti yazır ki, Borçalı mahalında bu il çəyirtgə edib.

* * *

Zikr olan qəzet yazır ki, Gömrüdən Zəyəm qəryəsinə və Bayazid qalasına teleqraf açılıb.

* * *

Ozurgetdən Tiflis qəzetlərinə yazırlar ki, orada çox soyuqdur. Ət, un və qeyr mə'kulat çox bahalanıbdır.

* * *

"Tiflisski vestnik" qəzeti yazır ki, Borçalı mahalından olan İsgəndər adlı məşhur qaçağı aprelin 12-də öldürüblər.

* * *

Tiflisin kommerçeski bankı və sobraniyası hərəsi min manat veriblər ki, Qafqazda zəxmdar olan əsgərə məsrəf olsun. Şəki uyezdindən "Tiflisski vestnik"ə yazırlar ki, təzədən bir dəstə də qaçaq əmələ gəlib, pristav Fyodorovun və Ağayevin üstə tökülüb, Ağayevi zəxmdar edib.

* * *

Bu il qışda hər yerdə çox quraqlıq olub. Amma indi çox yağış yağır. Hətta bizim Badkubəyə indiyəcən 3-4 dəfə yağış yağıb. Ümidvarıq ki, bu il yay çox isti olmasın.

## E'LAN

"Peterburqski vedomosti" yazır ki, padşahlıq bangı aprelin 25-dən mayın 9-can 25 milyon kağız pulu kəsdirib.

* * *

Badkubə gimnaziyasına uşaqlarını vermək istəyənlərə mə'lum olunur ki, bu barədə gərək avqust ayının 25-cən ərizə verilsin və bu uşaqları avqust ayının 25-dən sentyabr ayının ibtidasınacan imtahan verəcəklər.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*3-cü sənə* *12-ci nömrə*

*Fi 9 cəmadiyülaxir, sənə 1294*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Pəncşənbə günü*




*Fi 9 iyun Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*1 sənəliyi – 3 manat*
*6 aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Müştərilərimizin birisi yazır ki, sən allah, bu halda qəzeti mənə göndərmə. Mən onu qəzet hesab edib, təzə xəbərlər axtarıb, tapmayanda ürəyim xarab olur. Doğrudur, dərman-davanın çoxu insana xoş gəlməz, lakin gələcəkdə səhhətbədənlik istəyən naxoş olanda gərək dərman-dava içsin.

## DAXİLİYYƏ

Neçə dəfə Avropa tayfalarının, yə'ni Məğrib-zəminin bizim tayfalardan, yə'ni Məşriq əhlindən artıcaq tərəqqi etməyindən və onun səbəblərindən danışmışıq. Əlbəttə, bu səbəblərin ümdəsi onlar bizdən artıqraq elm təhsil etməkdir və ondan masəva bunun bir səbəbi də azadlıqdır.

Nə qədər Avropa əhli bizim təki azadlıqdan bixəbər olub ol vaxtacan bizdən bədtər avam olub. Amma bu halda azadlıq cəhətindən Avropa əhli çox tərəqqi edib və hər bir işdə bizdən irəli düşüb.

Əgərçi bizim şəriətimizə görə qul azad etmək çox böyük savabdır, amma biz bu barədə həm işi gec qanmışıq. Satınalma qulu azad etməyi savab hesab edə-edə, biz öz xahişimiz ilə bir-birimizə qul olmuşuq. Rəiyyət padşaha, övrət kişiyə, uşaq ataya, nökər ağaya, şagird ustada və qeyrə məgər qul deyil?

Bəli, biz hamımız quluq və buna səbəb bizim ata-baba adətləridir. Xülasə, Məşriq-zəmində azadlıq olmadığına biz Avropa əhlindən geri

qalmışıq və nə qədər belə olsa, biz tərəqqi etməyəcəyik və edə bilmərik.

Mətləb uzun olmasın deyibən bu nömrədə oğul atanın qulu olmağından bir az danışacağıq.

Həqiqət, bizlərdə oğul atanın quludur. Mə'lumdur ki, bizlərdə oğul atanın hüzurunda oturmaq, xörək yemək, danışmaq və qeyrə eybdir. Ondan masəva oğul atadan izinsiz nə ki bir iş görə bilməz, hətta evlənə də bilməz. Xülasə, ata oğulu, bir şey kimi, məsələn, eşşək kimi özünə təəllüq hesab edib, hər nə öz xahişidir ona əməl elədir və dəxi bunu fikir eləmir ki, gələcəkdə bu adam olub, qəyyumsuz iş görəcək. Belədə uşaq nə ki qeyrlərin, hətta özünün ixtiyar və borclarından bixəbər olduğuna atası kimi özündən gücdülərin qabağında ikiqat oluban, özündən zəifləri adam hesab etməməyə adət edər. Xülasə, nə qədər qabiliyyətli uşaq olsa, bizim adətlər ilə oluna tə'limdən insan ola bilməz. Biz övladın yağısı olub, onun axırına çıxıb, insaniyyətlikdən uzaq edirik.

Bunu oxuyan belə qiyas etməsin ki, biz deyirik uşaq atanın sözünə baxmayıb, o buyurduğuna əməl eləməsin. Bu halda ki, bizim malımızın və qeyrə düşməni artıb, uşağı dəxi bərk saxlamaq gərək ki, düşmənlərimizin ləzzətli görünən adətlərinə öyrənməsinlər. Pəs, biz deyirik ki, yumruq, sillə ortalıqdan çıxsın, uşaq ilə adamyana rəftar olsun ki, özü yaxşını yamandan dərk edib, bəd əmələ mürtəkib olmasın. Qardaşlar, hökumət, ya dövlət və qeyrə ilə adam insan olmaz, hər kəs öz vücudunun qədrini bilib insaniyyət ixtiyar və borclarını əda etmək ilə insan olur. Belədə əvvəl gərək insan olub, sonra dövlət və qeyrə axtarmaq.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Böyük şəhərlərdə nə qədər artıq mal saxlansa, onun südü ol şəhərdə sakin olanlara çatmır. Çünki xörəklərin hamısından, ələlxüsus, uşaqlar üçün mal südü yaxşıdır, ona binaən indi quru süd qayırıllar ki, un kimi olur. Bundan ötrü təzə südü süzüb, böyük, ağzı bərk möhkəmlənmiş qazanların içində 35 dərəcəyəcən qızdırıllar. Belədə südün suyu mürur ilə buğa dönüb, rədd olur və qazanın içində süd quruyur. Belə südü dəmir qutularda bir neçə il saxlamaq olur və haçaq onun üstə su tökəndə təzə süd əmələ gəlir.

* * *

Avropa əhli indi çox qarğıdalı, yə'ni peyğəmbər buğdası əkir. Yazırlar ki, onun üstə bir qurd əmələ gəlib, ona çox zərər edir və bu qurd öz toxumunu peyğəmbər buğdasının yerin üstə quruyan budaqlarının içinə qoyur ki, onlardan gələn il qurd əmələ gəlir. Ona binaən məsləhət edirlər ki, peyğəmbər buğdasını yığandan sonra onun yerin üstə qalan budaqlarını yandırsınlar ki, onların toxumu tələf olsun.

* * *

Qarğıdalını və bir neçə qeyr otları əkəndən sonra onlar göyərəndə qarğa və qeyr quşlar onları didib tələf etməməkdən ötrü məsləhət edirlər ki, onların üstə tor çəksinlər və onun altına ağaclar vursunlar ki, tor yerin üzündən bir çərək hündür dursun.

* * *

Avropa əhlinin üç qism malı olur: süd, ət və iştədmək üçün. Süd malının südü çox, əti az, ət malının əti çox, südü az olur, işləyən malın əti, südü az, amma gücü çox olur.

Hər bir qism mal saxlıyan gərək onun ə'lalanmışlarından gətirib, öz malını yaxşılandırsın və ya öz malının yaxşılarını seçmək ilə onları yaxşılandırsın. İndi yazırlar ki, süddən ötrü saxlanan malı gərək kiçik olan zaman çox kök saxlamıyasan və məqdur olduqcan onları tez, yə'ni kiçik olan zaman doğuzdurasan.

* * *

Yağışdan bədəni saxlamaqdan ötrü su keçməyən parça qayırıllar və bu cürə parça iki qism olur: ya onu lak ilə örtüllər, ya qeyri əczalar ilə elə edirlər ki, ondan su keçmir. Lak ilə örtülən parça bədənə zərərdir, ona görə ki, bədəndən rədd olan tər və qeyrənin rədd olmağına mane olur. Bu səbəblərə, parçanı qeyr tövrlər ilə su keçməyən edirlər, əzon cümlə yundan və katandan toxunmuş parçanı belə su keçməyən edirlər: zəyi suda əridib, onun içinə mel, yə'ni uçqolalarda taxtanın üstə yazmaqdan ötrü iştənən ağ torpağı salıb, bunun içinə bir neçə dəfə zikr olan parçaları salıb çıxarıb, sonra isti suda ərinmiş, yə'ni köpüklənmiş sabun suyuna salıb çıxarıb, təmiz su ilə yumaq ilə.

## MƏKTUBAT

Ey bizi həcv qılan şairi-dövrani-Əzim,
Seyyidü sərvərü sərdari-süxəndani-Əzim
Dəhri-gülzari ara bülbüli-xoşxani-Əzim,
Əzizim, iki gözüm, cəddinə qurban, Əzim!

Şə’ni-üzmada əgər biz deyilik əzmi-rəmim,
Abi-heyvan degisən biz dəxi ğəssaq həmim,
Seyyidin təbi kəramətli olur, nəfsi səlim,
Nə rəvadır deyəsən hərzəvü hədyan, Əzim?

Sən əgər ali-Əlisən, hanı qeyrət, de görüm,
Haşimisən, qüreyşisən, hanı qeyrət, de görüm,
Allah, Allah, nədi bir boylə qəsavət, de görüm,
Sakit ol, sammit otur, sən demə biman, Əzim!

Cəddini mədh edən vəqtə, əya alicənab,
Niyə qarnına düşər sancı, edərsən təbü tab,
Sən də mən kimi gözün yaşını tök, başını çap,
Cəddini yaxşı tanı, mərtəbəsin qan, Əzim!

Aç bəsirət gözünü şahi-şəhidanə tərəf,
Baxgilan Kərbübəla səmtinə meydana tərəf.
Məhliqa canları gər tiği-cəfa ilə tələf,
Gör ki, sən də olusan qanına qəltan, Əzim.

Şur başında əgər olsa, bilirsən ki, nə var,
Eşq gülzarına gəl, seyr elə bir, keçdi bahar,
Qumrivü bülbülü cuğdü necə gör zarü fəkar,
Eşq soltanına olmuşlar əzaxan, Əzim.

Gər desəm həcv sənə, cümlə müsəlmanə dəgər,
Zəmm daşın gər atam, şişeyi-imanə dəgər,
Bədənə hadis olan sədmə, yəqin, canə dəgər,
Nə edim, çarə nədir, cuş qılır qan, Əzim.

Hüsni-xülqi bizə mə’lum idi Mirzə Həsənin
Yox lüzumi o cənabə dəxi iqrar sənin,
Mənbəi-feyzdir aləmlərə, kani kərəmin,
Mədəni-elmü ədəb, məlcəi-irfan, Əzim.

Kim deyir rus dili bid’ətdir aləmara,
Cahili əlsinələr xiclətdir aləmara,
Hər dilin mə’rifəti izzətdir aləmara,
Mə’rifət elminin kim eyləyir kitman, Əzim?

Dəxi bihudə danışma sən, əya paknihad,
Nəfsi-əmmarə ilə Hadi kimi eylə cihad,
Hüzn ilə qan-yaş axıt, eyləgilən cəddini yad,
Nariza olmaya ta şahi-şahidan, Əzim!

## DƏR ŞƏRAFİYYƏTİ-İNSANİYYƏT

Əvvələn, bəni-noi-bəşər üçün fərzdir ki, özünü və öz saneini tanıyandan sonra öz vücudunda olan əvalimi və iste'dadı diqqəti-tamam ilə dürüst mülahizə etsin ki, xudavəndi-əliyyül-ə'la onun zəif və nəhif sayılan bədənində nə əzim olan əvalimlər və onun zəmairində nə ənva-ənva əlaimlər ibda' və icad buyurub, hansı ki, onun qüvvətilə insan qadirdir hər bir növ sənaye'i-əcubə və məhbubə və hər bir qism övzaati-müxtəlifələr ibda' və ixtira etməkliyə.

Məşhur sözlərdəndir ki, aləmdə elm iki qismdir: biri elmi-bədən və birisi elmi-din. Məsələn, aləm nasutdan və elm bədəni-lahutdandır, yə'ni elmi-din qalıb və elmi-bədən ruh misalındadır. Bu mə'naya ki, kişinin dini ikmala yetişir ibadət ilə və ibadət kamil olur mə'rifət ilə və mə'rifət şəxs üçün aid olur elm ilə və hakəza elm əməl ilə və bunların qəmusu mənutdur bədənin səlamət olmağına və bədənin səlamət olmağı bağlıdır məişəti-dünyaya və bu məişət hərgah vüs'ət ilə məqdur olsa, bədən üçün səlamətlik və rahatlıq artıcaq olur. Bədən ki, səlamət və rahatlıqda oldu, ruhaniyyət ilə ibadətlər edib və təkmilidin onun üçün hasil olub, özünü məqami-həqiqətə yetirəcək. Və mülahizə edirik ki, bu məişətin vüs'ətindən ötrü aləmdə əsbablar tərtib olunub. Belə ki, bu əsbabların iste'malı ilə, cəmi ona mübaşir olan əşxaslar məqami-rahətliyə yetişib və məratibi-ə'laya və dərəcati-irtifaya çatıblar. Və hərgah dürüst təəmmül etsək, müşəxxəs olur ki, hər iki elm ibarət imiş elmi-məişətdən. Və bir də çün xudavəndi-əliyyül-ə'la bizləri şö'bə-şö'bə və firqə-firqə ki, məqami-icada gətirib, məhz budur ki, bir-birimizə elmlər və ədəblər və o sənətləri ki, insanı vüs'əti-məişətindən ötrü lazımdır, zahiri və batini öyrədək, tainki bir-birimizdən bəhrəmənd olub və bu aləmi-kövni-fəsadi ki, indi aləmi-tərəqqidir, məqami-təkmil və irtifaya yetişək və mə'lumdur ki, bu ülumatların təhsilindən ötrü nə qədər zəhəmatımız artıcaq olsa, məqsud və mərama artıcaq yetişirik. Pəs, bu məqamda lazımdır ki, əsbabi-məişətin təhsil və vüs'ətindən ötrü qayət inbisat ilə zahir və

batinlərimizi bir edib və məbane' xətirlər məsarif edib, hər növ ilə məşğul olaq elmi-mə'rifət təhsil etməyinə, ta bəlkə sair millətlər kimi bizlər də özümüzü məqami-tərəqqi və məratibi-ə'laya yetirib elmi-həqiqət və hikmətdən bir şey idrak edək. Əfsus ki, cəmi millətlər piş-qədəm olub və məşəqqət və təkəllüfati-ülumata mütəhəmmil olub, nə fünunlar ilə məqamati-ülviyyə və dərəcati-tərəqqiyə yetişdilər və biz islam tayfası hala ehtiyac biyabanında kor-koranə heyran və sərgərdan dolanırıq. Bavücudi-in mühavirət zamanı laf və gəzafımız həddən ziyadədir. Heyf olsun ki, təsəvvürati-batilə və təxəyyülati-naqisə ilə bu cəhalət çölündə qalıb, insaniyyət caməsi bədənlərimizdən məslub olub, elm və ədəb puşişindən ari olacayıq, yə'ni nə eybi var ki, daireyi-qürur və mədəniyyətdən xaric olub və bu cəhalət tilsimini sındırıb, bizlər də sair millətlər kimi təhsili-elmi-mə'rifət ilə özümüzü gəncineyi-məqsudə yetirib, pakizə olan sənayei-ülumatları və əsbabları bizlər də dünyanın üzündə yadigar qoyub və onun iste'malı və mübaşirətilə bizdən sonra vücuda gələnlər rahatlıq məqamına yetişib və bizimçün tələbi-məğfirət edib və sair nadan olan qövmlərə o əsbabın vücudu ilə iftixar edib, məqamati-tərəqqiyə vasil olalar.

Heyhat, heyhat, ey bəsa arzu ki, xak şəvəd[1].

## ŞUŞA QALASINDA OLAN ƏXBAR

Rəbiüssani ayının 20-ci günü bir seyyidə övrət bir baqqalın yanına 5 put düyü gətirir satmağa. Baqqal düyünü çəkəndə qul verib[2] onu 3 put hesab edir. Hərçənd seyyidə fəryad edir ki, mənim düyüm 5 putdur, amma baqqal qulaq asmayıb onu qovur. Seyyidə ona nifrin edir ki, Allah sən məni yandıran təki səni də yandırsın. Haman gecə baqqalın dükanına od düşür və onun meymənətindən 40 bab dükan və 2 dəst imarət və o dükanlarda olan əşxasların şeylərinin nisfi bit-tamam yanıb, tələf oldu. O dükanların və evlərin sahibləri Səfi bəyə və Hacı Rzaya və orada sakin olanlara təxminən yüz min manat zərər yetişdi. Zikr olan baqqal, onun oğlu və bir neçə hammal dükanlarda yanıb, vəfat etdilər. Və bir də erməni məhləsində bir Harsen gecələr qudurmuş heyvan kimi divanəvar gəzir və hər bir qəviheykəl adam

[1] Bir çox arzular var idi ki, məhv olur.

[2] Yə'ni: aldadıb

qabağına çıxa, yırtıcı heyvanat kimi ona həmlə edir, ta sübhə kimi. Elə ki sübh oldu yuxuya gedir, ta axşam olur, axşam genə bu qəbil.

Bu ayın 15-də şəhərin qərbi tərəfinə yarım arşına yavıq qar gəldi və çox soyuq oldu. Və bir də bir türkman Cavanşir mahalında bədgüman olub öz övrətinin və bacısının başını kəsib. Sonra boynuna alıb ki, mən öldürmüşəm.

*Hadiyül-Müzillin Qarabaği*

Qalada yanğı olmağına sözüm yox, lakin onun səbəbi barəsində lazım bilib ərz edirəm ki, əgər hər bir şəriətdən xaric iş görənə Allah qəzəb eləsə, gərək bu halda bizim hamımıza qəzəb eləsin və bir də tutalım, zikr olan baqqala seyyidəni aldatmaqdan ötrü və cənabani-Səfi bəyə və Hacı Rzaya mərsiyəxana pul verməməkdən ötrü və ya imam ehsanı paylamamaqdan ötrü Allah qəzəb eləyib. Görəsən biçarə hammalların və dükanlarda sakin olanların taxsırı nə imiş?

## TƏZƏ XƏBƏRLƏR

Bir ay bundan irəli qəzetlər yazmışdılar ki, İran dövlətinin Rəşt şəhərinə taun naxoşluğu düşüb. Bu səbəbə bizim Badkubədən iki həkim və Tehrandan bir neçə firəng həkimi oraya göndərilmişdi ki, ol naxoş olanlara baxıb həqiqət eləsinlər zikr olan naxoşluq taundur, ya yox. Bizim Badkubə həkimləri qayıdıblar və deyirlər ki, ol naxoşluq taun deyil. Lakin Tehrandan göndərilən həkimlər deyib ki, taun naxoşluğudur, amma indi şiddət etmədiyinə səbəb budur ki, isti düşüb və əgər gələn qışacan qalsa, ol vaxtda şiddət edəcək.

* * *

Dövlət məsləhətxanası qət edib ki, Rusiyada hasil olan tənbəkini və neft cövhərini yaxşılandırmaqdan ötrü gələn 1878-ci ilin ibtidasından, yə’ni yanvarın əvvəlindən neft cövhərindən aksiz xərci heç alınmasın və Rusiya yerində hasil olan papiros tənbəkisinin hər bir qisminin girvənkəsindən 24 qəpik, papirosun 100-ündən 15 qəpik, siqarın 100-ündən 60 qəpik, qəlyan tənbəkisinin girvənkəsindən 2 qəpik banderol pulu alınsın. Qeyr yerlərdən Rusiyaya gətirilən tənbəkidən tamojna xərcini belə artırsınlar: hər puta keçmişdə alınan 4 manat 2 abbası əvəzinə 14 manat alsınlar.

* * *

“Pravitelstvenni vestnik” qəzeti yazır ki, bizim Rusiya dövləti təzədən 15 milyon funt sterlinq (bir funt sterlinq 8 manatdır) borc edib.

* * *

Yazırlar ki, Çin məmləkətinin şimal tərəfində elə bərk aclıqdır ki, hər gündə bir neçə yüz adam acından vəfat edir. Uşaqları satın alan olmadığına onları ata-anası öldürür.

* * *

“Əndipindas Belği” qəzeti yazır ki, mayın 14-də Hollandiya məmləkətinin Ğaağa şəhərinə xəbər gəlib ki, Hindistan dəryasının cəzirələrində sakin olan Açin tayfasının sərkərdələri Hollandiya məmləkətinə müt’i olublar, ona binaən cəng qurtarıb.

* * *

Açin tayfası islamdır, bir neçə ildir ki, onlar ilə Hollandiya cəng edirdi.

* * *

Zikr olan qəzet yazır ki, Afrika qit’əsində vaqe olan Transvaal hökumətini İngilis dövləti zəbt edib.

* * *

“Naş vek” qəzeti yazır ki, dövlət məsləhətxanası qət edib ki, bundan sonra padşahlıq qulluğuna girən kəslər əlahiddə imtahan olunsun və bu imtahan necə olunsun – qaydasını yazmaqdan ötrü əlahiddə komisyon bina olunub.

* * *

Tiflisdə Ərdəhan qalasını bizim rus əsgəri almaqdan ötrü iki gün şadyanalıq ediblər və bu zaman zəxmdar olan əsgərlər üçün 6 min manat cəm olub.

* * *

Şəkidən "Kavkaz" qəzetinə yazırlar ki, bu il növqan çox yaxşıdır: buğdanın putu 3 abbasıya, darının 2 abbasıya satılır. Hərçənd barama da çoxdur, amma çox ucuzdur və buna səbəb budur ki, cəng olduğuna barama alan firənglərin yolu bağlanıb.

* * *

Rəşt şəhərinə taun naxoşluğu düşüb xəbəri çıxdığına Badkubəyə hökm gəlib ki, Əfşəran nimcəzirəsində karantin bina olunsun ki, hər İrandan gələn gəmi öz malı və miniyi ilə belə əvvəl orada iki həftə qalıb, sonra Badkubəyə gəlsin.

* * *

Mə'lumdur ki, cəng olan zaman kağız pulu qiymətdən düşür, amma Peterburq qəzetləri yazırlar ki, hərçənd bu halda bizim 825 milyon manatlıq kağız, yə'ni əskinas pulumuz var və indi bizim Rus dövləti Osmanlı ilə cəng edir, lakin kağız pulu ol qədr qiymətdən düşməyib və buna səbəb budur ki, davadan irəli bangların çoxu bankrot, yə'ni yoxsul olduğuna xalq onlara bavər etməyib, pulunu əlində saxlamışdı. Elə ki, dava başlananda kağız pulu bir az qiymətdən düşdü, hamı istədi ki, o kağızlardan alıb, sonra baha satsın. Bu səbəbə zikr olan kağızlar qiymətdən düşmürlər.

## E'LAN

Bir cavan rus ki, Badkubəyə təzə gəlib və özü türk dilini danışmağı bilir, istəyir amil, yə'ni prikaşçik olsun. Hər kəs onu saxlamağa xahiş edirsə, "Əkinçi"nin idarəsinə xəbər eləsin.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления

---

*3-cü sənə* *13-cü nömrə*

*Fi 23 cəmadiyülaxir, sənə 1294*

* * *

*Poşt xərci basdıran illədir*

* * *

*Pəncşənbə günü*




*Fi 23 iyun Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*1 sənəliyi – 3 manat*
*6 aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Fikrimiz budur ki, bu yayda Tiflisdən cənab qubernatora xalqa mə'lum eləməkdən ötrü göndərilən tellərin əlahiddə çap elədiyi qəzet ilə belə göndərək.

* * *

Cənab şahzadə sərəsgər, Qafqazın ixtiyarında hesab olunan general Abdullah ağa Bakıxanov Bakı quberniyasına gəlib, Quba şəhərində olan zaman Qafqazda zəxmdar olan əsgərlər üçün oranın müsəlmanlarından 233 manat siyahı ilə cəm edib, iyun ayının 3-də cənab qubernatora göndərib və cənab qubernator o məbləği və siyahını cənab sərdarın övrətinin qofmeysteri Tolstoya göndərib ki, zəxmdar olanlara məsrəf olunsun.

## DAXİLİYYƏ

Hər kəsin öz dili ona artıq xoş gəlir. Bu səbəbə biz "Əkinçi" qəzetini bina edəndən sonra onu Osmanlı və İran məmləkətlərində çap olunan qəzetlərin, əzcümlə Tehranda çap olunan "İran" qəzetinin idarəsinə göndərib iltimas elədik ki, onlar da öz qəzetlərini bizə göndərsinlər. Amma İran qəzetinin idarəsi bizə məhəlgüzar olmadı. Bu səbəbə indiyəcən "İran" qəzetini görməmişdik. Bu həftə bizim dostlardan birisi Tehrandan "İran" qəzetinin bir nüsxəsini ki, rəbiüssaninin 9-da çap olunub bizə göndərilib. Ona binaən lazım bilib ol qəzetin barəsində bir neçə kəlmə danışacayıq.

Bu halda ki, tamam dünya biz müsəlman tayfasının işlərindən danışır, bizim müsəlman məmləkətində çap olunan, İran əhlinin bircəsi “İran” qəzeti görün nə danışır.

Xəbəri-teleqrafi və qeyrə fəslində Azərbaycan, Xorasan, İsfahan və qeyr İran vilayətlərindən gələn tellər çap olunub ki, guya dünyada Parij, London, Peterburq və qeyr Avropa şəhərləri yoxmuş və zikr olan tellərin xəbərləri belə xəbərlərdir: Filan yerə yağış yağıb, növqan yaxşıdır və mərdüm asudə bəduaguyi-vücudi-mübarəki-ə’lahəzrəti-əqdəsi-hümayun məşğulənd. Sonra cənab rəisi-külli-darültəbaə və darültərcümeyi-məmaliki-məhruseyi-İran Səni’üddövlə Məhəmmədhəsən xan (“İran” qəzetinin münşisinin ismi və ləqəbidir) Mədinə şəhərində İran hacıları ilə Osmanlı və ərəblər elədiyi duadan bir neçə kəlmə danışıb qəzetin baqisinin üstə ki, olsun bir vərəq bir çərək (tamam qəzet vərəq yarımdır) Tehran şəhərinin tarixini yazır.

Ey Səni’üddövlə, fədayət şəvəm, qəzetin tarix ilə nə işin var? Məgər dünyada qeyr xəbər yoxdur ki, qaramal yediyi xörəyi sonra gövşəyən kimi, keçmişdə olan işləri dərviş kimi müştərivüzə nağıl edirsiniz və bunu fikir eləmirsiniz ki, o işlər yaxşı olsaydı, biz bu günə qalmaz idik? Heyhat, heyhat!

Əzizim, qəflət yuxusundan oyanıb, Avropa tərəfinə tamaşa edin, yoxsa sonra... əlaci-vaqeə piş əz vüqu’ bayəd kərd[1].

## ƏF’ALİ-ƏHLİ-DEHAT

Ərəbistan isti və susuzluq olduğuna onun kəndləri ki, su olan yerlərdə vaqedirlər, bir-birindən çox aralıdır. Çünki uzaq yolu ancaq yeyin at ilə getmək olur, ona binaən ərəblər qədim zamandan bəri öz atlarını yaxşılandırmaq fikrində olublar. Bu səbəblərə Ərəbistan atı çox yaxşılanıb, ətrafda olan yerlərin atlarını həm yaxşılandırıb ki, İranın və Türkmanın atları da yaxşıdır.

Əgərçi bizim Qafqaz vilayətində tavana ilxı sahibləri yaxşı ayğır saxlamaq ilə öz atların ə’lalandıra bilir, amma kənd əhli ki, 1-2 madyandan ziyadə saxlaya bilmir, yaxşı ayğır da saxlaya bilməz. Belədə bizim atları gün-gündən yaman olmaqdan mühafizət etməkdən ötrü

[1] Hadisənin əlacını gərək o baş verməzdən əvvəl edəsən.

məsləhət olunur ki, hər kəndin əhli birləşib 1-2 ayğır alıb hər madyana basdırandan bir cüz'i məbləğ, məsələn, bir manat almaq ilə təzədən pul cəm edib təzə ayğır alsın. Və bir də çünki bizim adam başısoyuqluq etməyə adət edib, ona binaən ola bilər ki, o bir manatı verməyə də heyfsilənsin. Belədə dəxi yaxşı olur ki, hər camaat 5-6 manat yığmaq ilə hər bir uyezd ildə bir neçə yüz manat cəm edib, ildə bir dəfə yaxşılanmış dayları və ya atları yığıb, onların çox yaxşılarını sahibinə versin ki, belədə hər kəs öz atını yaxşılandırmaq fikrinə düşər.

* * *

Bir neçə dəfə yazmışıq ki, Rusiyada qaramalda bir naxoşluq olub ki, ona Sibir taunu deyirlər. Bu naxoşluğun nişanları budur: heyvanın gözləri qızarır və onlardan qəliz yaş tökülür, dili ağ və quru olur, nəfəsi çox ağırlıqla alır, xörəyi qaytarıb dübarə çeynəmir, ayaqları əsir, qulaqları sallanır, tükü pırtdaşır, qarnı şişir.

Çünki bu naxoşluq yoluxmadır, ona binaən gərək belə naxoşlayan heyvanı sürüdən aralayıb, əlahiddə saxlamaq və əgər ölsə, onun cəmdəyini dərisi ilə belə kənddən kənarda bir yerə basdırmaq ki, onu heyvanat yeyib, sürünün qeyr mallarına dəyib onları da naxoş eləməsin.

* * *

Qənd qayırmaqdan ötrü böyük zavodlar tə'mir olunur və onun maşınları baha olduğuna onu hər kəs aça bilmir. Və bir də böyük zavodlarda çuğundur, sümük kömürü və qeyrə çox işləndiyinə, onları zavodun yavıqlığında hasil etmək olmadığına onları qeyr yerlərdən gətirillər. Bu səbəblərə qənd baha əmələ gəlir.

İndi Russo adlı hükəma bir qayda ilə qənd qayırır ki, 1000 manat pul ilə də belə zavodu açmaq olur. Ona binaən ümid var ki, gələcəkdə hər bir kənd əhli özünə mürəbbə bişirən kimi, özü üçün qənd də qayırsın.

Russo qəndi belə qayırır: çuğundur kökünü əzib, sıxıb, üstə su töküb, genə sıxıb, sonra bu suya qarğa duzu qarışdırıb (300 misqal suya bir misqal) 100 dərəcəyəcən qaynadıb, onun köpüyünü atıb, suyu bir tövr ilə duruldub, onun içinə təmiz dəmir pası (hümzi-əvvəl) töküb (100 misqal suya 6-7 misqal pas) təzədən qaynadanda su bilmərrə saf olur. Ol vaxtda onu süzüb bir təmiz qazanda quruyuncan qaynadanda ondan qənd hasil olur.

* * *

Tehrandan bizə yazırlar ki, qızıl mə'dəni barəsində danışılan sözlər yalan oldu.

## MƏKTUBAT

### Məktubi-mənzumeyi-əhaliyi-Şamaxı

Əssəlam, ey əhaliyi-zişan!
Ey olanlar bəla oxuna nişan.
Nə bəla? Cəhlü dərdi-nadanlıq,
Ey tutan cəm'ini pərişanlıq!
Neçə müddətdi kim, Həsən bəyi-zar,
Hüsni-tədbir ilə o fəxri-kibar,
Öz qədimi lisanımızda həman
Qəzetə çapını edib ünvan.
İzn hasil qılıbdı dövlətdən;
Biz gərək dəm uraq səadətdən.
Özünə gərçi yoxdur faidəsi,
Leyk var xəlqə feyzi-zaidəsi.
Feyzi-əvvəl budur ki, müxtəsəri,
Yetirir ol cənab hər xəbəri.
Oluruq hali-aləmə vaqif,
Bu bizə bəs deyilmi, ey arif?
Feyzi-sani budur ki, hikmətdən,
Şərh edir kəsbdən, ziraətdən.
Əkibən elm toxumunu o cənab,
Məzrəi-aləmi edir sirab.
Ol bizə bir səhabi-rəhmətdir,
Baisi-abruyi-millətdir.
Gərçi hər dildə var qəzetlər çox,
Bizə ondan və leyk faidə yox.
Bilmirik rus, ya firəng dili,
Hər dilin rəmzini öz əhli bili.
Bizdə yox rus, həm firəngi səvad,
Olmuşuq türki, farsiyə mö'tad.
Onu da hiç bilmirik kamil,
Əksəri-xəlq əvamdır, cahil.
Pəs "Əkinçi" bizə münasibdir,
Qiyməti yaxşı, mali-kasibdır.
Pəs "Əkinçi" cəlalımızdı bizim,
Baisi-ibtihalımızdı bizim.
Səy edin, ey güruhi-niksifat,
Etməsin ta bizim "Əkinçi" vəfat.
Sonra göydən əgər yenə İsa,

Edə bilməz o mürdəni əhya.
Ey “Əkinçi” xirid edən kəslər,
Verməsə cəngdən “Əkinçi” xəbər,
Qəzetə tərkin etməyin zinhar,
Nə gərəkdir bizə o nəqlü güzar?
Qadağandır o növ söhbətlər,
Eşidib pəndlər, nəsihətlər,
Biz gərək səy edək məişət üçün,
Sən’ətü kəsb üçün, ziraət üçün.
Kimi mane’ deyil nəmazımıza,
Sümmü təthirü dəstəmazımıza.
Neylirük biz ki, kimdi sərəsgər,
Nə vəzirik, nə münşiyi-ləşkər.
Bu qədər fəhm edin ki, dövləti-Rus,
İmperaturi-mə’dələtmənus
Görüb Osmanlının xətalərini,
Füqəra əhlinə cəfalərini,
Bir zaman qıldı çox nəsihətlər,
Etmədi ol güruhi-zülmə əsər.
Gəldi dəryayi-qeyrəti cuşə,
Etdi amadə ləşkərü tuşə,
Türk ilə verdi cəng üçün fərman,
Oldu amadə ləşkəri-pərran.
Fəxrimizdir əgər ola qalib,
Gərək olmaq duayə biz talib.
Çün bizə ol vəliyyi-ne’mətdir,
Mə’dəni-lütfü əbri-rəhmətdir.
Bundan əqdəm ki, şahi-çərxi-sərir
Etməmişdi bu ölkəni təsxir,
Hamı xanlar əlində qalmışdıq,
Zülmü bidaddən saralmışdıq.
Yox idi munca malü dövlətimiz,
Gündə əldən gedirdi hörmətimiz.
Bir tulaya satardı xan bizi,
Tapmayırdı əkinçi bir öküzi.
Vardı qarğı, qəmişdən evlərimiz,
Bir qədəkdən olurdu zivərimiz.
İndiki, ağzımız çatıb çörəgə,
Heyfdir adımızda olsa ləkə.
Dövlətindən bu şahi-zişanın,
Bilmirik dərdini bu dövranın.
Şükrlillah qurtarmışıq qəmdən,
Olduq asudə rənci-aləmdən.
Seyyida, ey səramədi-şüəra,
İmperaturə eylə xeyr-dua,
Həqq bunun ömrünü ziyad etsin,
Xatirin fəthlərlə şad etsin.

İyun ayının 8-ci günü Şamaxıya Qubadan gələn süvarilərdən iki nəfər süvari məst olub, birisi öz yoldaşın xəncər ilə öldürdü. Ölən şəxsin adı Hüseyn bəydir və özü valantr, yə'ni öz xahişi ilə gedirmiş və öldürəni hələliyə tutublar.

Şamaxıya neçə vaxtdır ki, hər gündə yağış yağır və yerlər təzədən səbzü xürrəm olub. Hava bahardan yaxşı keçir və çaylarımızın suyu artıb, xüsusən ki, Pirsəid çayı Nəvahı ətrafını sirab edib. Və dünən iyunun 8-də qapanda ə'la unun putu satıldı 14 şahıya, Şamaxının füqəraları çox şad oldular.

Şamaxının bağlarında neçə ildir ki, bir növ ilə qurdlar əmələ gəlir. Onlar əvvəl kiçik olurlar, sonra böyüklənib, ağaclara çıxıb, yarpaqların yeyirlər, hərgiz ağaclar daha meyvə gətirmir, ənkəbut, yə'ni hörümçək kimi tor çəkirlər. Özləri qara-qara uzun qurdlardır. Şamaxıda adına qum-quma deyirlər.

Bağbanların təvəqqəsinə görə bu keyfiyyəti yazıb "Əkinçi" qəzetindən iltimas edirik ki, bunun əlacını yazıb mə'lum eləsin.

Dünyada qara qurd çoxdur, ona binaən onu görməmiş tanıyıb bilmək və əlacını yazmaq məqdur deyil. Təvəqqə olunur ki, o qurdlardan bir neçəsini tutub bir kiçik şüşə içinə salıb və şüşəni spirt ilə doldurub bizə göndərsinlər.

* * *

"Əkinçi"nin axırıncı nömrələrindən belə mə'lum olur ki, müştərilər ondan təzə xəbərlər təmənna edir və "Əkinçi" onların xahişinə əməl edə bilmir. Qardaşlar "Əkinçi" bir tifli-səğirdir və onun kamala çatmağı bizim ianəmiz ilədir. Pəs gəlin hər birimiz özümüzü ona vəkil hesab edib, onun tərbiyəsində sə'y, hümmət edib müəllimindən iltica edək ki, "Əkinçi"ni qeyr qəzetlər kimi həftədə 1 və ya 2 dəfə çıxartsın, yoxsa iki həftəlik qəzetdən hər gündə çıxan xəbərləri istəmək eyibdir və bir də "Əkinçi"də yaxşı xəbərlər həmişə olur, amma ona biz məhəl qoymuruq. Məsələn, xəbər deyilmi ki, "Mşak" qəzeti yazır: müsəlmanlar üçün elm təhsil eləmək və ittifaq olmaq mümkün deyil, əgər böhtan isə niyə cavab vermirsiniz? Yox doğru isə nə üçün kar eləyib, hərəkətə gəlmirik və ya Tiflis şəhərinin xalqı bir məktəbi-sənaye bina edib ki, orada rus, gürcü, erməni dillərində tə'lim olunacaq, amma müsəlmanları bilmərrə aradan çıxarıblar ki, onların elm kitabları yoxdur.

Pəs "Əkinçi" qəzetində həmişə yaxşı xəbər olur və onun azalmağına səbəb biz özümüzük. Belədə bizə lazımdır ki, təzə il üçün "Əkinçi"nin həftədə bir dəfə çıxmasının, müştərisi artmağının və qiymətinin barəsində məsləhət bina eləyək.

*Məhbus Dərbəndi*

* * *

Keçən il Dağıstanın aclığı bə'zi fürsət axtaran adamları milyonçu olmaq xəyalına salıb, taxıl cəm etməyə başlamışdılar və xalq bu xüsusda çox müztərib olub, özlərindən mə'yus idilər və əgər dövlət kömək edib pul verməsəydi, keçinmək ümidləri yox idi. Amma İranın ucuzluğu və atəş gəmilərinin tez gəlib taxıl yetirməyi xalqı Allahın kəráminə ümidvar edib, fəqir adamlar qışın fəlakətindən xilas olub, yaz fəslinə vasil oldular.

Təzə arpa Petrovski bazarında keçən bazar günü putu iki abbasıya satıldı. Bu həftə təzə buğda əkiləcək. Ümid var ki, çox ucuz olsun.

*Petrovski, iyunun 18-də*

## TƏZƏ XƏBƏRLƏR

Əgərçi Badkubədə qarantin bina edib, hər İrandan gələn gəmini iki həftə saxlamağa hökm gəlmişdi, amma sonra tel gəlib ki, gəmilərdə naxoş olmasa, onları dərhal buraxsınlar və əgər naxoş olsa, ancaq 3 gün saxlasınlar.

Çünki keçən dəfə Rəşt şəhərinə göndərilən həkimlərin mabeynində orada olan naxoşluq taundur ya yox xüsusunda birlik olmamışdı, ona binaən təzədən Tiflisdən 3 həkim gəlib keçən həftə Rəştə getdilər ki, o naxoşluq nə naxoşluğudur, mə'lum eləsinlər.

* * *

Bir neçə gündür ki, Badkubədə külək əsmədiyinə isti çox şiddət eləyib. Adam nəfəsin almağa hava azlıq edir. İsal naxoşluğu artıb, uşaqlara çox əziyyət edir.

* * *

Mayın 10-da vəziri-daxilə təsdiq edib ki, Badkubə şəhərində qərardadi-şəhər işlənsin. Bundan ötrü komisyon bina olub ki, şəhərdə

mülkü olanların və dadistəd edənlərin adlarını siyahı eləsin, sonra komisyon onları cəm edəcək ki, şəhər divanları üçün özlərindən calislər intixab eləsinlər və bu tövr ilə divanxanalar bina olandan sonra şəhərin hər bir işi, savayı tə'mirat tikdirmək, onlara veriləcək.

* * *

"Tiflisski vestnik" qəzeti yazır ki, bu günlərdə gürcü dilində çap olunan "Droeba" qəzeti hər gündə bir dəfə çıxır. Bu xəbəri danışıb zikr olan qəzet heyfsilənir ki, bizim "Əkinçi" qəzeti tez-tez çıxmır. Amma bunu bilmir ki, bu halda onu iki həftədə bir çıxartmağın da zəhmətinə dözmək olmur.

* * *

İyunun 3-də və 4-də Tiflis şəhərində elə bərk dolu yağıbdır ki, şəhərə 500 min manatlıq zərər olub, əzcümlə 4 min manatlıq evlərin akoşkalarının şüşələri sınıb. Bağlara həm çox zərər olub. Dolu qoz boyda imiş. Bu dolu şəhərin ətrafında olan kəndlərə və Telav şəhərinə də çox zərər edib.

* * *

"Naş vek" qəzeti yazır ki, pravitelstvuyuşçi Senata okrujnoy sudlar üstə ol qədər ərizə verilib ki, onlara illərlə növbət yetişmir. Bu səbəbə təzədən Senata 20 calis tə'yin olacaq ki, işlərə tez baxsınlar.

* * *

Starorus şəhərində Borisov adlı genaralın övrəti bir yetim qız saxlayır imiş. Bir gün o qız gedib bir övrətə ərz edib ki, xanım onu çox döyüb incidir. Bu övrətin ərizəsinə görə prokuror həkim ilə belə gedib o qızı soyundurub onun bədəninə baxıb görüblər ki, həqiqət onun dalında və qeyr yerlərində çubuq nişanı var. Sonra silist başlanıb. Həqiqət olub ki, Borisovun övrəti o qızı sarıyıb çubuq və kəndir ilə çox döyürmüş. Okrujnoy sud bu taxsıra görə qət edib ki, general Borisovun övrəti Sibirə getsin.

* * *

"Kazanski" yeparxialni vedomosti" yazır ki, keçmişdə xristian olan tatarlar qəryəbəqəryə dönüb genə islam olub keşişlərini çıxarıb, molla gətirib, kilsələrinin yanında məscid bina edirlər.

* * *

“Pravitelstvenni vestnik” qəzeti yazır ki, hökm olub ki, Rusiyanın öz xalqından 200 milyon manat borc alınsın, yə’ni ol qədər kağız pul kəsilsin və bu kağızların üstə belə yazı olacaq: Osmanlı cəngindən ötrü.

Telav şəhərindən “Tiflisski vestnik” qəzetinə yazırlar ki, doduy ləzgiləri yaği olubdur xəbəri buraya çıxandan sonra işlər çox pərişan olmuşdu. Amma indi xəbər gəlib ki, onları sakit ediblər. Ona binaən indi çox əminlikdir.

* * *

“Odesski vestnik” qəzeti yazır ki, Peterburqdan oraya zəxmdar olan əsgərə kömək eləməkdən ötrü gələn övrətlər başlayıb türk dili öyrənirlər ki, zəxmdar olan Osmanlı əsgəri də onlara rast gəlsə kömək eləsinlər.

* * *

London şəhərində çap olunan “Ekonomi” qəzeti cəngin dövlətə zərər olmağını belə sübut edir: 25 illik müddətində Avropa əhlindən cəngdə vəfat edib bir milyon 948 min adam və o cənglərə xərc olunub 2413 milyon funt sterlinq ki, hər sterlinq 8 manatdır.

* * *

“Misyon katolik” qəzeti yazır ki, katolik ruhaniləri Məşriq-zəmində hər il 10 min adam xristian edirlər ki, onların çoxu bütpərəstdir.

## E’LAN

Şamaxı şəhərində Qalabazar məhəlləsində Məşədi Kazım bəy Hacı Ağa Rəhim bəy oğlunun evində sakin olur İran səfhəsindən bir kəhhali-kamil ismi-şərifləri Mirzə Abbas Hacı Hüseynov. Göz kəsməkdə və kəhhallıq elmində ustadi-kamil olmağı xüsusunda əlində çox şəhadətnamələri var.

Hələ bir müddət Şamaxıda olacaqdır. Ona binaən cəvanib və ətrafdan hər kim xahiş etsə, bismillah.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub.

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Fi 8 rəcəbülmürəccəb, sənə 1294*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Pəncşənbə günü*




*Fi 7 iyul Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*1 sənəliyi – 3 manat*
*6 aylığı –*
*1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## DAXİLİYYƏ

Neçə il bundan əqdəm Badkubənin nefti Mirzoyevin icarəsində idi. Elə ki, bu icarə bərhəm oldu, neft quyularını bir neçə hissə edib, tək-tək icarəyə verib, hər bir xahiş edənə ixtiyar veriblər ki, təzədən quyu qazsın. Ol zaman Balaxana və Sabunçu kəndlərinin yerləri çox bahalandı. Elə ki quyular çoxlandı və onların bə'zindən neft pəvvarə vurub bulaq kimi axdı, neft qiymətdən düşdü. Keçmişdə xalvarı, yə'ni 20 putu 9 manata satılan neft bir manata, hətta 3 abbasıya satıldı. Bir tərəfdən neftin belə artmağı, bir tərəfdən xəzanə neftdən aldığı aksiz xərci və bir tərəfdən Amerikanın neft cövhəri Rusiyada ucuz satılmağı neft qazanlarının və cövhəri çəkmək üçün zavod saxlayanların işini pərişan elədi. Axırda neft sahiblərinin dad-fəryadı yerinə yetişdiyinə keçən il hökm olundu ki, Amerika cövhərindən 50 qəpik artıq tamojna xərci alsınlar. Ona binaən Amerika zavodçuları keçən il Rusiyaya neft cövhəri gətirmədiyinə Rusiyada Badkubənin neft cövhəri 3-4 manata, hətta 4 manat yarıma satıldı. Bavücudi ki, irəli manat yarıma güclə satılırdı. Bu səbəbə neft sahiblərinin işi genə yaxşı oldu, neft yerlərinin qiyməti artdı.

Elə ki bu ildən tamojna xərci qızıl pulu alınır və mə'lum olub ki, gələn ildən neftdən aksiz xərci alınmayacaq, neft yerlərinin qiyməti həddən çıxıb. Məsələn, bir şəxs keçən il 5 desyatin yeri 2 min 5 yüz manata almışdı. 2 ay bundan əqdəm ol şəxs zikr olan yeri 8 adama, 8 min

manata satıb. İndi deyirlər ki, o 8 adamın birisi öz hissəsini, yə'ni səkkizdən biri 18 min manata satıb. Və genə deyirlər ki, bir kəs bir desyatinin dörddən bir hissəsini belə icarəyə verib, icarəçi yer sahibinə 2 min manat verib ki, o yeri 12 ilə ona versin, bəşərti ki, bu 12 ilin müddətində o yerdən nə qədər neft çıxsa, onun nisfi yer sahibinin olsun və 12 ildən sonra ol yer orada olan mayəhtaclar ilə yer sahibinə qalsın.

Xülasə, yer alan, yer satan həddən çıxıb. Küçə və bazarlarda məhz neft və cövhər sözü danışılır. Nataryusxanalarda neft yeri aldı-satdı kağızlarını yazmağa növbət çatmır. Badkubədə sakin olanlar keşişdən tutmuş qulluq əhlinin ədna bəsərinəcən, tacirlərdən tutmuş ədna papaqçıya və şam tökənəcən öz işlərini tullayıb, bir neçə adam şərakət edib Molla Nəsrəddin torba götürüb sarı qayaya bostan uruya gedən kimi, olan-olmazlarını yığıb, Sabunçu bəylərinin yanına yer almağa və ya Qara şəhərə (şəhərdən kənar zavodlar olan yerdir) zavod tikdirməyə gedir ki, bir ya iki ilə sahibi-milyon olsun.

Qardaşlar, çünki biz yer alıb-satan və zavod sahibi deyilik, ona binaən ümidvarıq ki, biz ərz elədiyimiz sözlərə qulaq asasınız. Elmidadistəd aşkar edir ki, hər bir malın qiyməti onu alan ilədir, yə'ni alıcı çox olduqca mal baha satılır və genə mə'lum edir ki, bir şey baha satılsa, yə'ni onu xahiş edən çox olsa, ol şey qayıran həm çoxlanır, ta ki, ol şeyə olan zəhmətin qədrinə müvafiq qazanc olur. Məsələn, Badkubədə İran papağı az tikilir və əgər Badkubədə və ətrafda sakin olanlar birdən İran papağına həvəs eləsələr, bizim papaqçılar tamam İran papağı tikərlər, hətta qeyr sənətkarlar da İran papaqçılığının nəf'ini artıq görüb öz sənətini atıb, belə papaqçılıq edərlər. Belədə İran papağından nəf' görən əvvəl dəfə onu tikənlər olur, sonra meydana girənlər ya irəli elədiyi qazancı edəcək və ya bu zindəganlıq cənginin meydanı papaqtikən ilə dolu olduğuna, onun nəf'i az olmağa görə genə öz sənətinə qayıdacaq. Pəs gözüyumma meydana yügürmək ki, keçən il filankəs manata yüz manat qazanıb, mən də qazanacağam, ağıllı iş deyil. Ola bilər yüyürən ol qədər olsun ki, manata iki şahı qazanca həsrət çəksinlər.

Doğrudur, neft yeri almaq və papaqçılıq eləmək bir deyil. Ona binaən ki, neft hər bir vilayətdən çıxmır ki, o vilayətlərin adamı həm onu qazsın və onlar naəlac qalıb bizim nefti alacaqlar. Amma bunu da yaddan çıxarmamaq ki, neft su kimi bizim yerin altında damar-damar axır. Belədə Balaxanı, Sabunçu, Ramana kəndlərinin yerlərindən neft

çıxanda ətraf kəndlərdən həm çıxacaq. Pəs gözüyumma Sabunçuya yüyürüb neft yerini qızıl qiymətinə almaq nə lazım? Bəlkə bu küyü ol yer sahibləri çıxardıb ki, öz yerini artıq qiymətə satsınlar.

Pəs, qardaşlar, biz demirik ki, neft yeri almayın. Yox, alın, Allah sizi pəvvarə vuran neft damarına rast gətirsin. Amma ərz edirik ki, bunu həm yaddan çıxarmayın ki, 100 manata milyon qazanmaq xam xəyaldır.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Gilas ağacının meyvəsi 40 qism olur: onların meyvəsi şirin olana albalı, meyvəsi turş olana gilas deyirlər. Gilasın ya toxumunu, yə'ni meyvəsini və ya onun dibindən köklərin üstə bitən budağı dibindən kəsib payızda əkirlər. Gilas ağacı üçün yeri qüvvətləndirmək lazım deyil, ancaq onu narın etmək gərək və bir də gilas dağ yerində torpağı isti, yə'ni gili az, qumu çox yerdə yaxşı pərvəriş edir. Belə yeri narın edəndən sonra toxumları və ya zikr olan budaqları cərgə əkib onların arasında bitən ələfiyyatı yolub, yə'ni alaq edib isti olan zaman sulamaq gərək. 3 ildən sonra, yə'ni bu kiçik ağaclar barmaq boyda olanda yaxşı meyvə gətirən ağacın budağını kəsib bu kiçik ağaclara calamaq gərək ki, onlar da yaxşı meyvə gətirsin.

Gilas ağacını qələm də etmək olur. Bundan ötrü baharda yaxşı meyvə gətirən ağacın budağını kəsib, bir qaba su töküb, onun içində 20 günəcən, yə'ni budaqdan yarım kərəh uzunda köklər əmələ gəlincən saxlayıb (su gərək dəyişilməsin) sonra yeri narın edib onu basdırıb, budağın yerin üstə qalan ucunu bıçaq ilə elə kəsəsən ki, onun üstə bircə qönçə qalsın. Sonra onu tez-tez sulamaq gərək ki, qurumasın.

Gilas ağacını elə yetirmək olur ki, onun meyvəsinin tumu olmasın. Bundan ötrü zikr olan qayda ilə toxumu əkib, bahar olanda, yə'ni ağac yarpaq açmamış o kiçik ağaclardan bircə budaq olanı iti bıçaq ilə başdan dibinə, yə'ni kökünəcən bərabər yarıb sonra nazik çub ilə məsələn, kibrit ağacı ilə o budağın içində olan qara yumşaq hissəni təmiz çıxarıb, budağın 2 parasını bir-birinin üstə qoyub, bıçaq kəsən yeri bağban yapışqanı ilə (ağac calananda iştənən) üstün yapışdırıb, yun sapı ilə bağlayıb, budaq yarpaq açanda sapı açmaq gərək, belə ağacın tumunun yerində su olur.

Gilas ağacının bir bəlası kətrə çox olmaqdır. Belə məsləhətdir ki, kətrəni bıçaq ilə kəsib onun yerini su və sabun ilə yara sağalıncan yuvasan və bir də gilas ağacının budaqlarının üstə kiçik qara qurd əmələ gəlir ki, ağaca zərər edir. Onları belə tələf etmək olur: bir girvənkə smalaya 16 girvənkə kükürd qarışdırıb, bir saxsı qab içində əridib, sonra onu yumurta boyda parçalar edib, soyudub, yaş bəlim ilə belə gilas ağacının altında yandırıb onun tüstüsünü qurdlara verəndə onlar qəşş edir. Bir saatdan sonra ağacın üstə su çiləyəndə qurdlar su ilə tökülür. Və əgər bu qurdlar qeyr yerdə əmələ gəlib gilas ağacına çıxırsa, yaxşı olur ki, gilas ağacının dibinə smala ya qəliz neft sürtəsən ki, qurd ona çıxa bilməsin.

* * *

Hər vilayətin yeri az, xalqı çox olduqcan orada yerdən hasil olan şeylər baha olur və xalq artıq qənaət edir. Bu səbəblərə Çin məmləkətinin əhli çox darlıq çəkib artıq qənaətçi olub. Yazırlar ki, Çin məmləkətində xalq siçan əti yeməyə elə adət edib ki, siçanın birisi bir abbasıya satılır. Ona binaən indi İngilis vilayətində bir icma bina olub ki, Çin vilayətinə siçan aparsın. Yazırlar ki, bu icma çox qazanc edəcək.

* * *

Ağac talaşası və yonğusu əgərçi yaxşı yanır, amma tez yandığına onlardan heylə isti əmələ gəlmir. Bu səbəblərə Peterburqda bir şəxs onlardan artıq nəf' olmaqdan ötrü onları suya salıb, xəmir təki edib, ondan kərpic kəsib, qurudub, sonra yandırır. Yazırlar ki, bu kərpic odun kimi yanır və ondan yaxşı isti əmələ gəlir.

## MƏKTUBAT

*Rəşt şəhərindən.* Əbrişim novğanının xüsusunda yazmışdıq ki, qurdların hamı qismi yaxşıdır, amma yağış gəlmir. Rəbiüssani ayının 22-dən sonra bir neçə dəfə yağış yağdı. Əgərçi onların soyuğu olmadı, amma genə novğan xarab oldu, qurdlar tələf olub, toxumadı. Kağızı, yə'ni 1 dəfə və 2 dəfə çıxan toxum Xorasan tərəfinin toxumundan yaxşı oldu. 2 dəfə çıxan bir dəfə çıxandan yaxşı oldu. Amma dürüst mə'lum olmur ki, bildir yaxşı olmuşdu, ya bu il. Ona binaən ki,

maliyyat dərdindən novğanı olan da deyir olmadı, olmayan da deyir olmadı. Amma bizim nəzərimizdə gələn bu il bildirdən yaxşıdır, yə'ni ipək artıq olub. Amma bildir baha qiymətə satılır idi. Bu il alan yoxdur, ucuzdur. Bu hesaba binaən xalq üçün bildir bu ildən yaxşı idi.

Qərəz mə'lum olan novğanın xarab olmağı həm toxumdan, həm havadan oldu. Ona binaən ki, bə'zi toxumlar ki, naxoşluq görməyən yerdən gətirmiş idilər, onlardan az xarab oldu. Məsələn, bir Məhəmməd ağa nam İsfahani üçün türbət tərəfdən toxum gətirmişdilər. Hər kəs aldı çox yaxşı oldu. Belədə mə'lum olur ki, bu xarab olanlar havadandır. Amma Xorasan tərəfinin toxumları tamam xarab oldu. Mə'lum ki, onlarda eyib var imiş. Amma nəzərə gələn bu halda 2 dəfə çıxan toxum novğan etmək üçün hamı toxumlardan məsləhətdir: 1) Bu toxum ucuzdur. 2) Tez əmələ gəlir. 3) Yekca nabud olmur, az-çox toxuyur. 4) İki dəfə hasil gətirir.

Əgərçi xalq kağızı toxum kəmhasil deyib ona dimağ etmir ki, bu toxumdan 10 girvənkə ipək olanda o birisindən 30 girvənkə olur, amma bir neçə ildir ki, qeyr toxumlardan bir girvənkə də olmur. Lakin bundan 10 olmasa, 8 ya 5 olur.

Qərəz, bu halda 2 dəfə çıxan toxumların ə'lasından intixab edib, ipək əmələ gətirmək çox məsləhətdir.

İranda qanun olmadığına binaən işlər bu tövr başlanıb ki, doğru və yalanı qanmaq olmur. Doğru deyəndə adəti-xalqa binaən doğru demir, labüd haləti-xalq ilə rəftar edir. Xalqa deyəndə ki, qanun olmasa asudəlik və tərəqqi olmayacaq, deyir: hansı qanundur ki, şəriətdən artıq ola?

Əzizim, qanuni-şəriət hansı öz qaydası ilə dolanır? Qanuni-şəriət üçün iki vəch var: biri ibadəti və biri qanuni-siyasətdir ki, bu qanuni-siyasətə elmi-əbdan və əqli-məaş deyilir, yə'ni zindəganlıq və məmləkətdarlıq adabları.

Vəchi-ibadəti də danışmırıq, amma vəchi-siyasəti öz qərar və qaydasına əməl olmur, mövqufdur hər kəsin rə'yinə. Hakimlər qanun üzilə hökm etmir. Qərəz, çox şuluq və İran xalqı sərgərdandır. Günbəgün müftəxor çox olur, kasıb payimal olur, fəqir əlindən adam təngə gəlir.

Qızıl mə'dəni genə mə'lum deyil nə tövrdür, doğru söz yoxdur. Naxoşluq, həbsə və xirək az-az var. Gündə 5 ta 15 nəfər ölür, amma çoxu uşaq və övrətdir. Hələ dürüst mə'lum deyil ki, bu naxoşluq taun əlamətidir ki, sonra güc gətirəcək, yainki o deyil. İnşaallah mövquf olacaq. Allah rəhm eləsin.

* * *

Bəni-noi-bəşərin anadan olmağını ağac göyərməyinə misal tutublar, necə ki, ağacın toxumundan ağac əmələ gəlib, cavanlıq həddinə yetişib, meyvə, yə'ni toxum gətirib, sonra mürur ilə tələf olur, həmçinin insan anadan olandan sonra mürur ilə cavanlığa yetişib, sonra qocalıb, axırda vəfat edir. Və bir də mə'lumdur ki, meşədə və bağda əmələ gələn ağac bir olmaz. Meşə ağacının meyvəsi turş, kiçik və quru olur, amma bağ, yə'ni bağbanlar saxlayan ağacın meyvəsi şirin, böyük və abdar olur. Əlbəttə, bağ ağacının belə olmağına səbəb bağbanın sə'yü kuşişi, yə'ni ol ağaca tərbiyət verməyidir və bu sə'yü kuşişi, artıq olduqcan ağacın meyvəsi artıcaq ləziz olur. Habelə insanın da tərbiyəti ağacın tərbiyəti kimidir.

Əgər insana uşaqlıqda yaxşı tərbiyət verilsə, gəlib qabiliyyət sahibi olur və əgər ona tərbiyət verilməsə və ya bəd tərbiyət verilsə, meşə ağacı turş meyvə gətirən kimi, biqabiliyyət olur. Pəs, insanın qabil olmağına səbəb tərbiyətdir. Ona binaən tərbiyət vacibi əməllərin birisidir.

Əgərçi dünyada hər bağban, ya hər sənətkar öz işində özünü mahir hesab edən kimi hər kəs özünü kamil hesab edir, lakin hər sənətkar bir olmamağı ya hamı bir qabiliyyətdə olmamağı mə'lum və aşkardır. Və genə mə'lumdur ki, qabiliyyət elm ilədir, elmsiz qalan kəs meşənin susuz qalan ağacı kimi bisəmərə olur. Çünki insan üçün tərbiyət elm ilə olurmuş, belədə çox yaxşı olurdu ki, biz də, qeyr tayfalar kimi, məktəbxanalar bina edib, elm kitablarını öz dilimizə tərcümə edib, uşaqlarımıza elm yolu ilə tərbiyət edək və bundan ötrü ittifaq və himmət gərəkdir. Pəs, qardaşlar, ittifaq olub himmət edin ki, meşə ağacı kimi gələcəkdə həm bisəmərə olmayaq.

*Möhsün Badkubeyi*

* * *

Bu il Dərbənd xalqının və ətraf kəndlərin ziraətləri çox yaxşıdır. Sulanan məzrəə ilə sulanmayanda bir təfavüt yoxdur və sünbüldən buğda hasilə gəlir birə 8-dən 25-əcən. Ard putu 60 qəpikdən 50 qəpik, qənd 7 manat 70 qəpik, qoyun əti 6 qəpik, yağ 20 qəpik. Ümid var ki, gəldikcə ucuzluq olsun.

## TƏZƏ XƏBƏRLƏR

Tiflisdən gəlib Rəştə gedən həkimlər hələ qayıtmayıblar.

Bu həftə Krasovski adlı məşhur həkim Peterburqdan gəlib Rəştə getdi.

Amerikadan Badkubəyə 1-2 adam gəlib. Deyirlər ki, onlar orada olan neft zavodlarının sahiblərindəndirlər və buraya gəlməkdən murad budur ki, özlərinə yer alıb, quyu qazdırıb cövhər çəkdirsinlər. Bu barədə bizim neftçilərin arasında çox danışıq var. Əzon cümlə nağıl edirlər ki, keçən il bizim neft cövhəri Amerika zavodlarına zərər elədiyinə, onlar gəliblər ki, yer alıb cövhər çəkib, onu zərərinə satıb, bizim zavodçuları sındırıb, sonra onların zavodlarını və yerlərini ucuz alsınlar. Əlbəttə, bu danışığa həm bavər etmək olmaz.

* * *

Gəncədə olan padşahlıq bağlarının bağbanı yazır ki, oranın üzüm ağaclarında Avropada olan məşhur naxoşluq əmələ gəlib və buna səbəb budur ki, bu il yağınlıq olub və bir də müsəlman bağbanları üzüm ağaclarını çox sulayırlar. Bu naxoşluq əvvəl üzüm dənəsinin üstə ağ ləkə kimi əmələ gəlib, sonra ağaclara düşür. Bu naxoşluğun imtahan olunmuş əlacı budur: o ləkələrin üstə narın kükürd səpmək. Və əgər əvvəl vaxta bu tövr ilə ağacları sağaltmayasan, sonra tamam ağaclar bu naxoşluqdan meyvə gətirməz.

* * *

Tiflisdə olan heyvanat həkimi mə'lum edir ki, Tiflisin malında bir yoluxma naxoşluq əmələ gəlib ki, naxoş olan heyvanın ağzının və dırnağının suyundan və südündən nə ki qeyr heyvan, hətta insan həm naxoşluyur. Çünki belə südü qaynadanda naxoşluq olmur, ona binaən yaxşı olur ki, südü qaynadandan sonra içsinlər və əgər bir kəsə çiy süd içmək lazım isə məsləhət budur ki, heyvan naxoş olmamağı bilib sonra içsin. Bu naxoşluqdan insanın ağzı səpir, mə'dəsi gücdən düşür. Bu naxoşluq uşaqlara çox kar edir.

* * *

Bu halda Avropa əhlinin dəmirdən qayrılmış cəng gəmilərinin müqabilində kiçik, yeyin gedən dəmir lotkalar qayırırlar ki, onlar gəmi-

nin yanına gəlib altına torped (barıt ilə dolmuş külulə) atıb, odlayıb qaçır. Bu torped gəmini dərhal para-para edir. İndi bunun müqabilində gəmilər üçün dəmir köynək tikdirirlər ki, dəmirdən qayrılmış tordur. Onu gəminin ətrafına atanda lotka gəminin altına torped ata bilmir.

* * *

Petrovskidən "Novoyo vremya" qəzetinə yazırlar ki, Vladiqafqazdan Qroznıya gedən yolda bir kazak bir kazak paltarında süvariyə rast gəlib, onu danışdırıb. Elə ki ona cavab verməyib, ondan bədgüman olub, onu öldürüb. Sonra görüblər ki, ölən Osmanlı imiş və onun ciblərində çox ərəb dilində yazılmış kağız tapıblar.

* * *

Olenetski quberniyadan – ki, Peterburqdan şimal tərəfdədir, – yazırlar ki, buraya 200 çərkəs öz külfətlərilə göndərilib, Qafqaz vilayətində yaği olmaq səbəbinə. Və genə yazırlar ki, irəlidə buraya çərkəs göndəriblər və onlar burada həmişəlik sakin olub. Amma buranın ab-havası onlar ilə saziş eləmir.

* * *

Keçən nömrədə Senata çox ərizə verilməkdən yazmışdıq. İndi "Qolos" qəzeti yazır ki, kasosyonnı ərizələri azaltmaqdan ötrü danışıq var ki, bu qaydanı qoysunlar: mirovoy sud işlərindən helə ərizə verən 5 manat əvəzinə 20 manat zaloq pişnəhad eləsin.

Dustaq kəsilən kəslər belə ərizəni verəndə zaloq da versinlər. Əgər dustaq iştədə sud qət etmiş ola ki, zərər alınsın, bu zərəri o ərizəyə mülahizə edincən almaq olmasın.

* * *

Qəzetlərdən mə'lum olur ki, tamam Rusiya bizim əsgər Tuna çayını keçməyi eşidib, şadyanalıq edib.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*Fi 22 rəcəbülmürəccəb, sənə 1294*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Pəncşənbə günü*




*Fi 21 iyul Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*1 sənəliyi – 3 manat*
*6 aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## DAXİLİYYƏ

Əgərçi indiyəcən Rəşt şəhərinə göndərilən həkimlər gəlməyib, amma Tiflisdən karantin saxlamaq üçün təzədən göndərilən həkimlər deyirlər ki, Rəştə gedən həkimlərdən tel gəlib ki, orada olan naxoşluq taundur və bu səbəbə genə təzədən Badkubəyə hökm gəlib ki, İrandan gələn gəmilər, əzcümlə minik götürən atəş gəmiləri də Əfşəranda 10 gün karantin saxlasın. Çünki Rəştdə olan naxoşluq taun oldu və bizim vilayət ilə Rəştin arasında bircə dərya var ki, onu bizim yelkən gəmiləri gizdində gedib gələ bilirlər, ona binaən taundan bir az danışmağı lazım bilirik ki, bizim gəmi sahibləri belə gizdin gedib gəlmək bizim xeyrimizdir – deyib karantindən qaçmasınlar.

Taundan insan yara çıxardıb vəfat edir. Taun yoluxmadır, yə'ni hər kəs naxoş olana və naxoş olan kəs dəyən şeyə dəysə, o da naxoşlayıb vəfat edir. Onun səbəbi mə'lum deyil, amma çünki taun bizim Məşrif tərəfinin böyük şəhərlərində, məsələn, Bağdadda çox olur və bu şəhərlərin küçələri dar və mütəəffini çox olur, ona binaən belə deyirlər ki, taun havanın və ya suyun xarab olmağından əmələ gəlir.

Taunun əlacı yoxdur. Ona binaən lazımdır ki, belə naxoşlayanı qeyr kəslərdən aralayıb, əlahiddə yerdə saxlayasan. Keçmişdə taun çox bərk şiddət edirmiş ki, yekə vilayətləri xaraba qoyurmuş. Bu halda ki, ticarət artdığına vilayətlərin arasında getdi-gəldi həm artıb, taun gərək dəxi ziyadə şiddət eləsin. Bu səbəbə tamam məmləkətlər taun

barəsində birləşiblər ki, bir yerdə bu naxoşluq düşsə, həkimlər göndərib, ol yeri əhatə edib, karantin bina eləsinlər ki, oradan naxoşluq çıxıb qeyr yerlərə düşməsin. Pəs ümid var ki, bu halda Rəşt şəhərini də əhatə edib, karantin bina ediblər və hər məmləkət öz tərəfindən oraya həkim göndərib.

Çünki taun naxoşluğundan insana dəyən zəhər dərhal biruz eləmir və karantin saxlanan zaman ola bilər ki, bə'zi şey ilə ol zəhər bu dairədən çıxıb qeyr yerə düşsün, ona binaən ətrafda olan yerlərdə dübarə karantin saxlamaq vacibdir. Əlbəttə, karantinə gedib 10 gün məəttəl qalmaq karantin saxlayanlar üçün zərərdir. Amma taun bir yerə düşsə, onu ol yerə salanlara dəxi ziyadə zərər olur.

Bizim qanuna müvafiq taun düşən yerdə gərək belə rəftar olunsun: bir yerdə taundan bir kəs naxoşlasa, ol yerin hakimi gərək dərhal bu barədə yazıb yerinə mə'lum edib, ol naxoş olan evi əsgər ilə əhatə edib, ol mərizi və bu evdə sakin olanları apardıb, şəhərdən kənar bir əlahiddə mənzildə (hər birini əlahiddə) saxladıb, naxoş olan məhləni, sonra tamam şəhəri də zikr olan qayda ilə əhatə eləsin ki, bu əhatə olan yerlərdən çıxıb oraya getmək qadağan olsun. Sonra taun şiddət eləsə, gərək şəhəri orada olan həkimlər arasında təqsim eləsin ki, hər həkim öz adamları ilə öz hissəsini hər gündə iki dəfə orada sakin olanlara baxmaq üçün gəzib, naxoş olanları zikr olan mənzilə aparsın və bu naxoşları aparmaqdan ötrü zikr olan mənzildə əlahiddə adamlar var ki, onların əynində göndən (dəridən) tikilmiş paltar, əlində həm belə əlcək və tamam bədəni yağ və ya neft ilə sürtülmüşdür. Bu adamlar naxoş olan evə gəlib, naxoşu və o evdə sakin olanları əlahiddə qırmaq ilə götürüb aparırlar.

Hər naxoşu olan gərək dərhal həkimə mə'lum eləsin və əgər eləməsə, ona əsgəriyyə qanunu ilə tənbeh olunur, yə'ni topa bağlatmaq və qeyrə. Şəhərdə olan it, pişik, quşları qırdırıb dükan-bazarı bağladıb, hətta kilsə və məsciddə yığılmağı həm qadağan edirlər.

Hər bir əhatə olan yerdə əlahiddə adamlar ilə azuqə göndərlənir və bu adamlar azuqəni gətirib sərhəddə müəyyən olan yerə qoyub, pulu bir müəyyən olan qutuya yığıb (əl vurmamış), sonra həkimə pişnəhad edir ki, onu karantin edəndən sonra sahibinə verillər.

Bu minval ilə karantin ol vaxtacan qalır ki, ol yerin əhli ya tamam qırılıb puç olur və ya naxoşlayan olmur. Elə ki ol yerdə dəxi naxoşlayan olmadı, bu gündən qırx gün sonra karantin bərhəm olur.

Pəs 10 gün məəttəl olmağı, 5-10 manat zərəri çox görən qardaş, yuxarıda zikr olan sözləri oxuyub, karantindən qaçmaq fikrinə düşmə və bunu yaddan çıxarma ki, əvvəl qırmaqda taun dəyənlərin mənzilinə gedən sən və sənin əhli-əyalın olacaq.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

12-ci nömrədə gələn ildən tənbəki üçün qoyulan aksiz xərcindən danışdıq ki, Rusiyada əmələ gələn tənbəki üçün bu xərc azalacaq, amma qeyr vilayətlərdən gətirilən üçün 4 manatdan 14 manatacan artacaq. Bu qanun təsdiq olandan sonra Peterburqda tənbəki çox bahalanıb (manata 7 şahı). Çünki bu qanunun ümdə muradı Rusiya tənbəkisi yaxşı pula satılmaqdır və bizim Qafqaz vilayətinin hər bir tərəfindən tənbəki yaxşı əmələ gəlir, ona binaən yaxşı olurdu ki, bizim mülkədarlarımız tənbəki əkdirmək sə'yinə düşəydilər.

Çünki tənbəkini yığıb qurutmaq çətindir və bunu məhz imtahan ilə bilmək olur, ona binaən tənbəki əkdirmək istəyən mülkədarlarımıza məsləhət olunur ki, bundan ötrü bizim vilayətdə olan Osmanlı tabelərini saxlayıb, xalqı da tənbəki qurutmağa öyrətsinlər.

* * *

Çünki kartofel quyularda və təpələrdə saxlananda çürüyüb xarab olur, ona binaən məsləhət edirlər ki, onu belə saxlasınlar: onu qat-qat yığıb, hər qatın arasına bir qat əhəng çəksinlər, amma gərək əhəng üstə su tökülüb sonra qurumuş və ya havada çox qalmış olsun ki, üstə su tökəndə qaynamasın. Deyirlər belədə kartofel gələn ilə qalır və dadı xarab olmur.

* * *

Çünki Avropa məmləkətlərinin yeri az olduğuna çox mal saxlamaq olmur və bu səbəbə quru ot baha satılır, ona binaən Odes quberniyasının mülkədarlarının birisi bu fikrə düşüb ki, quru otu iki taxtanın arasına qoyub, sıxıb, bu sıxılmış otdan taylar bağladıb, Avropaya satılmağa göndərsin və ümid vardır ki, çox nəf' eləsin.

* * *

Bir şəxs taxıl dərzlərini bağlamaqdan ötrü bir təzə maşın ixtira edib. Bu maşını imtahan edəndə mə'lum olub ki, onilə 2 adam bir saatda 600 dərz bağlaya bilir.

* * *

Bə’zi şeyləri necə yumaq gərək: atlas parçanı və ipək baftanı əvvəl yumurta sarısı ilə sürtüb, isti suda yuyub, soyuq suda çalxalayıb qurutmaq, sonra Ərəbistan kətrəsini əridib mahuddan süzüb, ona bir az su və sirkə töküb, bunun içinə zikr olan parçanı ya baftanı salıb çıxardıb, günə sərib qurutmaq.

Qızıl və ya gümüş sapı ilə işlənmiş ipək baftanı gərək ələkdən su çiləmək ilə isladıb, sonra ərimiş sabun suyuna mal ödü qarışdırıb, ona sürtüb, yağış suyu ilə yumaq və bundan sonra Ərəbistan kətrəsini ərimiş suya salıb qurutmaq.

Gümüş və qızıl saplarından toxunmuş baftaları. Gümüş baftanı 24 saat qatıqda saxlayandan sonra bir suya yaxşı sabun (Venetsiya sabunu) salıb, əridib ona təmiz bal və təzə mal ödü töküb, bir neçə saat qarışdırıb baftanın üzünə sürtüb qurutmaq və bunu belə qurutmaq yaxşıdır: bir yumru (tüfəng lüləsi kimi) ağacın üstə yaş mahut çəkib üst baftanı sarıyıb, üstünə bir qat da yaş mahut çəkib, düz taxta üstə quruyuncan yummalamaq, sonra onun rəngi yaxşı olmaqdan ötrü suya Ərəbistan kətrəsi və qənd salıb əridib, bunun içinə baftanı salıb çıxarıb, ağaca sarıyıb zikr olan qayda ilə qurutmaq.

Qızıl baftanı bir gecə çaxırda saxlayıb gümüş baftanı yuyan kimi yuyasan. Sonra onun rəngi yaxşı olmaqdan ötrü bir suya Ərəbistan kətrəsi salıb, əridib, ona bir az zə’fəran və araq qarışdırıb bunu baftanın üzünə şotka ilə yavaş sürtüb, sonra gümüş baftanı qurudan kimi qurutmaq. Lənkəni və qeyr boyanmış bezi qaynar suya salanda solub xarab olur. Yaxşıdır ki, onları isti çaya salıb, çay soyuyandan sonra çıxardıb, isti su və sabun ilə yuyub qurudasan.

Məxməri belə yumaq gərək: yağış suyuna təzə mal ödünü qarışdırıb ona bir az sabun və təmiz bal töküb, bunu əsgi ilə məxmərə sürtüb mahut ilə belə yumru ağacın üstə çəkib yummalıyırlar. Bu tövr ilə ol şeyi məxmərə ol qədr sürtüb qurudullar ki, dəxi çirk qalmaya, sonra soyuq suda çalxalıyıb, qurudub balıq yapışqanının suyuna salıb, qurudub, məxməri mahut ilə sürtmək gərək ki, rəngi açılsın.

İpək parçaları gərək çaya salıb, sonra soyuq qənd suyuna salıb, qurudub ütüləmək və ya parçanı sərib bir əsgi ilə isti sabun suyunu ona sürtüb, zikr olan qayda ilə ütüləmək.

## ELM XƏBƏRLƏRİ

Qədim zamanın filosofları deyirlər imiş ki, insan da heyvandır, amma ağlı artıq olmaq səbəbinə tamam heyvanların padşahıdır. Onun heyvan olmağı xüsusunda deyirlər imiş ki, hər bir insanda olan əcza heyvanda həm var. İnsan heyvan kimi yeyir, içir və onlar kimi ölüb tələf olur. Heyvanın da insan kimi dili, külfəti, vətəni və qeyrəsi olur.

İnsan və heyvanların padşahı olmağı xüsusunda deyirlərmiş ki, insanın bədəni çılpaq olduğuna heyvanın bədənindən zəifdir, amma insan ağıl ilə parça toxuyub, öz üryan bədəninə paltar tikmək ilə və tə'mirat bina edib özünü havanın dəyişilməyindən mühafizət etmək ilə öz zəif bədənini heyvandan yaxşı saxlıyır. İnsanın iti dişi, dırnağı, buynuzu yoxdur, amma ağıl ilə insan ox, bıçaq və qeyr alat qayırıb, heyvanatın diş və dırnağından özünü mühafizət edir. İnsanın bədəni düz durmaq səbəbinə onun üçün çapukluq, yə'ni yeyin yürümək mümkün deyil, amma at, eşşək və qeyr heyvanları tutub, öyrədib handa bir yeyin heyvana faiq gəlir.

Xülasə, insan ağlı artıq olmaq səbəbinə hər bir heyvanata faiq gəlir. Pəs insan heyvanların padşahıdır.

Hərgah diqqət ilə mülahizə edəsən, aşkar olur ki, insan nə ki heyvanata, tamam dünyaya malikdir. Ağıl ilə hər bir şeyin səbəbini axtarıb və bu tövr ilə elmlər bina edib. Su ilə maşınlar, külək ilə dəyirman, su buğu ilə atəş ərradəsi, gəmisi və qeyrə iştədib, hətta göydə olan günün istisi ilə maşınlar bina edir. Pəs ağıl və elm ilə insan tamam dünyanı təsərrüf edə bilir. Lakin insan bu şərafətdən özünü uzaq edib və buna səbəb budur: keçmişdə birisi az, birisi çox zəhmət çəkdiyinə kimi tavana, yə'ni güclü, kimi kasıb, yə'ni gücsüz olub və bu gücsüzlər günügündən gücdən düşdüyünə güclüləri dəxi güclüraq ediblər. Bu səbəblərə kasıbların tavanadan ehtiyacı artıb və gözü onun əlində qalıb. Tavana avamın avam olmağını öz nəf'i hesab edib, onun əlini, ayağını, gözünü, ağzını bağlı saxlamağa sə'y edib ki, avam ağlını artırıb malikdünyalıq iddiasını etməyib, özünü tavanaya təəllüq hesab edib, onun artıq güclü olmağına bais olsun və bu tövr tavana artıq güclü və kasıb, artıq gücsüz olmağı Məşriq-zəmində çox şiddət edib ki, oranı bə'zi tavanası Fir'on kimi Allahlıq iddiasına düşüb, kasıbları bizim İrandan gələn hammallar kimi yövmiyyə çörəyə möhtac olub. Bu tövr ilə ağıl sahibi və dünyanı təsərrüf etməyə qadir olan insanın çoxu dünyanın malikliyindən uzaq olub bə'zi heyvanın zindəganına həsrət çəkə qalıb.

Həqiqət, insanın çoxunun zindəganı bə'zi heyvanın zindəganından yaxşı deyil. Məsələn, mə'lumdur ki, bir heyvan bir ahunu şikar edib özü yeyir və əgər bir qeyr heyvan onun əlindən o ahunu almaq istəsə, onilə ölüncən dava edər. Amma insan qan-tər töküb qazandığını avamlığı cəhətindən öz əlilə özündən güclülərə verib onun dəxi artıq tavana olmağına bais olur. Və genə mə'lumdur ki, heyvan haraya istəsə gedir, hər tərəfə xahiş etsə baxır, hər nə istəsə eləyir, haçaq kefi istəsə uluyur, amma insan nə ki özü istədiyini edə bilmir, hətta heyvan uluyan kimi öz xahişilə danışa da bilmir. Pəs insanın malikdünyalıq ixtiyarı payimal olub, onun ağlı məhz tavanalar üçün işləyir.

Əlbəttə, tavana kasıb ilə belə rəftar eləyir ki, onun özü üçün yaxşı olsun, amma bunu fikir eləmir ki, necə bir at, yaman saxlandıqcan onun nəf'i olur, habelə kasıb gücdən düşdükcən ondan az nəf' olur. Pəs tavana və kasıbların hər biri üçün lazımdır ki, insan elm öyrənib malikdünya olmağa sə'y etsin. Və bizim Məşriq-zəminin Avropa əhlindən geri qalmağına bir ümdə səbəb budur ki, tavana və kasıbların arasında bu barədə ittifaq yoxdur.

## TƏZƏ XƏBƏRLƏR

Badkubə şəhərində şəhər qərardadını binalandırmaqdan ötrü komissiya tə'yin olunmuşdu. Bu komissiya şəhərdə sakin olan intixab edicilərin siyahısını yazıb tamam edib. Bu siyahı indi qubernski pravleniyanın çapxanasında basılır. Siyahı xalqa bəyan olandan hər kəsdə ixtiyar var ki, bir həftənin müddətində onun adı ol siyahıda olmasa, zikr olan komissiya mə'lum eləsin, sonra intixab ediciləri cəm edəcəklər ki, şəhər idarəsi üçün calislər intixab etsinlər.

* * *

Əgərçi bizim Rusiyada iştəyən gümüş pulu çox alçaq gümüşdür (yarıbayarı misdir) və bu səbəbə onu qeyr vilayətlərə aparmaq nəf' eləmirdi, amma bu halda qeyr vilayətlərdə bizim kağız pul çox qiymətdən düşdüyünə (bir manat 3 abbasıya gedir) gümüş pul aparmaqda nəf' edir. "Qolos" qəzetinə Berlin şəhərindən yazırlar ki, bir həftənin müddətində yəhudilər Berlinə satmağa yüz min manatlıq gümüş pul gətiriblər və genə çox gətirillər.

* * *

Bir neçə il bundan əqdəm Peterburq şəhərində yəhudiləri xaçpərəst etməkdən ötrü bir icma bina olub. Yazarlar ki, ol icma yəhudi uşaqlarından xahiş edəni xristian edib, bir əlahiddə mənzildə saxlayıb, onlara tə'lim edir. Bu il o mənzildə 40 uşaq var və bunların hər birinə ildə 200 manat xərc olur. Bu uşaqlar tamam edəndən sonra onları hər bir tərəfə yəhudiləri xaçpərəst etməyə göndərillər.

Mə'lumdur ki, indi olan Osmanlı davasında torped çox iş görür. Torped bir su keçməyən dəmir qutudur ki, onun içini barıt ilə doldurub dəryaya atırlar, onun üstə puçları var ki, gəmi üzən zaman o puçlara dəyəndə torped atılıb gəmini para-para edir.

Çünki İngilis dövlətinin gücü cəng gəmiləri ilədir və bu gəmilər torped olan yerə gələ bilmirlər, ona binaən bu halda İngilis məmləkətinin Port-Smut bargahında torpedi tələf etmək imtahanı olur.

Yazırlar ki, bundan ötrü bir dəmir qutuya pambıq barıtı (bu barıtı pambıqdan qayırıllar və özü pambıq kimi yumşaq olur və əsli barıtdan güclü olur) doldurub, torped olan yerə atıb, yandıranda hər qutu 300 arşın ətrafda olan torpedləri tələf edir.

* * *

"Qolos" qəzeti yazır ki, bizim kağız pulu qiymətdən düşdüyünə bu il Peterburqdan Avropaya gedən çox azdır. Çünki Peterburqdan Varşova gedən dəmiryolunun idarəsi mədyundur ki, hər gündə o tərəfə atəş ərradəsi göndərsin və gedən olmadığına ərradələr boş gedir, ona binaən zikr olan idarə vəziri-daxiliyyədən izin istəyib ki, həftədə 2 dəfə ərradə getsin, amma buna izin olmayıb.

* * *

Rusiyada bir icma var ki, İncil kitabını rus dilində çap elədib xalqa müftə paylamaqdan ötrü bina olub. Yazırlar ki, keçən il ol icma 40 min kitab paylayıb.

* * *

Əgərçi bu halda Osmanlı ilə olan cəngdə Avropa dövlətləri yoldaşlıq eləmirlər, amma bu davanın onlara həm zərəri dəyir. "Qolos" qəzeti yazır ki, Avstriya məmləkəti Tuna çayının kənarlarında olan

ticarətdən hər il 50 milyon manat mədaxil alır. Lakin indi dava olduğuna ticarət bağlanıb.

Hər ildə İstanbulun Ağ dəniz boğazından 4 min vapor, 40 min yelkən gəmisi keçirdi, amma indi yol bağlanıb, tamam dünyada olan ticarət əhlinə zərər dəyir.

* * *

Yazırlar ki, Amerikada olan Cəmahiri-Müttəfiqə məmləkətində zavodlarda və dəmir yollarında olan fəhlələr birləşib, sözü bir ediblər ki, onları iştədəndən artıq pul alsınlar və bundan ötrü hamı birdən işləməyə getməyiblər. Bu səbəbə dəmiryollar və qeyr bağlandığına dövlət fəhlələrin üstə – ki, onlar 5 mindən ziyadə imişlər, – əsgər göndərib. Onların arasında dava düşüb, fəhlələrdən 9-u ölüb, 30-u yaralanıb, amma fəhlələr genə sakit olmayıb. Yazırlar ki, onların qədəri günü-gündən artır.

## E' L A N

Pavel Yeqoroviç Zaparojçenko – ki, tamojnaxanada ambarçılıq edirdi, – mə'lum edir ki, sudlarda vəkillik eləməkdən ötrü şəhadətnamə alıb. Hər kəs onu vəkil etməyə xahiş etsə, onun mənzilinə getsin ki, Kokorevin imarətində sakin olur.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*3-cü sənə* | *16-cı nömrə*

*Fi 6 şə'banülmüəzzəm, sənə 1294*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Pəncşənbə günü*



*Fi 4 avqust Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*1 sənəliyi – 3 manat*
*6 aylığı -*
*1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Badkubəyə gələn telləri oxuyan, biz çap elətdirdiyimiz telləri görüb bizə töhmət etməsin ki, onların hamısını çap elətmirik, biz ağa quluyuq...

## DAXİLİYYƏ

1852-ci sənəd hökm olunub ki, Qafqaz vilayətinin şəhərlərində mümkün olduqca təzə şəhər qərardadı bina olunsun və bu günlərdə Badkubə şəhərində şəhər pulu verənlərin siyahısı xalqa mə'lum olacaq ki, ondan sonra o siyahıda ismiləri olanlar cəm olub, zikr olan siyahıda adları olanlardan şəhər divanxanaları üçün calislər intixab eləsinlər.

Bu qərardadın muradı budur ki, şəhər əhli şəhərdən təhmilatı cəm edib, özü o məbləği məsrəf eləsin. Əlbəttə, bu muradın yaxşı olmağına söz yoxdur, amma mə'lumdur ki, nə qədər bir çobanın əyninə əlvan paltar geyəsən çoban çobanlığından çıxmaz və habelə nə qədər ə'latər qərardad ola, onu iştədənlər nadan olsa, ol qərardaddan bir səmərə olmaz. Pəs indi qoyulan qərardad nə qədər yaxşı da olsa, onun yaxşı iştənməyinə səbəb biz özümüz olacayıq. Ona binaən ki, onu iştədənləri biz özümüz intixab edəcəyik. Çünki bizim adam həmişə başısoyuqluğa adət edib və bu halda bir tərəfdən taun və bir tərəfdən cəng xəbəri bizi dəxi başısoyuq edib, ona binaən lazım bilib bizim intixab edici qardaşlarımıza bir az məsləhət edəcəyik.

Siz Allah, intixab edən zaman intixab elədiyiniz adamların uzun saqqalına, böyük qurşağına, dəmir sandığının doluluğuna baxmayın. Şəhər divanxanalarında danışıq və yazı-pozu rus dilində olacaq. Ona binaən gərək rus dili bilən doğru adamlar intixab edəsiniz ki, xaçpərəstlər intixab edən calislərin (onlar üçdən iki hissə intixab edəcəklər) arasında bizim adımızı dəxi ziyadə batırmasınlar.

Güman etməyin ki, bu məsləhəti biz özümüzdən ötrü deyirik. Xeyr, biz buğda yeyib cənnətdən çıxmışıq. Bizi intixab edicilərin siyahısına yazmayıblar. Ona binaən ki...

Nə bər şütür səvarəm,
Nə çü xər, bəziri-barəm,
Nə xudavəndi-rəiyyət,
Nə qulami-şəhriyarəm[1].

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Yazırlar ki, Misirdə bir ərəb pambığa oxşayan bir ot tapıb, onun toxumunu yığıb, əkib, becərib. İndi bu təzə otdan pambıq əmələ gətirir ki, əsil pambığdan ə'latər olur.

Bu ot pambıq otuna oxşayır, amma onun 4 arşın hündürlüyündə bircə budağı olur ki, onun başında 70-dən ziyadə gül açılır. Çünki bizim pambığın budağı çox olduğuna artıq yer tutur ki, hər otun bir-birindən arası bir arşın olur; lakin bu təzə pambıq az yer tutduğuna onun arası yarım arşın da olsa, yaxşı əmələ gəlir. Bu səbəbə təzə pambığı əkib becərmək zəhməti birə-bir az olur. Bu təzə ota bamya pambığı deyirlər. Belə güman edirlər ki, onun toxumu Misir məmləkəti Sudan vilayətini bir neçə il bundan əqdəm zəbt edəndən sonra Sudandan Misir torpağına düşüb.

* * *

Zavodlarda buğdadan nişastanı belə çəkirlər: çay ya yağış və ya şirin bulaqların suyunu soyuq ya ılıq edib, bir qabda buğdanın üstə töküb, 8-10 gündən sonra suyu süzüb, buğdanı ərradə oxuna oxşayan ağaclar ilə əzib, xəmir edib, bu xəmirin üstə təzə su töküb, ona xəmir

---

[1] Nə bir dəvəyə minmişəm, nə eşşək kimi yük altındayam. Nə rəiyyətin ağası, nə də hökmdarın nökəriyəm.

maya kimi turşu vurub, 2 həftəyəcən kürək ilə qarıştırıllar, ta ki, xəmir dəxi qaynamasın, yə'ni xəmirdən əmələ gələn hava qismi şeylər ondan bilmərrə rədd olsun. Sonra suyu süzüb, xəmiri bir ələk üstə qoyub, üstə təzə təzə su töküb, ol qədər yuyurlar ki, xəmirin nişastası su ilə bilmərrə rədd olsun. Bu suyu 3 gün saxlıyanda nişasta onun dibinə düşür. Ol vaxtda suyu süzüb nişastanın üstünə təzə su töküb, qarışdırıb bir nazik ələk üstə töküb, süzüb 47 saat saxlayandan sonra, suyu süzüb nişastanı belə qurudullar: onun üstə bir parça çəkib, parçanın üstə kül töküllər ki, bu kül nişastanın nəmişliyini çəkir. Sonra nişastanı nazik, uzun doğrayıb təndirlərdə qurudullar.

* * *

Şvedsariya vilayətində pəniri belə qayırıllar: südü mis qazanlara töküb, ona turşumuş mal mə'dəsi vurandan yarım saat sonra onun içinə bir dəstə nazik ağac (çub) salıb, ol qədər çırpıllar, ta ki çürümüş süd xırdalanıb, noxud boyda parça-parça olur. Sonra onu ocağa qoyub, 60 dərəcəyəcən qızdırıb, bu zaman həm çırpıllar. Sonra torbalara töküb, iki taxta arasında, yə'ni maşın ilə sıxıb bir quru, 12 dərəcə istisi olan otaqda saxlayıb hər gün də duzlu su ilə sürtüllər, ta ki yetişib tamam olur.

* * *

İnsanın bədəni yanmaqdan, məsələn, qaynar su tökməkdən qabarıb ziyadə azar edər. Bu qubarın içi su ilə dolu olur. Yazırlar ki, belə qabarı duzlu ya zəyli suya salanda qabarın içindəki su bu duzlu sudan duru olduğuna dəridən keçib duzlu suya qarışır və bu səbəbə belə qabarı yarım saata sağaltmaq olur və əgər qabar olan yeri duzlu suya salmaq məqdur olmasa, ol vaxtda bir əsgini tez-tez duzlu suya batırıb onun üstə qoyanda qabar çəkir.

* * *

Havanın dəyişilməyini piş əzvəqt bilmək əkin və ziraət edən kəslər üçün çox lazımdır. Amma havanın dəyişilməyinin səbəbi sox olduğuna onu bilmək məqdur deyil. Əkinçi bunu bilməkdən ötrü Avropa əhli çox sə'y edir. Amma bu halda onun bircə əlacı var. Külək ya yağış başlanan yerdən o külək ya yağış gedən tərəflərə tel göndərib mə'lum eləmək ki, filan tərəfə külək ya yağış getdi. Çünki tel tamam kürreyi-ərzin ətrafını bir dəqiqədən də tez gedir, amma külək

və yağış dəqiqədə bir neçə verst ancaq gedir, ona binaən tel gələn yerdə sakin olan kəs tel göndərilən yerin fasiləsini hesab edib bilə bilir ki, neçə saatdan sonra külək əsəcək ya yağış yağacaq.

Yazırlar ki, Parij şəhərində bir yer bina olub, tamam Avropa qit'əsinin bu başından o başınacan, yə'ni İstanbuldan Londonacan hər gün sübh saat 8-də hava necə olmağı tel ilə gəlib mə'lum olur və ol yerdə Firəngistanın 500-dən ziyadə kəndinə (günü-gündən tel apartdıran kənd artır) o xəbər günorta vaxtı gedib yetişir ki, o kəndlərdə sakin olanlar piş əzvəqt hava dəyişilməyini bilir.

## MƏKTUBAT

Şamaxıda bir qabili-ərz əhvalat yoxdur. Məgərin ki, bir neçə gündür ki, Şamaxıda havanın hərarəti nəhayət şiddət edibdir. Mizanül-hərarət gün qabağında qoyanda otuz qrata çıxır. Ətraf kuhistandan şəhərə gələn çeşmələrin suyu münqət' olubdur və çahların suyu quruyubdur, əlatəş sədası asimana bülənd olubdur. Bu günlərdə Şamaxının şəhəri susuzluq barəsində səhrayi-Kərbəlayi-pürbəladan bir nişanədir. Bir para meyvələr susuzluqdan tələf olub və hərarət şiddətindən çox adamların dimağı eyib edib, divanə olublar və o divanələrdən bir nəfər öz əqrəbasını bıçaq ilə məcruh edibdir. Allaha təvəkkül.

### Məktubi-mənzumə

Ey bizə xeyirxah olan Möhsün,
Əhli-ehsanü xoşnişan Möhsün!
Millətin qeyrətin çəkən qardaş,
Toxmi-xoşbəxtlik əkən qardaş.
Sözlərin dün gətirdi şurə məni,
Şad qılsın görüm ilahi səni!
Yazmış idin ki, ey güruhi-bəşər,
Əhli-islamü qövmi-paksiyər,
Ayılın bircə xabi-qəflətdən
Geri qaldıq təmam millətdən!
Afərin, ey yeganeyi-dövran!
Pəndinə yoxdu şəkkü reybü güman.
Məsəlin xub, sözlərin mərğub,
Zövq edər guş edəndə əhli-qülub.
Filhəqiqət dirəxti-nakamil
Tərbiyət fezyinə olur şamil.

Növ’i-insan deyil ağacdan kəm,
Qabili-tərbiyətdi hər adəm;
Daşı tə’siri-afitabi-fələk
Döndərib lə’li-nab edər bişək.
Nafi-ahudə müşk edir qanı,
Dürri-nab eylər abi-neysani.
Elm üçün, ari, əhli-hikmətlər,
Çəkib aləmdə çox riyazətlər.
Elmsiz kimsənə hünərsizdir,
Elmi-bitərbiyət səmərəsizdir.
Tərbiyət mayeyi-səadətdir,
Tərbiyət şəxsə malü dövlətdir,
Elmlə hər o kəs ki, danadır,
Qabili-feyzi-rəbbi-ə’ladır.
Nitq ilə mürdələr qılan əhya
Qaçdı nadandan həzrəti-İsa.
Elmdir baisi-tərəqqiyi-tam,
Alimə tay deyil güruhi-əvam.
Bunu da bil ki, ey qərini-şərəf,
Elm ancaq deyil bu “Nəhv” ilə “Sərf”.
Bu deyil ancaq elm ki, ey dana,
Edəsən bövl vəqti-istibra.
Hələ qalsın bu rəmzlər barı,
Elmsiz adəmin nə miqdarı?
Möhsüna, ey fəda olum sənə mən,
Etdiyin fikri-bikrə səd əhsən!
Bilməyən yoxdu kim, bu mə’nanı:
Tərbiyət kamil eylər insanı.
Tutalım gəldik əmrə mərdanə,
Baxmadıq tə’nü lə’nü nadanə,
Tutalım eylədik bu əmrə tifaq,
Tərbiyət biz gərək ki, kimdən alaq?
Hansı məktəbdə fövği-ətfali
Hansı bir elmdən edək hali?
Məktəbi-tibb, ya ki hikmətdən?
Ya ki hərbiyyə, ya ki hirfətdən?
Necə kim, ol “Vəkili-namə’lum”
Eyləmişdi bu nüktəni mərqum,
Əvvəla, bizdə yox o məktəblər –
Ki, verə kəsbi-elmi xəlqə səmər.
Nə o gunə kitablar əl’an –
Ki, ola öz lisanımızda bəyan.
Bizə hasil nə şey olur yoxdan –
Ki, itibdir kitabımız çoxdan,
Hanı bizdə “Xülasə”nin səməri,
Hanı “Cəbrül-müqabil”in xəbəri?

Səhl, dillərdə elmi hey’ət yox,
Cəmü təfriqü zərbü qismət yox.
Nə təqiyyə, budur sözün safi,
Küfrüdür bizdə elmi-coğrafi.
Elm evi oldu ol zaman bərbad,
Ki, etdi rehlət xəlifeyi-Bağdad.
Hər vilayətdə var beş-on məktəb,
Edirik kəsb onda elmü ədəb.
Məktəbin fərşi altı köhnə həsir,
Neçə ətfali-müztərr onda əsir.
Dərsimizdir kitabi-”Kürbəvü muş
“Nəqli-həmdunə”, “Qisseyi-xərguş”.
Oxuruq, çox tərəqqi etsək əgər,
Cümlə “Tarixi-Nadir”i əzbər.
Bixəbər elmi-paki-hikmətdən,
Bisəmər cadeyi-şəriətdən.
Deyəcəksən ki, ey qərini-ədəb,
Pəs gəlin tazədən açaq məktəb.
Biz bu əmrə görək ki, ey xoşnam,
Hansı qüdrətlə eyləyək iqdam?
Pulumuz varmı ol sərəncamə,
Ta yetişsin fəqirlər kamə?
Əhli-islam eyləyibdi vəfat,
Dəxi müşkül tapar bu qövm həyat.
Məgər ol Əsgəri-Goranlı gələ,
Neçə məktəb gələ dəxi əmələ.
Vəzirov bəlkə eyləyə imdad,
Qıla bu qövmi elm üçün irşad.
Aça onlar da mən kimi məktəb,
Çəkələr ruzü şəb ənavü təəb.
Bar ilaha, behörməti-Quran,
Bizə çatdırsın onları sübhan.
Seyyida, hər güruh içində ola,
Daima əhli-halə eylə dua.

## ELM XƏBƏRLƏRİ

Yazırlar ki, İngilis və Rusiya dövlətləri hər il Məşriq-zəminə 24 milyon manatlıq mal aparıb satıllar. İngilis vilayətinin bircə Birminğam şəhərində bir həftənin müddətində qayrılır: dəmir qələm 14 milyon, dəmir çaharpay 6 min, tüfəng-tapança 7 min, mismar 100 milyon, at yəhəri 1000, mis pul 5 milyon, çeşmək 20 min, kağızdan şeylər 382 put, almasdan qayrılan şeylər 25 min manatlıq, dəmirdən və poladdan

məftil 6 min verst uzunluğunda, sancaq 620 put, övrətlər üçün qırmaq 310 put, dəmirdən bəndlər 41 min put, təzə gümüşə oxşayan mə’dən-dən şeylər 2500 put, daşdan hasarlar üçün dayaq 1200, dəmirçi körüyü 3500, misdən, bronzdan kiçik şeylər 50000.

* * *

Yazırlar ki, havada su buğu artıq olduqcan ulduzların şəfəqi ziya-də olur və bu səbəb yağış yağmağı piş əzvəqt bilmək olur.

* * *

Elmi-hikmət sübut edir ki, yer girdədir və bunun bir dəlili budur ki, bir kəs gəmilə Dəryayi-mühitə girib bir tərəfə, məsələn, Məşriqə getsə axırda genə ol yerə gəlir. Əlbəttə, yer düz olseydi, belə səfərə gedən heç geri qayıtmaz idi. Bu tövr kürreyi-ərzin ətrafını dolanmaq səfəri çox çətin idi ki, 3-4 ilə onu ancaq qurtarmaq olurdu. Yazırlar ki, Firəngistanın Parij şəhərində bir icma bina olub ki, hər xahiş edəni aparıb kürreyi-ərzin ətrafını səyahət elətsin. Hər kəs bu səfəri xahiş etsə, gərək pis əzvəqt ol icma mə’lum eləsin, sonra icma onları yığıb gəmilə göndərir.

Yazırlar ki, icmanın əvvəlinci gəmisi bu il may ayında Marsel şəhə-rindən çıxıb gedib və 10-11 aydan sonra qayıdıb genə Marselə gələcək.

* * *

Yazırlar ki, yer üzündə 23 min qəzet çap olunur. Germaniyada 3775, Avstriyada 1200, Şvedsariyada 450, İngilisdə 2500, Firəngistanda 2000, İtaliyada 1126, Rusiyada 500, Şvedsiyada 296, Norvegiyada 178, Daniyada 250, İspaniyada 400, Portuqaliyada 250, Hollandiyada 250, Belgiyada 250, Osmanlıda 200, Şimali Amerikada 8129, Cənubi Amerikada 1000, Hindistanda 250, Çində 50, Japoniyada 75, İranda 2 və Asiya qit’əsinin qeyr vilayətlərində 10, Afrika qit’əsində 50, Avstraliya qit’əsində 100.

## TƏZƏ XƏBƏRLƏR

Bu il yayda Badkubədə 3-4 dəfə şimal küləyi əsibdir. Hər dəfə 1-2 gün. Qeyr vaxtlar külək olmadığına bərk isti olub ki, mizanul-hərarət gün altında 45 dərəcədən də ziyadə isti göstərib.

* * *

Rəştə gedən həkimlərimiz gəlib çıxdı. Onlar deyir ki, naxoşluq həqiqət taun olmağı mə'lum deyil. Amma iş budur ki, İranda meyiti şəhərin içində basdırıllar və onun üstünü yaxşı torpaqlamırlar. Bu səbəbə şəhərin havası və veyllərinin suyu günü-gündən xarab olur. Ona binaən biz qorxduq ki, ol naxoşluq döndərib taun eləməsin və bu səbəbə cənab valiyi-Gilandan iltimas elədik ki, şəhərin ətrafında bir yer ölüləri basdırmaq üçün müəyyən eləsin. Amma ol cənab bizim iltimasımızı qəbul eləmədi. Belədə biz naəlac qalıb yazdıq ki, karantin bina olsun.

* * *

İngilis qəzetləri yazırlar ki, bir şəxs bir alati-hərbiyyə ixtira edib ki, topa oxşuyur. Onun ağzına iki qılınc hər biri 6 arşın uzunluqda bir yerə möhkəmlənmiş qoyub, sonra topu doldurub atanda o qılınclar düşmən əsgərinin içinə daxil olub, altı yüz arşın adamları qırıb gedir.

Türküstandan yazırlar ki, Türküstani-şərqiyyənin hakimi Yəqub xan Çin məmləkətilə cəng edirdi. Amma məzkur xan bir davada basıldığına acıqdan bağrı çatdayıb vəfat edib. Ona binaən onun oğlu Begim bəy onun yerinə hakim olub.

* * *

Novqrad şəhərindən iyulun 18-də yazırlar ki, bu gün bizim şəhərimizə 500 çərkəs gətirdilər ki, burada kəndlərdə sakin edəcəklər. Onlardan bə'zi rus dili danışmağı bilir. Bunlar deyiblər ki, Dağıstanski və Terski oblastlardan genə də çox adam göndərirlər və onları Novqrad və Voronej və Voloqda və qeyr quberniyalarda sakin edəcəklər.

Bu öz külfətləri ilə göndərilən çərkəs və ləzgilərin taxsırı budur ki, onlar dövlətə yaği olmuşlar imiş.

* * *

Avropa dövlətlərindən bir-birinə poşt getmək xüsusunda o dövlətlərin arasında kağız bağlanıb və bu kağıza sərəncam çəkmək Şvedsariya dövlətinin poştxanasına rücu' olub. İndi "Tiflisski vestnik" qəzeti yazır ki, zikr olan poştxana e'lan edir ki, İran dövləti də özünü o kağıza saldırıb. Ona binaən Rusiya ilə İranın arasında Badkubə dəryası ilə poşt açılıb.

* * *

Bizim əsgər Ərzurum tərəfində olanda üç min erməni (övrət, uşaq, qoca) onlara qoşulub, onlar ilə Qafqaza gəliblər. Bu halda Tiflisdə onlar üçün pul cəm edirlər və belə danışıq var ki, onları Qafqaz vilayətində sakin eləsinlər. Bu barədə qəzetlərin arasına mübahisə düşüb. Bə’zi deyir ki, erməni tayfası ticarət əhli olduğuna Rusiyadan Qafqaza ticarət əhli gəlməyə mane olur. Ona binaən onları burada sakin eləmək dövlətin nəf’i deyil. Bə’zi deyir ki, erməni tayfası əkin və ziraət də edir, pəs onları sakin eləmək dövlətin nəf’idir.

* * *

Yazırlar ki, İstanbulda ərəb dilində “Cavab” adlı bir qəzet çap olur ki, islam vilayətlərinə çox gedir. Ona binaən Firəng dövləti Cəzair məmləkətindən ötrü və İngilis Hindistandan ötrü ərəb dilində əlahiddə qəzetlər çap elədilər ki, zikr olan “Cavab” qəzeti ol yerlərdə olan islam tayfasına tə’sir eləməsin.

* * *

Teymurxan-Şuradan yazırlar ki, bazar kasaddır. Elə gün olur ki, süftəyə məəttəl qalırıq. Məzənnə budur: ardigəndum 1 manat 20 qəpik, co 90 qəpik, cövhəri-ə’la 1 manat 80 qəpik, birinci-alalan 1 manat 25 qəpik, akuleyi-xub 1 manat 65 qəpik, xurma, səbzə 4 manat, əsəli-İran 6 manat 50 qəpik, rəngü həna vücud nədarəd, əbrişəm girvənkə 3 manat, səqqizi-səfid 2 manat 50 qəpik, qeysi 2 manat 50 qəpik, pənbə 2 manat 50 qəpik. Və genə yazırlar ki, iki aydır ki, yağış yağmır və əgər 2 həftə də yağmasa, Dağıstan əhlini ölmüş hesab edin. Buğda yaxşıdır. Soyuqdur.

* * *

Bu 2 həftənin müddətində biz çap elətdirdiyimiz tel yoxdur. Ona binaən bu nömrə ilə tel çap olunmur.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского
Губернского Правления.

*3-cü sənə* *17-ci nömrə*

*Fi 20 şə’banülmüəzzəm, sənə 1294*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Pəncşənbə günü*



*Fi 18 avqust Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*1 sənəliyi – 3 manat*
*6 aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E’lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Badkubədə şəhər təhmilatı verənlərin siyahısı çap olunub, bu avqust ayının 14-də divarlara vurulub. Hər kəsin adı o siyahıda yoxsa, ya öz silkində yazılmamış isə, zikr olan gündən iki həftənin müddətində o siyahını yazan komissiyaya gərək mə’lum eləsin.

## DAXİLİYYƏ

Bizə izin veriblər ki, Badkubəyə gələn tellərin hamısını çap edək. Çünki buraya hər gündə tel gəlir və onların hamısını birdən əlahiddə çap etmək çox olur, ona binaən onları qəzetin içində basdıracayıq. Belədə gərək qeyr fəsilləri azaldaq və bir də lazım bilib ərz edirik ki, o tellərin və qeyri xəbərlərin barəsində cənab şahzadə sərəsgəri-əsgəri-Tunə yazır ki, onlara çox bavər etməsinlər ki, onların bəzi düşmən sözü olur. Məhz cənabın öz tellərinə inansınlar ki, həmişə göndərəcək və əgər tel gəlməsə, mə’lum ki, bir xəbər yoxdur.

## ƏF’ALİ-ƏHLİ-DEHAT

Cənubi Rusiyanın Donski oblastında çox siçan peyda olduğuna camaat bir qayda qoyub ki, hər kəs gərək 30 siçan tutub, tələf edib, camaat məclisinə pişnəhad eləsin və əgər hər kəs 30-dan ziyadə tələf eləsə, hər bir ziyadə tələf olan siçana camaat 2 qəpik verir.

Yazırlar ki, iki il bundan əqdəm xalq su gətirib siçanın dəməyinə buraxmaq ilə onları tutub tələf edirdi. Amma su gətirmək zəhməti çox olduğuna indi dəməklərin ağzında quru ot yandırıb, onun tüstüsünü içəri verib, siçanı çıxarıb tutub tələf edillər.

* * *

Qaratorpaq əkin yerində, həmçinin bağ, bostan yerində nazik qırmızı qurd olur ki, ona suvalcan (soxulcan) deyirlər. Bu qurd yağışdan sonra yerin altından üzünə çıxdığına ona yağış qurdu da deyirlər. Bir yerdə bu qurd çox olanda avam elə bilir ki, o, əkinə zərər edər, amma indi təcrübə olunub ki, onun əkinə nəf'i çoxdur. Bu qurd yer altında bir arşın dərinlikdə özünə dəmək qayırır. Bu dəməklərin içi onun nəcisindən qüvvətlənir və bu dəməklərə əkinin kökü düşəndə çox dərinə gedir. Belədə əkin dəxi yaxşı əmələ gəlir.

* * *

Yazırlar ki, cənubi Rusiyanın qədim nimcəzirəsində bir qara hörümçək peyda olub ki, hər bir gəzəndərgəz arşın yerdə bir neçə hörümçək olur. Əgərçi onların dişləməyindən insan vəfat etmir, amma bir neçə gün naxoşluyur.

Onların və qeyr hörümçəyin dişdəməyinin ağrısından xilas olmaqdan ötrü məsləhət edirlər ki, bir stakan suya iki çay qaşığı naşatırnı spirt və bir çay qaşığı düz töküb, əridib, bu suda əsgini isladıb, hörümçək dişdəyən yerə qoysunlar.

* * *

Bizlərdə əkinçi toxumu əlilə səpir və belə toxum səpmək təcrübə istər, hər kəs toxum səpə bilməz. Amma Avropa vilayətlərində hər bir əkini cərgə-cərgə əkirlər. Belə əkməyin nəf'i budur ki, toxumu hər kəs səpə bilir, yə'ni adətkərdə adam lazım deyil. Toxum birə-bir az gedir. Toxumu nə qədər dərin istədikcən basdırmaq olur. Bu səbəbə ona qışın soyuğu və yayın quraqlığı heylə kar eləmir. Bu zikr olan səbəblərə görə cərgə əkilən əkin birə-bir artıq bəhrə gətirir. Əlbəttə, əkini maşın ilə cərgə əkirlər, amma bu maşını şəkilsiz, yə'ni bircə yazı ilə bəyan etmək çətin olduğuna onun məzmununu müxtəsər bəyan edəcəyik.

Bir uzun qutunun altında mala dişi kimi və ya dəxi böyük dişlər var ki, hər dişin dalında qutunun bir kiçik, yə'ni bir toxum keçən deşiyi var ki, deşiklərin və dişlərin bir-birindən arası bərabərdir.

Yeri şuxm edib, narın edəndən sonra o qutunun içinə toxumu doldurub, ol yer ilə mala sürən kimi çəkirlər. Belədə toxumlar cızıq-cızıq səpilir, amma belədə bir cızıqda olan toxumların arası bərabər olmaz. Onları da bərabər eləməkdən ötrü qutunu yumru və fırranan qayırıb, onun hər cızıqda olan deşiklərinin arasına bir-birindən bir aralıqda edirlər. Məsələn, taxıl üçün o deşiklərin arası gərək bir kərəh yarımdan az olmasın.

## ELM XƏBƏRLƏRİ

İnsanın adətlərinin çoxu qədim zaman əmələ gəlib ki, ol vaxtda yazı-pozu olmadığına onun tarixi yazılmayıb. Ona binaən onun əmələ gəlmək səbəbini bilməkdə hükəma aciz qalmışdı. Amma indi bu tövr ilə hükəma bunu bilir: mə'lumdur ki, yer üzündə hər bir qism tayfa var ki, onların bə'zi Avropa əhli kimi kamala yetişib, bə'zi indiyəcən həzrəti-Adəm vaxtındakı kimi vəhşi tövründə çılpaq gəzir. Və genə mə'lumdur ki, hər bir tayfa əvvəl vəhşi kimi olub, sonra mürur ilə kamala yetişib. Ona binaən, hər bir tayfanın adətini öyrənəndə kamala yetişən tayfanın adətlərinin çoxu necə əmələ gəlmək mə'lum olur. Məsələn, bizlərdə olan qız götürüb qaçmaq və övrəti qul kimi və ya bir şey kimi özünə təəllüq hesab etmək adətinin necə əmələ gəlməyini hükəma belə bəyan edir:

Keçmişdə kəbin olmayıb. Hər camaatın övrətləri ol camaatın kişilərinin olub. Belədə bir kişi bir övrət məxsusi onun olmağı istəyəndə labüd qalıb onun qeyr camaatdan oğurlayıb: yə'ni kəbinin əsli övrət oğurlamaqdan əmələ gəlib. Və bir də keçmişdə qeyr tayfadan oğurlanan, yə'ni əsir olan kəslər qul hesab olub. Bu səbəblərə çox kəs indiyəcən övrəti götürüb qaçır ki, onu əsir edirəm və ondan sonra onu özünə qul hesab edir ki, guya əsir edibdir.

Bə'zi tayfanın bir adəti var ki, bir kişi vəfat edəndən sonra onun övrəti dübarə ərə gedə bilməz. Bə'zi tayfanın adətinə görə bu dul övrət gərək özünü öldürsün. Bə'zi yerdə bu dul övrəti ya öldürüb və

ya diri-diri öz əri ilə belə basdırıllar. Bu adətin əmələ gəlməyini hükəma belə bəyan edir:

Bə'zi tayfa belə fəhm edir ki, bu dünyada elədiyi əməli o dünyada həm edəcək. Məsələn, Peru vilayətinin əhli ki, əkin və ziraəti dost tutur, vəfat edənin qəbrinə buğda və qeyr toxumlar qoyur ki, o dünyada onları əkib becərsin. Tunğuz tayfası ölən kişinin qəbrinə tüfəng, yaraq qoyur ki, o dünyada ovçuluq eləsin. Xülasə, hər ölüsü ölən sə'y edir ki, o dünyada onun üçün xoş keçsin və bundan ötrü bə'zi yerdə ölən kəslər adət elədiyi şeyləri onilə basdırıllar ki, o dünyada onun yanında hazır olsunlar. Və bu səbəbə bə'zi tayfa bir kəs öləndə onun pullarını və övrətlərini ki, ölənə təəllüq hesab olunurlar, öldürüb və ya diri-diri onilə basdırıllar ki, o dünyada ona qulluq eləsinlər. Hətta bə'zi tayfa bu qulları və övrətləri qabaqcadan öldürüllər ki, onlar piş əzvəqt gedib ölən kəs üçün yer hazır eləsinlər. Bir kəsdən intiqam almaq adətini hükəma belə bəyan edir: mə'lumdur ki, bir uşağın başı divara dəyəndə uşaq divarı yumruqluyur. Buna səbəb budur ki, hər kəs hətta hər bir heyvan öz bədənini gərək mühafizət eləsin və bir də intiqam necə alınmağı mülahizə edənə mə'lum olur ki, bə'zi tayfa nə ki düşmənin özündən, hətta onun əqrəbasından və qonşusundan həm intiqam alır. Məsələn, bizim Dağıstanda sakin olan çeçen tayfası öz qanlısının yerinə onun əqrəbası da əlinə düşəndə onu öldürür. Çin və Japon vilayətlərinin əhli qanlısının nə ki özündən və əqrəbasından, hətta qonşusundan və həmşəhrisindən də intiqam alır.

Belə intiqam almağa səbəb budur ki, keçmişdə insan əvvəl külfətbəkülfət, sonra artdıqcan hər külfət bir güruh olub və bu güruhlar birbirilə cəng-cida edib, axırda birləşib, məmləkət bina ediblər. Ona binaən avam indiyəcən külfəti, camaatı və güruhu bir adam kimi hesab edib, onlardan bir kəs bir bəd əməl görəndə qeyrlərə intiqam edir ki, onlarda da taxsır var imiş.

Əlbəttə, düşməndən intiqam almaq ol yerdə olur ki, orada ədalət qanunu bina olmamış ola. Elə ki bir yerdə belə qanun bina olundu, intiqam almaq gərək bərhəm olsun. Pəs bu halda hər tayfadan intiqam almaq adəti var isə, mə'lum ki, o tayfanın belə qanunu yoxdur və əgər var isə də, ona əməl olunmur.

## TƏZƏ XƏBƏRLƏR

Taun barəsində bizim həkimlər danışırlar ki, karantin bərhəm olacaq. Ona binaən ki, ol naxoşluq tauna oxşamır.

"Mşak" qəzetinə Badkubədən yazırlar ki, bizim şəhərin erməniləri Üçkilsədə olan erməni patriarxına ərizə göndəriblər ki, cənab patriarx Rusiyada sakin olan ermənilərin adından padişahi-imperaturi-ə'zəmdən təvəqqə eləsin ki, Osmanlı dövlətinə tabe olan erməniləri onlara olan zülmdən xilas etməkdən ötrü slavyan tayfasına alınan ixtiyarları onlar üçün də alsın və barədə "Mşak" qəzetindən iltimas ediblər ki, bu ərizəni çap edib, ermənilərə mə'lum eləsin ki, qeyr şəhərlərdə olan ermənilər də cənab patriarxa belə ərizə göndərsinlər.

* * *

Osmanlıdan bizim Qafqaza qaçıb gələn 3 min erməni barəsində yazırlar ki, onları Üçkilsədə bir neçə gün ermənilər paltar, xörək verib saxlayıblar. İndi "Mşak" qəzeti yazır ki, Qarabağda, İrəvanda, Qubada olan erməni mülkədarları zikr olan ermənilərə ixtiyar veriblər ki, onların yerlərində sakin olub, əkin və ziraətə məşğul olsunlar və mədyun olurlar ki, bir neçə il onlardan dəhyek almasınlar.

* * *

Keçən iyul ayının 29-da Daşkənd şəhərinin kazonni palatı Peterburqa Xokənd xanlığının yaxşı gümüş pulundan 4 milyon 52 min manat göndərib ki, onu əridib, kəmqiymət gümüş pulu kəsdirəcəklər.

* * *

İyulun 15-də Samar şəhərində çox böyük yanğı olub ki, 7 küçədə (52 desyatin) olan evlər yanıb tələf olub. O yanğından zərər yetişənlər üçün pul cəm edirlər. Padşahi-imperaturi-ə'zəm onlara yüz min manat verib.

* * *

Novqorod şəhərinin ətrafından yazırlar ki, oraya iki yüz külfət çərkəs gətiriblər ki, orada sakin eləsinlər.

* * *

Tiflisdən yazırlar ki, avqustun 3-də oraya Zəkərtala şəhərindən 12 ləzgi ayağı buxovlu gətiriblər ki, onlar camaata əsgər verməyə mane olurmuşlar.

* * *

Lənkərandan "Bakinski izvestiya"ya yazırlar ki, bizim Badkubə quberniyasından cəm olan süvari əsgəri İran sərhəddinə göndəriblər ki, orada olan kazakların əvəzinə sərhəddə dursunlar və kazakları Gömrüyə göndərirlər. Və "Qolos" qəzeti İrəvan və Gəncə süvariləri barəsində yazır ki, onları da bədəstur İran sərhəddinə göndəriblər.

* * *

*Badkubəyə gələn tellər*

*İyulun 3-dən İstanbuldan.* İsmayıl paşa yazır ki, üç gündür Məsuk kəndini alıb, sərhəddən iki ağac o yana getmişik.

*İyulun 31-də Bukarpeştdən* (Rumıniyanın paytaxtı) Ternoy şəhərinin (Balkandan Tuna tərəfə Osmanlı şəhəridir ki, bizim Rus zəbt edib) ətrafında olan dağları rus bərkidir. Məhəmmədəli paşa (sərəsgər) rus əsgərlərindən səkkiz ağac aralı dayanıb.

*Rumıniya* (Osmanlı dövlətinə xərac verən əyalətdir ki, indi bizim ilə birləşib onlar ilə cəng edir) Dubrovic vilayətini (Tuna vilayətinin bir hissəsidir) istəyir.

*Vyanadan.* Dubrovicdə olan rus əsgəri irəli gedib Məcidiyyə ilə Rasov qalalarının arasına cəm olur.

*Afina.* Rum (Qrek) dövlətinin əsgəri Osmanlı sərhəddinə getdi. Krit cəzirəsində yaği olan artıb.

*Avqustun 1-dən Qornıstuden* (Tunanın Osmanlı tərəfindən bir kənddir ki, orada bizim əsgər dayanıb) cənab şahzadə sərəsgər yazır ki, Avropa qəzetləri bizi Osman paşa Plevna yanında basandan sonra Mesisto tərəfə qovmaqdan Ruscəq, Həzarqrad tərəflərində basmaqdan çox danışır.

Bunlar hamısı böhtandır, hər nə olsa özüm yazaram və əgər tel gəlməsə, mə'lum ki, təzə xəbər yoxdur.

*Avqustun 2-dən.* Gömrü. Biz Kodor çayına (Suxum tərəfdədir) yavıqlaşlanda Osmanlı əsgəri Kelasur çayından o yana keçdi. Abxaz tayfası biz irəli getməyə mane olmur.

*Qornıstuden.* 700 Osmanlı süvarisi Jedin kəndinin üstə gəlmişdi, onları qovduq.

*İstanbul.* Dövlət hökm edib ki, Asiyada olan vilayətlərin məğrib tərəfində olanlarından təzədən 60 min əsgər cəm olunsun.

*Vyanadan.* Rus əsgəri Plevna və Bela şəhərlərinin arasına cəm olur. Plevnada olan Osman paşanın qabaq dəstəsi 20 kilometr irəli yeriyib. Qafqazda olan Osmanlı əsgərinin bir hissəsi Tunaya gedir.

*Avqustun 3-dən.* Belqrad. Bosnə vilayətinin vəkilləri Vyana şəhərinə təvəqqə eləməyə getdilər ki, Avstriya məmləkəti Bosnəni zəbt eləsin. Nyu-York (Amerika cümhuriyyəsinin paytaxtı) Noiçvan bargahından ingilis gəmisi Osmanlı üçün bir milyon iki yüz min dollarlıq (dollar bir manat 30 qəpikdir) tüfəng və qeyr alati-hərbiyyə apardı.

*Bukarpeştdən.* Rus əsgəri Zimnisdən 2 körpüdən keçir.

*Sərəsgər qayıdıb* (Tırnovodan) Qornıstudenə gəlib ki, Bela şəhərinin yavıqlığındadır (Tunadan 20 verst arası var), Padşahi-imperaturi-ə'zəm özü də oraya gəlib.

*İstanbuldan.* Məhəmmədəli paşa yazır ki, Həzarqrad yanında bir az düşmən ilə atışıbdır.

Balkan dağının dalından ruslar çıxan kəndləri və yolları Suleyman paşa zəbt edir.

Ruslar Şipka yolunu bərkidirlər.

*Avqustun 2-dən.* Gömrü. İsmayıl paşa 40 batalyon əsgər, 55 top və çox süvari ilə Mison dərəsinin (İrəvan quberniyasındadır) yanına gəlib.

Baş Gədiklərin (Gömrü tərəfindədir) yanında 2 min Osmanlı süvarisi bizim qabaq dəstənin üstə gəlmişdi, qovduq.

Kobulet (Batum tərəfdə sərhəddədir) qoşununun üstə Osmanlı gəlmişdi, düşməni qovduq. Bizdən 61 ölüb.

*İstanbuldan.* Dövlət e'lan edir ki, ruslar Balkan dağının o biri tərəfindən qayıdıb gediblər.

*Bukarpeşt.* Dünən ruslar Slabdzidən (Rumıniya qalasıdır) Ruscəqə top atmaqdan Ruscəqdə saat 12-cən bərk yanğı oldu. Bu gün Ruscəqdən Jorjevə (Rumıniya qalasıdır) top atırlar, ruslar ona cavab vermir.

*Avqustun 4-də.* Vyanadan. Raquze şəhərindən tel var ki, ustaşlar (yaği olan Bosnə əhli) Osmanlını bərk basdılar, 1000 adam öldürüb, çox tüfəng, azuqə alıb, Kluq, Petrovis şəhərlərini yandırdılar.

*İstanbuldan.* Ruslar Ruscəq yanında təzə körpü tikib Tunanı keçirlər.

*Vyanadan.* Msestudon (Tuna kənarında Osmanlı qalasıdır ki, bizim əsgər əvvəl oradan keçib onu zəbt edib) yazırlar ki, bir diviziya rus əsgəri Qornıstudenə köməyə getdi. Ona binaən ki, Süleyman paşa bizim üstümüzə gəlir.

Süleyman paşa Balkandan çıxıb Yelena və Qaber yollarını bərkidib irəli gedir. Onun qabaq dəstəsi rus süvarisinə rast gəlib atışıblar.

Rumıniya əsgərinin üçüncü diviziyası hələ Tunanı keçməyibdir.

Belə güman var ki, rus əsgəri bu qış Rumıniyada qalsın.

*Avqustun 4-də.* Qornıstuden. Cənab sərəsgər yazır ki, bu gün Tunanın Rumıniya tərəfində olan Slabodzi və Jorjev qalaları ilə Ruscəq qalası bir-birinə top atıllar. Bizim toplar səkkiz yel dəyirmanı yandırıb. Plevnadan düşmən Turkins kəndinə gedirdi, bizim toplar ona mane oldu.

General Qurkonun qoşunundan (Balkan dağını keçən qoşundur) bir ayın müddətində 10 əfsər, 181 adam ölüb, 33 əfsər, 709 adam yaralanıb, 57 adam itib. Onun ixtiyarında olan bolğarlardan 22 əfsər, 600 süvari tələf olub.

*Avqustun 4-də.* Qornıstuden. Bizə kömək gəlib yetişir, işimiz yaxşıdır. Əgər düşmən Plevnadan çıxmasa, gərək bu yazıq zamanda genə dava olsun.

Şipka, Silvi, Ternovi qalaları (Balkandadır) hələliyə bizim əlimizdədir. Axır dəfə olan Plevna davasında bizdən on minəcən adam tələf olub. Əzon cümlə 5 min yaralı Stuzimens mərizxanalarına göndərilib. Bu davada naxoşlara baxan qulluqçulardan da 40 adam ölüb.

*Avqustun 9-da.* Qornıstuden. Bu gün Süleyman paşanın 40 batalyon əsgəri Şipkanı (Balkanda olan yollardan bizim əlimizdə bircə Şipka qalıb) almağa gedib. Bir neçə dəfə düşməni geri qaytarmışıq, amma genə təzədən gəliblər. Əgərçi, bu halda qaranlıq düşüb, genə düşmən dava edir. Bu gün Loça qalasından düşmən bizim əlimizdə olan Silvi qalasının üstə gedib bərk dava olur.

*Avqustun 10-da.* Qornıstuden. Dünən sübhdən Şipkada dava olur, düşmən hər səfər təzə əsgər ilə onun üstə gedir, bizim igidlər hər səfər

onları geri oturdub, onlara çox zərər yetiriblər. General Radski onlara köməyə gedir. Dünən Loçadan gələn düşmən axşam davanı mövquf eləmişdi, bu gün genə başlayıb.

Plevna tərəfdən xəbər yoxdur.

*Avqustun 11-də.* Qornıstuden. Ayın 9-da düşmən 10 dəfə Şipkanın üstə gedib, hər səfər biz onları geri oturtmuşuq. 10-da düşmən ancaq top atır. Bizə ol qədr zərər olmayıb. Heyf ki, çox əfsər qırılıb, iki general – biri Derujinski, biri Stoletov – oraya göndərmişik.

*Avqustun 11-də.* Qornıstuden. Dünən düşmən bizim üstümüzə Aclar kəndinə gəlib (Silvinin yanındadır), onu almışdılar, amma biz genə geri aldıq. Bu gün genə gəlmişdilər, genə geri oturtduq. Ümid var ki, genə gəlsinlər.

Bu gün sübhdən düşmən Şipka üstə getmişdi, biz onu geri oturtduq. Amma təzədən genə gəliblər.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*3-cü sənə* *18-ci nömrə*

*Fi 4 rəməzanülmübarək, sənə 1294*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Pəncşənbə günü*




*Fi 1 sentyabr Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*1 sənəliyi – 3 manat*
*6 aylığı – 1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

Müştərilərimizin birisi yazır ki, sən allah sən də erməni qəzetləri kimi cəng olan yerlərin surətini çəkdirib, qəzet ilə xalqa payla ki, hər kəs o yerlərin surətini görüb, dava necə olmağından müxbir olsun.

Doğru deyiblər: varlığa darlıq yoxdur. Pəs belədə yoxsulluqdan da bir şey ummaq olmaz.

Ermənilərin nəyi yoxdur və bizim nəyimiz var.

Biz ki qəzeti basdırmağa hürufat tapmırıq, cəng olan yerlərin surətini və ya maşınların şəklini necə çəkdirək?

Vay, vay bizim halımıza ki, qeyrlərindən çox geridə qalmışıq!

## DAXİLİYYƏ

Bizim uzaqda olan müştərilərin birisi yazıb təvəqqə edir ki, gələn il "Əkinçi" qəzeti nə şərtlər ilə çıxmağı yazıb piş əzvəqt mə'lum edin ki, vaxtında pulunu göndərək.

Əvvələn, bu il 200-dən də az müştərimiz var idi ki, bu halda cəng olmaq səbəbinə onların bə'zinin yolu bağlanıb, bə'zi yerini itirib, bə'zi özü itib. Belədə gələn iləcən cəng qurtarmasa, müştərimiz dəxi az olacaq. Müştərisiz ki, qəzet olmaz.

Saniyən, əgər bizim hürufatın bə'zi köhnəlib xarab olsa, gərək təzədən hürufat gətirtmək. Bu vaxtda onu kim və haradan gətirtsin?

Salisən, bizim qəzeti çıxardan bircə mənəm və əgər mənim başıma bir iş gəlsə, gərək qəzet mövquf olsun. Aya bu halda ki, it sahibi-

ni tanımır, kim sabaha ümid ola bilir?.. Bunilə belə biz ümidvarıq ki, gələn il də qəzeti çıxardaq (at ölüncən otdar) və bu əsnada onun şərtlərini dəyişdirmək məqdur deyil.

Əgər əhyana zikr olan səbəblərin birinə görə qəzetimiz bərhəm olmalı olsa, bunu vaxtında yazıb müştərilərimizə mə'lum edib onların pulunun artığını özlərinə qaytaracayıq.

Allah "Əkinçi"yə rəhm eləsin.

* * *

Mə'lumdur ki, hər kəsin mahnıdan xoşu gəlir və bir yaxşı sövtü olan olmayan da özü mızıldamağa durur. Bu səbəbə mahnı çərəndiyat hesab olunur isə də, çox vacibi şeydir. Ona binaən onun mə'nasını yaxşılandırmaq sə'yinə düşmək lazımdır.

Hər tayfanın vətəndarlıq və millətin keçmişində olan yaman və yaxşı günlərini şərh edən mahnıları olur ki, bu mahnılar ağızdan-ağıza düşüb milləti birləşdirməyə bais olur. Amma bizim mahnılara baxan gərək təəccüb eləsin ki, xudavənda, onları kim və nə üçün düzəldib. Onların çoxunun ki, avam çağırır, heç mə'nası olmur. Məsələn:

Ağacda oturub sərçə,
Niyə uzunsan, ay küçə?
Sən harda qaldın, ah beçə,
Ey yar, ey yar, ay qaragöz.

Belə çağıranların barəsində doğru deyiblər ki, eşşəyin anqırmağı özünə xoş gəlir, amma çifayda, eşşək anqıra gəzir və onu belə anqırmaqdan xilas etmək sə'yinə düşən yoxdur. Bizim kamallı hesab olunan qardaşlarımız Hafiz ya Sə'dinin bu məzmunda şe'rlərini oxuyurlar: meyi düsalə və yar çəhardəh salə və ya məkün təkyə bərmali-dünya və püşt[1] ki, bunlar avam çağıran mahnılardan da yamandır. Avamın ağzına qeyr mahnı da salmaq olur, amma məkün təkyə bərmali-dünya çağıran qardaş vəfat edib, öz ağlaşmasını çağırır və onun sağalmağına ümid yoxdur.

Belədə yaxşı olurdu ki, bizim şüəralar bir-birini həcv ya mədh etmək əvəzinə zikr olan məzmunda mahnılar düzəldeydilər ki, onlar ağızdan-ağıza düşüb xalqı nadanlıqdan danalığa təhrik etməyə bais oleydi.

[1] İkillik şərab və on dörd yaşında mə'şuqə və ya dünya malına bel bağlama.

## ƏF’ALİ-ƏHLİ-DEHAT

Morye adlı hükəma London şəhərinin hükəma məclisində əkinə zərər vuran cücülərin xüsusunda danışandan sonra zikr olan məclis qət edib ki, dövlətdən təvəqqə olunsun o cücülərin zindəganını öyrənib, onları necə tələf etməyi bilməkdən ötrü əlahiddə hükəmalar tə’yin eləsin.

Bu il payızda İsveçrə (Şvedsariya) cümhuriyyətinin Bern şəhərinə hükəmalar cəm olacaq ki, üzüm ağacının naxoşluğuna əlac tapsınlar.

Kartofel naxoşluğuna bais olan Kolorado adlı düz amqurdini tələf etməkdən ötrü hükəma məsləhət edir ki, tavus quşu saxlasınlar. 1–2 quş bir desyatin yerin (uzunu 80, eni 30 sajın) qurdunu yeyib tamam edir.

Qaramalda bir naxoşluq olur ki, onun qarnı şişib ölür. Rizet adlı hükəma bu naxoşluqdan ölən malın qarnını yarıb görüb ki, onun qarnında hava qismi qaz turşusu əmələ gəlib. Ona binaən belə naxoşlayan mala maqnezi və ya yanmış əhəng (üstə su tökəndən sonra) verib onu sağaldıb.

Aran yerinin yayı uzun olduğuna orada bitən ələfiyyat çox ömür edib böyük olur. Amma onun çiçəyi böyük olmur, lakin yaylaqlarda yay gödək olduğuna ələfiyyat özü kiçik, çiçəyi böyük olur. Çünki malın südünün və yağının dadı o yediyi ələfiyyatdan olur, ona binaən dağlarda saxlanan mal yediyi ələfiyyat özü kiçik, çiçəyi böyük olduğuna onların yağının ətri çox ə’la olur.

İndi yazırlar ki, İtaliya məmləkətində yağı ətirli etməkdən ötrü xoş ətri olan ələfiyyatı, məsələn, reyhanı qurudub onu bir torbaya töküb, ağzını bağlayıb, nəhrəyə salıb yağ çalxıyırlar. Belədə yağdan o ələfin dadı gəlir.

Yayda ağ paltarda sərin, qara paltarda isti olmağının səbəbi budur ki, ağ şeyin üstə günün şüası, yə’ni şəfəqi düşəndə onun çoxu qayıdıb havaya rədd olur, amma qara şeyin üstə düşəndə rədd olmur. Bu səbəbə isti tərəflərdə qara heyvan üçün zindəganlıq etmək çətindir. Məsələn, bizim ərəb qardaşlarımız bu səbəbə qara dəvə vecsiz olmağa binaən onu tələf elədiyinə, indi heç qara dəvə olmur. Habelə əkin yerinin rəngi gərək orada əkilən əkinə kar eləsin.

İndi yazırlar ki, Qalney adlı hükəma təcrübə ilə aşkar edib ki, rəngi qara yer isti olduğuna onun kartofeli çox böyük oldu.

Berlin şəhərində itlərdən mütəvəcceh olmaqdan ötrü bir icma bina olub. Yazırlar ki, ol icmanın bir muradı da budur ki, hər bir qism itləri ə’lalandırıb qeyrlərə satsın.

Şimali Amerikanın İngilis dövlətinə təəllüq olan Kanada vilayətində bir öküz ölüb, Londonda olan qəribə heyvanat saxlıyan mənzilə göndəriblər ki, onun 85 put ağırlığı olub.

Germaniyada əldə saxlanan heyvanatın yeminə mülahizə edən hükəmaların birisi at və qaramal yeminə baxıb yazır ki, onları çox qüvvətli yem ilə (arpa, noxud, peyğəmbər buğdası) həmişə saxlamaqdan zərər yoxdur. Habelə göy ot körpə, yə'ni nazik olan vaxtda onlar üçün yaxşıdır. Amma ot çox yetişəndə, məsələn, çox yetişmiş taxılın bəlimini atın mə'dəsi heç bişirmir. Lakin qaramal onu da bir az bişirir.

## MƏKTUBAT

M o s k v a d a n. Üç ildir "Əkinçi" qəzeti fəryad edir ki, ay qardaşlar, elm öyrənin, yoxsa zindəganlıq cəngində özünüz, millətiniz, məzhəbiniz bərbad olacaqdır. Amma indiyəcən heç bunun dalıycan olan yoxdur. Bavücudi ki, bu söz doğru olmağı gün kimi aşkardır. Məsələn, Avropa vilayətlərində hər il 1000-dən 20-30 adam vəfat edir. Amma İran əhli ki, hər il acından qaçıb bizim yerlərə fəhləliyə gəlir, yavan çörək yeyib gün altında işləyib, ayazda yatdığına payızda milçək qırılan kimi tələf olur və yəqin ki, hər il onların yarıbayarısı vəfat edir.

Bu günlərdə Moskvanın küçələrində bir iranlı gördüm, başaçıq özünə xaç çəkə-çəkə dilənçilik edən. Dedim bu nədir? Cavab verdi ki, Allah İrana qəzəb edib, çörək tapmaq olmur.

Pəs, qardaşlar, bunun səbəbi elmsizlik deyil ki, bizim gözəl vətənimizdə çörək tapmaq olmadığına xalq baş götürüb diyarbədiyar gəzib, külfətindən, millətindən, məzhəbindən əl çəkib, acından milçək təki tələf olur və ya Hindistanın altmış milyon müsəlmanı bir neçə yüz ingilis əlində giriftar olub, onlar üçün sağmal inək təki olmağı məgər elmsizlikdən deyil?

Ay qardaşlar, "Əkinçi" qəzetinin fəryadını eşidib elm təhsil etmək dalıncan olun, necə ki bir çırağın yağı qurtaranda onun işığı kəsiləndən irəli, ondan bir şəfəq çıxar və bu zaman onun üstə təzə yağ tökülməsə, bilmərrə sönüb tamam ölür, habelə "Əkinçi" qəzeti sizin üçün bu axırda çıxan şəfəqdir.

Haray, qardaşlar, yağ, yağ, yağ! Yoxsa "Əkinçi" sönüb bizi zülmətə qərq edər ki, bu zülmətdən bizim üçün xilas olmaq yoxdur.

*Harayçı qardaş*

## TƏZƏ XƏBƏRLƏR

Badkubəyə gələn tellər.

*Avqustun 12-də Qornıstuden. Cənab sərəsgərdən.* Dünən sübh tezdən düşmən Şipkanın üstünə 3 tərəfdən gəlib. Bizim əsgər qoçaqlıq edib, hər səfər onları geri oturdub. Bu minval ilə gecə saat 12-yəcən düşmən Şipkadan əl çəkməyib. Ol vaxtda ay tutulduğuna aralıq sakit olub. Əgərçi Süleyman paşanın əsgəri çox olub və bizə hər tərəfdən top atıblar, amma bizim əsgər öz yerlərini saxlayıb. İndi 4 gündür ki, düşmən bu tövr ilə gecə-gündüz Şipka üstə gəlir. Bu zaman bizim əsgər heç yuxlamıyıb və isti xörək yeməyib. Gərək biz göndərən kömək bu gecə Şipkaya yetişəydi.

Bu gün sübh saat 4-dən gecə düşmən Şipkanın üstə gedir. Dünən günortadan sonra düşmən təzədən Ayasların (Balkanda Ternovi yanında kənddir) üstə gəlib onu alıbdır. Bizim əsgər Sultangöy kəndinə (zikr olan kənddən bir az aralıdır) gedib.

Bu gün saat 2-dən sonra Şipkada əl davası olmur, ancaq top atılır. Düşmənin sol tərəfini qaçırtmışıq. Bizim dal tərəfdə atılan 2 top götürülüb.

Bu gün Plevna, Lovça tərəflərdən təzə xəbər yoxdur.

*Avqustun 13-də Qornıstuden.* Bu gün sübh saat 9-da Şipkada dava başlanıb. İndi 5 gündür ki, Süleyman paşa tamam əsgər ilə bizim üstümüzə bərk gəlir. Biz əlimizdə olan yerləri saxlamışıq. General Dirajniski ki, Şipkada əvvəl zaman 3 gün sərkərdəlik edirdi, bu gün zəxmdar olub ölüb.

*Avqustun 13-də Vyanadan.* Salabudziya qalasına (Tunanın Rumıniya tərəfindən Ruscəq qalasının müqabilindədir) ruslar 48 çox böyük top gətiriblər.

15 min Osmanlı əsgəri Ponkiyo (Balkanda Ternovi tərəfdə kənddir) üstə getmişdi, onları ruslar geri oturdub.

*Avqustun 14-də Nikolayevdən.* Bizim "Konstantin" paraxodu gedib Suxumda gecə vaxtı bir böyük Osmanlı gəmisini torped ilə dağıdıb.

*Qornıstuden.* Sübh saat 9-da düşmən Şipkanın üstə gəlib, axşam saat 12-yəcən bərk vuruşub. Bizdən 30 əfsər, 400 nizam tələf olub, amma yerlərimiz əlimizdə qalıb. Gecə Osmanlıya kömək gəldi, onlar gecə ikən bizim üstümüzə gəlib, bu halda vuruşullar. Hələliyə yerlərimiz əlimizdədir.

*London.* İngilis dövlətinin rus əsgərində olan vəkili Oayillisli gəlib vəziri-xaricə Derbiyə cavab verib ki, rus əsgəri Osmanlı tabelərinin haqqında zülm eləmək sözü doğru deyil və rus saldatını çox tə’rif edir.

*Avqustun 15-də Qornıstuden.* Dünən-bu gün düşmən Şipkaya az top atır. Düşmən Şipkanın ətrafında olan dağlarda oturub, əsgəri dəstəbədəstə bizə üstümüzə göndərir. Özləri üçün suyu eşşəklər ilə, xörəyi, patronu, topları öküz və bolğarlar ilə gətirdir.

Körik dərədən (Gömrü ilə Karsın arasındadır) Osmanlı əsgəri bizim üstümüzə gəlib, Qızıltəpə dağını aldı. 13 saat yarım bərk dava oldu. Əgərçi biz düşməni geri oturtduq, amma Qızıltəpə onların əlində qaldı. Bizim tərəfdən 8 əfsər, 269 nizam ölüb, 133 əfsər, 677 nizam yaralanıb.

*Avqustun 17-də Qornıstudent.* Cənab sərəsgər yazır ki, avqustun 16-can bizim Şipkada olan əsgərdən 98 əfsər, 2633 nizam yaralanıb (ölən mə’lum deyil).

Tuna tərəfindən bizim süvari əsgəri iki dəfə qoçaqlıq edib, düşmənə azuqə aparanların üstə tökülüb, bir dəfə 19 adam öldürüb, 7-sini dəstgir edib, bir dəfə 93 adam, 237 qaramal, 4009 qoyun alıb. Bizdən 3 adam zəxmdar olub.

Plevna və Lovça tərəflərdən xəbər yoxdur. İstanbuldan “Pres” qəzetinə yazırlar ki, Şipkada Osmanlıya çox zərər dəyib. Az olsa 10 min adam ölüb.

“Deyli nyu” qəzeti yazır ki, ruslar Şipkanı elə bərkidiblər ki, hərgah Süleyman paşa qeyr yol tapmayıb, istəyə ki, Şipkadan keçsin, onun tamam əsgərini öldürəcəklər.

Rumıniya əsgəri Tunanı keçib Plevna üstünə gedir.

Midhət paşaya kağız gedib ki, qayıdıb İstanbula gəlsin (Midhət paşa Vyana, Parij, London şəhərlərini gəzib əlahiddə danışıq edirdi). Knyaz Sirinlov Belqrad şəhərinə çox pul aparıb. Ümid var bu günlərdə serblər də Osmanlı ilə cəng başlasın.

*Avqustun 19-da Qornıstuden.* Ruscəq qalasından Osmanlı əsgəri bizim orada olan əsgərin qabaq dəstəsinin üstə getdiyinə biz qayıdıb Qaraxan göy, Xandır göy kəndlərinə getmişik. 12 min düşmənin müqabilində durub, 12 saat dava etmişik. Bizdən 400 adam zəxmdar olub.

Plevnadan çox Osmanlı əsgəri bizim üstümüzə gəlib, bərk dava olub.

Ploeştidən (Rumıniya şəhəridir), Qalas şəhərindən (Tunanın boğazı tərəfdədir) bərk top səsi gəlir.

Osmanlı əsgəri Yanku (Balkanda olan kənddir) yanlarına cəm olur.

*Avqustun 2-də Qornıstuden.* Dünən 8 batalyon Osmanlı qoşunu Ruscəq qalasında bizim qabaq dəstənin Kadikudan (Ruscəqdən 15 verst aralı kənddir) çıxartdı. Bizə kömək gələndən sonra onları oradan çıxartdıq.

Bu gün sübh Osmanlı süvarisi Plevnadan (Plevna ilə Ruscəq arasında bizim əsgərin hamısı cəm olub) çıxıb bizim qabaq dəstəni geri oturdandan sonra düşmənin piyada əsgəri və topları meydana girib bərk cəng başdadı. Bizim əlimizdə olan Stalivisi və Pleşak kəndləri əldən ələ düşəndən sonra bizim əsgər gücdənib, 25 min düşməni ol yerlərdən çıxartdı. Günortadan 4 saat keçmiş cəng qurtardı. Bizdən Ruscəq tərəfində 600 adam tələf olub.

*Avqustun 21-də Qornıstuden.* Ayın 19-da bizdən Kadikuda 7 əfsər, 30 nizam, Plevnada 30 əfsər, 1030 nizam tələf olub.

Balkanda bir dəstə başıporzuq və çərkəs gəzib Zelunə kəndini almışdılar, bizim əsgər gələndə qaçdılar.

*Avqustun 22-də Qarayaldan* (Gömrü ilə Kars arasında Körik dərədən 5 verst aralı kənddir) general Alxazov dünən sübh Suxum qalaya daxil olub görüb ki, Osmanlı əsgəri gecə ikən gəmilərə oturub gedib.

Terski oblastda yaği olan çərkəsləri təzədən basıb, onlara çox zərər vermişik.

*Avqustun 22-də Qornıstuden.* General knyaz İmeretinski yazır ki, dünən general Skoblev 12 saat cəng edib, Luçanı alıb. Zərərimiz hələliyə mə'lum deyil. General Rezqildiyev zəxmdar olub.

Luçanı alanda bizdən 1000-cən adam tələf olub, Osmanlıya çox zərər dəyib. 105 yaralı əsir etmişik.

*Qarayaldan.* General Devil öz diviziyası ilə (Gömrüdən) İrəvanda olan əsgərə köməyə getdi. Onun yerinə general Lazarov (bizim İvan Davidiç) qabaq dəstəyə sərkərdə tə'yin olub.

General Çernyayev qayıdıb Moskvaya getdi.

*Avqustun 24-də Qornıstuden.* Dünən Ruscəqdən 17 dəstə düşmən çıxıb Kadikuvu almışdı, amma bizə kömək gələndən sonra onları çıxartdıq. Bizdən 30 adam ölüb, 150 zəxmdar olub.

Avqustun 25-də Qornıstuden. Osmanlı Migrindən Luçanın üstünə gəlmişdi, onları geri qaytardıq. Dünən düşmən Ruscəqdən bizim üstümüzə hücum edib, ələlxüsus Kasliv və Oblanur kəndlərinin üstə getdi.

Bizim Kaslivdə olan əsgər 6 saat cəng edib, çox zərər ilə geri qayıdıb. Ustri kəndinə gəlib, Oblanur kəndi əldən ələ düşüb, axırda bizim əlimizdə qaldı.

Balkan tərəfdən xəbər yoxdur.

*Avqustun 27-də Çətinədən* (Qaradağ paytaxtıdır). Bu gün toplar atıb şadyanalıq edirlər ki, Qaradağ əsgəri Osmanlının Nikşiş qalasını alıb.

*Avqustun 27-də Qornıstuden.* Osmanlı əsgəri Kaslivi alandan sonra əgərçi bizim əsgər Oblavo kəndindən düşməni çıxartmışdı, amma özü oradan çıxıb geri qayıdıb.

Bizim Plevna müqabilində olan əsgər o qalanın ətrafında olan dağlarda topları qoyub ayın 26-da başlayıb oraya top atır. Dünən axşamacan top atmışıq. Bizə helə zərər olmayıb. Bu gün genə bərk top atırıq.

*Avqustun 28-də Qornıstuden.* Bizim Ruscəq müqabilində olan əsgərə hökm olub ki, bir az geri qayıtsın.

Plevna müqabilində olan əsgərin sol dəstəsi Plevnanın qiblə tərəfində olan dağı alıb. Bizdən 500 adam tələf olub. Zikr olan əsgərin sağ dəstəsi və ortası Plevnaya 700 sajın qalmış yerdə olan Ovis kəndini alıb.

Serbistan bu günlərdə Osmanlı ilə cəng başlıyacaq.

* * *

İngilis hükəmaları Rusiya tabelərinin hesabına gedib yazırlar ki, Rusiyada hər 100 adamdan 50-si, yə'ni onların yarısı slavyan millətindən deyil, qeyr millətlərdəndir və hər 100 adamdan 16-sı, yə'ni altıdan biri xristian deyil.

"Qolos" qəzeti yazır ki, Peterburqda təzə qəlp 10 manatlıq kağızı çıxıb və onu elə yaxşı qayırıblar ki, məxsusi banglarda pul sanıyanlar onlara əsil 10 manatlıqdan təfavüt verə bilmir.

Kutais quberniyasından və Telav şəhərindən "Tiflisski vestnik"ə yazırlar ki, oranın qaramalına bərk naxoşluq (taun) düşüb.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*3-cü sənə* *19-cu nömrə*

*Fi 17 rəməzanülmübarək, sənə 1294*

* * *

*Poşt xərci basdıran elədir*

* * *

*Pəncşənbə günü*




*Fi 15 sentyabr Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*1 sənəliyi – 3 manat*
*6 aylığı -*
*1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## DAXİLİYYƏ

Bu halda biz Qafqaz vilayətinin qaramalına düşən taun naxoşluğundan bir neçə dəfə danışmışıq. Bu naxoşluq Sibir vilayətində əmələ gəldiyinə, ona Sibir yarası da deyirlər. Onun bizim qaramala düşməyinə səbəb bu halda olan cəngdir ki, Qafqazda cəm olan əsgər üçün qaramal gətirəndə onlar ilə naxoş mal gətiriblər.

İnsan taununun əlacı olmayan kimi, bu naxoşluğun da əlacı yoxdur və bu naxoşluq qeyr yerlərə düşməməkdən ötrü də gərək karantin bina olunsun. Amma qaramal ilə insanın təfavütü olan kimi, bu karantinlərin həm təfavütü var. İnsan taunu bir yerə düşəndə tamam dünyanı xəbərdar edib, hamı onu qurtarmağa sə'y edirlər. Amma qaramal taunu illər ilə vilayətlərdən çıxmır. Bu barədə bizim dövlət tərəfindən tə'yin olan Kaxanovski adlı həkim yazır ki, Rusiyada hər il yüz minəcən heyvan bu naxoşluqdan tələf olur ki, onların qiyməti 2 milyon manatdan ziyadədir. Zikr olan həkim deyir ki, bu naxoşluqdan xilas olmaqdan ötrü gərək naxoş olan heyvanı öldürüb, onu basdırmaq və əgər məqdur olsa onu yandırmaq ki, onun əti, gönü (dərisi), buynuzları tamam tələf olsun. Yoxsa onlar ilə naxoşluq qeyr yerlərə də düşər. Bu tövr ilə naxoşluqdan xilas olmaq mümkün olmağı zikr olan həkim belə bəyan edir: 1865-66-67-ci sənələrdə bu naxoşluq İngilis vilayətinə düşüb, bir neçə ayda 35 milyon manatlıq zərər eləmişdi. 1865-ci sənənin noyabr ayında 5300, dekabrda 10000, yanvarda (1865 sənə) 13000, fevralda 18000 heyvan tələf olan zaman

millət məclisi hökm edib ki, belə naxoş olan heyvanı yandırıb və ya basdırıb tələf eləsinlər. Bu hökmə əməl olandan sonra martda 8000, apreldə 4500, mayda 1700, iyunda 300 heyvan tələf olub. 1867-ci sənənin ibtidasınacan naxoşluq bilmərrə qurtarıb.

Pəs qaramal taunun karantini budur ki, hər kəs öz naxoş olan heyvanını sağaltmağa ümid olmayıb, onu dərhal qeyr heyvanlardan aralayıb saxlasın və əgər ölsə, onun gönünə tamah eləməyib, onun cəmdəyini yandırsın.

Taundan naxoş olan qaramalı belə tanımaq olur; onun gözləri qızarır və onlardan qəliz yaş axır, dili ağ və quru olur, nəfəsini gec-gec və çətinliklə çəkir, xörəyi mə'dədən ağzına gətirib onu dübarə çeynəmir, ayaqları əsir, qulağı sallanır, tükləri pırtdaşır, qarnı şişir.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

Tamojna xərcindən dövlət və zavod karxana sahibləri mənfəətbərdar olur. Dövlətin nəf'i mə'lum zavod və karxana sahiblərinə belə nəf' olur. Qeyr vilayətlərdə qayrılan şeylərdən bu xərc alındığına o şeylər bahalanır. Bu səbəbə zavod karxanada qayrılan şeylər artıq qiymətə satılır. Amma xalq üçün, ələlxüsus əkin, ziraət edən üçün bu xərc çox zərərdir.

Şimali Amerika cümhuriyyəsində çap olunan əkin, ziraət qəzetlərinin birisi bu zərəri aşkar etməkdən ötrü yazır: əkinçi minən atının nal mıxından manata 67, onu nallayanın çəkicindən 54, at sürməyə ağacı kəsən bıçaqdan manata 60 qəpik tamojna xərci alınıb. Onun kotanından manata 50, kotana lazım olan zəncirdən 67 qəpik alınıb. Əkinçi geydiyi katandan manata 58, mahutdan 50, başmaqdan 35, şlyapadan 80, onun mahut yorğanından manata 250 qəpik alınıb, ayağının altına saldığı xalçadan manata 150, boşqabından 40, çəngəl-bıçağından 35, o içdiyi çaydan manata 47, qəhvədən 47, yediyi qənddən 70, duzdan 100, istiotdan 270, çəkdiyi tənbəkidən manata 100 qəpik tamojna xərci alınıb. Belədə hər bir şey birəbir bahalandığına əkinçilik edən yoxsul olub. Ona binaən bu halda hər il 120 milyon buşil taxıl əmələ gəlir. Bavücudi ki, 8 il bundan əqdəm 160 milyon olurdu.

* * *

Heyvanat və ələfiyyatın bədəni çürüyəndə gələn yaman iyə səbəb onlardan rədd olan qazdır ki, ona amonyak (nişatır ruhu) deyirlər. Bu qaz havada və suda çox olduğuna insana artıq zərər edir. Təcrübə olunub ki,

şəhərin havasında və quyularının suyunda bu qaz çox olur. Habelə qəbristanlıqdan gələn suda, hacətxanaların və qeyr mütəəffinatın yavıqlığında olan quyuların suyunda nişatır ruhu çox olur və onun buralarda çox olmağı suyun iyindən mə'lum edir. İndi imtahan ilə aşkar olub ki, belə suyu gün altında çox saxladıqca onun qazı rədd olub, suyu təmiz edir.

* * *

Mə'lumdur ki, insanın bədəni o yediyi xörəkdən əmələ gəlir. Bu səbəbə onun bədəninin qüvvətli olmağı xörək ilədir və genə mə'lumdur ki, ət xörəklərin hamısından qüvvətlidir. Məsələn, ingilis fəhləsi ki, həmişə ət yeyir, Hindistanın həmişə düyü və ya çörək yeyən fəhləsindən birə beş artıq iş görür. Bu səbəbə Avropa tayfaları sə'y edir ki, ət artıq yeyilsin və bundan ötrü xalq çox olan yerlərdə təzə ət baha satıldığına xalq az olan yerlərdə əti ucuz alıb, onu ya qurudub qaxac edib, ya duzlayıb və ya ona bir neçə əcza vurmaqlıqla təzə saxlayıb, xalq çox olan yerlərə gətirib ucuz satırlar ki, tavanası olmayanlar da ət alıb yeyə bilsinlər.

Bizlərdə belə ət saxlamaq adət deyil. Amma bizim kəndlərdə sakin olanların çoxu həftələr ilə ət görmür. Əti bir neçə tövr şora qoyurlar, əzon cümlə Vestfaliya vilatində bir parça əti (5–8 girvənkə) sərin yerdə təmiz, ağ duz ilə və bir az gəhərclə (azotit putas) ki, ondan barıt qayırırlar sürtüb, on gün saxlayıb və bu zaman hərdəm bir onu çökürüb təzədən duzlayıb, onun altına bir deşikli qab qoyurlar ki, ondan rədd olan su axsın. Sonra əti torbalara qoyub buxarının və peçin içində asıllar ki, od yanan yerdən çox hündürdə olsun. Orada əti 4–6 həftə saxlayıb, sonra torbalardan çıxarıb sərin yerdə bir neçə gün asıb, boçkalara yığıb saxlayırlar.

Amerikada əti belə şora qoyurlar: 4 girvənkə təmiz duz, girvənkə yarım qənd, 12 misqal kəhərclə bir yerə qarışdırıb, 17 kasa su ilə qaynadıb köpüyünü alıb, sonra onu soyudub, əti duzlayandan sonra bu suyu onun üstə töküllər ki, belə ət xarab olmur. Frenkuniyada suda duzu əridib (nə qədər ərisə) ondan əriyən duzun ondan bir hissəsi qədər də kəhərclə töküb bu suyun içində əti mürur ilə bişirib (su quruyuncan) sonra əti tüstü içində 24 saat asıb, çıxardıb saxlıyırlar. Əti tüstüyə verməkdən ötrü buxarıda odun yandırmaq vacib deyil. Hər bir şey yandırmaq olur. Məsələn, kəpək yandırmaq çox yaxşıdır ki, onun alovu olmur, amma tüstüsü çox olur.

## TƏZƏ XƏBƏR

Zərdabdan yazırlar ki, avqustun 12-də oraya bərk dolu yağıb. Əvvəl dolu sərçə yumurtası kimi, sonra üçqəpiklik qara pul kimi yastı, qıraqları nazik, ortası qalın, axırda toyuq yumurtası kimi olub. Bu dolu əkinə çox zərər edib, kiçik heyvanatı, hətta dovşanı da tələf edib.

* * *

Yazırlar ki, bu ilin ibtidasından yarısınacan, yə'ni altı ayın müddətində Avropa dövlətləri əsgərə, dəmiryollarına, padşahlıq zavodlarına xərc olmaqdan ötrü 1442 milyon frank (30 qəpik) kağız pulu bang bileti, obliqatsiya və qeyr kağız kəsdiriblər. Əzon cümlə Germaniya 105, İngilis 131, Firəngistan 237, Rusiya 715 (bunlardan 675 dava üçün), İspaniya 19, Hollandiya 25.

Bizim Tunədə olan əsgər düşmən yerində olduğuna məhz qızıl və gümüş pulu xərc edir. Yazırlar ki, avqustun 5-də oraya 7 atəş ərradəsi qızıl və gümüş pul göndəriblər.

* * *

Parij şəhərində dünyada olan məxluqatın barəsində yazılan kitabdan mə'lum olur: tamam dünyada 1429 milyon adam var, o cümlədən Avropa qit'əsində 310, Asiyada 126, Afrikada 201, Amerikada 87, Avstraliyada 5 milyon.

Onların ticarəti barəsində yazılır:

| Bir ildə | Mal gətirir | Aparır |
|---|---|---|
| Avropa | 27177 | 22225 |
| Amerika | 4878 | 5302 |
| Asiya | 2376 | 2910 |
| Avstraliya | 1108 | 977 |
| Afrika | 812 | 718 |
| İngilis dövləti | 9348 | 7040 |
| Firəngistan | 4111 | 4280 |
| Amerika cümhuriyyəsi | 2769 | 3215 |
| Rusiya | 1828 | 1714 |

Hamı məmləkətlərin məsarifi 20895, mədaxili 20694 milyon frank (frank 30 qəpik). Onların borcu 127346 milyon frank. Firəngistanın

məsarifi və mədaxili hamıdan artıqdır: məsarifi 2583, mədaxili 2573 milyon. Rusiyanın məsarifi 2130, mədaxili 2280 milyon frank. Hamıdan çox xərc mədaxildən artıq gəlir Avstriyadakı onun xərci 1596, mədaxili 1494 milyondur, Osmanlıda xərc 650, mədaxil 536 milyondur. Onların borcu: Firəngistanın 23403, İngilisin 18126, İspaniyanın 10508, Amerika cümhuriyyəsinin 1001, Avstriyanın 9576, Rusiyanın 8100, Osmanlının, Misir və qeyr vilayətlər ilə 5000 milyon frank. Hamıdan çox əsgərə xərc olunur Rusiyada, ondan az Firəngistanda, Germaniyada, İtaliyada.

* * *

Badkubəyə gələn tellər.

*Avqustun 27-də Bukareştdən.* Rumıniya əsgərinə Şipkada olan davada çox zərər dəyib. Rus əsgəri Plevna qalasını dəmir halqa kimi əhatə edib və bu halqa mürur ilə kiçildiyinə Plevnaya günü-gündən artıq güc edir.

*Avqustun 29-da Pradin* (Plevna qalasının yanında kənddir ki, oraya sərəsgər gedib). Biz dünən Plevna qalasının 600-700 sajın yavıqlığına gedib, oraya toplar atanda düşmən hücum edib, bizim sol dəstənin üstə gəldi. Amma biz onlara çox zərər verib geri oturtduq.

Bu gün axşamacan Plevnaya top atmışıq. Axşam çağı bizim sol dəstə general Skoblevin sərkərdəliyilə Plevnanın yanında bir dağ alıb ki, oradan qalanı və düşmən əsgəri dayanan yeri topa tutur.

Bizim Plevnanın dalında olan süvarinin üstə çərkəs atlıları gəlmiş imiş, onları qovmuşuq.

Luça qalasını (Plevnadan Balkan tərəfə 30 verstlik yoldadır) alanda 2 baydaq və çox tüfəng almışıq. Düşmən qalada 2200 meyit qoyub qaçmışdı, onları basdırdıq. Bu Luça davasında bizdən 1000-dən artıq adam ölməyib.

*Avqustun 31-də Pradin.* Dünən Plevnaya top-tüfəng atdırıb, axırda onun üstünə yeriş elədik. General Skoblev qalanın yanında olan təpələrdən üçünü alıb. General Rodionov – ki, özü də zəxmdar olub, – Qroyevis dağını alıb. Bu davada iki generalımız zəxmdar olub.

Bu gün cəng başlanıb. Dünən aldığımız yerlər bizim əlimizdədir. Bu günəcən bizdən beş mindən artıq adam yaralanıb. Ölənlərin hesabı hələliyə mə'lum olmayıb.

*Sentyabrın 1-dən Pradin.* Dünən Plevnaya yavıqlaşıb oraya və düşmən dayanan yerlərə top atırdıq, qalada yanğı başlanıb. Düşmən dayanan

yerdə 2 dəfə barıta od düşüb. Düşmən general Skoblev alan təpələrin üstə beş kərə hücum edib, biz onu geri qaytarmışıq, amma axırda, altıncı dəfə gəlib o təpələri alıb, bizi geri oturdub. Gecə Plevnanın ətrafında xəndəklər qazıb, onların içində gecəni keçirmişik. Bu gün günorta vaxtınacan bizdən altı min adam yaralanıb.

*Sentyabrın 3-də.* Pradin. Dünən düşmən Kroyevis dağını almağa gəlmişdi, amma biz 3 saat yarım dava edib onları geri qaytardıq. Bu gün düşmən dayanan yerlərə top atırıq. Plevna qalasına od düşüb yanır.

Sentyabrın 3-nəcən bizdən üç yüz əfsər, on iki min beş yüz nizam və Rumıniya əsgərindən altmış əfsər, üç min nizam tələf olub.

*Sentyabrın 4-də.* Osmanlı Şipka yolunun üstə olan Nikolay dağının üstə 3 top qoyub, hər birinin atını 2 put barıt və gecə sabahacan o dağa top atıb. Bizdən 27 ölüb. Sentyabrın 2-də bizdən 129 ölüb. Plevnada top atırıq, amma düşmən bizə cavab vermir.

*Sentyabrın 5-də.* Qornıstuden. Osmanlı 5 gün Şipkaya top atdırandan sonra bu gün sübh saat üçdə Nikolay dağının (Şipka yolunun bərk yeridir ki, bizim rus əsgərinin əlindədir) və tamam Şipka yolunun üstə yeriş elədi. 9 saat dava edib onlara çox zərər vurub, geri oturtduq. Düşmənin əsgəri nizam və Ərəbistan əsgəridi. Bizdən 18 əfsər, 100 nizam yaralanıb, 400 ölüb.

*Sentyabrın 6-da Kroyevisdən* (Plevna yanında kənddir). Bu gün 7 batalyon Rumıniya və 2 batalyon rus əsgəri Kroyevis təpəsinin yanında olan təpələri alıb, bu təpələrdən bizim toplar düşmən oturan yerləri tutur.

Vyanadan yazırlar ki, Serbistan əsgəri əldən qoyub baharacan Osmanlı ilə cəng başlamıyacaq.

Süleyman paşa Balkan dağını keçib otuz min əsgər ilə Plevnaya, Osman paşaya köməyə gedir.

İstanbuldan yazırlar ki, Oxraniya şəhərinə (Plevna qalasının dalında, ondan 50-60 verst aralıdır) 30 batalyon əsgər gedib ki, Osman paşaya kömək eləsin.

*Sentyabrın 9-da.* "Tayms" qəzetinə Qornıstudendən yazırlar ki, ruslar Plevna qalasını əhatə edib onun ətrafında 320 top qoyub oraya atırlar, amma Osmanlı onlara cavab vermir. Ona binaən belə deyirlər ki, Osmanlının barıt gülləsi qurtarıb.

Ruslar Adişyu təpəsini də bərkidirlər.

*Vyanadan.* Bela şəhərinin (Ruscəqdən 50-60 verst arası var ki, orada əvvəl zaman bizim sərəsgər olurdu) yanında bərk cəng başlayıb,

ruslar oraya kömək göndərir (bu davada bizim əsgərin sərkərdəsi həzrət vəliəhddir, Osmanlı əsgərinin sərkərdəsi cənab Məhəmməd əli paşadır). “Pres” qəzeti yazır ki, ruslar Plevnanı elə əhatə edib ki, oraya barıt, güllə və azuqə gətirmək olmur.

*Sentyabrın 10-da.* Qornıstuden. Osmanlı əsgəri təzədən Şipkada olan Nikolay dağının üstünə gəlib. Osmanlı Sirkovniyanın (Bila tərəfdə) üstə gəlmişdi, onları geri qaytardıq. Ümid var ki, bu gün genə gəlsinlər.

“Novoye vremya” qəzetinə Bukareştdən yazırlar ki, rus əsgəri Plevna qalasını əhatə edib.

Qafqazdan gələn əsgərlər Plevnanın dalında olan Sofi yolunu zəbt edib. Süleyman paşanın yolu kəsildiyinə Osman paşaya köməyə gələ bilməyəcək.

* * *

Dövlət tərəfindən müəyyən olan həkimlər Badkubədə karantin bina edib, İranda olan taunu gözləyirlər. Amma bu iki ayın müddətində nə ki, Badkubədə, hətta İranda heç kəs taundan ölməyib.

* * *

Çünki cəng olan zaman teleqraf çox iş görür və düşmən bir yerə daxil olanda öz düşməninin tellərini qırıb özü üçün teleqraf bina edir, ona binaən Germaniyada təzə teleqraf bina edirlər ki, onun məftili yer altında olacaq.

Bu halda Rusiyada naxoş və zəxmdar olan əsgərə kömək etməkdən ötrü bina olan icma Rusiyanın hər tərəfində onlar üçün mənzillər bina edir. Yazırlar ki, keçən avqust ayının 15-cən zikr olan icma 16000 adam üçün mənzil qayırıb ki, orada dərman-davadan tutmuş hər bir mayəhtac hazırdır.

“Türküstan” qəzetinə Daşkənd şəhərindən yazırlar ki, avqust ayının 30-da orada təzə şəhər qərardadı qoyublar.

* * *

“Qolos” qəzeti yazır ki, Permski, Vyatski quberniyalarda bir neçə ildir ki, qaramal taunu var. İndi zikr olan şəhərlərin camaat divanxanası xalqı bu naxoşluqdan xilas etməkdən ötrü dövlətdən təvəqqə edir ki, böyük yolların üstə əlahiddə mənzillər bina olunsun ki, qeyr yerlərdən gətirilən malları bu mənzildə bir neçə gün saxlayıb onlardan naxoş

olanını tələf edib qeyrlərini xalqa satsınlar, ya bir zaminlik icması bina olsun ki, hər kəs öz malını qiymət edib, ol icmaya ildə bir az məbləğ versin, bəşərti ki, mal ölsə icma onun qiymətini mal sahibinə versin və yainki bu icmanın əvəzində hər kəs öz naxoş malını öldürüb tələf eləsə, dövlət ona hər mala 10 manat versin.

* * *

Mə'lumdur ki, cəng olanda yetim artır və bu səbəbə fəqir-füqəra çoxlanır və genə mə'lumdur ki, bizim Rusiyada yetimlər üçün bina olan mənzillərə və məktəbxanalara uşaqları səkkiz yaşından sonra götürürlər. Ona binaən indi Peterburqda səkkiz illik və'dəsinə bir yetim mənzili bina etmək istəyirlər ki, bir yaşından səkkiz yaşına [qədər] uşağı götürüb ona tə'lim eləsinlər.

* * *

Vıborq şəhərindən yazırlar ki, oranın bağında bir alma ağacı var imiş ki, bu il 4400 meyvə gətirib.

Ozurget şəhərindən "Tiflisski vestnik" qəzetinə yazırlar ki, oranın qaramalında naxoşluq olduğuna inək, öküzün birini 3-4 manata satırlar.

* * *

Zakona müvafiq böyük şəhərlərdə hər ev sahibi gərək bir və ya bir neçə gəda saxlasın ki, evin həyətini və küçəni süpürüb təmiz saxlamaqdan masəva gecələr də qarovul çəksin. İndi bu qayda bizim Badkubədə bina olur.

---

Qubernski pravleniyanın mətbəəsində təb' olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

*3-cü sənə* *20-ci nömrə*

*Fi 3 şəvvalülmükərrəm, sənə 1294*

* * *

*Poşt xərci basdıran ilədir*

* * *

*Pəncşənbə günü*




*Fi 29 sentyabr Rusiya, sənə 1877*

* * *

*Qəzetin qiyməti*

*1 sənəliyi – 3 manat*
*6 aylığı -*
*1 manat 50 qəpik*

* * *

*2 həftəlik qəzet*

*E'lamnamə və məktub göndərən qəzeti çap elədənin adına göndərsin. Bu qəzeti çap elədir Badkubə gimnaziyasının müəllimi Həsən Məlikzadə Zərdabi.*

## E'L A N

Biz naxoş olduğumuza görə bu ilin axırıncı nömrələri öz vaxtında çıxmayacaq və onların haçaq çıxmağı mə'lum deyil.

## ƏF'ALİ-ƏHLİ-DEHAT

İngilis vilayətində qoyun çox olduğuna oranın qoyuna gedən itləri çox ə'latər olur və bu itlərin yaxşısı çobansız, özü sürünü aparıb, otarıb, axşam qaytarıb geri gətirir. Yazırlar ki, itləri belə eləməkdən ötrü onlar anadan olandan sonra gözləri açılmamış anasından ayırıb qoyun altına qoyurlar, belədə qoyun itə və it qoyuna rağib olub, bir-birlərinə öyrənsinlər. Sonra itlər böyüklənəndə onlara hər gün axşam vaxtı qoyun içində xörək verirlər ki, belədə it sürünü aparıb otarıb axşam xörək yemək vaxtı olanda qaytarıb yatağa gətirir.

* * *

Yazırlar ki, Moskva quberniyasında olan Qraçyev adlı mülkədar qovunların çiçəklərini bir-birinə ə'zayi-tənasüli-zükuri, ə'zayi-tənasüli-ünasə qarıştırmaqlıq ilə bir qovun yetirib ki, onun uzunu 20 kərəh, eni 17 kərəh və özü çox abdar və şirindir.

* * *

Mə’lumdur ki, hər bir vilayətin heyvanı başqa olur və bizim eşşək isti tərəflərdə sakin olan heyvanlardandır ki, Avropa vilayətlərinin şimal tərəflərində eşşək olmaz.

Yazırlar ki, bir iranlı bir eşşək aparıb, Moskvada ona bir mənzil bina edib, onu xalqa göstərib pul yığır.

* * *

At qocalanda onun rəngi ağarmağı mə’lumdur, amma bə’zi vaxtda at 2–3 yaşında olanda da onun tükü ağarır. Bu səbəbə hükəma deyir ki, atın tükü ağarmaq soyuqdan əmələ gələn bir naxoşluqdur və belə tükü ağarmaq dəlalət edir onun bədəninin zəif olmağına. İndi bir ingilis hükəması bir atın tükü ağarmağın mülahizə edib yazır ki, həqiqət, əvvəl zaman atın bədəni zəiflədi, amma bir azdan sonra bu at genə qüvvətləndi.

* * *

İmtahan ilə aşkar olub ki, süddən qaymaq yığmaq istəyəndə süd sərilən yer nə qədər soyuq olsa, o qədər qaymaq təmiz yığılır və belə soyuqda yığılan qaymaqdan yağ çox çıxır. Yağ özü dadlı olur və tez xarab olmur və belə qaymağın sərilmiş südü sərin olur. Südü soyuqda sərməkdən ötrü məsləhət edirlər ki, onu sağan kimi süzüb qablara töküb, bu qabları buzlu su və ya əriyən qar içinə (ki, 2 dərəcə istisi olur) qoyub 5–10 saat saxlayıb, onun qaymağını yığıb, bu qaymaqdan yağ çalxıyasan.

* * *

Baharda əkilən taxıl bitkisi barəsində yazırlar ki, bu taxıl nə qədər gec əkilsə, ol qədr onun hasili az, bəlimi çox olur və bu gec əkilən taxıl özü yaxşı olmur.

* * *

Toxumun yaxşı və yamanlığını, onun dərin və ya dayaz şuxm olunmağını imtahan edib, arpa və buğda barəsində yazırlar ki, yaxşı toxumdan hasil artıq olur, amma hasilin yaxşı-yamanlığı toxumun yaxşı-yamanlığı ilə deyil. Toxum nə qədər dayaz şuxm olsa, ol qədər hasil artıq olur. Amma onun dayaz və ya dərin şuxm olunmağından hasil yaxşı ya yaman olmaz.

Barama qurdunu bəstiyib onun baramasından ipək çəkmək bir çətin elmdir və bu halda ki, qurdlarda naxoşluq var, toxum üçün baramanı intixab etmək bu elmi dəxi çətin edib. Çünki bu qism elmlərin hamısı imtahan ilə təhsil olur, ona binaən Avropa vilayətlərinin ipək əmələ gələn yerlərində əlahiddə mənzillər bina edib, oraya gəlib genə qurdları bəstəməyi, ipək çəkməyi, baramanı intixab eləməyi müftə göstərirlər. Bu mənzilin birisi Moskva şəhərində var.

Yazırlar ki, bu il qurdlar bəstənən, ipəkçəkən, barama intixab olan vaxtda bu mənzilə hər gündə yüzdən ziyadə adam gəlib ki, bunlara hər bir qurdlara lazım olan mayəhtacı həm göstəriblər.

* * *

İnsanın dərisində ufaq deşiklər var ki, onlardan tər rədd olur. Tər rədd olmaq bədən üçün lazım olmağını bundan qiyas etmək olur ki, insanın bədənini ərinmiş mum ilə tutanda insan vəfat edir. Bədəndən tər ilə qeyr şeylər də rədd olur və bu şeylər dərinin deşiklərini tutduğuna 1–2 həftədə bir hamama gedib, bədəni isti su və sabun ilə yumaq lazımdır ki, o deşiklər təmiz olsun. Kəndlərdə sakin olanlar illər ilə hamama getməyinə səbəb budur ki, onların hamamı yoxdur və onu kənd yerində tə'mir etmək çətindir.

İndi yazırlar ki, Amerikada bir şəxs ərradəyə oxşayan bir hamam tə'mir edib ki, onu at, mala qoşub kəndlərə də aparmaq olur.

## ELM XƏBƏRLƏRİ

İnsan saxlayan heyvanat və ələfiyyat nə qədər ə'latər olduqca onun nəf'i də artıcaq olur. Heyvanatı ə'lalandırmaq intixab ilədir. Südü, ya əti, ya gücü və ya onun bədəninin bir hissəsi çox ya az olan heyvanın balasının da bu xasiyyəti olur. Bu səbəbə mal saxlayan bu xasiyyətlərin birisi və ya bir neçəsi olanları intixab edib saxlayanda bir neçə arxadan sonra heyvanın bu xasiyyətini ə'lalandırır. Həmçinin ələfiyyatı da ə'lalandırmaq olur və onu ə'lalandırmaqdan ötrü onun ata və anasını intixab etmək lazımdır.

Mə'lumdur ki, hər ələfiyyatın çiçəyi olur ki, bu çiçəkdən toxum və toxumdan ələfiyyat əməl gəlir. Hər çiçək bir neçə hissədən əmələ gəlir, bu hissələrin bə'zi ki, onlardan toxum əmələ gəlmir, lazımsız

hissədir və qeyriləri ki, onlardan toxum əmələ gəlir, lazımlı hissədir. Çiçəyin lazım olmayan hissələri o hissələrdir ki, onlar olmağına görə avam ona çiçək deyir. Onun göy və ya rəngbərəng olan yarpaqları ki, biz iyləyirik lazım olmayan hissələridir. Onun lazım olan hissələri kiçik rəng və iysiz olduğuna avam onu çiçək hesab eləmir, bavücudi ki, toxum bu hissələrdən əmələ gəlir.

Çiçəyin rəngbərəng olan yarpaqlarının dibindən şirin su çıxır ki, cücülər (arı) bu suyu aparmağa (bal qayırmaqdan ötrü) gələndə onun lazımlı hissəsi cücünün qanadına yapışıb, gedib qeyr çiçəyin üstə düşür və bu səbəbə ələfiyyat gələcəkdə dəxi ləvinbələvin olur. Çiçəyin lazımlı hissəsi ki, onun içində olur, iki qismdir: birisi bir neçə sap kimi nazik şeydir ki, onların başında yumruca şey olur. Bu yumrucanın içində sarı toz əmələ gəlir. Bu hissə ə'zayi-tənasüli-zükurdur. Və birisi çiçəyin ortasında bircə sapdır ki, onun başı yastı və dibi yumrudur və bu yumrunun içində kiçik girdə şeylər var. Bu hissə ə'zayi-tənasüli-ünasdır.

Toxum əmələ gəlməkdən ötrü gərək ə'zayi-tənasüli-zükurun sarı tozu ə'zayi-tənasüli-ünasın başında olan yastının üstə düşüb onun sapının içinə gedib, onun yumru hissəsinin içində olan kiçik girdə şeylərə qarışsın ki, onlar bir-birinə qarışandan sonra o kiçik yumru şeydən toxum əmələ gəlir.

Zikr olan ə'zayi-tənasüli-zükur və ünas ikisi də hər bir çiçəkdə olmur. Məsələn, peyğəmbər buğdasının (qarğıdalı) iki qism çiçəyi olur ki, onun birisinə ə'zayi-tənasüli-zükur və birisində ə'zayi-tənasüli-ünas olur və bu çiçəklərin ikisi də bir otun üstə olur. Amma söyüd ağacının da iki qism çiçəyi olur, lakin onların hər biri qeyr ağac üstə olur.

İndi toxum necə əmələ gəlməyini biləndən sonra ələfiyyatı intixab ilə ə'lalandırmaqdan danışaq.

Necə ki, at ilə inəkdən bala törəməz, amma at ilə eşşəkdən bala törəyər, habelə bir-birinə oxşamayan ələfiyyatın zikr olan ə'zalarını qarıştırmaqdan toxum əmələ gəlməz. Gərək at eşşəyə oxşayan kimi ələfiyyat da bir-birinə oxşasın. Məsələn, cürbəcürə üzüm ağaclarını, ya qovun-qarpızları, ya tənbəkiləri bir-birilə qarıştırmaq olur, yə'ni ağ qarpız ilə ala qarpızı, ya Şiraz tənbəkisi ilə tütün tənbəkisini qarıştırmaq olur və bundan ötrü gərək ə'zayi-tənasüli-zükuru dərib, onun sarı tozunu ə'zayi-tənsüli-ünasın üstə salmaq. Belə qarıştırmaqdan əmələ

gələn toxumdan çıxan otun meyvəsi çox olur. Onun kökü, budaqları, yarpaqları böyük və ağır olur və hisslər hər iki otun (ana və ata) hisslərinə oxşuyur. Onların çiçəklərinin rəngi hər iki otun çiçəklərinin rənginə oxşuyur. Məsələn, onlar ağ və qırmızı olanda, ya ala və ya ağ üstə qırmızı səpmə olur. Çünki bir bağda, bostanda, hətta bir kənddə bir neçə qism bir-birinə oxşayan ələfiyyat əkiləndə onları ə'zayi-tənasüli-zükurun tozunu cücü və ya külək aparıb qeyrilərinin ə'zayi-tənasüli-ünasına qarışdırır, ona binaən ə'lalanmış madyanları yaman ayqırdan saxlayan kimi, bir ə'lalanmış otu qeyr otlara qarışdırmaqdan saxlamaq gərək və bundan ötrü onu uzaqda əkmək və ya çiçəyi açılanda onun üstünü örtmək gərək.

## TƏZƏ XƏBƏRLƏR

Badkubəyə gələr tellər.

*Sentyabrın 14-də. Qornıstuden.* Cənab sərəsgər yazır ki, sentyabrın 10-da Plevnanın dalında Sofiya yolu ilə 10 min Osmanlı əsgəri top və qeyr alatlar ilə bizim süvari əsgərini yarıb, Plevna qalasına daxil olub.

Ruscəq və Balkan tərəflərindən xəbər yoxdur.

Bizim təzə yığılan əsgər gəlib yetişir.

İcarədar Polyakov bizim qoşunun dalında təzə yollar tə'mir edir.

*Bakareştdən.* Yağış çox yağdığına əsgər irəli getməyi ləngə düşür.

Belə danışırlar ki, Yantardan (Bela qalasının yanında axan çaydır) düşmən geri qayıtmaq istəyir.

İngilislər 160 adam üçün mərizxana açdırıblar. Bu gün o mərizxana üçün 400 qutu mayəhtac gəlibdir.

*Sentyabrın 16-da.* Vyana. Veddin qalasından Plevnaya köməyə gedən Osmanlı əsgəri Rumıniya əsgərilə 4 saat cəng edib. Kim kimə faiq gəlməyi mə'lum deyil.

*Sentyabrın 17-də.* İqdirdən (İrəvan quberniyasındadır). Dünən düşmən bizim üstümüzə yeriş elədi. Axşamacan bərk dava oldu, biz onları geri oturtduq. Bizdən 180 adam tələf olub.

*Sentyabrın 18-də.* Vyanadan. İtaliya dövləti məşq eləməkdən ötrü 50 min əsgər cəm edib. İndi onları əldən qoymur.

Serbistan genə əsgər yığmaq istəyir. Venqriya vilayətinin Transilvaniya adlı yerində dövlətdən izinsiz bir icma bina olunmuş imiş ki,

Osmanlı süvarilərilə birləşib, Rumıniyanın rus əsgəri gələn yollarını dağıdıb xarab etsin. İndi dövlət xəbərdar olub.

*Sentyabrın 19-da Qornıstuden.* Düşmən bizim Yelenak (Bela tərəfdədir) əsgərinin üstə gəlmişdi. Ona çox zərər vurub geri oturtduq. Bizdən 122 ölüb.

Vyana. Bukareştdə belə danışırlar ki, həzrət vəliəhd Məhəmmədəli paşanı Qralum çayının yanında (Bela tərəfdədir) basıb. Osmanlıdan 1 minəcən adam tələf olub. Bu ayın 9-dan 15-cən Şipkada bizdən 15 adam tələf olub.

*Sentyabrın 20-dən. Qornıstuden.* General Marzin əsgərindən bir dəstə süvari tatar Bazarcəq (Silistriya qalasının yanında) tərəfindən sentyabrın 14-də beş yüz, 15-də yeddi yüz, 16-da üç yüz çərkəs süvarisinə rast gəlib, onları pərakəndə edib, geri qayıdıb. Bizdən 31 adam tələf olub.

Cənab sərəsgər yazır ki, dünən knyaz Karl ilə (Rumıniyanın knyazıdır) bizim Plevna qalasını əhatə edən əsgərin yerlərinə baxdıq. Hər tərəfdən irəli gediblər. Düşmən bizə cavab vermir, yə'ni biz onlara top atırıq, onlar atmır.

Qarayalda (Kars tərəfindədir) bu gün bizim əsgərin hamısı Muxtar paşanın üstünə yeriş edib. Yağını, təpəsini almışıq, o təpəni saxlayan batalyonu tələf eləmişik. Sübhdən axşamacan bərk dava olub. Düşmənə çox zərər vurmuşuq. Bizim zərər hələliyə mə'lum deyil. 17 əfsər, 160 nizam əsir almışıq.

*Vindən.* Transilvaniyada bina olan icmanın qəsdi bu imiş ki, venqrlərdən 15 min adam Rumıniya yollarını dağıtmağa getsin. İndi Avstriya dövləti xəbərdar olub oraya əsgər göndərib. O adamlar bu əsgər ilə dava edib.

*Sentyabrın 22-də. Qarayaldan.* Dünən düşmən bizim sol dəstənin üstə gəlmişdi. Biz onları geri oturtduq. Bizdən 3 əfsər, 40 nizam ölüb, 11 əfsər, 2250 nizam zəxmdar olub.

Sentyabrın 20-də olan davada bizdən 9 əfsər, 1000 nizam ölüb, 60 əfsər, 2000 nizam zəxmdar olub.

*Sentyabrın 21-də. Plevna yanından.* Məhəmmədəli paşanın bir dəstə əsgəri Serkovna yanında geri oturduğuna onun hamı qoşunu geri oturub və bu səbəbə bizim Ruscəq əsgəri irəli gedib.

Silistriya tərəfində düşmən qəsd edirmiş ki, Tuna çayını keçib Rumıniya üstünə getsin. Bu barədə sərəncam olunub ki, onlara mane olsunlar.

*Sentyabrın 19-da. Plevnadan.* Batalyon 49 eskadron Osmanlı əsgəri ətrafından azuqə cəm eləməyə getmiş imiş. General Çernozubovun süvarisinin bir hissəsi onları geri oturdub. Bizdən 40 adam tələf olub.

Plevna qalasının bürclərinin birisində olan barıta bizim toplardan od düşüb.

Dünən Plevnadan bizim yola çox bərk top atırdılar.

Sentyabrın 22-də Plevnanın yanından cənab şahzadə sərəsgər yazır ki, Plevna qalasının dalında Sofiya qalasına gedən yolun üstə general Liviç sentyabrın 19-da Rodomet kəndinin yanında düşmənin bir karvanını vurub, onlar Plevnaya gətirən duzu, dərman-davanı, min baş qaramalı, 80 at alıb, o kəndin yanında olan körpünü və teleqrafı dağıdıb. Sentyabrın 20-də Çervin Bryaq kəndinin yanında körpünü dağıdıb.

Bizim əsgər Plevna qalasına top atır.

Bizim Ruscəq əsgərinin qabaq dəstəsi düşmən ilə dava edir.

*Sentyabrın 23-də. İstanbuldan.* Dünən Süleyman paşa (Balkan dağının dalında olan əsgərin sərkərdəsidir) Tuna əsgərinə sərəsgər tə'yin olub. Balkan dağında bu gün qar yağır.

*Sentyabrın 25-də. Qornıstuden.* Cənab şahzadə sərəsgər hökm edib ki, general Qurko Plevna qalasının müqabilində olan süvari əsgərinə sərkərdə olsun və general Skoblev 16-cı diviziyaya, general Dondukov 13-cü korpusa, general knyaz İmeretinski ştaba naçalnik olsunlar. General Totelbeyn Rumıniya knyazı Karla köməkçi olsun.

Plevna qalasının müqabilində olan Rumıniya əsgəri qəndək atıb, onun içilə düşmənin qəndəklərinə iyirmi qədəm qılıncan gedib.

Nikopol qalasından düşməndən qalan cəng gəmilərini (zikr olan qalanı alanda orada su içində iki gəmi tapılmışdı ki, bizim toplardan şikəst olmuş imiş) tə'mir edib, üstə toplar çəkib hazır eləmişik.

*Sentyabrın 27-də. Qarayal* (Kars tərəfindədir). Sentyabrın iyirmisində və iyirmi birində olan cənglərdən sonra bu gecə düşmən özü dayandığı yerlərin çoxundan, əzcümlə Qızıltəpədən köçüb getdi. Bizim əsgər onların dalınca gedib Hacıvəli, Subatan, Gilverən kəndlərini zəbt edib.

Türküstan şərqinin hakimi Yəqub xan bu il baharda mərhum olandan sonra onun məmləkəti 3 yerə hissə olub: birisi onun oğlu Bəyqulu bəyə, birisi qardaşı oğlu Xakim xan Tyuriyə və birisi Çin məmləkətinə düşüb. İndi "Türkestanski vedomosti" qəzeti yazır ki, mərhum Yəqub xanın varisləri bir-birilə cəng edirlər və Xakim xan Tyuri onu Bəyqulu bəy basandan sonra min sərbaz ilə qaçıb Rusiya sərhəddinə gəlib.

* * *

Avropa dövlətlərinin hamısından çox İngilis dövlətinin gəmisi var. İndi yazırlar ki, onun 180 cəng gəmisi var ki, bu gəmilərdə 1522 top var.

* * *

“Peterburqski vedomosti” qəzeti yazır ki, Peterburqda pul kəsilən mənzildə hər gündə Rumıniyaya göndərməkdən ötrü yüz altmış min tək manatlıq gümüş pul kəsilir.

* * *

Avropa vilayətlərində sakin olan yəhudilər hesabına gedib yazırlar ki, Avstriya məmləkətində 40 milyon adam var. Onların yüzdən üçü yəhudidir. Prusiyada 512 min, Firəngistanda 188 min, İngilisdə 51 min, İtaliyada və İspaniyada mindən bir və Rusiyada bir milyon 612 min yəhudi var.

* * *

Yazırlar ki, Bejis şəhərində dilənçi olmasından ötrü bir icma bina olub ki, hər calis ildə beş manat verir. Bu icma dilənçilərdən ötrü bir mənzil bina edib ki, şikəst olanları orada saxlayır və şikəst olmayanları ya sənətkarlara tapşırıb, sənət öyrədir və ya məktəbxanalara qoyub oxudur.

---

Qubernski pravleniyanın mətbəəsində təb’ olunub.

---

С дозволения Цензуры печатано в Типографии Бакинского Губернского Правления.

# KİTABDAKILAR

